**Əsğər Şahi**

# I CİLD

# Məhəmməd Füzulinin Qəzəllərinin Irfani Şərhi

**BAKI - 2008**

**Bismillahirrəhmanirrəhim**

**الحمد الله رب العالمين و الصلاه و السلام على رسول الله الامين و على آله الطاهرين و العنه على اعدائهم اجمعين**

Ürfan, insan zehninin dərk etdiyi və ona çatmaq üçün daima onu hərəkətə və zəhmətə salan ali və mənəvi dəyərlər arasında ən dərin və gözəl bir məfhumdur ki, insanın ona bağlılığı ən yüksək səviyyədədir.

Bu dərin və ali məfhum zəriflik və gözəllik kimi xüsusiyyətlərə malik olduğu, insan həqiqətinin müxtəlif cəhətlərini bəyan etdiyi, insanlıq ömrünün ona həsr edildiyi, ona çatmaq arzusunda olduğu və daima axtardığı ideal həyatı özündə ehtiva etdiyi, həmçinin şövq yaradan mənzillərinin dəqiqliyi və zərifliyi və insanın susuz canını sirab edən zülal sərçeşməsinə malik olduğu üçün insanın agah və müştaq ruhu üçün bənzərsiz hədəf və misilsiz amaldır.

Başqa sözlə ürfan, məbdə və məaddan tutmuş kamillik və gözəlliyə qədər insanın bütün ideallarının tərifini özündə birləşdirir, onun bütün arzularını təsvir edir və buna görə də hər kəs maddi aləmin kədərindən və kəsrətindən ayılıb bəsirət gözünü açdıqda ürfan dağına tərəf üz tutur və onun həqiqətini tanımağı, ona tərəf hərəkət etməyi özünün əsas hədəfinə çevirir. Buna görə də bütün ilahi dinlərdə və metafizik düşüncə məktəblərində ürfan adı altında olan mərifətlər insanın malik olduğu elmlər arasında yüksək yer tutur. Aydındır ki, bu müqəddəs və əzəmətli mərifətə hər kəs malik ola bilməz. Yalnız dərin elm və xüsusi pəhrizkarlıq sahibləri onun mübarək sərhədlərindən daxil ola bilərlər. Biz bu insanları arif və buna oxşar adlarla tanıyırıq. Ariflərin həqiqəti müşahidə və dərk etmələri çox şirin və uca olduğuna görə onlar gördüklərini və anladıqlarını bəyan etmək üçün xüsusi bir dil yaratmışlar. Əlbəttə, bu dil bir tərəfdən qeyri-ixtiyari şəkildə və ibarələrin çətin olması səbəbindən, digər tərəfdən isə müqəddəs və uca mənalar zərif və dəyərli olduğu üçün meydana gəlmişdir. Beləliklə bəşər mədəniyyətinin ensiklopediyasında ürfan ədəbiyyatının meydana gəldiyinin şahidi oluruq və olmaqdayıq. O ədəbiyyat ki, keçmişdəkilərin gələcəkdəkilərə ən gözəl irsi, yadigarıdır və özündə zəriflik və maarifdən dolu xəzinələr birləşdirir. Deməli, arif mənəvi məqamlara sahib olan bir ədib insandır. O, müqəddəs mənaları, gözəl

sözü və zərifllikləri bir-birinə qataraq özündə zövq və şühuddan ibarət xəzinələr yaratmışdır.

Bəşər tarixinin hər bir dövründə ürfan və ürfan ədəbiyyatının hərçənd enişli-yoxuşlu, çiçəklənən və süqut dövrləri olmuşdur, lakin daima mövcud olmuşdur. Şübhəsiz insanlar arasında əbədi möcüzə kimi daima qalan vəhyin nazil olması ilə başlanan İslam dövrü bu sahəni daha da zənginləşdirmək və inkişaf etdirmək üçün insanlara gözəl bir fürsət yaratdı. Elə buna görə də hicri qəməri tarixinin 3-cü əsrindən başlayaraq Quran və İslam mətnləri digər dünya dillərinə tərcümə edildikdə və ya müxtəlif xalqlar müqəddəs İslam mətnləri ilə tanış olduqda ürfan və ürfan ədəbiyyatı özünün çiçəklənən dövrünü yaşamağa başladı və bunun nəticəsini İbn Fariz Misri, Hafiz Şirazi, Cəlaləddin Mövləvi və Nizami Gəncəvi kimi dahilərin nəzm və nəsr əsərlərində aydın şəkildə görmək olar. Əhli-Beyt (ə) məzhəbinə arxalanaraq hakimiyyətə gələn qüdrətli və mə-nəviyyatlı Səfəvilər dövlətinin hakimiyyəti illərinə təsadüf edən hicrinin 10-cu əsrində ürfanın və ürfan ədəbiyyatının çiçəklənməsi üçün geniş imkanlar yarandı. Bu dövrdə onlarla məşhur arif və şair meydana gəlib ulduz kimi ürfan ədəbiyyatının qaranlığında parıl-damağa başladılar. Peyğəmbər Əhli-Beyti (Allahın salamı onlara olsun) tərəfindən buyurulan həqiqət və mərifətləri bəyan etmək üçün münasib zəminin yarandığı üçün Səfəvilər dövrü ariflərinin ürfan ədəbiyyatı daha da zənginləşdi. Şübhəsiz Qafqaz xalqları, xüsusən də Azərbaycan xalqı arasında dərin hörmət və sevgi sahibi olan Molla Məhəmməd Fizuli Səfəvilər dövrünün birinci yüzilliyinin ən parlaq elmi - ürfani və ədəbi simalarından idi. Azərbaycan dilini öz doğma ana dili hesab edən Məhəmməd İraqın Hillə şəhərində Süleyman adlı bir kişinin evində dünyaya göz açmışdır. Məhəmməd Fizulinin doğum günü və vəfatı tarixi dəqiq surətdə məlum deyil. Lakin aparılmış tədqiqatlar daha çox aşağıdakı tarixlərin üzərində durmağa əsas verir. Belə ki, o, 890-cı hicri, yəni 1485-ci miladi ilində doğulmuş və 963-cü hicri, yəni 1556-cı miladi ilində vəfat etmişdir. İbtidai təhsilini bitirdikdən sonra Bağdada yollanır və orada biliklərini artırır. Daha sonra Kərbəla və Nəcəf şəhərlərində daha dərin biliklərə yiyələnir. Bu dahi insanın elmi məqamı haqqında alim və tədqiqatçıların

dediklərindən, həmçinin özünün nəzm və nəsr əsərlərindən aşağıdakılar aydın olur: Birincisi Molla Məhəmməd Fizuli bir din alimi olub və kəlam, fəlsəfə, ürfan, fiqh, üsul, hədis və təfsir kimi dini elmlərə dərindən yiyələnmişdir. İkincisi bütün tədqiqatçıların da təsdiq etdiyi kimi o həm əqli, həm də nəqli elmləri çox yaxşı bilir və bu iki növ elmi özündə birləşdirmişdi. Üçüncüsü o, kamil bir ədib və şair olmuşdur və üç dildə, ərəb, azərbaycan və fars dillərində şer demişdir və özü bununla fəxr etmişdir. Fizuli fars dilini şer və ədəbiyyat dili hesab edir və bu dildə şerin səlisliyini və gözəlliyini çox yüksək həddə görürdü. Elə buna görə də onun fars dilində olan divanı azərbaycan dilində olan şerlərindən iki dəfə çoxdur. Lakin onun azəri türkcəsində yazdığı şerləri və əsərləri istər ədəbi, istərsə də məna və məzmun baxımından bu dildə olan ən dəyərli əsərlərdən biridir. Bir çox tədqiqatçılar hesab edir ki, Fizulinin azərbaycan dilində yazdığı şerlər bu dildə yeni bir üslubun meydana gəlməsidir. Ondan sonra gələn şairlərin çoxu onun üslubundan təsirlənmişlər. Dördüncüsü o böyük bir arifdir və ürfanın ən mühüm ünsürlərindən olan vəhdəte-vücud, eşq və təcəlli, seyir və süluk, şühud və zövq, həqiqət və bu kimi məfhumları çox zəriflik və ustalıqla əsərlərində işlətmiş və ən gözəl üslubda və ədəbi dildə bəyan etmişdir. Beşincisi və ən mühüm məsələ isə budur ki, Fizuli Quran və Peyğəmbər Əhli-Beyti (ə) tərəfdarıdır, şiəliyin əsaslarına tam agah olan, İmam Əli (ə) və digər imamlara, xüsusilə də İmam Hüseynə (ə) aşiq olan bir şiə idi və heç vaxt bu yoldan dönməmişdir. Deyilənlərdən aydın olduğu kimi Molla Məhəmməd Fizuli İslam dünyasının böyük ariflərindəndir ki, özünün mənəvi məqsədlərini bəyan etmək üçün şer dilindən bütün gözəlliyi ilə bəhrələnmiş və bu işin öhdəsindən asanlıqla gələ bilmişdir. O, zövq və lətafət sahiblərinin məşqinə çevrilən və uzun əsrlər dillərdə və qəlblərdə yaşayan əsərlər yarada bilmişdir.

Qeyd olunduğu kimi Fizulinin elmi-mənəvi şəxsiyyəti və ürəyəyatan kəlamı istər türk, istər fars və istərsə də ərəb dilli müsəlmanlar arasında böyük şöhrət qazandı. Lakin məlum səbəblərə görə onun parlaq ədəbi və ürfani siması azəri dillilər, xüsusilə də müsəlman Azərbaycan xalqı arasında məşhurlaşdı. Fizulinin kəlamına olan bu sevgi və hörmət şübhəsiz diqqətəlayiq

bir mərifətin olmasına dəlalət edir ki, uzun əsrlərdir regionda yaşayan istər alim, istərsə də adi insanlar arasında mövcud olmuşdur. Müasir dövrdə də bu mərifətə qarşı diqqətli olub onun təbliğində çalışqan olmalıyıq. Ona görə ki, arif bir ədibin dediyi sözlər, cümlələr, terminlər və tərkiblər şərhə və təfsirə ehtiyacı olan sözlər və terminlərdir. Hər kəs bu əsərlərin şərh və təfsiri öhdəsindən gələ bilmir. Ustad Şəhid Mürtəza Mütəhhərinin Hafiz Şirazinin şerlərinin təfsiri haqqında dediyi kimi, bu şerləri şərh edən özü də arif və ədib olmalıdır.

Daima qardaş və dost Azərbaycan xalqına mədəni və dini xidmətlər göstərməyə çalışan İran İslam Respublikasının Azərbaycandakı səfirliyinin Mədəniyyət Mərkəzi və təbii ki, mədəni və dini bağlılıq cəhətdən heç bir ölkə belə bir xidməti göstərə bilməzdi, hələ çoxdan bir ədəbiyyatçı alim tərəfindən Molla Məhəmməd Fizulinin azərbaycan dilində olan şerlərinə şərh və təfsir hazırlayıb dəyərli bir hədiyyə kimi azərbaycanlı oxucuların ixtiyarına verməyi nəzərdə tutmuşdu. Allaha şükürlər olsun ki, indi bu məcmuə dəyərli Azərbaycan oxucularına təqdim olunur. Bu mübarək əsərin dəyərli şərhçisi cənab Ustad Hacı Əsgər Şahi Ustad Murtəza Mütəhhərinin qeyd etdiyi iki yüksək xüsusiyyətə malikdir. Birincisi Ustad Şahi uzun illərdir ədəbiyyat və fəlsəfə sahəsində tədqiqat və araşdırmalar aparıb və böyük İslam ariflərinin əsərlərini nəzərdən keçirib. Həmçinin o, bu sahədə ali məktəblərdə tədris etməklə yanaşı İslam dünyasının ən məşhur və böyük arifi olan Hafiz Şirazinin şerləri haqqında böyük bir tədqiqat aparmış və hal-hazırda onun "Ta qafe əndişe" adlı Hafizin divanına yazdığı təfsiri bu sahədə olan şərhlər arasında ən mötəbər əsərlərdən biri sayılır. İkinci cəhət isə budur ki, o, şer və ədəbiyyat sahəsində də başdan-başa sənət və zövq əhli olan İranın parlaq ulduzlarından biridir. Şübhəsiz Ustad Şahi azərbaycan və fars dillərində yazan müasir şairlər arasında ən məşhur şairlərdən biridir ki, şerləri çox dərin mənaya, bənzərsiz gözəlliyə və zərifliyə malikdir. Ustad Şahinin məqamı o dərəcədədir ki, şer və şairşünas İslami İranın ədib və müdrik rəhbəri Həzrət Ayətulla əl-üzma Xamneyinin xüsusi hörmətini qazanmışdır. İran islam Respublikasının Azərbaycandakı səfirliyinin Mədəniyyət Mərkəzi Ustad Şahinin bütün bu xüsusiyyətlərini nəzərə

alaraq ona Molla Məhəmməd Fizulinin azərbaycan dilində olan divanına şərh yazmaq xahişi ilə müraciət etdi və o, böyük məmnuniyyətlə bu ağır və mühüm işi öhdəsinə götürdü. Orijinal ürfani mətnlərə istinadən sözlərin və terminlərin şərhi, beytlərin və şerlərin mənalarının bəyanı, ariflər arasında yayılmış ali məf-humların araşdırılması və ən əsası şübhəsiz Molla Məhəmməd Fizuli kimi böyük və əzəmətli arifin də əsas hədəfi olduğu Quran ayələrinə və hədislərə istinad Ustad Şahinin zəhmətinin bəhrəsidir. Bu kitab nəfis tərtibatda çap olunaraq Azərbaycan oxucularına təqdim olunur. Ümid edirəm bu məsuliyyətli iş Allah dərgahında qəbul, dost və qardaş azərbaycanlı alimlər, ədiblər, şairlər və adi insanlar tərəfindən bəyənilər və ölkələrimiz arasında mədəni-dini əlaqələrin daha da inkişaf etdirilməsində müsbət bir addım olar. Mütəal-Allahdan bütün müsəlmanların, xüsusən də bir-birinə bağlı olan İran İslam Respublikası və Azərbaycan Respublikası müsəl-manlarının xoşbəxtliyini diləyirəm.

***Seyid Əli Əkbər Ocaqnejad***<br>
***İran islam Respublikasının Azərbaycandakı***<br>
***səfirliyinin Mədəniyyət Mərkəzinin sədri***

## ÖN SÖZ

Ulu Tanrının əzmi ilə eşq duyğularını tərənnüm edən Hafiz qəzəllərinin ürfani – fəlsəfi şərhini "Ta qafe əndişə"[1] ünvanlı 4 cildli kitabda yazıb yayandan sonra şair, ədəbiyyatşünas və fəqih ustadım, İran – Azərbaycan Mədəniyyət Mərkəzinin sədri Hacı Əli Əkbər Ocaqnejad həzrətləri, Füzuli qəzəlləri haqqında ürfani mərtəbələr, həmçinin ədəbi anlaşılmazlıqların aydınlaşmasının ədəbi – dini təklif kimi gərəkli olduğunu buyurduğuna görə qadir Allah yardımına ürək bağlayaraq bu şərhi araşdırmağa başladım. Beləliklə, hər sözdən əvvəl hüccətül-islam vəlmüslimin Seyid Əli Əkbər Ocaqnejad həzrətlərindən, Hafiz ədəbi əncüməninin müəssisi Cəbrayıl Nəvid Azərbaycani cənablarının təşviqlərindən, şair və alim dostum ustad Nemət Həqiqi verdiyi məlumatlardan, bu şərhlərin redaktorluğunu qəbul etmiş alim və şair qardaşım professor Şahin Fazil müəllimdəm, həmçinin bu kitabın ərəb mənşəli türk əlifbasından latın mənşəli Azərbaycan əlifbasına köçürməsində zəhmət çəkmiş Məcid Kamrani cənablarına açıq ürəklə təşəkkür edərək möhtərəm mütaliəçilərin nəzər diqqətini aşağıdakı icmallara cəlb etməyi zəruri görürəm:

1 – Əruz vəzninin ərəb tərkibləri ilə təbii dolğunluğu, ərəb-fars dilli ürfani qaynaqların toplanması, xüsusilə bir çox türkcə tərcümə imkanından xaric ürfani nişanələrin çətinliyi, bu müəllifin fars ədəbiyyatını 40 il tədris təcrübəsi, beləliklə, Mövləvi, Nizami, Xaqani, Sədi və Hafiz əsərləri ilə dərindən tanışlığı, bu şərhin bir qədər qeyri-türki tərkiblər – ibarələr ilə aydınlaşdırılmasına səbəb oldu.

2 – Bu şərhdə qeyd olunmuş ürfani nişanələr, müəllifin zehni düşüncəsi, yaxud şəxsi anlayışı yox, bəlkə də qaynaqların bilavasitə özündən, yaxud təfsirindən alınma faktik çeşidlərdirlər.

3 – Müxtəlif nüsxələrdə bir-birindən fərqli qeyd olunmuş misralar, yaxud kəlmələrə diqqər yetirməyimiz, onların ürfani məna münasibəti, yaxud eyham xüsusiyyəti ilə əlaqəlidir. O cümlədən: "Bahari-hüsnünə əmvac peyda qər napeyda"[2] misrasında "bəhar"

---

[1] "Ta qafe əndişe" = "Düşüncələr zirvəsinə qədər"
[2] Qəzəl 4, beyt 1

sözünün "əmvac" sözü ilə ürfani münasibətini nəzərə alaraq "bəhar" kəlməsini izah etmək məcburiyyətində qaldıq.

**Qeyd** 1: *"Bəhar", "İnna lillah"[1] ünvanlı həqiqi həyat mərkəzinə hidayətdən ibarətdir.*

**Qeyd** 2: *"Əmvac" A – mütləq vücuddan nişanədir.*

B – "İnna lillah" mərkəzinin cilvələrdən ibarətdir.[2]

P – Büsbütün yaranmışların ilahi bağlılığını eyham edən nişanədir.

T – Mənəvi sağlamlığı mühafizə edən ürəkdə çaxmış ilahi şimşəkdir.[3]

---

[1] Quran, Bəqərə surəsi, 156-cı ayədən bir qismət: انا لله و انا اليه راجعون (Biz Allahın fərmanı ilə [dünyaya] gəlmişik və ona tərəf qayıtmalıyıq)

[2] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-istilahat və təbirat-ürfani, Tehran, h. 1386

[3] Fərhəngi-Moin, Tehran, h. 1378

## Q Ə Z Ə L 1

**(1) Qəd ənar əl eşq lil- üşşaq, minhac əl-huda**
**Saliki-rahi-həqiqət eşqə eylər iqtida**

**(2) Eşqidir ol nəşeyi-kamil kim ondandır müdam**
**Meydə təşviri-hərarət neydə təsiri səda**

**(3) Vadiyi-vəhdət həqiqətdə məqami eşqdir**
**Kim, müşəxxəs olmaz ol vadidə sultandan gəda.**

**(4) Eyləməz xəlvətsərayi-sirri-vəhdət məhrəmi**
**Aşiqi məşuqdən, məşuqi aşiqdən cüda.**

**(5) Ey ki, əhli-eşqə söylərsən məlamət tərkin et!**
**Söylə kim, mümkünmüdür təğyiri-təqdiri-Xuda**

**(6) Eşq kilki çəkdi xətt hərfi-vücudi-aşiqə**
**Kim, ola sabit həq isbatində nəfyi ma əda**

**(7) Ey Fizuli, intəhasız zövq buldun eşqdən,**
**Böylədir hər iş ki, Həqq adilə qılsan ibtida.**

Beyt 1: **Qəd ənar əl eşq lil- üşşaq, minhac əl-huda**
**Saliki-rahi-həqiqət eşqə eylər iqtida**

Sözlük: Qəd = əlbət; üşşaq = aşiqlər; minhac = açıq və aydın yol; hüda = hidayət = doğru yolu göstərmək; salik = müsafir = səyahətçi = seyrə çıxan; iqtida = təqlid etmək = itaət = İmam cümənin arxasında dayanıb namaz qılmaq.

**Nişanə** – "Ənar" - nur sözündən alınmış şühudi keçmişə dəlalət edən feldir, nur sözünə gəldikdə isə o, ürfan və panteizm baxımından elə bir iqtidardan əlamətdir ki: A-özü işıq olduğu halda, başqalarını[1] işıqlandırar və həqiqətləri aydınladar, demək "Allahu nurus-səmavatu vəl-ərz"[2] dedikdə müəyyən mənada, Allah-təala öz qüdrətilə bütün göyləri və yeri işıqlandırmışdır. Bu işıq olmasa dünyada heç bir vəchlə və heç bir varlıqla düzgün mənada tanış olmaq imkanı heç kimə müyəssər ola bilməz. Təsadüfi deyildir ki, Həzrəti-Mövləvi bir misalla ürfan nəzəriyyəsində mərifət adlanan bu tanışlığın əzəmətini qeyd edərək deyir: "Bir kənd əhli öz inəyini axurda bağlamışdı, birdən bir yırtıcı aslan peyda olub heyvanı parçalayıb yeyir və özü onun yerini tutur, yəni demək heyvanın dərisinə girir. Heyvanın yiyəsi gecədən bir az keçdikdən sonra inəyə baş çəkmək üçün tövləyə girir. Qaranlıqda əlini onun boynuna, belinə və ayrı yerlərinə sürtür. Onu sığallayır, çünki onun zənnincə bu bir yırtıcı aslan yox, bəlkə öz inəyidir. O aslan belə deyir: Ey məlumatdan uzaq və mərifətdən qıraq qəflətdə və nadanlıqda qalan insan, bura bir parça nur saçılsaydı və sən mənim üzgünlüyümün necəligini bilsəydin ürəyin qana dönərək bağrın çatlayardı, zil qaranlıqda sən mərifətdən uzaq olduğuna görə mənim aciz bir inək olduğumu zənn etdiyin üçün məni sığallamağa cəsarət tapırsan. Elə düşünürsən ki, əhliləşən və aciz inəyəm. Allah-Təala deyir: Ey insan, ey mənim bəndəm, adımın heybətindən Tur dağı parçalanan iqtidarlı Xaliqəm. Ona görə mənim adımı cəsarətlə çəkirsən. Çünki bu adın əzəməti barədə biliyin çox az və mərifətin yoxdur. Mənəmlik və lovğalıq zülmətində kor olduğundan bu adın ululuğunu başa düşmək imkanını tapa bilmirsən.[3] Bu əzəməti görməyə və bu tanışlığa bir nur gərəkdir, elə bir nur ki, könüllərə saçır və "batini işıq" yaxud "tohid günəşi" adlanır. [4]

---

[1] Yalnız maddi vücudlar "başqa" deyillər, bütün məfkurələr, anlamlar, mənalar, təsəvvürlər və bütün ağıl və zehnə bağlı mücərrəd mövzular isə "başqa"lardırlar.
[2] Quran, Nur surəsi, 35- ci ayədən bir qismət.
[3] "Məsnəviyi-mənəviyi Möləvi", dəftər 2, səh 225
[4] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-istilahat və təbirat-ürfani.

**Qeyd:** *Varlıqın var olması iki qüvvədən asılıdır. Birincisi var olmağıdır ki, ürfanda "iqamə" başlığına bağlı olan geniş bir mövzudur. İkincisi isə öz varlığını davam etdirməkdir ki, ürfanda "idamə" başlığı ilə ifadə edilir.*

B – "Nur" büsbütün varlığa, xüsusilə, bitki, heyvan və insan həyatına saçaraq varlığlarını davam etdirməklə əlverişli şərait yaradan qüdrətin nişanəsidir. O, nur saçmasa, təkcə həyat deyil, bütün varlıq öz davamını itirər.

"Nur" ürfanların Allah təamı adlanan məxsus qidası – həm də obyektidir. Hər təamın özəl dadı – ləzzəti olduğu üçün nur təamının da öz dadı, öz ləzzəti var, bu təam içəri aləmlə bağlı olduğuna görə onun dadı maddi yeməkdən tam başqadır və eyni halda ondan daha çox üstün – daha çox şərəflidir. Nəzərə alsaq ki, bədənə yemək yetişməzsə onun varlığı təhlükəyə məruz qalar və nəhayət məhv olar, insanın da öz mənəvi cəhətinə həyat verən və mənəvi varlığının davamını ödəyən nur təamıdır.[1] Bu baxımdan insan yarı yer, yarı göy sakini olduğu üçün bilməlidir ki:

**"Bal şərabı içənin axırı torpaq olacaq,**
**Nuru şərbət elə ta axırı Quran olasan."**[2]

T – İç aləmi işıqlandırmaq üçün səbəblər gərəkdir, onların ən güclüsü, ən təməllisi namaz və orucdur. [3]

**Qeyd:** *Mövləvi insanın zahirinə "bədən", batininə isə "Nuri-mutamən" deyir. Nuri- mutamən - iman nuru, nəhayət Allah nurudur ki, biz onu birinci beytin birinci nişanəsində xatırladıq. O (Möləvi) öz dünyagörüşünü belə konkretləşdirir: insanı yalnız gövdə təsəvvür edən və onun məhz zahiri obrazını görən şəxs, dəhşətə gələrək, qaçmışdır. (Çünki bütün cinayətlər, qan tökmələr, qudurğanlıq, özbaşınalıq, çapkınçılıq, habelə insaf və imandan geri qalmış heyvərə işlər gövdə ilə əlaqədardır, əksinə insanı "Nuri-mutamən" kimi təsəvvür edib onun iç xarakterini, batini ərdəmini görən hər kimsə onun şərəf və kəraməti qarşısında baş əyib hörmət etmişdir. (Çünki bütün mənəvi, ilahi, habelə humanitar işlərin mənşəyi batindir).*

2- "Eşq": A – yəni məşuq və məbud Həzrətlərinin (Allahın – Ş.F) özündən nişanədir.

B – Həqiqət ümmanına dalmaqdan əlamətdir.

---

[1] Məsnəviyi-mənəviyi-Mövləvi, dəftər 4, səh. 704
[2] Müəllifin qəzəlindən bir beyt.
[3] Məsnəviyi-mənəviyi-Mövləvi, dəftər 5, beyt 828

P – Qəlbin məşuq vasitəsilə qiyam tapması, yaxud istiqamətlənməsi deməkdir. Qiyam hərfi anlayışı ayaq üstə durmaqdır və o həyat və dirilik təcəssümüdür, demək, eşq qəlbin həyatı yaşamasıdır, əlbəttə belə bir həyat məşuq ilə məşğul olmaq və ona məğlub olmaqla mümkün ola bilir.[1]

T - Əflatunun fikrincə məcazi və zahiri eşq bioloji varlığı ərimik durumundan qoruyub saxlayaraq nəslin davamlanmasına səbəb olduğu kimi, həqiqi eşq isə canı və əqli aramlıqda saxlayaraq batin dünyasının davam etməsinə maraq və müşahidə [2] övladının doğulmasına səbəb olur, bununla da reyal həyat davam edir.

3- "Hidayət": hidayət insanı mənəvi kamala yönəldən və yüksəldən rəhmətdən nişanədir. Bu kamal ürfan dilində "ikinci kamal", yaxud "ikinci mərifət" adlanır.

4- "Salik": bir aşiqdir ki, onun qapalı şəxsiyyətinin şərhi üçün dərin biliklər və geniş izahlar gərəkdir. Ancaq biz bu yazıda sözü uzatmamaq fikrində olduğumuz üçün məzmuna xələl yetirməmək şərtilə qısa izahla kifayətlənəcəyik. Buna görə də aşağıdakı qısa izahları qənaətbəxş hesab edirik:

A – hərəkət və yeniləşmək: hərəkət və yeniləşmək bütün varlıqların özəl və sirli xasiyyətidir, ayrı bir nöqteyi-nəzərdənsə "vəhdət" məktəbilə əlaqədardır. Molla Sədra hərəkəti varlıqların mahiyyəti hesab edərək, cövhər silkinə daxil edir. Onun fikrincə belə olduqda hər bir varlıq hərəkət və yeniləşmək xüsisiyyətindən ayrılsa şərh edilməz və açılmaz qalar. Fəzada olan ulduzlar – planetlər, qalaktikalar, eləcədə yer üzərindəki yaranmışlar, həmçinin həm də subyektiv təsəvvürlər, öz bütövlüyündə həm də tərkib hissələrində, hərəkət qanununa tabe olaraq daima yeniləşməkdədirlər. Atomlar və onların tərkib hissələri belə hərəkətdən kənar deyillər. Ona görə də həmin qanun fəlsəfənin əsas prinsiplərindən biridir: " ... atomlar da elə dəyişməz deyildir, bəlkə bütün bütövlükləri ilə yanaşı kiçik – kiçik hissələrə çevrilərkən yeniləşilər, "radioaktivitə" iktişafi habelə xüsusi və kütləvi nisbilik tezisi kimi zamanla fəzanın bir-birinə daxil olması,  bu zamanda yaşayan insanlara, hərəkət və yeniləşmək təmindən geniş üfüqlü bir məlumat bağışlayıbdır".[3]

---

[1] Bu sözün "İqamə" ünvanlı ürfani bəhsdə izahı var.

[2] Bu kitabda  yer "maraq və müşahidə" məzmununa tuş gələndə, ürfani "məkaşifi" yaxud "şühud" ünvanını qeyd etməliyik.

[3] Doktor Ebdül Kərim, "Nəhadena aram cahan" səh 14 .

B – hərəkətin formaları, çeşidləri: hərəkətin zaman, məkan, miqdar, keyfiyyət və digər vəziyyətlərlə əlaqədar formaları. Salik mövzusunda ayrı-ayrı müəyyən faydalar və nəticələrə aiddir, ancaq onların dairə formalı çeşidi digər formalardan çoxdur  Bu da, ilahi mövzuların araşdırıcılarına – dərin hissli mütəfəkkirlərinə zəngin və daha anlamlı gələrək onları dolğun şərhlər – geniş izahlarla məşğul edir. Bu forma fəlsəfə və ürfanda "Müstədir[1] hərəkətlər" başlığı ilə tanınır, ilahi məqsədə rahat müraciət prinsipini cürbəcür variantlarla, təhlil kimi göstərir. Qapı başlarının və tağ – taqçalarının, xüsusilə, məscidlərdə və  məbədlərdə, abidələrdə əski zamanlarda yayılı görkəmdə (dairədən bir bölgü) düzəldilməsi, baş endirmək, boyun əymək, təvazökarlıq göstərmək, hörmət gözləmək və bir də əslə və kökə yaxud, "inna lillah" müraciət etməyin yalnız dairəvi obrazlar və müqtədir hərəkətlə mümkün olduğunu bildirir.

P – müstədir hərəkət fəlsəfədə "bütün işlərin get – qayıt" prosesi başlıqı ilə bir çox təbii dünyəvi araşdırılmalar və açıqlamaların mənşəyi olubdur.

T  - müstədir hərəkət ürfani vəziyyətə məcazi obraz bağışlayarkən zahiri batinlə paralel tutaraq salikin müstədir yolda necə seyr etməsini obrazlaşdırmışdır. Bu təsvirdə iki dünya (mənəvi, məcazi) arasında təxmini  bir müstəqim xətt və sərhəd, seyr və hərəkət dairəsini ortadan iki yay kimi bölür, beləliklə, bir yarım dairə yol, məna üzərində və ikinci yarım dairə isə dünya səviyəssində qərar tapır. Məna üzərindəki yarım dairə yenə ortadan iki hilala bölünürkən "inna lillah" nöqtəsinin sağında – solunda təsvir olunur. Salik qeyb aləmində "inəllah" nöqtəsində öz yaranışının başlanması ilə bərabər hərəkətini də başlayır və ikiyə bölünən yarım dairənin, yaxud məna üzərindəki iki hilalın birini seyr edərkən dünya və maddə sərhədinə çatır, orada məcbur olur bir cisim və gövdə adlı örtüyə (hicab) bürünməklə maddəyə uyğun bir forma taparkən dünya ilə ünsiyyət tapsın, sonra dünyəvi bir biçimlə dünya üzərində ikinci yarım dairə yolunda hərəkətini davamlandırsın.Yenidən mənadən gələndə görmüş olduğu və sovuşduğu sərhəddə müraciət etsin, bu sərhədi sovuşmağa və məna mülkünə daxil olmağa bir üryan, bəsit, mücərrəd yaxud bir məna cinsinə uyğun şəkil alsın. Belə bir biçim şəraiti və movqeiyyəti yalnız ölümlə ilgidədir (cism həbsindən kənar olmaq), lakin ömrün sona çatması ilə müstədir hərəkət bitmir, bəlkə məna üzərindəki xatırlanan iki hilal yolun hələ də biri qalır. Salik o bir hilalı mənəvi

---

[1] Müstədir = dairəvi

şəraitlə, yəni cismsiz vücudla seyr edərkən "inna iləyhə raciun"[1] məqsədinə müraciət edilir.

انا الله

<< 1 >> mənəvi hilal ( ) mənəvi hilal << 4 >>
Sərhəd-------------------------------------------------------------
<< 2 >> maddi hilal ( ) maddi hilal << 3>>

T – Həqiqət - həmən "inna lillah", yaxud həmən başlanğıcdan ibarətdir.

**Anlam: Əlbətdə eşq hidayət işığıyla gerçək mənəviyyat və birlik mülkünə müraciət etmək yolunu açıq – aydın göstərir və düzgün aşiqlər onu( eşqi) həqiqi bir rəhbər tanıyarkən göstərdiyi müstədir yolda seyrə məşğul olurlar.**

C - Əflatunun zənnincə, salik bir aşiqdir ki, görünməz ilahi aləmdə yaşayışını və orda qazandığı, öyrəndiyi elmləri, mərifətləri təmamilə unutmayarkən, hələ ağlında və zehnində bir para qeybi məlumatlardan izlər və əsərlər vardır, bu məlumatlar səbəb olur ki, o, çalışsın və dünya və maddənin təbii küdurət və qaranlığında itirdiyi elmləri taparkən dübarə öz həqiqi və qeybi kamalına müraciət etsin[2].

Beyt 2: **Eşqdir ol nəşeyi kamil-kim, ondandır müdam**
**Meydə təşviri-hərarət, neydə təsiri-səda.**

Sözlük: nəşe = nəşə = nəşvə = dirilmək = xoşluq = təzədən peyda olmaq; = müdam = dayimi = həmişə = ardı-arası kəsilməyən şərab; Təşvir = işarə qılmaq = şərməndə etmək = estetik əhvalı yaşamaq = şur və həyacan tapmaq.

**Nişanə** 1 – "Nəşə" - yeni bir həyatdan nişanədir. Bu həyat bir şəraitdə nişat tapar ki, aşiq açiq-aşkar dünya qazanclarını, kimliyini, hətta özlüyünü də yaddan çıxarar[3];

**Nişanə** 2 – "mey" - müxtəlif mənəvi hallar və mərhələlərdən nişanədir:

A – birinci beytdə salik nişanəsində izah olunduğu kimi maddi və mənəvi aləmlər arasında təxmini bir zolaq və sərhəd var. Bu sərhəd seyr dairəsini tən ortadan iki hissəyə bölür. Salik əlbətdə gərək maddi dünya

---

[1] Quran, Bəqərə surəsi, 156-cı ayədən bir qismət.
[2] Məhəmməd Əli Füruği, "Seyri-hikmət dər Avropa", cild 1, səh.31
[3] Bu nişanənin "Hicranəl-məarif" ünvanlı ürfani məqalədə dərin bəhsi var.

tərəfindəki hissəni sağlam sovuşsun, sonra mənəvi hissəyə çatarkən "İnna lillah"a müraciət etsin. Ancaq maddi dünya tərəfindəki yarım dairə hissəsini saglam sovuşmaq asan deyil, çünki bu hissədə qəddar yol kəsənlərin, yırtıcı heyvanların yüzlərcə belə-belə fırtınalara, təhlükələrə qarşı çıxması təbii və qətidir. Həvəs qərəz, təkəbbür, mal, dövlət, mənəmlik və digər cismani tələblər isə – dünyəvi istəklər deyilən təhlükələrdən ibarətdir.

Saliki sərhəddin mənəvi hissəsinə aparan elə bir qüvvədir ki, insanı dünya tələblərindən təmizləyər, sadaladığımız uçurumlardan amanda saxlar və nəhayət, sərhədin mənəvi hissəsinə daxil edər.

B – Dünyəvi dəhşətlər, ziyanlar, sədəmələr yalnız təbii və fiziki mənəmliklərə təsir etməyə qadir olduğuna görə salik qarşısında acizdirlər. Çünki salik təbiətini və maddi mənliyini yadından çıxarıb, itiribdır.

**Nişanə** 3 – "Hərarət" - İlahi cəlalərin – parıltıların orta mərtəbədə mövcud olan nişanəsidir. Bu mərtəbənin ürfani adı önündə "bərq" və sonunda "təms"dır[1].

"bərq" – nar, yaxud od içində yanmaq mərhələsindən ibarətdir. Bu mərhələ salikin təbii sifətlərini yandırarkən onu mənliyindən və nəhayət, fiziki və dünyəvi təhlükə təsirindən azad edər ( Mey qüvvəsi gördüyü işi təkrar edər).

"təms" - nur içində yanmaq mərhələsinindir. Bu mərhələ salikin vücudunu Allah nurunda məhv edərkən onu çırağa döndərər başqaları da o çırağın yaxud o salikin işığından faydalanarlar.

3/1 Hər bir hərəkətin baisi fiziki aləm baxımından "hərarət"dir. Bu baxım birinci beytin << A >> nişanəsində qeyd etdiyimiz obrazla özəl əlaqədədir.

**Nişanə** 4 – "Təşvir" - şur, qayğı, habelə, şənlik nişanəsidir. Ürək öz duyğusunu təşvir (şur) mənbəyindən hasil edir.

4/1: döyüntü, çırpıntı ürəyin keyfiyyətinə bağlı bir hərəkətdir, hər hərəkətə bir məqsəd gərəkdirsə, ürək döyüntüsünün məqsədi isə məşuqun hüzurudur.

4/2: ürək çırpıntıdan ayrılsa sakin olar, sakin isə seyr etməz və seyr etməyən də məqsədə çatmaz.

4/3: bioloji – fiziki olan damaratma, sadəcə "çırpıntı – döyüntü" deyil, aşiqin qəlbində və məfkurəsində tapılan bütün vücudunu bürüyən qayğı və məhəbbətə bağlı bir sifət və haldır.

---

[1] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-istilahat və təbirat-ürfani.

4/4: çırpıntının əksi (ziddi) sakinlikdir və o iki əsaslı bir ruhiyyədən ibarətdir:

A: Mütəal Allahdan başqasına söykənmək. Bu ruhiyyə, mənfilik və xəbərsizlik nişanəsidir, çünki Allahdan başqa hər nə varsa məhdud və acizdir.

B: Qadir məbud və məşuqun rəhmətinə təkləyənmək və təvəkkül etmək. Bu sakinlik ürəyin içərisi ilə bağlı olaraq, onun batini mövqeyini və mahiyyətini müəyyən edir. Bu müəyyən uğuru qoruyan ürəyin fiziki – zahiri çırpıntısıdır, çünki dünyəvi yaşayışda, yaxud ölüm adlı həyatı dəyişmədən əvvəl içəri üzdə içəri həyatın müstəqilliyi mümkün deyil, bu əsasla demişlər: "insan iki başlanğıcdan ibarətdir: tanrı – təbiət". Buna görə də salikə mənəvi seyrlə dünyəvi seyri vahid paraleldə irəli sürmək vacib sayılmışdır. Bir də məna dünyasını izləyən gərək dünya üzərindən sovuşsun, çünki hərəkət olmasa sovuşmaq mümkün olmaz. Hər halda məhbub və məbudun qayğısı ilə çırpınmaq aşiq və salikin ürəyinin gərəkli bir hərəkəti və olduqca önəmlidir, habelə ölüm – dirim məsələsidir.

4/5: Məhz mütləq sakinlik hətta Allaha söykənmək mərtəbəsində də mümkün deyildir, çünki aşiq məşuqun hüzurunda, yaxud vüsal sahəsində hər an öz sədaqətini artırmaq üçün ürəkdən çalışır – həm özü yeniləşir həm də iradətini yeniləşdirir. Bu yeniləşməklər, birinci beytdə salik nişanəsində xatırladığımız kimi, hərəkəti bildirən bir əlamətdir.

**Nişanə** 5 – "ney": dünyəvi fenomen və forma, yaxud kainatın hər biri görünməz – ölümsüz həyatdan kölgə və nümunədir. Demək dünya varlıqlarının mükəmməli axirətdə mövcuddur. Beləliklə, maddi varlığın bütünlüyü və təfərrüatı mənəvi varlığın rəsulu və təbliğçisidir. Dünyada məna şəraitini əks etdirən bu rəsulların ən tanınmışlarından biri də "ney"dir.

5/1: Ney-keçmiş zamanda yaşıl, güllü və canlı bir bitki olduğunu yada salarkən qayıdış həsrətində yanıqlı nalə qoparan məcazi bir nişanədir.

5/2: Ney-mənəvi həyatdan ayrı düşən və gördüyü ilahi yaşayış həsrətində yanan alovlu ürəkdən haray qoparan insanın mənəviyyət nişanəsidir.

5/3: Ney ən qədim bir bitki olduğuna görə insanın əzəliliyinə eyham edir.

5/4: Ney 5, 10 və gah 25 metr dövrlərində boy artığına görə insanın səmavi uca məqamına eyham edir.

5/5: Ney şəkər qamışı olduğuna görə öz mənəvi və qeybi şirinliyinə eyham edir.

5/6: İranda kamil neyin yeddi bəndi var, yeddi rəqəmi islam və İran mədəniyyətində, xalq kulturunda qapalı, heyrətli və müqəddəs bir rəqəm kimi tanınarkən, müxtəlif tərkiblərlə məşhurdur, o cümlədən: Mütəal Allahın elm və eyn (göz) mərtəbəsində yeddi sifətlə ( həyat, elm, iqtidar, iradə, eşitmə, görmə və kəlam) zühur etməsi[1]. Yeddi rəqəmi yeddi səma, yeddi dəniz, yeddi yer, yeddi bulağ habelə namazda yerə qoyulan yeddi üzv və digər tərkibləri ifadə edir.

5/7: Ney səslənməsinə səbəb dodaqdan yaxud ürəkdən çıxan neçə üstünlüklü nəfəsdir.

A – Nəfs həyat nişanəsi olduğuna görə müqəddəsdir çünki həyatında başqa nemətlər kimi təbii cəhətlərin biri də müqəddəslikdir.

B - Nəfs bioloji qüvvələrlə hərarəti enerjiyə dönən təamdır və hərarət dördüncü nişanədə dediyimiz kimi, fəlsəfi və ürfani bir mərtəbənin əlamətidir.

C – Ney içi boş olduguna görə başqa bir müqəddəslik dən nişanədir, beləliklə hər batin və hər ürək dünyəvi istəklərdən kamil boşalmasa yalnız bir buğda qədər dünya, təbiət və mənlik havasını öz içərisində saxlasa o hava məşuq həzrətlərinə rəqib və əks sayılar, məşuq da rəqibin yolunda hazır olmaz. O səbəbdən deyər ki, "...boş zehin macal verir ki, üluhiyyət quşu batininə yol sala [2] və artırar ki: təslim[3] məqamına nail olmaq batinin təmamilə boşalması şərtilə mümkün olmalıdır."[4]

**Anlam: "Mey" və "Ney" qüvələrinə malik olan eşq, hidayət işıqini saçarkən, aşiqi dünyəvi duyğularından, təbiətindən və özlüyündən ayırır və onu yeni bir həyatla ilahi kamala çatdırır.**

Beyt 3: **Vadiyi-vəhdət həqiqətdə məqami-eşqidir,**
**Kim müşəxxəs olmaz ol vadidə soltandan gəda.**

Sözlük: Müşəxxəs = bəlli = məlum = müəyyən = tanınmış = xarakter tapmış; gəda = dilənçi.

---

[1] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-istilahat və təbirat-ürfani.

[2] - Xəllaqiyyət, tərcümə: Mərcan Fərəci, səh. 59

[3] İslamın orijinal məzmunu təslim olmaqdır (əl-islam hüvə təslim), yeri gəldikdə bu barədə söz açmalıyıq.

[4] - Üluhiyyət = ilahi bir məqam və şəxsiyyət tapmaq.

**Nişanə** 1 – "Vəhdət": vəhdət məhz vahidlikdən nişanədir. Demək yalnız bir vücud əzəli, əbədi və həqiqidir, digər vücudlar onunla bağlı cilvələr və kölgələrdirlər.

**Əzəldə bir vücud var fəqət, bəqiyyə hiçdir,**
**O bir iddədə gəh iki, gəh üç, gəhi hezardır**[1]

1/1: Vəhdət mərtəbəsilə tanış olan aşiq, məşuq həzrətlərini sahili sonu olmayan və əqlə, elmə, sığmayan bir dəniz hesab edər və o dənizdən başqa heç bir varlığı həqiqi bilməz, bütün vücudları o dənizin dalğaları və köpükləri təsəvvür edər, beləliklə, hər insan əgər öz əlaqəsini vəhdət aləmindən qırsa, dalğa dənizdən ayrılan kimi təhlükəyə məruz qalmalıdır.

1/2: Özünü dalğa hiss edən bir aşiq müstəqillik fikrini başdan atarkən özünü öz vücuduna sahib və malik tanımaz. Beləliklə, yalnız mənəmlik qürurundan yox, bütün şər işlərin qaynağı olan mənəmliyin özündən xilas olar.

1/3: Vəhdət kəsrətin batini, yaxud ilahi vicdanıdır. Demək vicdan yaxşını yamandan ayıran batini bir qüvvə olduğu üçün günahlar onu ört – basdır etsə də, o öz mahiyyətindən ayıra bilməz, belə bir özgünləmək səbəb olar ki, oğrubaşı başqalarını çapıb-talasa da, öz talanmağına razılıq vermir və vicdan diliylə çapqınçılıqı pisləyir.

**Nişanə** 2 – "Soltan və gəda": soltan və gəda bu beytdə, etibarsız, dünyəvi izzətlər və zillətlər anlamındadır. Dünyapərəst insan fikrini və ağlını bu anlamla məşğul edərkən əbədi izzət və zillətdən xəbərsiz qalar. (İlahi camal cənnətini və əbədi fəraq cəhənnəmini yaddan çıxarar). Soltan və gəda, iki termin olduqlarından ikiliyi eyham edir. Demək ikilik hazır olan yerdə, birlik (vəhdət) və nəhayət yeganə məhbub qayib olar və eşq öz mənasını əldən verər.

**Anlam: Eşq vücudların içəri üzilə yaxud batini hissəsilə əlaqədardır. İçəri üzlərin əsasda ilahi olduğu (vicdan), onların vəhdət dənizinə bağlılığını sübut edir, beləliklə soltan və gəda bir-birinə qarışarkən bir səviyyə tapmış olur.**

**Qeyd**: *Bütün aşiqlər mütəal, qadir, gözəl məhbubun camalını ziyarət etməyə möhtacdırlar, buna görə də bir-birilə bərabərdirlər.*

Beyt 4: **Eyləməz xəlvətsərayi-sirri-vəhdət məhrəmi**

[1] Müəllifin bir qəsidəsindən beytdir

**Aşiqi məşuqdən, məşuqi aşiqdən cüda**

Sözlük: xəlvətsəra = xəlvətilik = sayxınlıq = xəlvət otağı = namaz otağı; cüda = ayrı.

Nişanə 1 – "Xəlvətsəra" - məşuq hüzuruna ən yaxınlıq[1] və nəhayət qovuşma və birləşmə (ittihad) məqamından nişanədir.

1/1: Xəlvət-dərin və dəyərli mənalar, müəyyən çeşidlər – müxtəlif izahlar və ürfani bəhslər başlığıdır. Ancaq biz bu beytdə xəlvət nişanəsindən söz açmayaraq onun üstündən keçməliyik, çünki bu nişanə gələcəkdə yeri gəldikdə açılıb-aydınlaşacaq, həm də "ney" və "vəhdət" ünvanlı ürfan əlamətlərin izahında, yəni ikinci və üçüncü beytlərdə, onunla bağlı mətləblər kifayət qədər xatırlandı. Yalnız yada salmaq fikrilə əlavə etməliyik ki, vəhdət məqamına nail olmağın ilkin şərtı zehni, qəlbi yaxud batini bütün dünyəvi duyğulardan, mənlik və mənəmliyi hiss etmək və yada salmaqdan boşaltmaqdır(ney). Çünki aşiqin batinində ulu məhbubdan başqa heç bir anlam, hiss, hətta bir movhum xəyal olarsa rəqib və əngəl sayılar və həzrət məşuq rəqib olan yerdə zühur etməz. (rəqib olan yer xəlvət bir yer deyil və "ney" şəraiti "boşluq" tapmayıbdır.

Anlam: İnsanın iç dünyasını yaxud qəlbini – batinini və bütün təfəkkürünü maddi bağlantılardan boşaltmağa qadir olan yalnız eşqdir. Təkcə eşq aşiqlə məşuqu, vəhdət mərtəbəsində birləşdirə bilər.

Beyt 5: **Ey ki, əhli-eşqə söylərsən məlamət tərkin et,**
**Söylə kim, mümkünmüdür təğyiri-təqdiri-xuda?**

Sözlük: məlamət = sərki = danlaq = qınamaq = təhqir etmək təqdir etmək = ilahi əmrin cərəyan tapması.

Nişanə 1 – "Məlamət" - bütün hörmətlərdən çəkinmək və dünyəvi xarakteri sındırmaqdan nişanədir.

**Qeyd:** *Təbiət fəzasından xaric olmaq, təriqət və həqiqət fəzasına daxil olmağın ilk şərtidir. Demək Tanrı və təbiət başlanğıcına bağlı olan bəşər təbiətdən nə qədər uzaq olsa bir o qədər də Tanrıya yaxınlaşar (qürb), beləliklə təbiətdən uzaq insan təbii prinsiplərdən də uzaq olar, ondan təbii və adi yaşayışda tanınmış məntiqlər və qanunlarla uyğun, uyarlı paralel işlər baş verər və nəhayət təbii və qanuni ölçülərə - biçimlərə sığmaz əməllər və hərəkətlər, yaxud qeyri-təbii və qeyri-qanuni işlər onu təhqir olmağa və sərki görməyə məhkum edər.*

---

[1] Bu yaxınlığın ürfani ünvanı "qürb" dür və biz "qurban" nişanəsindən bəhs etdiyimiz vaxt bu istilah barədə məlumat verəcəyik.

**Qeyd** 1: *Məlamətçi şəxs bilər- bilməz aşiqə xidmət edir, ona görə ki: Vücudun içəri üzünün, yaxud batini həyatın dirçəlməyinin və canlanmağının ilk şərti, çöl vücudun, yaxud zahiri xarakterin inciləməyi və ufaq olmasıdır, sərkilər, vücudun yalnız çöl üzünü və şəxsiyyətin fəqət zahiri və dünyəvi cəhətini təhqir etməyə qadirdir.*

**Qeyd** 2: *Aşiq öz zahiri xarakterini yaddan çıxarmasa, məlamətlər önündə müqavimət edə və duruş gətirə bilməz, beləliklə məlamət həyatın dünyəvi cəhətini yaddaşdan silərkən, mənəvi cəhətini yüksəldir.*

**Qeyd** 3: *Aşiq istər – istəməz, sərki – dil yarası vuranları gözdən atarkən, onlardan kənar gəzməyə cəhd edər, beləliklə bir sıra qeyri məşuqdan, yaxud bir sıra hicab və maneədən kənar olaraq, xəlvət və vəhdət şəraitinə yaxınlaşır.*

**Qeyd** 4: *Yuxarıda qeyd etdiklərimiz sübut edir ki, məlamət sərki vuranların obyekt tutmuş olduqlarının əksinə iş görür.*

**Qeyd** 5: *Təbii və dünyəvi atmosferdə yaşayan hər bir insana öz məlumat və məfkurəsi qədər mərifət vermək və umumiyyətlə insanları hidayət etmək peyğəmbərlər və imamların ilahi və müqəddəs məqsədidir, bunun üçün də onlar məlamət qanunundan müstəsnadırlar.*

**Qeyd** 6: *Məlamət-zahiri xarakteri, cismi meylləri, nəhayət mənəmliyi və mənəmliyi yüyənləyərək onları qudurğanlıqdan, aşıb-daşmaqdan saxlamaq istər, halbuki peyğəmbər və imamlar hər halda nəfsə və cismə qalibdirlər və məlamət vasitələrinə möhtac deyillər.*

**Qeyd** 7: *İmam və Peyğəmbərin qeyri təbii (mənəvi) fəzaya daxil olması, duğal haldan xaric olmağa bağlı deyil, onlar vücudun çöl üzünü içəri üzlə həmcins edərkən, zahir və batini yaxud maddə və mənanı bir birinə qatıb – qarışdırıblar, beləliklə dünyada varkən dünyada yoxdurlar*[1].

**Qeyd** 8: *Məlamət sözünün bir mənası isə ələ salmaqdır və aşiq bir növ divanəliyə yetişdiyinə görə məlamətə qarşı çıxmalıdır, halbuki İmam və Peyğəmbərin ağlı kamildir və məlamət kamil ağıla yaxınlaşa bilməz.*

Nişanə 2 – "təqdir" - yuxarıda xatırlanan qeyri-təbii, yaxud mənəvi fəzanın ilahi yazısı və qanunudur.

**Qeyd**: *Bir sıra alimlər, "təqdir"i cəbrlə yanaşı, yaxud cəbrlə eyni bilərkən, onunla əlaqədar, ölçüyə sığmaz dəlil və izahlar söyləmişlər, amma müxtəlif ürfani araşdırmalar bu sözü inkar edib onu (təqdiri) təbiətin daxil və xaric üzündə, yaxud maddi və mənəvi üzərində zəruru*

---

[1] هرگز وجود حاضر و غايب شنسده ای
من در ميان جمع و دلم جای ديگر است، سعدی

*qanunlar başlığı biliblər, demək həyatın dünyəvi və çöl üzündə, ağıl və məntiq insanı qanunun tabeliyinə məcbur etdiyi kimi, onun batini və mənəvi yönlərindəki qanun isə, bəşəri hörmətə və itaətə məcbur edir, bu məcburluq fəlsəfədə, ixtiyar qarşısında ünvan edilən məcburluqdan başqadır.*

**Anlam: Eşq fəzasında ilahi əmrlə müəyyən olan qanunların biridə məlamətdir. Buna görə də məlamətdən çəkinmək mütəal məhbubun əmrindən çıxma ərəfəsindən qaçmaq, yaxud ilahi əmri tənqid etməkdən ibarətdir. Bu tənqid aşiqi kafir edən bir günahdır.**

Beyt 6: **Eşq kilki çəkdi xətt hərfi-vücudi-aşiqə**
**Kim, ola sabit həqq isbatında nəfi-maəda.**

Sözlük: Kilk=qələm, xətt çəkmək=məhv etmək=batil etmək, nəfi-ma əda=başqasını inkar etmək=məhbubdan başqasını inkar etməkdir.

Nişanə 1: "xətt çəkmək": xətt çəkmək mütəal məhbubdan başqa bir vücudu, xüsusilə aşiqin öz vücudunu fani bilərkən onu batil etmək əlaməti.

Nişanə 2 – "hərfi-vücud": eşq ilə tanış olan insana xas sifət heç bir günahla müqayisə olunmayan, bütün günahlardan üstün olan bir günah özlüyünü qurumaq və mənliyini tanımaqdır, bunun üçün də islamın ulu peyğəmbəri buyurur: "vucudəkə zənbin la yuqasə bihi zənb"[1], yəni "Ey insan, özlüyün bir günahdır ki, heç bir günahla müqayisə olmaz. Demək həzrət aşiqi silkələmək və huşa gətirmək istəyir. Olsun ki, o daha doğrusu düşünərkən və sayıq baxarkən eyni halda görə ki, malına, canına, elminə, iqtidarına və bütün vücuduna mütəal məhbub malikdir o və başqa insanlar hər cür malikiyyətdən qıraq aciz və əliboş bir məmlukdurlar [2], çünki məmluk heç bir şeyə hətta öz ixtiyar və iradəsinədə malik ola bilməz. O, malikə təslim olan bir qul, kölə olmaq istər.

**Qeyd** 1: *Aşiq damla qədəri bir şeyə malik olsa belə onda iki malik olmalıdır: bir aşiq – bir məşuq, bir damla – bir dəniz. İkilik isə, üçüncü beytdə şərh edilən vəhdət məqamı ilə tuş və uyğun gələn anlayış deyildir.*

---

[1] "Sufi kist", doktor Cavad Nurbəxş

[2] Bu şərhdə yeri gəldikdə ixtiyar – iradəsiz bir qula oxşar aşiqə biz məmluk deməliyik.

**Qeyd** 2: *Aşiq varlığını büs bütün məşuquna qurban etməlidir. O bir damla qədəri mənliyini və özlüyünü saxlasa, bir o qədər də fədakarlıqdan uzaqdır. Bəllidir ki, müzaiqə edən şəxs fədakar bir aşiq ola bilməz.*

**Qeyd** 3: *Doktor Nurbəxşin zənnimcə otuz mənzil, yaxud otuz vadidən sovuşmayan aşiq kamala çata bilməz və hədəfinə nail olmaz. Bu otuz mənzilin birincisi zahiri varlığı, yaxud mənliyi ayaqlamaq vadisindən ibarətdir. "Hər bir məzhəb və məktəb sahibi şəxsiyyət qazanmaq, yaxud bir məqam tapmaq və mənsəbə çatmaq məqsədi ilə yola qədəm qoyur. Aşiq məhbub sövdasında fənayə çatmaq üçün yollanır. Xacə Əbdullah Ənsari buyurur: "İlahi itkinlik hamıya müsibətdirsə də mənə qənimətdir."[1] Beləliklə "hərfi vücuda xətt çəkmək" adı, sanı və mənliyi, yaxud ikiliyi itirib yox etməkdən nişanədir.*

**Qeyd** 4: *Maddi dünyada özünü itirən bir bəndə mənəvi dünyada özünü tapar. Bu özlük ikinci vücud, yaxud real, ölümsüz və ilahi bir vücuddur.*

**Özün Xəlilsən, özün-özündən ayrı düşmə gəl,**
**Yanar odun içində gəz, sərin – sərin havayə bax.**[2]

Nişanə 3 – "Nəfi-maəda" - məşuq həzrətlərindən başqalarını gözdən, fikirdən, əqildən, zehndən atmaqdan nişanədir. Bunun üçün də aşiq itkinlik yolunda addımlayır, çünki o özüdə məşuqdan başqa bir vücuddur və nə qədər başqalığını başdan atmayıb bir o qədərdə ikilik tövrü əl-ayağına ilişib və buna görə də, vəhdət mərtəbəsindən, yaxud məşuqdan uzaq olmağa məhkum olacaqdır.

Anlam: Aşiqi özündən və özlüyündən ayıran eşq məşuqdan başqa müstəqil bir vücudun və bir varlığın heçə-puça çıxmasını sübut etmək istəyir.

Beyt 7: **Ey Füzuli, intəhasız zövq buldun eşqidən,**
**Böylədir hər iş ki, həqq adıyla qılsan ibtida.**

Nişanə 1 – "Zövq": mütəal məhbubun camalından şaxan cilalardır (təcəlli)[3], səmərəsi xalis ürəyə daxil olan qeybi mənalar (hal)[4] nəticəsində

---

[1] "Sufi kist" doktor Cavad Nurbəxş.

[2] Müəllifin qəsidəsindən bir beyt.

[3] Bu şərhdə ilahi cəlalər və parlamalar yaxud, əzəmət və iqtidar kimi cəlal sifətləri, həmçinin rəhmət və lütf kimi camal sifətləri "təcəlli" başlığı ilə xatırlanacaqdır.

[4] Ürəyə daxil olan sözə sığmaz mənəvi sirlər və qeybi hədiyyələr "hal" adı ilə qeyd olunacaqdır. "Hal" sözə, yazıya sığmaz bir rəhmətdir. Lakin tərif etməli və düşünməli əlamətləri var. Aşiqi keçmişdən və gələcəkdən xəbərsiz və qaib etmək, yaxud zaman

mövcud olan mənəvi müşahidə mərtəbəsinin (şühud)[1] ilkin dərəcəsidir. Zövq kamala çatanda daha zövq ünvani ilə yox demək "şurb" başlığı ilə ürfani mübahisələrə daxil olar. Beləliklə, "intəhasız zövq", "şurb" məqamından ibarətdir.

Nişanə 2 – Həqq adı: mütəal məhbubun sifətlərini təlqin edən adlarından ibarətdir.[2]

Anlam: Ey Füzuli, mütəal məhbubun müqəddəs adı ilə başlanan hər bir iş, zahiri əngəlləri – maneçilikləri aradan qaldırarkən həqiqi və batini nəticəyə, yaxud "şurb" məqamına hidayət edər.

---

işlərindən azad qılmaq deyilən əlamətlərin biridir. Beləliklə ağır, zəhmli bir hicabdan nicat tapmaq "hal" mərtəbəsindən bir əlamətdir.

[1] Mənəvi və qeybi müşahidələri yaxud mütəal məhbubun öz nuruyla zühura gələn sifətlərini "şühud" başlığı ilə qeyd etməliyik.

[2] "Ad" vücudu tanıtdıran bir sözcükdür və insan bir şeyin tanınmasına görə o şeyə ad qoyubdur, ancaq bunu da etiraf etmək gərəkdir ki, bütöv tanışlıqlar, sifət ilə mümkün olur ( bilgin insan, güclü heyvan, ağır daş və ismətli qadın, yaxud adlarda, özlərilə çəkdikləri bilgi, güclü, ağır və ismətli sifətlərlə müəyyən bir tanışlıq ifadə edilir, ancaq bunu da unutmaq olmaz ki, hər an öz daxilində bir neçə müəyyən sifət əks etdirir, beləliklə, hər ada tuş gələndə ona bağlı sifətlər qarşımıza çıxır. Məs. "Həsən" adını dinləyəndə onun savadı, işi, boyu,licimi və digər sifətləri təcəssüm tapır, buna görə də Quranın icmalçı alimlərindən bir çoxu mütəal məhbubun adlarını sifətlər biliblər və o sifətləri gah külli halda dörd yerə - bölgüyə bölərkən "Ummihati İsmə" (Adların anası) yaxud: əvvəl, axır, zahir, batin demişlər, gah da zati, sifati, əfali (fellərə mərbut) kəlmələrlə qeyd etmişlər.

## Q Ə Z Ə L   2

**(1) Ya mən əhat elmukəl əşyaə kulləha,**
**Nə ibtida sənə mütəsəvvir, nə intiha.**

**(2) Kim versə can yolunda bulur xaki-məqdəmin,**
**Guya ki, xak-rahinədir nəqdi-can bəha.**

**(3) Sənsən qılan məzahiri-ümmidü bim edib ,**
**Musanı elm gənci, əsasını əjdəha.**

**(4) Səndən bulubdur Əhmədi mürsəl məqami-qürb**
**Təhsini "ya" vü "sin" ilə, təşrifi "ta" vü "ha".**

**(5) Yəqubdə nişaneyi-şövqün qəmü ələm,**
**Yusifdə nəşeyi-nəzərin behcətü bəha.**

**(6) Bulmazdı qəhrin açmasa xani-siyasətin,**
**"Həl min məzid" loqməsina duzəx iştəha.**

**(7) Yarəb, bəlayi-qeydə Füzuli əsirdir,**
**Ol bidili bu dami-küdurətdən et rəha.**

Beyt 1: **Ya mən əhat elmukəl əşyaə kulləha,**
**Nə ibtida sənə mutəsəvvir, nə intiha.**

Sözlük: ya mən = ey o şəxs ki; əhatə = əhatə qıldı; Elmukə = sənin elmin; əşyaə = şeyləri; kull = tamam; ibtida = başlanğıc; mutəsəvvir = gümana gəlmiş = mümkün = surət qəbul etmiş = obrazlaşmış; intiha = son, axır.

Nişanə 1 – "ya mən" - mütəal məhbubu elm sifəti ilə çağırmadan nişanədir, çünki o həzrətin həqiqəti və zatı əqlə, elmə sığmaz bir həqiqətdir.

Nişanə 2 – "əhat" - bir mütləq malikiyyətdən və mükəmməl əhatə etmədən nişanədir. Əhat mütəal məhbubun elm sifəti olarkən[1] o həzrətin sifətini isə zatı ilə paralel eyham edir.

**Qeyd** 1: *Mütəal məhbub yeganə malikdir, o malikdən başqa bütün tapıntılar, xüsusilə, insan "məmluk" dir.*[2] *Məmluk hər yerdə olarsa malikin mülkündən kənar ola bilməz.*

**Qeyd** 2: *Mütəal məhbub yeganə alimdir, beləliklə bütün insanların yaxud bütün məmlukların elmindən, hətta niyyətindən xəbərdardır.*

**Qeyd** 3: *Dairənin mərkəzi nöqtəsi onun çevrəsindən qıraq ola bilmədiyi kimi məmlukun elmi, nəzəri, fikri, hətta niyyəti də mütəal malikin xəbər dairəsindən kənar ola bilməz. Beləliklə, "əhat" nişanəsi bu şərif ayəyə əsaslanır ki, Quranda buyurulur: "...Əla İlahu bikulli şey in muhit>>* [3] *(bilin və xəbərdar olun ki, mütəal məhbub ilə hər bir şeyi əhatələnmişdir)*[4].

Nişanə 3 – İkinci misra həzrəti-məşuqun əzəli və əbədi olduğuna işarə edir.

**Qeyd** 1: *"Əzəl" mütəal məhbubun adlarından yaxud sifətlərindən biridir. Başlanışı olmayana "əzəl" deyirlər. Əzəl ilahi feyzlərin davamlanma şərtidir. Əzəl ürfan araşdırmalarından məlum olduğu kimi maddə müddətindən üstün bir məna yağdıran ilahi zühurlar başlığıdır.* [5]

**Qeyd** 2: *"Əbəd", zamanın gələcək tərəfində fənaya məruz qalmaz halda davam edən bir həyatdan nişanədir. Əzəlin başlanışı və əbədin sonu olmadığı üçün, onların ikisi də zamanın məhv olmasına nişanədir.* [6]

---

[1] İkinci sifət, yaxud sifətin sifəti.
[2] Birinci qəzəlin altıncı beytinə bax.
[3] Quran "Fussilət" surəsi, ayə 54.
[4] "Şey" yalnız maddi vücudlardan ibarət deyil, məfkurələr, anlamlar, mənalar və təsəvvürlər də "şey"dirlər.
[5] Fərhənge estelahat və təbirati ürfani
[6] Yenə orada.

**Anlam: Ey mehriban məhbub, sənin mütləq aləm və malik olduğun sübut edir ki, bütün varlığın əvvəli, axırı, zahiri və batini sənə həm məlum, həm də məğlubdur və qalib, habelə, əzəli və əbədi varlıq yalnız sənsən.**

**Qeyd** 1: *Beyt insanın aciz və möhtaclığına eyham edir və başa salmaq istəyir ki, insanın nə qədər mülkü – malı çox olsa belə bir o qədər də o, məşuq həzrətlərinə möhtacdır və mülk, mal onu mütəal məhbub mülkündə məmluk və qul olmaqdan kənar edə bilməz. Beləliklə, onun nə qədər elmi dərinləşsə bir o qədər də çox mənəvi məlumata möhtac olmalıdır. Qəribə burasıdır ki, o mənəvi tanışlıqları iddia edən bəşər, fiziki dünyadan başqasını mümkünsüz bilir, hətta zahiri və maddi dünyaya da tam mərifət tapmaqdan acizdir. Çünki onun ixtiyarındakı mərifət əldə edən hissi və cismi vasitələr ( göz, qulaq, ...)*[1] *məhdud və naqis olmadan əlavə fənayə məruz qalan səbəblərdirlər. Beləliklə, alimlik və maliklik iddiası ilə dünyəvi mərifətlərə məğrurluq, insanı mənəvi mərtəbələrdən məhrum edən bir xəstəlikdir.*

**Qeyd** 2: *İkinci misra "dünyanın necə və nə vaxt yaranmasının əqlə və elmə sığmazlığına eyham edir" və onu "Şopenhauer" fəlsəfəsinə bir başlıq sayır.*

**Qeyd** 3: *Yuxarıda xatırladığımız iki qeyd insanı ömür boyu aciz bilərkən, onu öz yoxsulluğunu anmağa və bunu etiraf etməyə çağırır. Bu yoxsulluq, yaxud bu fağırlıq ürfani fağırlığa (fəqr) müqqədimədir. İslamın ulu məqamlı Peyğəmbəri bu fağırlığa öyünərkən buyurur: "Əlfəqri fəcri"*[2].

Beyt 2: **Kim versə can yolunda bulur xaki-məqdəmin,**
**Guya ki, xaki-rahinədir nəqdi-can bəha.**

Sözlük: xak = torpaq, məqdəm = addım izi = səfərdən dış zamanı = gəlmək vaxtı, rah = yol, nəqd = pul = sərvət, kapital, bəha = qiymət = qiymətləndirmək.

**Nişanə** – "Xak":

A: Xak vəhdət mülkünün ərəfəsindən nişanədir.Bu ərəfənin dəyərini tanımaqdan ötrü candan keçmək lazım gəlir.

B: Mənəvi həyata yaxınlaşmağın ilk şərti dünyəvi həyatdan uzaqlaşmaqdır.

---

[1] "Seyri-hikmət dər Avropa", Muhəmməd Əli Foruği, cild 3, səh. 78.

[2] Fərhənge estelahat və təbirati ürfani

Anlam: Ey həkim-məhbub,sənin astanının ətrini öz varlığından keçən aşiq düşünə bilər.

**Qeyd**: *Qurbanlıq məqamına hazırlaşan bir aşiq məşuq ərəfəsinə yaxınlıq imkanı tapar.*

Beyt 3: **Sənsən qılan məzahiri-ümmidü bim edib,**
**Musanı elm gənci, əsasını əjdəha.**

Sözlük: Məzahir = zühur mövqeyyətləri = tamaşagahlar = təcəllilər mövqeyyəti; ümmid = ümid; bim = qorxu = dəşhət; gənc = xəzinə.

Nişanə 1 – "ümmidü bim" aşiqi tərbiyə edərkən onu yetişdirən səbəblərdən nişanədir. Ümid - zühur məqamının şirinlik nişanəsi, bim - hicran mövqeyyətinin acınacaqlı əlamətidir.

**Qeyd**: *"ümmidü bim" - vəfa və cəfa şəraitinin meyvələridir və sonradan izah olacaqdır.*

Nişanə 2 – elm gənci - mənəvi elmdən nişanə olduğuna görə ilahi seyrlərə ürək bağlayanları ruhani həqiqətlərlə, həm də ülvi aləm ilə tanış edən bir məqamdır. [1] Bu tanışlığa nailiyyət tapan bir şəxs bəndəlik məqamını düşünməlidir. Bunun üçün də mütəal məşuq İslam Peyğəmbərini bu məqamda bəyənmişdir və müsəlmanlar isə o bəndəlik məqamına öz namazlarında şəhadət verirlər. (Əşhədu Ənnə Muhəmmədən Əbduhu və Rəsuluhu)

Anlam: Ey həkim və mehriban məhbub, sənin qəhr və qəzəbin rəhmətin kimi hikmətilə, xeyr və xoş aqibətlə bağlı gözəl və şirindir. Bunun üçün də Həzrəti Musanın mənəvi vədələri lazım olduğu əndazədə əsadan əjdaha törətməsi və bim yaratmasıda gərəklidir və burada bir tərəfdən qəzəb, başqa yöndən rəhmət obyektiv sayılmışdır.

**Qeyd**: *Batini inkişafların zahiri ibtilalarla əlaqədar olması ürfani təzad formasında, yaxud vəhdət mərtəbəsində yaxud digər ürfani terminlərdə yerbəyer qeyd və izah olunmalıdır.*

Beyt 4: **Səndən bulubdur Əhməd-Mürsəl məqami-qürb,**
**Təhsini- "ya" vü "sin" ilə təşrif "Ta" vü "ha".**

Sözlük: mürsəl = göndərilmiş = ilahi kitab gətirən Peyğəmbər; Qürb = yaxınlıq = mərtəbə = əzəmət; Təhsin = alqış = gözəlləşdirmə = əzəmət bağışlama; Təşrif = şərəfləndirmək = yüksəltmək .

---

[1] Göstərilən kitab.

Nişanə 1 – Qürb yaxınlaşma vasitəsilə qiymətlənmə nişanəsidir.

**Qeyd** 1: *Bütün səbəblər, qüvvələr, ilgilər, malikiyyətlər və s. Mütəal məhbubdan başqa etibarlar, hətta başdakı fikirlər, zehni doldurmuş elmlər və təcrübələrin ayrı-ayrılıqda öz qədərincə məşuqla aşiq arasında fasilə yaradan əngəllər və hicablardan ibarətdirlər. Bu əngəllərin hamısı aradan gedərsə fasilədə tamamilə məhv olmalıdır.* [1]

Bu məhvlik "qürb" məqamının sonucudur. Habelə, bu sonuc, vəhdət mülkünə daxil olarkən eşq dənizində batmaqdan ibarətdir.

**Qeyd** 2: *"qürb", qurban mənasını da ifadə edən bir başlıqdır. Demək bir heyvan qurban olmaqla qida olarkən, insanın varlığında, canında məhv olur, bir insan da şəhadət və qurbanlıq vasitəsilə bütün vücudunu damla- damla vəhdət dənizinə qatışdırırkən insan görkəmini itirir və ilahi surətini tapır.*

**Qeyd** 3: *Bir çox mənaşünas alimlər itaət və ibadəti məqamının səbəb sərmayəsi bilmişlər.*

Nişanə 2 – "YA " və "SİN " - Qurani Kərimin 36- cı surəsindən nişanədir. Quran icmalçılarının bir çoxu yasini "ya seyyidəl mürsəlin" ibarəsinin xülasəsi bilirlər və ümumən dolğun bir başlığın açıqlamasında önəmli bir mətləbdə ortaq olarkən demişlər ki: İslam Peğəmbərinin elm və əqlindən üstün əzəmət və həqiqəti Quranın bir çox surələrində, özəlliklə isə yasin surəsində gizlənmişdir və bu surənin "yasin" yaxud, "ya seyyidəl mursəlin" olduğu o səbəbdəndir.

Nişanə 3 – "Ta" vü "ha" – Qurani-Məcidin iyirminci surəsinin adı və bir neçə dərin və mənəvi sirrin nişanəsidir. Bu sirrlər aşağıdakılardan ibarətdir:

A – Quran təfsirçilərindən bir çoxu belə zənn edirlər ki, "ta" - tul sözündən əlamətdir və tul - ehsan, ucalıq və ululuq mənalarını daşıyan bir sözdür.

B – "Ta" İslamın ulu məqamlı Peyğəmbəri Həzrəti-Muhəmməd Mustafanın (s) doğallığından, adət və əxlaqından törənmiş qapalı sirdir.

P – "Ta" bir olan məhbubun yeganəliyinə sitayiş edən aşiqlərin və möminlərin tələbindən nişanədir.

---

[1] Allahdan başqasından ayrılmaq, dünya nemətlərindən özünü məhrum etmə, yaxud vücud nemətini intihar ilə aradan qaldırma deyil, bəlkə bütün xatırladığımız nemətlərin vücudunu Allah nuruna bağlı bilmək və Allah camalına güzgü tanımaq, hər bir yaranmışda yaradanın ətrini və cilvəsini dərk etmədən ibarətdir. Xülasə, Allahdan başqanı müstəqil bilməyən hər arif bütün yaranmışları birbəbir məna yolunda xadim tutarkən onların birini işçi, digərini yük aparan, başqasını qul və qeyrisini başqa bir xidmətçi etməklə yükünü məqsədə çatdırar.

T – "Ta" behişt əhlinin "tərəb" nişanəsidir. Bu nişanə batinin böyük sevincindən və ürəyin "bəst" məqamından əlamətdir və həqiqətin kənarında toxdamaqla zahir olar.[1]

Nişanə 4 – "Ha" - bir neçə rəmzdən nişanədir:

A – ha həqiqəti inkar edən şəxslərin "hərəbə" nişanəsidir və "hərəbə" sözünün anlamı həqdən qaçmaqdır.

B – "hərəb" cəhənnəm əhlinin "həvan" nişanəsidir və bu istilah zəlillikdən – alçaqlıqdan bir əlamətdir. [2]

Anlam: Ey mütəal məhbub, İslam Peyğəmbərini "yasin" məqamına yüksəldən və onu "taha" dövlətinə nail edən yalnız sənsən. Bu məqam, dünyəvi bilgiləri – istəkləri o həzrətin ürəyindən qopardı və o, qəlbinə yalnız səni hakim etdi (Peyğəmbər qürb vasitəsilə vəhdətə, yaxud Sənə qovuşub qatışdı).

Beyt 5: **Yaqubdə nişaneyi-şövqün qəmü ələm,**
**Yusifdə nəşeyi-nəzərin behcətü bəha.**

Sözlük: ələm = qəm = qüssə = dərd; Nəşe = nə`şə = şadlıq = dirçəlmək = mənəvi sərxoşluq = yenidən tapılmaq = tərbiyə görmək = daxili toxluq; Behcət = şadlıq = sevinc = gözəllik = vüsal ərəfəsində yaranan ruhiyyə; Bəha = kamal = əzəmət = zinət = gözəllik = parıltı = işıq = nur və ziya.

Nişanə 1 – A - şövq mərifətin meyvəsidir, bu səmərə aşiqin batininə daxil olan dünyəvi ilgiləri və məhbubdan başqa mövcud duyğuları yandırıb kül edən tələb atəşidir.

Nişanə 2 – "Qəm və ələm": aşiq qəlbinin axtarış (tələb) yolunda qərarsızlığından ibarətdir.

**Qeyd**: *Qərar yaxud sakinlik mərifətdən, tələbdən, şövqdən və digər batini və İlahi əhvaldan kənara düşmək və heyvan halətində yaşamaqdan ibarətdir*.

B – şövq-məhəbbət meyvəsidir.

P – şövq-məşuq cəmalını aşiq gözündə görmək istəyən tələbdən ibarətdir. [3]

Nişanə 3 – Behcət və bəha "qəbz" dustaqlığından çıxarkən "behsət" üfüqünə daxil olmaqdan əlamətdir.

---

[1] 5 – ci beytə müraciət etməli.

[2] "Təfsiri-nisfi", I cild, səh. 437

[3] " Şövq" müxtəlif mərtəbələrlə yerbəyer qeyd olunacaqdır.

**Qeyd** 1: *"qəbz və bəst" iki ürfan məqamının ünvanıdır. Qəbz üçüncü beytdə xatırlanan "bim" ilə, "bəst" isə "ümid" ilə bərabərdir. Qəbz bütün dünyəvi həzzlərin kökünü ürəkdən qoparmaq və ürəyi boşaltmadan nişanədir. "Bəst" mənəvi həzzləri və şadlıqları müşahidə nurunda boşalmış ürəyə doldurmaq əlamətidir. Boş ürək sözünə gəldikdəsə əlavə etmək və yada salmaq məqsədi ilə əlavə etməliyik ki, eşq sahəsində ümumi məhəbbət şəraitini tamamlayan bir salik özəl məhəbbət məqamına nail olarkən ürək və əhval sahiblərinin sırasına qoşular. Bu nailiyyətlə yanaşı "qəbz" lər onun ürəyinə şıdırğı yağış kimi yağarkən, dünyəvi sifətlərini və ilgilərini büstbütün selə-suya verərkən, ürəyini tamamilə boşaldar.*[1] *Belə bir boş ürək müşahidə (şühud) nuruna dolarkən "bəst" mövqeyyətinə nail olar.*

**Qeyd** 2: *Ürəyin qəbz və bəst tapması yalnız mütəal məhbubun iradəsinə bağlıdır və bəndənin çalışması ilə baş tutan bir iş deyil.*

**Qeyd** 3: *İnsanın həqiqi özgünlüyünə diqqət yetirə bilsək onu şübhəsiz mənəvi və ilahi mövcud kimi tanıyarıq, ancaq bu mövcudun bir neçə gün maddi və məcazi dünyaya süqut etməsi onun vücudunu istər – istəməz maddi və dünyəvi əlaqələr – ilgilərlə bulaşıb ləkələndiribdir, həmin qat – qat maddi ləkələri mənəvi vücuddan qoparan sıxma boğmaların ürfan ünvanı "qəbz" dir.*

**Qeyd** 4: *Bir şeyin içində yer tutan digər izafi şeylər, yaxud qatqılar onu sıxçalamaqla eşiyə tullanan kimi ürəyin içinə daxil olar, dünyəvi sifətlər və əlaqələr isə, qəbz sıxıncı ilə eşiyə atılar.*

**Qeyd** 5: *"bəst" ürəyin genişlik nişanəsidir və o dünyəvi qatqılardan boşalmaqla mümkün olur.*

**Qeyd** 6: *Şühud və hüzur nuruna nail olmaq bəst mərtəbəsinin əsas şərtidir.*

Nişanə 4: nəzər - iki mühüm yer tutan məzmunla iki ürfan başlığından ibarətdir: biri insani nəzər, ikincisi rəhmani nəzər (insani baxış – rəhmani baxış).

4/1 Dünyəvi və şəxsi etibarların və zahiri özəlliklərin gözə xoş çarpması insani nəzərdən ibarətdir. İnsani nəzər qürur yaradan bir nəzər olduğuna görə rəhmani nəzər qarşısında birinci maneədir.

4/2 Rəhmani nəzər-yalnız mütəal məhbubun öz bəndəsinə təvəccöh qılması, insani nəzərin, yaxud zahiri mənliyin məhv olması ilə şərtlənir.

---

[1] Qəzəl 1, beyt 2.

Anlam: Ey həkim, Həzrəti-Yaqubun alovlu həsrəti və Həzrəti-Yusifin oynaq hökmranlığı onların mənəvi yetkinliyinə aid bir belə sirrdir ki, yalnız sənin hikmətinlə bağlıdır.

**Qeyd**: *Salik qarşısında baş qaldıran acı, yaxud şirin olayların hər birinin hikməti və illəti bəlli olsa da, olmasa da vacibliyi bəllidir. Onun üçün də, mənəvi məktəblərin dərsi-məşqi acı, yaxud şirin hadisələrdən ibarətdir.*

Beyt 6: **Bulmazdı qəhrin açmasa xani-siyasətin,**
**"Həl min məzid" loğməsinə duzəx iştəha.**

Sözlük: Xan = süfrə = qida; Siyasət = ədalət = cəza = tədbir = cəzalandırmaq; Həl mən məzid = hələ bundan da əlavə var? [1]; Loğma = qida = bir tikə qida = bir dəfə boğazdan keçən qida; Duzəx = cəhənnəm.

Nişanə: "xani-siyasət" qadir və adil məbudun "qəhr" sifətinin "lütf" sifəti kimi məhdudsuzluğundan nişanədir .

Anlam: Əgər zalimlər və kafirlər cəhənnəmdə cəzalanmasalar qadir məbudun kamil tədbiri və hər bir sifətinin məhdudsuzluğu məlum olmaz.

**Qeyd:** *Şühud nemətindən məhrum olmaq, yaxud həsrət atəşində yanmaq aşiqlərə xas cəhənnəmdir. Beləliklə, beyt iddialı aşiqləri (müddəi), mənliyini ayaqlamayan salikləri eşq hökmü ilə cəzalanmaqdan və həsrət cəhənnəmində yanmaqdan xəbərdar edir.*

Beyt 7: **Yarəbb bəlayi-qeydə Fizuli əsiridir,**
**Ol bidili bu dami-küdurətdən et rəha,**

Sözlük: Qeyd = həbs = məhbəsdə qalmaq; Rəha = nicat tapmış = xilas olmuş.

Nişanə 1 – "qeyd" maddi vücud torunda, dünyəvi məhdud yaşayışda ilişib qalmadan nişanədir.

**Qeyd** 1: *Dünyəvi həyatda daimi qəbz və bəst mümkün olmadığından, dünyaya dustaqxana, ya həbsxana demişlər, demək bəstlərin davamı olmayan kimi qəbzlərin də davamı yoxdur. Bunun üçün də dünyəvi yaşayışda hicran vüsalın arxasında olan kimi, vüsal da hicranın kölgəsindədir. Təsadüfü deyil ki, ariflər və filosoflar hər qəbzi bir bəstə və hər bəsti bir qəbzə bağlı bilərkən şəraitin çevrilişini və işlərin get – qayıt formasını təbii və mənəvi bir proses adlandırmışlar.*

---

[1] Quran, "Qaf"surəsi, ayə 30" "يوم نقول لجهنمَ هل امتلات و تقولُ هل مِن مزيد" Qadir Allah buyurur: (O gün, yəni qiyamət günü cəhənnəmə deyərik: Aya kafirlər ilə doldun? Cavab verər ki, bir belədən əlavə də var? Yəni hələ doymamışam.)

**Qeyd** 2: *Dünya məhdud olduğuna görə məhbəs nişanəsidir.*

**Qeyd** 3: *Dünya məhdud olduğuna görə ölümsüz həyatdan xəbərsizlik nişanəsidir.*

**Qeyd** 4: *Mənəvi dünya mənəvi məhdud kimi naməhdud və əbədidir.*

Nəticə: Daim bir vüsalın ilkin şərti daimi hicrandır və daimi hicran dünyadan biryolluq ayrılmaq əlamətidir. Bunun üçün də ölüm ariflərin muştuluqçusudur, çünki ölüm dünyəvi sinirləri aşmaq, məhdudluğu sovuşmaq və sonsuzluq qapısını açmaq əlamətidir.

**Qeyd** 5: *"Aqamdes" və "Turufunyus" əzəmətli bir ibadətgah binasını tamamlayan gecə, yatmazdan əvvəl mütəal Allahdan yaxşı bir yazı və xeyrli bir aqibət tələb etdilər və gecə yatıb səhər durmadılar... "Argus" kahinəsinin oğlanları gördülər ki, anaları yubanıb və atı faytona bağlamalaq və yaraqlanmaq çox vaxt aparmalıdır. Özlərini fayona bağlayarkən ananı vaxrlı – vaxtında ibadətgaha çatdırdılar, ana əllərini göyə açaraq duaya məşqul oldu və onlara yararlı bir zəhmət haqqı tələb etdi. Onlar gecə yatdılar və səhər durmadılar.*[1] *Beləliklə məlum olur ki, ölüm aşiqi ölümsüzlüyə, ülvi və mənəvi aləmə, canan mülkünə köçürən bir nemətdir.*

**Qeyd** 6: *Yuxarıda xatıladığımız mətləb İslam Peyğəmbərinin "əldünya sicn mumin" buyurduğunu açıq izah edir.*

Nişanə 2 – Əsir - dünya məhbəsində və bədən çərçivəsində ilişib aciz qalmış insandır.

Nişanə 3 – Bidil - zahiri vücudu dünya həbsində və batini varlığı axirət şövqündə çırpınan aşiqdən əlamətdir.

**Qeyd** 1: *Bütün maddi yaranmışlar və nəhayət maddi dünya küdurət ilə qatqı və eynidir. Beləliklə, maddə qara sifətlərdən (küdurətdən) ayrılmaz olduğuna görə, məna qarşısında qabaran, bir məna və qalın bir hicabdır.*

**Qeyd** 2: *Küdurət-səfa məqamının müxalifi və əksidir. Mənəvi əhvalat və ilahi zövqlərdən başqa hər nə varsa maddi olduğuna görə küdurət ilə sıx bağlı, yaxud eynidir. Belə bir küdurəti, yaxud bütün dünyəvi qaranlıqları ürəkdən qoparmaq səfa məqamına nail olmanın ilk şərtidir. Beləliklə, küdurət səfa qarşısında dikəlmiş bir maneədir.*

**Qeyd** 3: *İnkişaf və müşahidə (şühud) məqamının nura bağlı olduğu sübut edir ki, küdurət şühud mərtəbəsinə də mane olur. Çünki küdurət nurun ziddidir.*[2]

---

[1] "Dovreyi-asari-Əflatun", cild 4, səh. 2456
[2] Qəzəl 1, beyt 1.

Anlam: Ey mehriban məhbub, Fizulini maddi vücud və dünyəvi küdurətdən xilas edərək onu öz nurunla müşahidə (şühud) nemətinə nail et.

## QƏZƏL 3

**(1) Ya Rəbb, həmişə lütfünü et rəhnüma mənə,**
**Göstərmə ol təriqi ki, yetməz sənə, mənə.**

**(2) Qət eylə aşinalığım ondan ki, qeyrdir,**
**Ancaq öz aşinaların et aşina mənə.**

**(3) Bir yolda sabit et qədəmi-etibarımı**
**Kim, rəhbəre-şəriət ola müqtəda mənə.**

**(4) Yox məndə bir əməl sənə şayəstə, ah, əgər**
**Əmalimə görə verə ədlin cəza mənə**

**(5) Xoffü xətadə müztəribəm, var ümid kim,**
**Lütfün verə bəşarəti-əfvü-əta mənə.**

**(6) Mən bilməzəm mənə gərəkin, sən həkimsən,**
**Mən eylə, vermə hər nə gərəkməz sənə mənə.**

**(7) Oldur mənə murad ki, oldur sənə murad,**
**Haşa ki, səndən özgə ola müddəa mənə.**

**(8) Həbsi-həvadə qoyma Fizulisifət əsir,**
**Ya Rəbb, hidayət eylə təriqi-fəna mənə.**

Beyt: 1 **Ya Rəbb, həmişə lütfünü et rəhnüma məna,**
**Göstərmə ol təriqi ki, yetməz səna, məna.**

Sözlük: rəhnüma – yolgöstərən, yol bələdçisi; səna – parlaqlıq, işıq, ucalıq, yüksəlmək.

Nişanə 1 – "Lütf":

A. Lütf – aşıqi mənəvi müşahidə (şühud) məqamına yetişdirən irfan tərbiyəsindən əlamətdir.[1]

B. Lütf – incəlmək və durulaşmaq əlamətidir. Duru və incə qatqısız olduğuna görə, həm bəsitlik və mücərrədlik əlamətidir, həm də nüfuzdan nişanədir.

C. Görünməz aləm bəsit və mücərrəd olduğuna görə, lütf-mənayə qovuşmağın və qeyb ilə tanışlığın əlamətidir.

D. Maddi maneələrə, xüsusilə cisim qatlarına nüfuz etmə və onlardan sovuşma, mənəvi aləmə yol açmağın əsas şərti olduğuna görə yenə də lütf, yaxud nüfuz qeyb aləminə daxil olmaqdan nişanədir.

Nişanə 2 – "Rəhnüma": rəhnüma bu betdə:

A. Lütf nişanəsini izah edən sifət əlamətidir.

B. İrfan tərbiyəsi vasitəsilə maddi dünyadan qopub qırılma və mənəvi atmosferə qanad açmaqdan nişənədir.

Nişanə 3 – "Səna":

A. Səna - nur məqamına nailiyyət tapmadan nişanədir.[2]

B. Maddənin quruluşu, küdurətlə[3] qatqı olduğuna görə, maddi dünyadan "səna" mərtəbəsini ummaq, təzada məruz qalmaqla bərabərdir, bunun üçün də nur nailiyyətinin ilk şərti küdurət, dərisini soymaq, yaxud dünya bağlantılarını qırmaqdan ibarətdir.

C. "Səna" - məna[4] zirvəsinə yüksəlmək və mərifət səmasında qanad açmadan nişanədir. Bunu nəzərə alsaq ki, zirvəyə ucalmaq və səmada qanadlanmaq qıfıllanmış qol-qanadla mümkünsüz bir təsəvvürdür, dünyəvi ilgilər və istəklər bağlantılarını qırıb-tökmək təkrarən ifadə olunur.

D. "Səna" işıq və nur saçmaq nişanəsi olduğuna görə müşahidə (şühud) məqamının birinci şərtidir. Bunun üçün də səna maddə və təbiət

---

[1] Fərhəngi-istilahat və təbirati-irfani.
[2] Qəzəl 1, beyt 1
[3] Bu şərhdəki "küdurət" sözü maddi və dünyəvi qaranlıqdan ibarətdir.
[4] "Məna" sözü, mənəvi əhval və aləmdən nişanədir.

küdurətinin qat-qat soyulub atılmasını eyham edir, çünki küdurət şühud nurunun birinci maneəsidir.

**Qeyd**: *Təbiət qatlarını soymaq və cisim bağlantılarını qırmaq maddi ilgiləri atarkən mənəvi istəkləri tutmaqdan ibarətdir.*

**Anlam: Ey mehriban məhbub, məcazi küdurətlər qatlarında, dustaq olmuş həqiqi vücudumu Sənin lütfünlə azad etmək və şühud nuruna çatmaq istəyirəm.**

Beyt: 2 **Qət eylə aşinalığım ondan ki, qeyrdir,**
**Ancaq öz aşinaların et aşina mənа.**

Nişanə 1 – "Qət":

A: Vəhdət və yeganəliyin yalnız bir olan mütəal məhbub həzrətlərinə həsr edilməsi, o həzrətdən başqalarının "kəsrət"lə bağlılığını sübut edir. Kəsrət qət nişanəsində iki element, yaxud iki durumlu mürəkkəblik əlamətidir, ulduzlar, planetlər, molekullar büsbütün canlı-cansız yaranmışlar, hətta eşq və nifrət kimi zehni anlayışlar, yaz-yay, gecə-gündüz kimi təbii parçalar, hətta təsəvvürlər və məfkürələr, kəsrət tərkibində, heç olmazsa ikiliklə mürəkkəbləşiblər. Şərif ayə bu mürəkkəbləşmədən "əzvac"[1] başlığıyla[2], irfan, zahir-batin adı ilə ədəbiyyat, yer-göy ünvanı ilə fəlsəfə "əzdad" termini ilə[3] mötəbər faktlarla müxtəlif izahlara gətirib çıxarır.

Beləliklə, hündür-alçaq, işıq-qaranlıq, gizli-açıq, dost-düşmən, incə-qalın, əyri-düz və habelə "əzdad" baxımını təsdiq edən yüzlərcə digər nümunələr, "hər şeyin öz ziddi" (əksi) vasitəsilə tanınmağını təsdiq edərək, mütəal məhbubun ziddi (əksi) olmamağı, Onun həqiqətinə mərifət yetirməyi mümkünsüz bilmişlər.

B. Əzvac, yaxud qoşa vəziyyətli bir element, bir anlam və bir təsəvvür və ... bir-bir mürəkkəblikdən çıxaraq müstəqillik tapmasa tanınmaq imkanını tapa bilməz.

---

[1] Əzvac – zovclar – qoşalar

[2] سُبْحَانَ الَّذِي خَلَقَ الْأَزْوَاجَ كُلَّهَا مِمَّا تُنبِتُ الْأَرْضُ وَمِنْ أَنفُسِهِمْ وَمِمَّا لَا يَعْلَمُونَ Yerin yetişdirdiklərindən, onların (insanların) özlərindən və bilmədiklərindən (erkək və dişi olmaqla) cütlər yaradan Allah pakdır, müqəddəsdir! (Eyibsiz və nöqsansızdır!) (Yasin, 36)

[3] İnsanların, heyvanların və bitkilərin qoşa-qoşa yaranması, onlara doğum imkanı yaradarkən, əzvacı bəzi cəhətdən əzdadla paralelləşdirir.

Nəticə: Əzvac və əzdad baxımı vəsl mərtəbəsilə tanışlığı qət mərhələsini tanımağın şərti bilir[1]. Qət özü isə təkliyində ikiyönlü bir mövqeiyyətdir:

A. Qət - dünyəvi ilgilər və maddi istəklərin kökünü ürəkdən qırıb-qoparmaq və nəhayət maddi həyatı atmaq və mənəvi həyata çatmaq nişanəsidir (mənəvi ləzzətləri dadmaq). Bu məqsədə çatmaq yaxud bu vüsal iki səmərəli bir mövqeiyyətdir:

Yaxınlıq, ya qürb, 2) Müşahidə, ya şühud.

Yaxınlıq iki şeyin, ya iki şəxsin arasındakı fasilənin yox dərəcəsinə çatmasından ibarətdir. Beləliklə, yaxınlıq yenə ikilikdən - "kəsrətdən" nişanədir.

**Qeyd:** *Vüsal ən böyük yaxınlıqdan ibarətdir.*

Müşahidə: Ərəb dilində "müfailə" bəhrində düzəlmiş sözcükdür, "müqabilə", yaxud üz-üzə baxmaq – danışmaq, yaxud ortaqlaşmaq mənasını ifadə edir. Demək müşahidə iki yönlü bir feldir, ikidən əlavəsini tələb edən həqiqətdir (gülüşmə-vuruşma). Müşahidə müfailə bəhrində olduğuna görə qoşalığı göstərir (məsələn aşiqin məşuqa baxması, bir halda ki, aşiq başqa və məşuq başqadır).

**Qeyd**: *Ürfan terminində aşiq, yaxud nəzarət edən "şahid", məşuq yaxud nəzarət olunan "məşhuddur".*

"Qət" aşiqin özünü özündən qoparan mərhələdən nişanədir. Bu mərhələdə qət mükəmməl olarkən aşiqi məşuq xəyalında itirib - batırar (fəna) və nəhayət ikiliyi aradan qaldırar (vəhdət).

**Nə qədri mən dedin mənə, təlanı satdın ahənə,**
**Uzun hicabdır sənə, hicabı at liqayə bax**[2]

Nişanə 2 – "Aşnalıq": aşnalıq dünyəvi maraqlara mayil olmaqdan nişanədir.

**Qeyd:** *Dünyəvi maraqlar ikilikdən* aşiqin mürəkkəblik, yaxud güclü "kəsrət" yaradan səbəbləridir.

Nişanə 3 – "Aşinalar":

A. Mütəal məhbubun ərəfəsindən feyz gətirən vasitələrindən nişanədir.

B. İnsani bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəldən mürşüdlərdən və liderlərdən nişanədir.

**Anlam: Ey mehriban məhbub, məni "qət" mövqeiyyətində səbr və mərifət tapmaqla vəsl mövqeiyyətinə qovuşdur.**

---

[1] Əzvac və əzdadın vəsl və hicr ilə əlaqədar geniş izahı vardır.
[2] Müəllifin qəzəlindən bir beyt

Beyt 3: **Bir yolda sabit et qədəmi-etibarımı**
**Kim, rəhbəre-şəriət ola müqtəda mənə.**

*Sözlük:* Müqtəda = rəhbər = başçıl = pişnəmaz = lider.

Anlam: Dünya "müamilə" meydanı olduğuna görə bütün dünyəvi kainat, yerdəki fenomenlər, səmavi kürələr, canlı-cansız mövcudlar irili-xırdalı bir göz qırpımı qədər sabit qalmayıb, daima dəyişilmək prinsipini qəbul edərək[1] dalbadal ilk durumunu itirirkən yeni bir vəziyyət ələ almaqla dünyanın alqı-satqı (müamilə) qanunundan müstəsna ola bilməzliklərini sübut edirlər. Maddi kainat və məcazi fenomenlər kimi mənəvi ruhiyyələr, məfkürələr, cövhərlər, mahiyyətlər, xülasə batinlə ilgili olan hallar isə müamilə meydanından kənar deyillər. Bunu nəzərə alsaq ki, kapital (sərmayə) olmayan yerdə müamilə mümkünsüz olar, mənəvi hallara yaxud ilahi müamilələrə kapitalsız qurşanmaq da mövhumatçılıqdan başqa bir şey ola bilməz. İrfana bağlı halların kitab, sinif, məktəb və müəllim gücünə təhsil etməsinin və eşqi məşq ilə qazanmağın yersiz bir iddia olduğu aydın və düzgündür, amma bunu da dəqiq bilmək gərəkdir ki, bir insana müftə və kapitalsız irfani bir mərtəbə bağışlamaq, başqa insanları məhrum qılmaq onlar üçün ədalətsizliyə, yaxud zülmə bərabərdir. Bunun üçün də mehriban və mütəal məhbubun adilliyi mənəvi qazanclara kapital hazırlamağı lazım edir. İntəhası mənəvi qazancın kapitalı özü kimi məna cinsindən olmalıdır. Beləliklə, xalis[2] ibadətlər, itaətlər, şəri hökmləri gözləmələr - mənəvi məqamların kapitalından ibarətdir. Lisanül-qeyb Hafiz Şirazi bu irfan kapitalı barədə bir incə tərkibli beytdə belə böyüyür:

نگویمت که همه ساله می پرستی کن
سه ماه می خورو نه ماه پارسا می باش

Hafiz bu beytdə neçə yönlü anlama eyham edir:

Üç ay (سه ماه), doqquz ayın (نه ماه) bərabərində qısa olduğuna görə, hal zamanlarının ömürsüz olmağına işarə etmək istəyir. Elə bunun üçün də demişlər "Hal şimşəkdir çaxar ancaq dayanmaq bilməz".[3]

---

[1] Qəzəl 1, beyt 1

[2] İrfan qazanclarını nəzərə alıb ibadət etmək, məşrut olan bir ibadətdir. Aydındır ki, məşrut bir şey xalis ola bilməz. Hər bir şeydən kənar və yalnız məhbubun eşqi ilə əlaqədar ibadət xalisdir, başqa ibadət mənfi müamilə bəhsinə daxil olmuş və qazancı məhbubu özündən üstün tutmağa bərabərdir.

[3] Fərhəngi-istilahat və təbirati irfani, Dr. Seyyid Cəfər Səccadi.

Üç ay yaz fəslini yada salarkən təbiətin və nəhayət məfkürələrin və mərifətlərin yeniləşmək prinsipinə eyham edir.

**Qeyd:** *Hər yeni bir mövqeiyyət doğulcağın köhnəlir yeni bir mövqeiyyətə çevrilməsini istəyir. Beləliklə, bu yeniləşmək isə ömürsüzlükdən nişanədir.*

C. Hafiz üçü az miqdara və doqquzu çox miqdara istiarə tutmaqla bunu bildirmək istəyir ki; irfan müamiləsində uzun bir ömür boyu yığılan kapital bir ləhzəlik hal nemətinin ucuz qiymətidir. Beləliklə, ibadətlər – itaətlər ömrün sərmayəsi olduğuna görə şəri hökmləri diqqətlə gözləmələr şəriət müqtədasına tam tabeliyin zərurətini nişan verir.[1]

**Qeyd** 1: *Eşq və təriqət*[2] *bəhanəsilə zahiri din cəhətlərində başısoyuqluq irfan prinsipləri ilə biganəlik əlamətidir.*

**Qeyd** 2: *Şəri əməllər yaxud vacib ibadətlər (namaz, oruc və ...) vaxtında, zövqünü oxşamaq və batini məstlik xəta və günahdır. Çünki həm şəri qanunları pozar və həm də xətakarların və qanunsuzların əlinə bəhanə salar.*

**Qeyd** 3: *Batinə və eşqə bağlı hallar, hasildən və təqliddən kənar olduğuna görə adi səviyyədə ömür sürən insanlara şübhə yaratmada və məfkürələrə xətər toxundurmada bir çox mənfi təsir qoyan və xəsarət törədən hallardır. Bünün üçün də, irfani hal-hərəkətin baş verməsinə xəlvət bir şərait yaranmasını lazım bilmişlər.*

Nəticə: Şəri hökmləri qorumaq, yaxud şəriət başçılarının təlimatını huşlu-başlı dinləmək irfan üfüqünü və təriqət qapılarını açmada gərəkli ilkin bir kapitaldır. Beləliklə şəriət müqtədasına tabelik təriqət nailiyyətlərinə əsas şərt sayılır. Bu şərt başa salır ki, zövq və eşq bəhanəsilə şəri hökmləri unudan bir şair, ya aşiq yalnız bir xəbərsiz – yararsız iddiaçıdır.

Beyt 4: **Yox məndə bir əməl sənə şayəstə, ah, əgər**
**Əmalimə görə verə ədlin cəza məna.**

Sözlük: Şayəstə - yararlı; əmal – işlər-əməllər; ədl - ədalət/

Nişanə 1 – "Ədl": ikicəhətli bir nişanədir:

Ədl zülmə qarşı sifətdən nişanədir. Bu sifət yuxarıda xatırladığımız fəlsəfi "əzdad" bəhsinə qarışmış bir sözdür.

Ədl saf ürəkli və duru batinli olmaqdan əlamətdir və o, vücudun içəri üzünü, yaxud batin vücudu, sədaqətli və sədaqətsiz şəxslərin

---

[1] Ta Qafi-əndişə, qəzəl 268, beyt 4

[2] Təriqət, yaxud batin və hal yolları yeri gəldikcə izah olunacaqdır.

qarşında vahid bir halda və dəyişilməz səviyyədə qoruyub-saxlamaqdan ibarət olur.

**Qeyd**: *Bu beytdə ədlin birinci cəhəti Fizulinin nəzəri ilə uyğundur.*

Anlam: Beyt, birinci misra ilə geniş universal mərifətdən hekayət edərək mütəal məhbubun rəhmət və əzəmətilə müqayisədə aşiq və arifin büsbütün ibadət və itaətlərini yüngül və dəyərsiz göstərmək istəyir.

**Qeyd**: *Mövləvi yuxarıda xatırladığımız mərifəti aydınlaşdırmaq üçün bir təmsildə öz fikrini belə söyləyir: Uzaq kənddə yaşayan bir ərəb çox çətinliklə dolanır, ailəsinin sərkisini dinləməkdən təngə gəlir, nəhayət həyat yoldaşı göstərən yolu qəbul edərək əmirəl-möminin hüzuruna çatmaq fikri ilə bir qab yağış suyu sovqat hazırlayır, yola düşür. O elə zənn edir əmirəl-möminin ölkəsində su qıtlığı vardır. Həftələrlə əzab verici yollar keçir. Sonra Bağdadın mərkəzinə çatarkən sultan sarayına daxil olmaq rüxsətini tapır. Sultan onun mövhumi mərifətlə gətirdiyi sovqatını qəbul edərək, onu neçə gün qonaq saxlayır. Sonra sulu yollarla kəndinə qaytarır. Ərəb Dəclə çayının dalğalı suyundan elə heyrətlənir ki, dönə-dönə alnını-üzünü gəmi səthinə çırpır, haray-həşirlə özünü danlayaraq deyir: Mən bu dalğalı dup-duru suyun sahibinə bir qab lilli yağış suyu gətirməklə ən böyük xətakarlıq etmişəm. Qəribə burasıdır ki, əmirəl-möminin bu həqir sovqatı məndən qəbul etdi və onu başıma vurmadı.*[1]

Nəticə 1 – Peyğəmbərlər, imamlar və ariflər mərifət zirvəsində olduqlarına görə ömür boyu gecə-gündüz ibadət-itaət etməyi və maldan-candan keçməyi, xatırladığımız bir qab sudan da həqir görürkən, günahlarından utanan günahkarlar kimi öz ibadətlərindən xəcalət çəkirlər:

عابدان از گناه توبه کنند عاشقان از عبادت استغفار[2]

Nəticə 2 – Ariflər xatırladığımız mərifət bərəkətindən özlərinin həqir-fəqir olduqlarını düşünərkən "fəqr" məqamına nailiyyət taparlar.[3]

Beyt 5: **Xofufü xətadə müztəribəm var ümid kim,**
**Lütfün verə bəşarəti-əfvü-əta mənə.**

Sözlük: əta = bağışlamaq = bəxşiş etmək.

Nişanə 1 – "Lütf":

---

[1] Məsnəviyi-Mənəviyi-Mövləvi, beytlər 2765 və ...

[2] Abidlər günahlarından xəcalət çəkdikləri kimi aşiqlər ibadətlərindən utanırlar (ibadətlərini həqarətli hiss eidrlər)

[3] "Fəqr" yeri gəldikdə izah olunacaqdır.

A. "Lütf" birinci və ikinci beytlərdə xatırladığımız nişanələrdən ibarətdir.

B. "Lütf" mənəvi yardımlarla aşiqi müşahidə (şühud) dərəcəsinə nazil edən nişanədir.

Anlam: Ey mehriban və bağışlayan məhbub, bəndələrin düzgün və həqiqi xeyr-məsləhətlərinə yalnız Sən alimsən, bunun üçün də mənim dualarımla yox, öz elm və hikmətinlə məni cəzalandır.

Beyt 6: **Mən bilməzəm məna gərəkin, sən həkimsən,**
**Mən eylə, vermə hər nə gərəkməz səna məna.**

Sözlük: mən = mümaniət = mane olmaq.

Anlam: Ey həkimi-məhbub, Sən mənim özümdən özümə yaxın olduğuna görə[1] xeyr-məsləhətimi məndən yaxşı bilirsən. Buna görə də mənim dua-xahişimlə yox, öz hikmətinlə məni cəzalandır.

**Qeyd** 1: *Hər nə gərəkməz səna məna: aşiqlə məşuq arasındakı eşqə yaramaz tələblər.*

**Qeyd** 2: *Hər nə gərəkməz səna məna: Sənin lütfündən kənar hadisələr və hallar mənə xeyr-mənfəət yetirsələr də yararsızdırlar. Yalnız Sənin lütfün danılmaz həqiqətdir.*

**Qeyd** 3: *Hər nə gərəkməz səna məna = ikinci beytdə "qət" nişanəsində xatırladığımız hər şeyin, heç olmasa, iki yönü olduğuna görə dünyəvi adi hallar və zahiri ziyan və mənfəətlər iki yönlü məhdudluqdan kənar deyillər, beləliklə bir çox hadisələrin dünyəvi obrazı yaxud çöl üzü ziyanlı olsa da içəri üzü və batin yönü xeyirli və qazanclıdır. Əksinə bir çox hadisələrin zahiri cəhəti qazanc olsa da, batin üzü zərərli və ziyanlıdır. Elə bunun üçün də şərif ayə buyurur:* << و عسى ان تكرَ هو شيئا و هو خيرً لكم >>[2] *Həkim Nizami həmin ayəyə əsaslanaraq bir çox qıfılları aça bilmişdir.*[3]

Beyt 7: **Oldur mənə murad ki, oldur səna murad,**
**Haşa ki, səndən özgə ola müddəa məna**.

Anlam: Yuxarıdakı beyti davam etdirmək məqsədilə buyurur: Ey həkimi-məhbub, sən mənim özümdən özümə yaxın olduğuna görə,

---

[1] Quran, surə Qaf, ayə 16 (وَلَقَدْ خَلَقْنَا الْإِنسَانَ وَنَعْلَمُ مَا تُوَسْوِسُ بِهِ نَفْسُهُ وَنَحْنُ أَقْرَبُ إِلَيْهِ مِنْ حَبْلِ الْوَرِيدِ) And olsun ki, insanı Biz yaratdıq və nəfsinin ona nə vəsvəsə etdiyini də Biz bilirik. Biz ona şah damarından da yaxınıq!

1 Quran, Bəqərə surəsi, 216 –cı ayədən bir qismət

3 سررشتهء غيب ناپديد است بس قفل چوبنگرى كليدست، ليلى و مجنون

düzgün və həqiqi xeyr və məsləhətimdən xəbərdarsan. Bunun üçün də mənə hadisələr önündə yalnız sənin razılığın gərəklidir.

Beyt 8: **Həbsi-həvadə qoyma Fizulisifət əsir,**
**Ya Rəbb, hidayət eylə təriqi-fəna mənə.**

Nişanə 1 – "Həva": yel mənasında işlənərkən dünyəvi ilgilərin, məcazi təmayüllərin və nəhayət dünyəvi yaşayışın davamsızlığlına və yel ayaqlı sovuşmasına eyham edir.

Nişanə 2 – "Hidayət": Hidayət bu beytdə ikinci kamalın yolunu göstərmək və bu yolda aşiqə yardımçılıq nişanəsidir.[1]

**Qeyd** 1: *Mütəal Allah bütün vücudların yaranması ilə yanaşı onlara birinci hidayət qüvvələrini bağışlayarkən təbii və düz yaşayışı və cismilə əlaqədar birinci kamal yolunu nişan verdi. Şərif ayə bu əsasda buyurur:*

ربناالذی اعطی کل شیئ خلقه ثم هدا [2]

Birinci kamal bütün yaranmışların maddi cəhətinin, xüsusilə, insanların bioloji və məcazi yaşayışının davamlanmasını kifayətləndirən bir kamaldır. Amma ikinci kamal hidayət üstündən bəxş olunmuş başqa bir hidayət olduğuna görə aşiqə bioloji maddi həyatdan başqa həyat yolunu göstərərkən onu mənəvi yüksəkliyə nail edir və həzrət məhbuba çatdırır.

**Qeyd**: *Birinci kamal dünya və axirət yüksəklikləri ilə əlaqədardır. Amma ikinci kamal yalnız mütəal məhbubun özünə aiddir.*

Nişanə 3 – "Fəna": A – fəna, insanın mənliyi ilə əlaqədar əxlaq - əhvalını və işlər - əməllərini aradan qaldıran bir nişanədir.[3]

B – Fəna - ilahi seyri nəhayətə çatdıran nişanədir.[4]

P – Fəna - mütəal məhbubun camal nurunun zühuru zamanı aşiqin elmini, biliyini və düşüncə - anlamının məhv edən vəziyyət nişanəsidir.

**Qeyd** 1: *Fəna üzündə iki yönlü bir məqamdır:*

*A – Zahiri fəna dünyəvi əməllərin məhv olmasını bildirən nişanədir.*

*B – Batini fəna isə cism ilə əlaqədar sifətləri məhv etməkdən nişanədir.* [5]

---

1 Qəzəl 1, beyt 1
2 Quran, Taha surəsi, 50 –ci ayədən bir hissə.
3 Fərhənge istilahat və təbirati ürfani.
4 Yenə orada.
5 Yenə orada.

**Qeyd** 2: *Ürfan, fəlsəfə hətta fizika araşdırmaçılarının zənniycə təbii yaxud maddi yaranışda boş bir həcm yaratmır, arifin batini isə bəşəri sifətlərdən boşalarkən ilahi sifətlərlə dolmağa başlayır.* [1]

**Anlam: Ey mehriban və mütəal məhbub, mənim batinimi bəşəri sifətlərdən – ilgilərdən boşaldarkən maddi vücudumu mənəvi sifətlərlə dolu ilahiləşməyə nail et.**

[1] Bu boşalıb – dolmamın "iradə" və "hicranül maarif" və "Ayətullah" ünvanlı ürfani bəhslərdə izahı vardır.

## Q Ə Z Ə L 4

**(1) Zəhi zatın nihanü ol nihandan masəva peyda,**
**Bihari-sününə əmvac peyda, qər napeyda.**

**(2) Boləndü pəsti-aləm şahidi-feyzı-vücudundur,**
**Degil bihudə olmaq yox ikən ərzü səma peyda.**

**(3) Kamali-qüdrətin izhari-hikmət qılmağa etmiş**
**Qubari-tirədən ayineyi-gitinüma peyda.**

**(4) Dəmadəm əks alır mirati-aləm qəhrü lütfündən**
**Onunçün gəh küdurət zahir eylər, gəh səfa peyda.**

**(5) Gəhi topragə eylər hikmətin min məhliqa pünhan,**
**Gəhi sünün qılır topraqdən min məhliqa peyda.**

**(6) Cahan əhlinə ta əsrari-elmin qalmaya məxfi,**
**Qılıbdır hikmətin küffar içində, ənbiya peyda.**

**(7) Nişani-şəfqətindir kim, olur izhar həmdincün**
**Füzuli tirə təbindən kəlami-canfəza peyda.**

Beyt 1: **Zəhi zatın nihanü ol nihandan masəva peyda,**
**Bihari-sününə əmvac peyda, qər napeyda.**

Sözlük: Zəhi - afərin = alqış (tərif ədatı); nihan = gizli; masəva = kainat = bütün Allahdan başqa vücudlar; sün = yaranış = yaradıcılıq = ehsan; əmvac = dalğalar; qər = dib = ən dərin yer = kök.

Nişanə 1 – "Zat" - həzrəti-məhbubun gizli həqiqətindən nişanədir. Bu həqiqəti elmə, ağıla, fikrə, və təsəvvürə sığışdırmaq mümkünsüz bir xəyaldır, amma onun cilvələrini can gözündə görmək və idrak anlamı ilə düşünmək imkanını tapmaq ola bilər.

**Can gözün aç ki, eyləsin yari**
**Pərdəsiz gör, görünməyən yari.**[1]

Nişanə 2 – "Bahar" - yeni bir həyatdan və təzə bir yaranışdan istiarədir.

**Qeyd**: *Qadir Allah bütün kainatı nümunəsiz və modelsiz yaradıbdır. Bunun üçün də bütün yaranmışları bahar ünvanlı ürfanı bəhsə daxil edirlər.*[2]

Nişanə 3 – "sən" - yaradıcı mütləq iqtidardan nişanədir.

**Qeyd**: *Hər bir yaranmış zəban halı ilə, yaradıcı iqtidarı təqdim edərkən əvvəla onu təsbih (zikr) edir.*[3]

Saniyən, ağlı, huşu, ürəyi və batini O qadir yaradanın hikmətinə, rəhmətinə yönəldir və bu hidayət insana mərifət bağışlayır.

---

[1] Müəllifin bir tərcibəndindən beyt.

[2] "Bihar" yeri gəldikdə, ürfan nöqteyi-nəzərindən izah olunmalıdır.

[3] Təsbih mütəal məhbubu zikr etmədən ibarətdir. Zikr, neçə mənalı bir istilahdır, amma biz ixtisarı nəzərdə tutarkən onun yalnız iki cəhətinə işarə edirik:

A – Dil zikri: Dil zikri mütəal məhbubu müqəddəs kəlmələrlə və hörmətli sözlərlə yad etməkdən ibarətdir.

B – Ürək zikri: Ürək zikri, içərini, gözəl və mütəal məhbubun fikir ilə məşğul və onu hər an batində hiss etmədən ibarətdir.

Qeyd 1: Hətta cansız yaranmışlar mütəal yaradanı təsbih edərək onun hikmətini – rəhmətini təsdiq edirlər, elə bu barədə mütəal Allah-Qurani Kərimin "əl-Hədid" surəsində birinci ayədə buyurur "سبح لله ما فی السماوات و العرض و هو العزيز الحکيم" (təsbih etdi Allahı bütün göylərdə və yerdəki yaranmışlar və O Allah qələbə və hikmət sahibidir.)

Qeyd 2: Quran icmaçılarından bir çoxu, hər bir cansız vücudun öz yerində qərar tapmasını və öz öhdəsindəki təklifə əməl etməsini onun özəl təsbihi bilmişlər (məsələn suyun axması, atəşin hərarəti, yelin hərəkəti və ...), bir çox cansız olan fenomenlərin isə insan kimi söz – ibarətlə (məxsus dil) təsbih deməsində izahlar aparıblar. Fəlsəfə isə bu bəhsdə sakit qalmıyıb və "Jan Mari Giyu" zənn edibdir ki: bütün cansız – hərəkətsiz fenomenlərin canları var, lakin onlardakı can zəif olduğuna görə yetkinləşmək imkanını tapa bilməmişdi. "Seyri-hikmət dər orupa", cild 3 səh. 247.

**Qeyd** 1: *Bağışlamanın ehsanla eyni olduğu sübut edir ki, yer – göy bir açıq ehsan süfrəsidir. Beləliklə, bu açıq süfrədən istifadə edən kainata xüsusilə insana şükür etmək lazım və vacib olur.*[1]

**Qeyd** 2: *"Ehsan" - xeyr və ilahi olduğu üçün müqqəddəsdir, demək yer – göy müqəddəsliklə dolub bir-birinə calanır.*

Nişanə 4: "Əmvac"[2] - iqtidarlıq – bağışlayıcı məhbubun parlamalarından və cilvələrindən ibarətdir.

**Qeyd** 1: Bütün yaranmışlar, xüsusilə insanlar əmvacdan yaranmışlar.

**Qeyd** 2: *Əmvac içəri və batini mərifətlərin güclü vasitələridir.*

Nişanə 5: "Qər" - birinci misrada qeyd olunmuş "zat" nişanəsinə sifətdir və onun dərinliyini və anlamdan üstün olduğunu izah edir.

Anlam: Ey qadir mütəal məhbub, sənin həqiqətin ağıldan, elmdən və idrakdan gizli olsa da, parlamaların və cilvələrin (əmvac) yaxud ehsanların ap – açıq məlumdur. Beləliklə sən "gizli – aşkar" bir məhbubsan.

**Qeyd**: *Həzrəti-məhbub yalnız gizli olsaydı, onda lazım olardı ki, o Həzrətin "aşkar" ünvanlı bir ziddi (əksi) tapılarkən onu tanıtdırsın və biz "əzdad" bəhsində xatırlamışıq ki, yaradıcı Tanrıya əks və zidd ola bilməz.*[3]

Beyt 2: **Bolənd pəsti-aləm şahidi-feyzı-vücudundur,**
**Degil bihudə olmaq yox ikən ərzü səma peyda.**

Sözlük: pəst = pəs = çökək = alçaq yer = eniş; bihudə = batil = hədər = faydasız.

Nişanə 1: "Feyz" - A - feyz əvəzsiz, yaxud analoqu olmayan ilahi nemətdir (ehsan).

B – Feyz, mənəvi inkişaflarda – parlamalarda, keçmişdən - gələcəkdən, yaxud zamandan, yaxud maddənin ən güclü bir yön və cəhətdən xilas olmaq nişanəsidir (hal).

Nişanə 2: "Yox ikən" - yerin – göyün və eyhamla büsbütün yaranmışların nümunəsiz – modelsiz yaranılmasını daşıyır və ifadə edir.

Anlam: Ey iqtidarlı və bağışlayıcı məhbub, yeri, göyü nümunəsiz yaradan, başdan-başa aləmdə rəhmət, nemət və ehsan süfrəsini açan və eyni halda əvəz istəməyən, minnət qoymayan yaradıcı yalnız sənsən.

---

[1] Qəzəl 4, beyt 7.

[2] "Əmvac", ürfan terminində "təcəlliyyat" adlanır. (təcəllilər)

[3] Qəzəl 3 beyt 2.

Beyt 3: **Kamali-qüdrətin izhari-hikmət qılmağa etmiş**
**Qubari-tirədən ayineyi-gitinüma peyda.**

Sözlük: tirə = qara = kədər = qaraya çalan = palçıqli; gitinüma = bütün dünyanı göstərən = görünməzləri açıqlayan.

Nişanə 1: "Hikmət " - bu beytdə Allah-Təalanın əqlə, idraka sığ-mayan, elmindən, əmrindən və iradəsindən nişanədir.

Nişanə 2: Ayine: A - ayine bütün yaranmışlardan nişanədir.

**Qeyd**: *Maddi yaranmışlar, müxtəlif formalı və çoxsaylı olduqlarına görə, ürfan araşdırmalarında onlar "kəsrət" terminilə adlanıblar. Kəsrət, iki əksi, (iki ziddi) paralelləşdirən bir istilahdır. Buna görədə: 1- Kəsrət aşiqlə məşuq arasında sərhəd qaldıran və sinir törədən əngəllər və maneələr (hicablar) nişanəsidir. Beləliklə, kəsrət gerilikdən və xəbərsizlikdən əlamətdir.*

*2- Kəsrət, yaxud dünyanı başdan-başa dolduran maddi yaranmışlar yaranmış olduqlarına görə həm zəbani-halilə yaradıcı iqtidardan söz çəkirlər həm də elmi və fəlsəfi bir halda yaradıcı iqtidarı sübut edirlər, bu söz-sübut aşiqə yaxud bəndəyə mərifət bağışlayarkən onu məşuq həzrətinə yaxınlaşmağa təlqin edir. Elə buna görə də kəsrət vəhdətdən və vüsaldan nişanədir.*

*B- Ayine, yaxud "ayineyi-gitinüma" kamil insanın qəlbindən nişanədir.*

**Qeyd**: *"Ayineyi-gitinüma" maddi və məcazi ilgilərdən boşalmış*[1] *və yalnız məbud cilvələrlə dolmuş könüldən ibarətdir, belə bir könül həmdə belə bir könül sahibinin vücudu həzrət məbud cilvələrini əks etdirən güzgüyə misaldır.*

Nişanə 3: "Qubar" - zahirən bir kiçik, həqir, gözə gəlməyən və heçə oxşar zərrədə yığışmış və xəzinə olmuş məcazi və mənəvi iqtidardan nişanədir.

**Qeyd** 1: *Zərrənin on milyon bölgüsündən biri, yaxud nüvə başlığı parlayışda yer kürəsilə birlikdə göy kürələrinin bir çoxunu mehvərindən xaric edərək nizamını və formasını pozmağa qadirdir, bu fikrə təsəvvürə gəlməyin və heçə bənzər zərrənin on milyondan bir bölgüsü:*

A – mütəal məhbubdan taysız və sonsuz iqtidarından nişanədir.

B – Zalım qan tökənlərə ibrət dərsidir. Bəlkə diqqətə gəlib düşünələr ki, insan yer üzünə hakim və qalib olsa da bir gözə görünməz zərrə

---

[1] Qəzəl 1, beyt 2.

bölgüsünə məğlubdur, necə ki Nəmrud hünü vasitəsilə məğlub və məhv oldu[1].

**Qeyd** 2: *Güzgüdə görünmüşlər obrazlarina əsasən, bütün yaranmışlar mütəal məhbubun yalnız cilvələrini nişan verməyə qadirdirlər və onun həqiqətini göstərmək imkanını tapa bilməzlər.*

Anlam: Küdurətli qara maddəni parlaq mənaya güzgü edən iqtidar yalnız Allaha məxsusdur.

**Qeyd** 3: *Toz, işığa və nəhayət gözə mane törətməyə görə kəsrətdən işarədir.*

**Qeyd** 4: *Toz, həqir bir fenomendə, ulu bir iqtidarı yığıb xəzinə yaraddığına görə vəhdət və hidayət əlamətidir.*

Beyt 4: **Dəmadəm əks alır mirati-aləm, qəhrü lütfündən**
**Onunçün gəh küdurət zahir eylər, gəh səfa peyda**

Sözlük: Dəmadəm = andan-ana = ardı-arası kəsilməyən = ləhzə-ləhzə; əks = şəkil = təsvir; mirat = güzgü, gəh = gah; üdurət = qaralıq = qəm qüssə = qatqı.

Nişanə 1 – "qəhr" - müşahidə nemətindən məhrumluq nişanəsidir. Qəhr, "qəbz" mövqeiyyətinin əlamətidir. O, aşiqi həsrət və məğlubiyyət atəşində yandırarkən, bütün dünyanı onun yadından çıxarar, demək onu mane şəraitinin qarşında mane törətməklə, məcazi əngəllərdən – istəklərdən xilas olmağa hazırladar.

Nişanə 2 – "Lütf" - qəhrin əksidir. Aşiq lütf mövqeyində məcazi və dünvəvi istəkləri – ilgiləri qat-qat soyub atir, nəhayət, bəsit bir vücud kimi incələşir və şühud (müşahidə) məqamına nailiyyət imkanı tapır, bu imkan ona bir çox mənəvi mərifətlərdən tanışlıq verir.

**Qeyd**: *Yuxarıda xatırladığımız iki nişanə məlum edir ki, qəhr və lütf zahirdə bir-birinə müxalif və paradoks olsalar da, batində müvafiq və eynidirlər və ikisi birlikdə aşiqi tərbiyələndirməyə mövqe yaradırlar. Bunun üçün də Mövləvi buyurur: "... Qəribə budur ki, mən məhbubun həm qəhrinə aşiqəm, həm də lütfünə."*[2]

Nişanə 3 – "Küdurət" - bu beytdə qəhr şəraitinin çətinliklərindən nişanədir.

Nişanə 4 – "Səfa " - küdurət mövqeyinin əksidir. O, dünyəvi əngəllərdən xilas olmaqdfn və məcazi ilgiləri qat-qat soymaqdan nişanədir.

---

[1] Quran, Bəqərə surəsi, ayə 26

[2] (1416 عاشقم بر قهر و بر لطفش به جد بو العجب من عاشق این هر دو ضد( ئثنوی، دفتر اول بیت

Nişanə 5 – "Mirat ": mirat üçüncü beytdə qeyd olunmuş "ayinə "başlığının təkrarıdır.

Anlam: Ey həkimi-məşuq, qəhr və lütf ilə, yaxud iki əksilə vahid hidayət və vahid məqsədə nailiyyət bağışlayan yalnız sənsən.

**Qeyd** 1: *Bu anlam belə eyham edir ki, çox hadisələr zahirdə zərər-ziyan əlaməti göstərsələr də, batində xeyir və ehsandırlar, əksinə bir çox aşkar xeyirlər və qazanclar batində zərər-ziyandırlar.*

**Qeyd** 2: *"Dəmadəm" nişanəsi göstərir ki:*

*A - Qadir Allah bir an da olsun dünyanı özbaşına boşlamayıb, bəlkə onu daima öz cilvələrilə, yaxud mələklər və digər vasitələrlə nizamlayır, elə buna görə də şərif ayə buyurur:*

"كُلَّ يومٍ هُوَ فى شان"[1]

*B – mütəal məhbub, dünyadan bir an da ayrılmır, buna görə də insana lazım gəlir ki, məhbubun qarşısında hörmət gözləyərək xətakarlıq və ədəbsizlik etməsin.*

Beyt 5: **Gəhi toprağə eylər hikmətin min məhliqa pünhan,**
**Gəhi sünün qılır topraqdən min məhliqa peyda.**

Nişanə 1: "Sən" - birinci beytdə qeyd olmuş nişanədən ibarətdir ki, bu beytdə mütəal məhbubun rəhmət və hikmətinin dalbadal yeniləşməyinə eyham edir.

Nişanə 2 – "Hikmət " - üçüncü beytdə qeyd olduğu kimi qadir məhbubun əmrindən – iradəsindən nişanədir.

Nişanə 3 – "Məhliqa " - Ay gəncənin qara kasasını ağ işıqla doldurmasına görə küdurətlə qatqı maddi vücudlarda mənəvi nurların çaxmasından niçanədir.

Anlam: Ey qadir və həkimi-məşuq, dünyəvi və mənəvi gözəlliklər sahiblərinin çiçəklənməyi və solması yalnız sənin elm və hikmətinə bağlıdır.

Beyt:6 **Cahan əhlinə ta əsrar-elmin qalmaya məxfi,**
**Qılıbdır hikmətin küffar içində, ənbiya peyda.**

Sözlük: Əsrar = sirlər = gizlədilmişlər; Pünhan = gizli; küffar = kafirlər; ənbiya = peyğəmbərlər.

Nişanə 1 – "Əsrar" - gözəl məhbubun eşqilə bürünməkdən və özünü o məbudun əhatəsində hiss etməkdən əlamətdir.[2]

---

[1] Qurani-Kərim, Ər-rəhman surəsi, 29-cu ayədən bir hissə.
[2] Qəzəl 2, beyt 1.

Nişanə 2 – "Ələm" - vəhdət ərəfəsinin yolunu aydınladan nurdan ibarətdir. Belə bir nur islamın ulu peyğəmbərinin təlimatı ilə aşiqin ürəyində və batinində çaxar.[1]

**Qeyd**: *Əql bütün insanların doğal hidayət payıdır. Amma elm yalnız möminlərə məxsusdur.*

Anlam: Ey mehriban məhbub, eşq, iman və həqiqət yolunu peyğəmbərlərin hidayəti ilə işıqlandıran və insanları küfrün qaranlığında çaşıb-itməkdən qurtaran məhbub yalnız sənsən.

Beyt 7: **Nişan-şəfqətindir kim, olur izhar həmdincün**
**Füzuli tirə təbindən kəlami-canfəza peyda.**

Sözlük: Həmd = sitayiş = şükr; Canfəza = dirildən = dirçəldən = şadlıq bağışlayan.

Nişanə 1 – "Şafqət" - mehriban məhbubun əvəzsiz yaxud ehsan etdiyi lütf və rəhmətdən nişanədir.

Nişanə 2 – "Həmd" - birinci beytdə xatırladığımız sün və ehsan nişanəsi ilə paralel və bağlı olan şükrdən ibarətdir. Bir bəndənə qədər yaradıcı məhbubun özünü və ehsanını yaxından düşünüb-tanısa bir o qədər də şükrünü əlavə etməlidir. Beləliklə, şükr, yaxud həmd yaxınlığa (qərib) bağlı bir mərtəbədir. Həkim Nizami islamın ulu peyğəmbərini məbud həzrətinə hamıdan yaxın təqdim edərək (müqərrəb) onu hamıdan artıq şükür mövqeyində nişan verir və bu mənəvi məzmunu məcazi təmsillə obrazlaşdırır: Həzrət məbudu tanımağa imkan yaradan istedadlar – insanlar da başqa mövcudlardan özəl və başqa olduğuna görə insan həmd ilə yanaşı bəlkə də qatqı yaranıbdır. Deməк, mənəvi və ülvi yaranış məktəbinin Ai (başlanğıcı) yazılan ləhzə Həzrət Əhməd islamın ulu peyğəmbəri yaranmışdır.[2] Beləliklə, islam peyğəmbəri məna üzərində və ülvi həyatda hamıdan əvvəl yaranmış bir insandır,buna görə də hamıdan əvvəl Allaha yaxınlaşdığından, demək yaxınlığın ən əla dərəcəsindədir (Bütün yaxınlar "müqərrəblər" peyğəmbərin ardında qərar tapanlardırlar).

Anlam: Ey mehriban məbud sənin ehsan və lütfündəndir ki, Füzuli dünya və bədən həbsində acizləşmiş təbii mənəviyyat və əbədiyyət izli sözlər bəyan edir.

---

[1] Fərhəngi istilahat və təbirati-ürfani.
[2] Ərəb və fars Abasında "A" həmdin ardında duranda Əhməd kəlməsi yazılar =(احمد = ) احمد+ا )

## Q Ə Z Ə L 5

**(1) Əşrəqət min fələkil-behcətü şəmsün və biha,**
**Mələəl-aləmə nurən və sürurən və bəha.**

**(2) Çıxdi bir gün ki, ziyasında təmamiyyi-rüsul**
**Oldu məhv öylə ki, xurşid şüaində Süha.**

**(3) Oldu bazari-cahan rövnəqi bir dürri-yetim**
**Ki, deyil iki cəhan hasili ol dürrə bəha.**

**(4) Rütbeyi-hikməti-meraci-kəmalinə görə**
**Hükəma firqeyi-dun, fəlsəfə cəmi-süfəha.**

**(5) Münhiyi-mərifəti hal dilililə daim**
**Qılır əhli həqə əsrar-həqiqət inha.**

**(6) Necə təqrir edim ovsafini bir şahin kim,**
**Ona vəssaf ola "Yasin"ü müərrif, "Taha".**

**(7) Ey Füzuli, rəhi-şərini tut ol rahbərin**
**Bu təriq ilə zəlalətdən özün eylə rəha.**

Beyt 1: **Əşrəqət min fələkil-behcətü şəmsün və biha,**
**Mələəl-aləmə nurən və sürurən və bəha.**

Beyt 2: **Çıxdi bir gün ki, ziyasında təmamiyyi-rüsul**
**Oldu məhv öylə ki, xurşid şüaində Süha.**

Sözlük: təmami = təmamən = hamılıqla; rüsul = rəsullar = peyğəmbərlər; xurşid = günəş.

Süha = "Dəbb əkbər" adlı teleskopsuz görünməyən bir ulduz.[1]

Nişanə 1 – "Behcət" - batini maraqlarından və içərini hərəkətə gətirən bir camal və cazibədən nişanədir. Behcət məqamına imkan tapan bir aşiq, bütün maddi dünyasını, həm də zahiri mövcudluğunu təpiyi altında təhqir edərək, ülvi aləmə yüksəlmək duyğularını tərənnüm edər, belə bir təpinmək və tərənnüm, ürfan obyektlərində, "rəqs" adı ilə tanınmış bir hərəkətdən ibarətdir.[2]

Nişanə 2 – "Şəms" - mənəvi aləmdən, ilahi cilalər gətirən vasitələrdən (peyğəmbərlərdən) nişanədir.

Nişanə 3 – "Nur və ziya" - aşiq ürəyində çıxıb batmayan parlaq bir günəşdən işarədir.

Nişanə 4 – "Surur" - behcət məqamini təkrar edən nişanədir.

Nişanə 5 – "Bəhar" - "rəqs" mövqeiyyətinə şərait yaradan şəms məqamına eyham edən nişanədir.

Nişanə 6 – "səha" - həqirlik və dəyərsizlikdən nişanədir.

Anlam: İslamın ulu peyğəmbəri, yaxud mehriban məbudun rəhmət günəşi gözəllik və şadlıq ziyası ilə aləmi doldurarkən, aşiq ürəklərə rəqs hərəkətini və yüksəlmək şəraitini bağışladı.

Beyt 3: **Oldu bazari-cahan rövnəqi bir dürri-yetim**
**Ki, deyil iki cəhan hasili ol dürrə bəha**

Sözlük: Dürri yetim = tapilmayan mirvari = taysız mirvari; bəha =baha = qiymət.

Nişanə 1 – "dürri yetim" - ülvi məqama yüksələn bir aşiqin kamil həqiqətindən nişanədir.

**Qeyd**: *İslamın ulu peyğəmbəri kamillik və ülvilikdə birinci və taysız dürri-yetimdir*

---

[1] Qəzəl 1, beyt1

[2] Fərhəngi-Moin, Elam cildləri

Anlam: İslam peyğəmbərinin müqəddəs vücudu iki dünyadan üstün və ağır olarkən, bütün aləmə xüsusilə də insanlara dəyər bağışlayan özəl və gözəl bir nemətdir.

Beyt 4: **Rütbeyi-hikməti-meraci-kəmalinə görə**
**Hükəma, firqeyi-dun, fəlsəfə cəmi-süfəha.**

Sözlük: merac = pilləkən = nərdivan; hükəma = həkimlər; dun = həqir = alçaq; süfəha = nadanlar = səfehlər.

Nişanə 1 – "Merac" - islam peyğəmbərinin səmalara yüksəlmək möcüzəsindən və ülvi aləmləri seyr etmək mərtəbəsindən nişanədir. Bu möcüzə - mərtəbənin yalnız O həzrətə məxsus olunduğunu Qurani-Kərim təsdiq edərək buyurub: " سبحان الذی اسری بعبده لیلاً من المسجد الحرام الی المسجد الاقصی الذی بارکنا حوله لنریه من ایاتینا انه هو السمیع البصیر" ( Pak bilirəm o Allahı ki, apardı gecələrin birində öz bəndəsini "Məscidül Həramdan" "Məscidül Əqsaya", bərəkət verdik ətrafı və nişanələrimizi ona göstərək, həqiqətən O Allahı eşidən və görəndir.[1]

**Qeyd** 1: *Səmalara yüksəlmək və göylərdə seyr etmək meracın zahiri yönüdür lakin onun əsas hissəsi ağıla – idraka sığmaz bir mərtəbədir.*

**Qeyd** 2: *Həzrəti-Adəmə dedilər:" "هبط", yəni ey Adəm aşağı düşərkən torpaq dünyasına get, bunun üçün ki, yer mülkü sənin səltənət və cəlalətindəki əzəmətin ağırlığından sakinlik tapsın, ey Məhəmməd (s) sən səmaya gəl, ona görə ki, göylərin ən yüksəyi sənin camalından parlayan nurdan cəlalansın..., nəhayət cismani əlaqələri hətta ruhani səviyyəni tərk qıl sonra bizə nəzər sal..."*[2]

Nişanə 2: "Kamal" - yəni həyat nailyyətində maddi aləmdən çıxarkən mənəvi forma tapmaq nişanəsidir.

Nişanə 3 – "hükəma": hükəma: A – gizli bilgilərə əl çatdıran elmlərdən nişanədir.

B - hər yaranmışın necəliyini və nə üçün yaranmasını axtaran araşdırıcılardan nişanədir.

Nişanə 4 – "Fəlsəfə" - ağıl və məntiq gücünə həqiqətlə tanışlıq elmindən nişanədir.

Nişanə 5 – "Cəmi süfəha" - nadanların birlikdə bir işə qurşanmağını eyham edir.

**Qeyd**: *Aşiqlə birləşib qatışmayan elm gücünə, yaxud dünyəvi vasitələr umuduna maddi mövcudların həqiqətini, xüsusilə onların*

[1] Quran-Kərim, İsra surəsi, ayə 1
[2] Fərhəngi-istilahat və təbirati-ürfani.

*mənəviyyata bağlı mərtəbələrini tanımağa çalışmaq əbəs və nəticəsiz bir araşdırma və nəhayət nadanlıq və maddilik əlamətidir. Elə buna görə də, ariflər xüsusilə Mövləvi fəlsəfi nəzərlərin bir çoxunu xəyal toxuması və xəbərsizlik əlaməti bilir və deyir: "Bir çox fəlsəfə ustadı başını divara vurmasa və zehnini dünyəvi araşdırmaqdan boşaldarkən mənəvi fikirlə doldurmasa həqiqəti inkar etməkdən xilas ola bilməz, nəhayət maddi yaranmışların mənasını düşünməyib suyun, torpağın, palçığın nitqini dinləməkdən[1] və onların təsbihini düşünməkdən aciz qalar.[2]*

Anlam: Elm və fəlsəfə gücünə, yaxud ağıl və məntiq vasitəsilə islam peyğəmbərinin merac mərtəbə - möcüzəsini idrak etmək mümkünsüz bir xəyaldır. Beləliklə, deyilmiş vasitələrlə merac həqiqətini araşdırmaq nadanlıq əlamətidir.

**Qeyd**: *Həzrəti-peyğəmbər öz vücudunu "ney" mərtəbəsində dünyəvi istəklərdən boşaldarkən[3], onu mənəvi ilgilər və sifətlərlə doldurubdur. Beləliklə o insani səviyyədən ilahi mərtəbəyə yüksəlməklə, o idrakdan üstün bir xarakterə malik oldu. Bu xarakter maddi dünya cinsindən fərqli olduğuna görə, dünyəvi və insani elmlər və fəlsəfələrə sığışmaz. Elə buna görə də "Flutin" zənn edib ki: " İlahi şəxsiyyətləri araşdırıb anlamaq, ağıl və məntiq ölçüsündə, hətta xəyal səmasında sığmaz bir çalışma qədər onları düşünmək üçün ağıldan-həsəddən yuxarıda qanad açmaq lazım gəlir.*[4]

Beyt 5: **Münhiyi-mərifəti-hal dililələ daim**
**Qılır əhli həqə əsrari-həqiqət inha**

Sözlük: Münhi = xəbər verən = sultan hökmünü çatdıran; dil = batin = ürək; əsrar = gizli həqiqətlər = sirrlər; inha = xəbər vermək = xəbərdar etmək.

Nişanə 1 – "Mərifət" - mənəvi tanışlıqdan ibarətdir, bu tanışlığı araşdırmağın elm və təcrübə vasitəsilə mümkünsüz olduğunu təkcə ürfan yox, bəlkə fəlsəfə də təsdiq edərək belə deyir: "Ülvi və mənəvi əhvalı – aləmi araşdırmaq heç bir təcrübə çərçivəsinə sığmayan bir sözdür.[5]

---

[1] فلسفی منکر شود در فکر و ظن   گوبر سر را به این دیوار زن، (Məsnəviyi-Mənəviyi-Mövləvi, 1-ci dəftər, beyt 3347)

[2] Qəzəl 4, beyt 1 (təsbih).

[3] Qəzəl 1, beyt 2

[4] Seyri-hikmət dər Orupa, Məhəmməd Əli Furuği, cild 1, səh 86-87

[5] 5 "Nəzəriyyeyi-mərifət dər fəlsəfeyi-Kant, Yustus Hartnak, tərcümə Qulaməli Həddad Adil, intişarati-Fekre ruz, səh.31

Nişanə 2 – "Munhiyi-mərifət" A – islam peyğəmbərinin ülvi və ilahi mərtəbələrindən xəbər verən həzrəti Cəbraildən nişanədir.

B – İslam peyğəmbərinin gizli mərtəbələrini öz mqəddəs vücudunda əks etdirən şəxsiyyətindən nişanədir.

Nişanə 3 – "Hali-dil" A – mənəvi ziyaların dünyəvi aləmdə zahir olması nişanəsidir.

B – Batini xarakteri zahirdə əks etdirən cəla və camaldan işarədir.

Nişanə 4 – "Əsrari-həqiqət" - hər bir vücudun mənəvi səviyyələrlə əlaqədar içəri üzündən ibarətdir.[1]

Anlam: A – Hər bir insanın sağlam batini və xalis ürəyi "munhi-mərifətdir" və onun içəri vücudu həzrət peyğəmbərin idraka – anlama sığmayan həqiqətini haylayır.

B – Həzrəti-peyğəmbərin öz batini xəbər gətirən bir mələk kimin onun həqiqətindən xalis insanlara xəbər verir.

P – Həzrəti-Cəbrail peyğəmbərin yüksək mərtəbəsindən xəbərlər verir.

Beyt 6: **Necə təqrir edim ovsafini bir şahin kim,**
**Ona vəssaf ola "Yasin"ü müərrəf "Taha".**

Sözlük: Vəssaf = çox vəsf edən = daim vəsf edən = vəsfşünas; Müərrəf = təqdim edən = tərif edən = bir vücud, ya bir təsəvvürün məchul cəhətini məlum edən.

Nişanə 1 – "şah" - ağılı, eşqi və ruhu, yaxud zahirlə batini birlikdə hidayət edən liderdən işarədir. İslamın ulu peyğəmbəri, belə bir lider olduğuna görə, mələklər onu seyr etdiyi səmaların şahı adlanmışlar.

Nişanə 2 – "Ya və Sin" - islam peyğəmbərinin gizli əzəmətindən nişanədir[2].

Anlam: Mən hansı iqtidar və idrakla Həzrəti peyğəmbərin ağıla – fikrə sığmayan yüksək əzəmətindən söz açım? Yasin və Taha rəmzlərilə işarə olunmuş əzəməti vəsf etməyə yalnız mütəal Allah qadirdir.

Beyt 7: **Ey Füzuli, rəhi-şərini tut ol rahbərin,**
**Bu təriq ilə zəlalətdən özün eylə rəha.**

---

[1] Qəzəl 4, beyt 6.

[2] Qəzəl 2, beyt 4

Sözlük: rəh = yol = məzhəb = nəğmə = məqam = pərdə = təriqət; rahbər = rəhbər = lider; təriqət = yol = məzhəb; zəlalət = düz yolu çaşmaq = sapqınlıq; rəha = xilas = azad olmaq.

Nişanə 1 – "Şər" - ağılı, fikri, hissi tamayülatı hidayət edən, dini aydın hökmlərdən ibarətdir.

Nişanə 2 – "Zəlalət" - duyğu – düşüncə müddəilərindən nişanədir, (nadan və yalançı müddəilər).

Anlam: Ey Füzuli, alimlik və liderlik iddiasıyla zəlalət toruna düşüb əyləşmə, bəlkə özünü hər halda həzrəti-peyğəmbərin təlimatina möhtac hiss edərkən, onun müqəddəs hökmlərini qoru.

## Q Ə Z Ə L 6

**(1) Ey olub merac bürhani-ülüvvi-san sana**
**Yerə enmiş göydən istiqbal edib fürqan sana.**

**(2) Hiyni-dəvayi-nübüvvət müddəi ilzaminə,**
**Cahil ikən el, sənin elmin yetər bürhan sana.**

**(3) Kilki-hökmün çəkdi hərfi-sairi ədyanə xətt,**
**Hökm isbat etdi nəfyi-sairi-ədyan sana.**

**(4) Baqiyi-möcüz nə hacət dini-həqq isbatinə,**
**Aləm içrə möcüzi-baqi yetər Quran sana.**

**(5) Vəsfi Cibrili-Əmin etmiş qəbuli-xidmətin,**
**Sirri-həqq kəşfinə onunla yetib fərman sana.**

**(6) Sənsən ol xatəm ki, rəf etmiş təmami-hakimi,**
**Xatəmi-hökmi-risalət tapşırıb dövran sana.**

**(7) Ol qədr zövqi-şəfaət cövhəri-zatında var**
**Kim, gəlir ərzi-xəta  mənidə bir ehsan sana.**

**(8) Mahi-novdur, yoxsa sən qıldıqda seyri-asiman,**
**Qaldırıb barmaq gətirmiş asiman iman sana.**

**(9) Ya Nəbi, lütfün Füzulidən kəm etmə ol zaman**
**Kim, olur təslim, miftahi-dəri-ğüfran sana.**

Beyt 1: **Ey olub merac bürhani-ülüvvi-san sana**
**Yerə enmiş göydən istiqbal edib fürqan sana.**

Sözlük: merac = pilləkan = nərdivan; Ülüvvi-san = yüksək məqam = ülvilik; fürqan = haqqı batildən ayıran qüvvə = Quran.

Nişanə 1 – "Merac" - islamın ulu peyğəmbərinin isra gecəsi, yerdən ayaq qaldırıb göylərə yüksəlməsindən nişanədir.[1]

Nişanə 2 – "Fürqan" - A – Haqqı batildən fərqləndirən, əhatəli bir elmdən nişanədir. Ürfan bu elmi, "təfsili elm" adıyla geniş izahlara başlığ tanıyıbdır.

B – Fürqan, Qurani Kəriminikinci adından - əlamətindən ibarətdir. Fürqanda yoxsa Quranda xəzinə olunmuş elmi məktəblərdən öyrənmək mümkünsüz bir xəyaldır, belə bir elm ki ürfan termində "icmali elm" adıyla tanınmış və bütün həqiqətlər onun əhatə dairəsində qərar tapmış, Allah təalanın rəhmət və hikmətilə yalnız xalis ürəklərdə coşar.

**Qeyd**: *Fürqan yoxsa Quran bir dənə tamamilə (bütün surələr və mənalar) həzrəti peyğəmbərin müqəddəs qəlbinə nazil olunmuş və o qəlbə ilahi dəyər və şərəf bağışlayıbdır. İkinci dənə başqalara iblağ üçün tədrici halda ayə - ayə peyğəmbərə vəhy olunmuş.(bu beytdə birinci nazil olma nəzərə qalib gəlir.)*

Anlam: Ey islamın ulu peyğəmbəri merac sənin uca və üstün məqamından bir nişanədir. Bu məqamdan istiqbal etmək üçün Quran elmi təmamilə səmalardan yerə enmişdir.

Beyt 2: **Hiyni-dəvayi-nübüvvət müddəi ilzaminə,**
**Cahil ikən el, sənin elmin yetər bürhan sana.**

Sözlük: dəva = iddia (düz iddia); Nübüvvət = peyğəmbərlik; İlzam = lazım və vacib etmək = isbat etmək.

Nişanə 1 – "nübüvvət" - nübüvvət, mənəvi və gizli həqiqətlərdən xəbər vermək və insanları Allah təala sifətlərilə tanış etməkdən ibarətdir.[2]

Nişanə 2 – "Müddəi": hər kim özünü bir ixtiyar – iqtidar sahibi bilsə müddəidir, bunu nəzərə alsaq ki, aşiq məşuqun önündə ixtiyarsız və iradəsiz qul kimidir[3] (məmlük) və bütün varlığını onun eşqində fəna edibdir, məlum olar ki, müddəi hələ aşiqlik imkanını tapa bilməyibdir,

---

[1] Fərhəngi-loğat və istilahat və təbirati-ürfani.
[2] Yenə orada
[3] Qəzəl 2 və 3

çünki özündən əlavə iqtidar – imtiyazlarına güvənərək[1] ikilikdən çox "kəsrət"də giriftar olmuşdur. Elə buna görə də "Sədi" bir təmsilində bülbülün eşqini təhqir edərək deyir: "Ey gülün eşqində hay həşir salan bülbül, eşq dərsini pərvanədən sor ki o biçarə yanıb kül olursa da ancaq səsi, sədası çıxmayır[2]. Beləliklə, müddəinin eşq aləminə biganə olmağı sübuta yetir. Bunun üçün də ona günahkar bir şəxsdən artıq sərki edilir və deyilir: [3] العاصی خیر منالمدعی, (günahkar adam müddəidən yaxşıdır.)

Anlam: A – Ey islamın ulu peyğəmbəri sənin elmin və əzəmətin elə üstün və parlaqdır ki müddəi səni ürəkdə qəbul etməsə də, zahirdə səni təsdiq etməkdən başqa çarə tapa bilməyir.

B- Ey peyğəmbər, cahiliyyət küdurətində boğulmuş bir əsrdə sən səviyyədə alim peyğəmbərin zühur etməsi nübüvvətə açıq-aşkar möcüzə və möhkəm dəlildir.

Beyt 3: **Kilki-hökmün çəkdi hərfi-sairi ədyanə xətt,**
**Hökm isbat etdi nəfyi-sairi-ədyan sana.**

Sözlük: Kilk = qələm; ədyan = dinlər; nəfy = batil etmək = uzaq salmaq.

Nişanə 1 – "kələk hökm" - peyğəmbərə vəhy olunmuş əmrlərin iblağ etməkdən nişanədir, bu nişanənin qarşında kafir bir şəxs isə sükut etməyə və baş endirməyə məcburdur.

Nışanə 2 – "hərf" - bu beytdə bir qanunun yaxud, bir tədbirin davam etməsindən nişanədir.

Nişanə 3 – "xətt çəkmək" - bir vəziyyətin etibardan düşməsini və onun davamının sons çatmasını sübut edən nişanədir.

Anlam: Ey peyğəmbər, sənin iblağ etdiyin din, başqa dinlərdən mükəmməl və üstün olduğuna görə, onların etibar və tabeiyyət müddətinin bitməsini sübut etdi.

Beyt 4: **Baqiyi-möcüz nə hacət dini-həqq isbatinə,**
**Aləm içrə möcüzi-baqi yetər, Quran sana**

Sözlük: Baqi (birinci misrada) = başqa = digər; Baqi (ikinci misrada) = canlı = möhkəm = sabit.

Anlam: Ey peyğəmbər sənə vəhy olunmuş Quran axıcı və ürək açan ədəbi incəlik və dolğun məzmunlarla dolu olduğuna görə aydın və əbədi

---

[1] Bu imtiyaz və iqtidarın bir çoxu movhumi və xəyalidir

[2] ای مرغ سحر عشق ز پروانه بیاموز   کان ساخته را جان شد آواز نیامد(گلستان سعدی)

[3] doktor Seyyid Cəfər Səccadi, Fərhəngi istilahat və təbirati-ürfani.

möcüzə kimi sənin peyğəmbərliyini sübut edir və elə buna görə də mütəal Allah buyurub:

[1] وان کنتم فی ریب مما نزّلنا علی عبدنا فاتو بسوره من مثله و ادعو شهداءکم من دون الله ان کنتم صادقین

**Qeyd** 1: *Qurani-Kərim həm ehtiva, həm məna, həm də ədəbi incəlik cəhətindən bütün gözəlliklərə və dərinliklərə mükəmməl malik olduğuna görə bənzərsiz bir kitab və aydın bir möcüzədir.*

**Qeyd** 2: *Möcüzə-təcrübə və adət ölçüsünə sığmaz bir iş göstərməkdir, bu iş "vəli"dən*[2] *baş versə "kəramət", peyğəmbərdən görünsə "möcüzə", kafirdən üz göstərsə "istidrac" adıyla adlanır*[3].

Beyt 5: **Vəsfi Cibrili-Əmin etmiş qəbuli-xidmətin**
**Sirri həqq kəşfinə onunla yetib fərman sana**

Sözlük: Cibril = Həzrəti Cəbrayıl = dörd mötəbər mələkdən biri = Allahın vəhyini İslam peyğəmbərinə gətirən mələk.

Nişanə 1 – "Sirr" - aşiqin ürəyində qoyulmuş bir lətif və gözəl əmanətdən nişanədir. Bu nişanə olmasa şühud məqamına nailiyyət mümkünsüz olar.

Anlam: Ey Ulu Peyğəmbər, Həzrəti Cəbrail Allah-Təalanın salamını sənə iblağ edərək, sənin qəlbindəki gizli və incə ilahi əmanətdən bir neçəsinin hətta kiçik bir işarə qədər aşkar etməyini və xalqı mənəviyyət mülkünə hidayət qılmağını səndən istəyir.

Beyt 6: **Sənsən ol xatəm ki, rəf etmiş təmami-hakimi,**
**Xatəmi-hökmi-risalət tapşırıb dövran sana.**

Sözlük: Xatəm = sonuncu = axırda gələn = seyr yollarını və yüksəlmək məqamlarını mükəmməl bilən və tamamlayan, onların əhayətə çatdıran bir salik = zinət. Rəf = yüksəltmək = ucaltmaq = dikəltmək = aradan qaldırmaq; Risalət = Peyğəmbərlik.

Anlam: Ey bütün Peyğəmbərlərin öhdələrindəki hidayəti sona çatdıran və onların başlarını ucaldarkən vücudlarını zinətləndirən Pey-

---

[1] Quran, Bəqərə surəsi, ayə 23. Öz bəndəmizə və nazil etdiyimizə şübhə edirsinizsə, siz də buna bənzəyən surə gətirin və Allahdan başqa şahidlərinizidə çaxırın, əgər doğru deyirsinizsə.

[2] "vəli" özünü məbud eşqində məhv edən və mənliyini yaddan şıxaran bir mömindir.

[3] Fərhəngi istilahat və təbirati-ürfani.

ğəmbər, dövranlar dəyişilsə də sən gətirən din və hökm qiyamətə qədər dəyişilməz, sabit və möhkəm qalar.

Beyt 7: **Ol qədr zövqi-şəfaət cövhəri-zatında var,**
**Kim, gəlir ərzi-xəta mənidə bir ehsan sana.**

Sözlük: Şəfaət = xətakarlara "bağışlanmaq və hidayət olmaq" istəmək; Zövq = qüvvə = ilahi təmayulat = mənəvi duyğular; Cövhəre zat = batinin batini = ikinci batin = həqiqətin içərisi.

Anlam: Ey rəhmət Peyğəmbəri sənin batininlə qatqı və həqiqətinlə qarışmış şəfaət meyli = bir daimi ehsan süfrəsi tək xətakarlar üzünə açılıbdır.

Beyt 8: **Mahi-novdur, yoxsa sən qıldıqda seyri-asiman,**
**Qaldırıb barmaq gətirmiş asiman iman sana**

Sözlük: Mahi nov = hilal.

Nişanə 1 – "Mahi nov" - qara bir fəzada dalbadal parlayan işıqdan nişanədir.

**Qeyd**: *Nadanlıq, bidinlik və digər mənfi anlamlar və şərr işlər qaranlıqdan nişanədir.*

Nişanə 2 – "İman" - bu beytdə həqiqətlə düzgün tanış olmaqdan və onu təsdiq etməkdən nişanədir.

Anlam: Ey rəhmət Peyğəmbəri, sənin vücudunda parlayan mənəviyyat və hidayət nuru bütün cəhalətlərin və küdurətlərin qaranlığını aradan qaldırdı, belə ki,: A – göylərin yüksək və parlaq aləmlərinə sənin mənəviyyət və hidayətin təsir etdi.

B – Səmalarda yaşayan mövcudları hidayət etdin.

Beyt 9: **Ya Nəbi, lütfün Füzulidən kəm etmə ol zaman**
**Kim, olur təslim, miftahi-dəri-ğüfran sana.**

Sözlük: Nəbi = Peyğəmbər, kəm = müzayiqə; miftah = açar; Dəri ğofran = rəhmət qapısı = şəfaət qapısı.

Anlam: Ey rəhmət Peyğəmbəri, qiyamət günü əzəmət və hökümranlıq tacını başa qoyanda,behiştin malikiyyət sənətini ələ alanda və guruh – guruh möhtacları bağışlatdıranda Fizulini öz şəfaətindən məhrum qılma.

## Q Ə Z Ə L 7

**(1) Ey mələksima ki, səndən özgə heyrandır sana,**
**Həqq bilir insan deməz hər kim ki, insandır sana.**

**(2) Verməyən canın sənə bulmaz həyati-cavidan,**
**Zindeyi-cavid ona derlər ki, qurbandır sana.**

**(3) Aləmi pərvaneyi-şəmi-cəmalın qıldı eşq,**
**Cani-aləmsən, fəda hər ləhzə min candır sana.**

**(4) Aşiqə şövqünlə can verməkliyin müşkül degil,**
**Çün Məsihi-vəqtsən, can vermək asandır sana.**

**( 5) Çıxma yarim gecələr, əğyar tənindən saqın,**
**Sən məhi-ovci-məlahətsən, bu nöqsandır sana.**

**(6) Padşahım! Zülm edib aşiq sana zalim demiş,**
**Xubrulərdən yaman gəlməz, bu böhtandır sana.**

**(7) Ey Füzuli, xubrulardan təğafül dur yaman,**
**Gər cəfa həm gəlsə onlardan, bir ehsandır sana.**

Beyt 1: **Ey mələksima ki, səndən özgə heyrandır sana,**
**Həq bilir insan deməz hər kim ki, insandır sana.**

Nişanə 1 – "Mələksima" - ülvi mənalar və ilahi parlamalar cəmalında cilvələnən məşuqdan nişanədir.

**Qeyd**: *Mələk göydə sakin olduğuna görə mələksima yer kürəsində yaşayan göy maraqlı insandan istiarədir*.

Nişanə 2 – "Heyran": heyran ülvi bir vücud qarşında əqli – idraki aciz və mat qalmış bir aşiqdən nişanədir.

Anlam: Ey həzrət məşuq, sənin cəmalında parlayan mənəvi hüsnlər və ilahi gözəlliklər ap - açıq nişan verir ki, yer kürəsinin küdurəti sənin səmavi obrazında heç bir təsir qoya bilməyib. Beləliklə, dünyanın maddi əngəlləri sənin İnnəlillahdan alınma hissiyatınə bir nöqtə qədər də ləkə sala bilməyib.

Beyt 2: **Verməyən canın sənə bulmaz həyati-cavidan,**
**Zindeyi-cavid ona derlər ki qurbandır sana.**

Sözlük: Cavidan = əbədi = ölməz; Zində = canlı; Cavid = əbədi.

Nişanə 1 – "Qurban": A – qurban ikilik fasiləsini yox dərəcəsinə çatdıran aşiqdən nişanədir.

B – Dünyəvi həyatını məşuq həzrətinə fəda edən aşiqdən əlamətdir.

**Qeyd** 1: *Dünyəvi xarakterini aşiq qılıncından keçirən bir insan dübarə mənəvi obrazına qayıdarkən mənəvi məşuqunun ərəfəsinə yaxınlıq imkanını tapar (qürb). Bu ərəfə ilə tanış insan dünyanın çirkin astanasını nəzərdən salıb onun zərər-ziyanını, yaxud mənfəət – qazancını gözündən salar. Beləliklə dünya ilgiləri (hökümranlıq, şahlıq, iqtidar, mal-dövlət və ...) onun əqidəsində, imanında və addım açdığı ilahi yolunda heç bir təsir qoya bilməz.*

**Qeyd** 2: *Həzrəti-məhbub yolunda cihad şəraitində canını, qanını fəda edən bir insan qurban, yaxud qürb məqamına nail olar. Bu nailiyyət ürfan məktəbinin "Qətil" ünvanlı mərtəbəsində geniş üfüqlü izahlara imkan yaratmışdır.*

**Qeyd** 3: *"Qətil" (ölüm, fədakarlıq) qürb, yaxud qurban məqamının əsas şərti olduğuna görə mənəvi sərmayə hesab olur. Yersiz deyil ki, belə bir sərmayəni ələ gətirməzdən əvvəl qətlə boyun əyən fədakar bir aşiq məşuq hüzurunda məhkəməyə məruz qalmalıdır. Elə bunun üçündə Hafiz buyurur:*

عجيب و اقعه ایّ و غريب حادیثه ايست
انا اصطبرت قتيلا و قاتلی شاکی [1]

[1] Qəribə burasıdır ki,məşuq mənim qanımı tökə-tökə mənə ariz olmuşdur (yəni məndən şikayətlənmiçdir).

*Və Sədi buyurur:*

مکن گریه بر گور مقتول دوست
بگو حمد الله که مقبول اوست[1]

Anlam: Ey gözəl məhbub[2] zavala uğrayan dünyəvi həyatını sənə qurban edən bir aşiq zavalsız və əbədi bir həyata nail olar.

Beyt 3: **Aləmi pərvaneyi-şəmi-cəmalın qıldı eşq,**
**Cani-aləmsən, fəda hər ləhzə min candır sana.**

Nişanə 1: "Şəmi-camal": A – gözəl məhbubun təcəlli[3] nurundan nişanədir. Bu nur aşiqin qəlbində çaxarkən o, qəlbi bəst[4] məqamına nail edər.

B – Şəmi-camal bir gözəl bəndənin cəmalında parlayan Allah nurundan nişanədir. Bu nur aşiqin, yaxud salikin könlündə dünyəvi və maddi ilgiləri qat –qat soyub yandırar və onu şühud şəraitinə hazırlayar. Demək, onu bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəldər.

P – Şəmi-camal həzrət məbudun lütf və rəhmət nurundan nişanədir.

Anlam: Ey gözəl məbud, yaxud ey gözəl məbudun lütf və rəhmət nuru cəmalında parlayan canan, dünya bu camal, yaxud bu nurun başına dolanarkən:

A – Hərəkət və həyat tapır.

B – Hörmət və minnətdarlıq göstərir.

P – Zavala məruz qalmış məcazi həyatını bu nurda itirərkən mənəvi və əbədi bir həyat tapır.

Beyt 4: **Aşiqə şövqünlə can verməkliyin müşgül degil,**
**Çün Məsihi-vəqtsən can vermək asandır sana.**

Sözlük: Məsih = Həzrəti-İsa Peyğəmbər.

Nişanə 1: "Şövq": A – şühud arzisinda[5] aşiqin mənliyini onun yadından çıxaran bir nişanədir.

B – Şövq - aşiqin qəlbini biqərar edən batini bir atəşdən nişanədir.

---

[1] Qətlə yetib qurban olmuş bir aşiqin məzarı üstə ağlama, bəlkə sərxoş olarkən şükür elə, ona görə ki,o aşiq öz arzusuna (qürb məqamına) nail olubdur.

[2] Bu məhbub (yeri gəldikcə qeyd və izah olacaq) gah mütəal Allahın öz təcəllası, gah da onun sifətlərini əks etdirən gözəl bəndələrindən (camalı gözəl kamalı gözəl) ibarətdir.

[3] Qəzəl, 1 beyt 7.

[4] Bəst, yeri gəldikcə qeyd və izah olunacaq.

[5] A – şühud, varlıq güzgüsündə (bütün yaranmışlarda yaxud kəsrətdə) vəhdət nurunu, yaxud məbud camalını əks etdirən məqamdır.

B – Şühud, haqqı haqda müşahidə etmək məqamıdır.

P – Şövq - məhəbbət rolunun lideri olduğuna görə onsuz məhəbbət bar verməz.

Nişanə 2: "Vəqt" - bu beytdə hal məqamından nişanədir.[1]

Anlam: Ey gözəl məhbub, sənin yolunda həyatını, canını fəda edən aşiq heç də zərər-ziyan görməz, ona görə ki, sən bir zavala məruz qalmış dünyəvi canı alarkən, bir əbədiyyətə söykənmiş mənəvi canı və yeni həyatı bağışlayansan.

**Qeyd**: *Məsih bəxş edən həyatın arxasında məmat var, amma sən bağışlayan həyat əbədi və ölümsüz bir həyatdır.*

Beyt 5: **Çıxma yarim gecələr, əğyar tənindən saqın,**
**Sən məhi-ovci-məlahətsən, bu nöqsandır sana.**

Sözlük: Tən = sərki = atmaca atmaq = nizələmək = eyb tutmaq; məh = ay = mah.

Nişanə 1: A - "Tən": mərifət və mənəviyyətə biganə, yaramaz insanların tərsə idrakından nəşət tapan təhqir etməklər və irad tutmaqlar nişanəsidir.

B – "Tən" - dil yarası vurmaqdan nişanədir.

Anlam: Ey gözəl məhbub, camal hüsnünü, kəsrət güzgüsündən[2] mərifət və mənəviyyətə biganə şəxslərə (naməhrəmlərə) əks etdirmə çünki onlar tərsinə düşünərkən əksinə qəzavət edərlər.[3]

Beyt 6: **Padşahım! Zülm edib aşiq sana zalim demiş,**
**Xubrulərdən yaman gəlməz, bu böhtandır sana.**

Sözlük: Xubru = gözəl.

Nişanə 1 – "Padşah": A – padişah, həsrət və arzu atəşində alovlanmış ürəklərdə hökm sürən canandan nişanədir.

B – Padşah - bütün varlığa malik və hakim mütəal məbudun üzündən nişanədir.

Nişanə 2 – "Zülm" - ürəksıxma – boğması, yaxud "qəbz" mərhələsindən nişanədir.

---

[1] Qəzəl 1, beyt 7.

[2] Qəzəl 4, beyt 3 ,(ayine,kəsrət)

[3] Hafiz bu barədə buyurub تابه گیسوی تودست ناسزایان کم رسد     هر دلی از حلقه ای درذکر یارب یار بست: (Bütün aşiq ürəklər dua edirlər ki, naməhrəmlər kəsrət güzgüsündə sənin camalını görməyələr) Bu müəllif "Ta Qafi-əndişe" kitabının birinci cildində bu beyti qarğış səthində və mənfi mənada yox bəlkə dua və xeyrxahlıq məqamında bilmiş, beləliklə biganələrə əvvəl tərbiyəyə yetişməyi, sonra müşahidə və mükaşifəni gərəkli görmüşdür.

**Qeyd**: *Necə ki, elmi akademiyalar bir sıra ağır və müşkül təkliflərlə öz tələbələrini sınamaq və nəhayət bişirib – yetirmək istəyirlər, eşq məktəbi də onlarla paralel, eşq tələbələrini bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəltməyə sıxçalamaq və tərbiyə edib hazırlamaq istəyir. Bu sıxıntılar yaxud bu "qəbz" hal və kamal səmalarına yaxud "bəst" məqamına[1] yüksəlmənin şərti və açarıdır.*

**Qeyd**: *Eşq mülkünü ən möhkəm və ilk tanınmış qanunlarından biri də qəbz qanunudur. Beləliklə aşiq ölmüş bir şəxsin hicran atəşində yanması və covr və cəfa görməsi həm təbiidir, həm də onun xeyrinə tamam olarkən onu minnətdar edir. Beləliklə, vəfa-cəfaya məşrut və bəstü, qəbzə bağlıdır. Bununla bərabər fəlsəfə "əzdad" bəhsinə[2] əsaslanır və "bir şeyin vücudunu və zühurunu onun ziddinə (əksinə) bağlı bilir"[3].*

**Qeyd** 1: *Əzdad bəhsi təzad formasından üstün addım açarkən, bir vahiddə iki ziddin (iki əksin) varlığını aramağa çalışır, nəhayət, hər bir vücudun ziddini özündə hiss edir. Beləliklə, "ağ qarda qara element qatqısından" söz açır.[4]*

**Qeyd** 2: *Ürfan isə vahid bir insanı iki əksdən ibarət bilir: biri zahiri yaxud dünyəvi cəhət, ikincisi batini yaxud mənəvi cəhət. Bu ikiyönlü vahid insanın dünyəvi həyatı nəzərindən düşməsə, mənəvi həyatı zühur etməz. Elə buna görə də İslamın ulu peyğəmbəri buyurmuş: " موتوا قبل ان تموتوا" Ölümdən əvvəl özünü öldür.[5]*

Anlam: Ey mənim həkimi-məhbub və malıkım,sənin iradə və əmrinə bağlı qəbzlər mənim ürəyimi bəst məqamına tərbiyə edən və hazırlayan sıxçalamalar və sınaqlardır. Beləliklə, hər aşiq qəbz əzabının qədrini bilməsə və cəfalar önündə şükür yerinə şikayət etsə, həqiqətən özünə zülm edər, çünki özünü bəst vasitəsindən məhrum qılar.

Beyt 7: **Ey Füzuli, xubrulardan təğafül dur yaman,**
**Gər cəfa həm gəlsə onlardan, bir ehsandır sana.**

Sözlük: Təğafül = özünü nadanlığa vurmaq, bilə - bilə bilməzliyini təsdiq etmək.

---

[1] Bəst yeri gəldikcə qeyd və izah olacaqdır.
[2] Qəzəl 3, beyt 2.
[3] Paydiya, ... səh.994.
[4] Tarixi-fəlsəfeyi-Qərb, Bertrand Rassel, səh.112.
[5] Qəzəl 1, beyt 4, nişanə 1

Anlam: 6-cı beytin izah və təkrarında buyurur: Ey Füzuli, yaxud ey aşiq, gözəl və hakim məşuqun cəfasını vəfasından fərqləndirən, bil ki təğafül edibsən,çünki cəfa (qəbz) vəfanın (bəst) sərmayəsidir.

## Q Ə Z Ə L 8

**(1) Kargər düşməz xədəngi-təneyi-düşmən mana,**
**Kəsrəti-peykanın etmişdir dəmirdən tən mana.**

**(2) Eymənəm səngi-məlamətdən kim, alıb çevrəmi,**
**Oldu zənciri-cünun bir qəleyi-ahən mana.**

**(3) Ondanam rüsva ki, seylabi-sirişkim çak edər,**
**Zəxmi-tiğin qani geydirdikcə pirahən mana.**

**(4) Dəmdədəm şəmi-cəmalından münəvvər olmasa,**
**Ey gözüm nuri, gərəkməz dideyi-rövşən mana.**

**(5) Hiç məskəndə qərarım yoxdurur ol zövqdən**
**Kim, qaçan xaki-səri-kuyin ola məskən mana.**

**(6) Başda bir sərvi-səmənbər vəslinin sevdası var,**
**Sud qılmaz baqiban nəzzareyi-gülşən mana.**

**(7) Ey Füzuli, odlara yansın büsati-səltənət,**
**Yeydir ondan Həqq bilir bir guşeyi-külxən mana.**

Beyt 1: **Kargər düşməz xədəngi-təneyi-düşmən mana,**
**Kəsrəti-peykanın etmişdir dəmirdən tən mana.**

Sözlük: Kargər = təsir edən = söz = şəmşir zərbəsi = dua; Xədəng = süngü = ox; peykan = ox ucu (dəmir).

Nişanə 1 – "Tənə" - eşq və ürfana biganə şəxslərin sərkilərindən nişanədir.

**Qeyd** 1: *Tənə ox mənasına da eyham edir, çünki sərkilər, dünyəviliyindən və özlüyündən iz, təsir saxlayan aşiqin qəlbini ox ucu kimi yaralar.*

**Qeyd** 2: *Sərki yarası aşiqi özlüyündən ayıran bir vasitə olduğuna görə həqiqətən aşiqə xidmət edərkən sərki vuranların hədəfini əks edir*[1].

**Qeyd** 3: *Sərvət, şöhrət ,iqtidar, məqam və habelə ictimai xarakteri dikəldən digər dünyəvi imtiyazları qazanmaq ilgiləri çox vaxt quldurbaşılığa, qolu zorluluğa və ağır-ağır günahlara bais olur, beləliklə aşiq sərkilərdən qorunmaq qəsdi ilə ictimailəşməkdən çəkinirkən bir çox kəsrət əngəllərindən uzaqlaşıb, xəlvət və vəhdət məqamına yaxınlaşır*[2].

Nişanə 2 – "Dəmir" – aşiqin cövr və cəfa vasitəsilə, yaxud qəbz tərbiyəsi ilə, dünyəvi uçurumlarda və maddi təhlükələrdə möhkəmlik göstərən yeni tapılmış xarakterindən nişanədir.

B- Aşiqin dünyəvi zərbələrin təsir etmədiyi mənəvi şəxsiyyətindən nişanədir.

Anlam: Ey həkimi-məhbub, qəbzlər təlimati bərəkətindən sərkilər və təhqirlər önündə bir sarsılmaz istiqamət tapmışam.

Beyt 2: **Eymənəm səngi-məlamətdən kim, alıb çevrəmi,**
**Oldu zənciri-cünun bir qəleyi-ahən mana.**

Sözlük: Səng = daş; məlamət = sərki = danlaq; cünun = məcnunluq = divanəlik; ahən = dəmir.

Nişanə 1 – "Səngi-məlamət": birinci beytdə qeyd olunmuş tənə nişanəsini təkrar edir.

Nişanə 2 – "zənciri-cünun" - aşiqin içəri vücudunu dünyəvi duyğulardan boşaldıb mənəvi ilgilərlə dolduraraq daşırdan əhval ruhiyyədən nişanədir.

Nişanə 3 – "Qəleyi-ahən" - birinci beytdə xatırladığımız istiqaməti təkrar edən nişanədir.

---

[1] Qəzəl 1, beyt 5, qeyd 1(məlamət)

[2] Qəzəl 1, beyt 3 və 4

Anlam: Ey gözəl məhbub, sənin eşqin həyatın əsas mövzusu olduğuna görə mənə bir sarsılmaz istiqamət bağışlayıb.

Beyt 3: **Ondanam rüsva ki, seylabi-sirişkim çak edər,**
**Zəxmi-tiğin qani geydirdikcə pirahən mana.**

Sözlük: Seylab = sel = sel-su; Sirişk = göz yaşı; Çak = rəxnə = para = paralamaq; Zəxm = yara; Pirahən = köynək.

Nişanə 1 – "Seyli-sirişk" - şühud tələbində bitablıq və qərarsızlıq etməkdən nişanədir.

Nişanə 2 – "Zəxmi-tiğ" - qəbz sınaqlarının çətinliklərindən nişanədir.

Nişanə 3 – "Pirahən" - yuxarıda xatırladığımız "qəleyi-ahən" nişanəsini və istiqamət mərhələsini təkrar edir.

Anlam: Ey gözəl məhbub şühud həsrətində etdiyin biqərarlıq, qəbz məktəbində öyrəndiyim istiqamətə rəxnə salarkən camaatın sərki təhqirinin əlavə olmasına bais olur.

**Qeyd**: *Rüsvaylıq, aşiqi cəmaətdən, yaxud kəsrətdən uzaqladərkən vəhdətə yaxınladan mövqeyyətdir. Beləliklə, eşq baxımında rüsvaylıq müsbətlik və mühimlik əlamətidir.*

Beyt 4: **Dəmdədəm şəmi-cəmalından münəvvər olmasa,**
**Ey gözüm nuri, gərəkməz dideyi-rövşən mana.**

Sözlük: Şəm = şam; münəvvər = parlaq = nürani; dide = göz, rövşən =nurani .

Nişanə 1 – "Şəmi-cəmal" A – salik və aşiqin ürəyində mütəal məbud ilgisindən başqa ilgiləri yandırıb aradan qaldıran nişanədir.

B – Mərifət nurundan nişanədir.

P – Vəhdət səmasından və yeganə məbudun ürək açan (bəst) cilvələrindən nişanədir.

Nişanə 2 – "Dideyi-rövşən" - şühud cəlalərini müşahidə edən batini gözdən nişanədir.

**Qeyd**: *Göz başqalarını görərkən özünü görməz olduğuna görə şühud məqamına istiarə tutulmuş və kinayəli halda, bəlkə də əyani surətdə mütəal məhbub təcəllasına göz açmağı və öz mənliyindən göz çəkməyi əsas bilir.*

Anlam: Ey görünməz mənəviyyətləri qəlbimin gözünə göstərən məbud, gözə dəyən və şərəf verən yalnız sənin camalından zühur edən gözəlliklərdir.

**Qeyd**: *"Əzdad və azvac" - yuxarıda xatırladığımız kimi* [1] *hər bir şey sonuna çatanda önünə qayıtmalıdır, buludun suya, gecənin gündüzə, yaşlının uşaq kimi zəif dolanmağı və yüzlərcə belə misallar məlum edir ki, nur da bu qanundan müstəsna deyil, demək parlaq göz qamaşmaq, hətta kor olmaq bu nəzəriyyənin aydın misalıdır. Bunu nəzərə alsaq ki, təcəllalıq nur, yaxud parlama maddi və dünyəvi nurdan tam başqa və çox üstündür, belə bir nurda maddi gözün kor olması və mənəvi batini gözün müşahidə səviyyəsinə çatması məlum olar. Elə buna görə də bəzən oxuyan adam halda gözünü yumur. O bilər – bilməz dünyadan göz yummaq vasitəsilə mənaya göz açmaq istəyir.*

Beyt 5: **Hiç məskəndə qərarım yoxdurur ol zövqdən,**
**Kim qaçan xaki-səri-kuyin ola məskən mana.**

Sözlük: Xak = torpaq; sər = başlayış = baş.

Nişanə 1: "Qərar" - sakinlikdən nişanədir.

**Qeyd**: *Sakinlik, hal* [2] *məqamının əksi olduğuna görə batin vücudun ölüm əlamətidir.*

Nişanə 2: "Zövq" A – şühud məqamının ilk mərtəbəsindən nişanədir. Bu mərtəbəni dərk edən aşiq şühud nemətinin dadını, tamını düşünərkən, dəmbədəm özünün atəşini və tələbini əlavə edər və nəhayət "hal" səmasının şıdırğı parlamalarına yetişər.

B – Zövq mərtəbəsində asanlıqlarla yanaşı çətinliklər də zühur edərlər.

P – Zövq müşahidə və mükaşifə məqamının meyvəsi olduğuna görə bu beyt də ötən beyti təkmil edir.

Nişanə 3: "Xaki-sərikuyi" - vəhdət ərəfəsində fanilikdən nişanədir.

Anlam: Ey gözəl məhbub, sənin astananın ətri ilə tanış olan çağdan dünya mülkündə və bədən mühitində qərarım yoxdur.

**Qeyd**: *Dünya və bədən fikrini başdan atmayan mənəvi vüsala yetişə bilməz.*

Beyt 6: **Başda bir sərvi-səmənbər vəslinin sevdası var,**
**Sud qılmaz baqiban nəzzareyi-gülşən mana.**

Sözlük: səmənbər = gül sinəli = sinəsi gül; sevda = sövdə = xəyal; sud = qazanc = mənfəət = fayda; nəzarə = nəzər salmaq = tamaşa, gülşən = gülüstan .

---

[1] Qəzəl 3 beyt 2 .
[2] Qəzəl 1 beyt 7 .

Nişanə 1 – "Sərv" A – dünyəvi bir canan qamətində mənəvi tənasüblərin quruluşundan nişanədir.

B – Sərv, mütəal məhbubun təcəllalarının davam etməyindən, yaxud şühud nurunun dalbadal yeniləşib çaxmaqından nişanədir.

Nişanə 2 – "Sevda" - ötən beytdə xatırladığımız zövq mərtəbəsinin tələb adlı meyvəsindən nişanədir.

Nişanə 3: "Gülşən" - bu beytdə dünyəvi gözəlliklər və maddi ürək açan müsbət və məna axımlı mövqeyitlərdən nişanədir (Dünyəvi bəst).

Anlam: Məna gözəlliklərilə tanış olandan dünya gözəllikləri gözdən düşübdür.

Beyt 7: **Ey Füzuli, odlara yansın büsati-səltənət,**
**Yeydir ondan Həqq bilir bir guşeyi-külxən mana.**

Sözlük: Büsat = geniş meydan = dəmdəsgah = kapital = sərvət; gülxən = zibil yeri = tulanbar.

Nişanə 1: "Büsati-səltənət" - dünyəvi iqtidar və hakimiyyətdən nişanədir.

Anlam: Ötən beytlərin təkrarında buyurur: Ey Füzuli mənəvi sərmayə köçmək ümidinə dünyəvi yer yaşayışını qəbul etmişəm yoxsa dünyanın ən uca məqamı onun ən alçaq mövqeiyyətindən həqir və aşağıdır. Ona görə ki, dünyəvi ucalıq (mənfi ucalıq) mənəvi yüksəkliyə xətərli bir maneədir.

## Q Ə Z Ə L 9

**(1. ) Cam içrə mey ki, dairə salmış hübab ona,**
**Ayinədir ki, əks salır afitab ona.**

**(2) Zahid sual edərsə ki, məndən nədir murad?**
**Bizdə səfadır, onda küdurət - cavab ona.**

**(3) Qan-yaş töküb yanımda gəzər atəşin kəbab,**
**Məşuqə bənzər atəşü aşiq kəbab ona.**

**(4) Eylər könüldə əşk xətin şövqünü füzun,**
**Oddan çıxar buxar saçıldıqca ab ona.**

**(5) Çeşmin mərizi oldu könül ləldən əm et,**
**Rənci-xumarə düşdü ,dəvadır şərab ona.**

**(6) Təklifi-cənnət eyləmə kuyində könlümə,**
**Çün cənnət əhlidir ,nə verirsən əzab ona?**

**(7) Məsduddur Füzuliyə meyxanələr yolu,**
**Ya Rəbb, hidayət eylə təriqi-səvab ona.**

Beyt 1: **Cam içrə mey ki, dairə salmış hübab ona,**
**Ayinədir ki, əks salır afitab ona.**

Sözlük: Hübab = köpük; əks = şəkil = təsvir; aftab = günəş.

Nişanə 1 – "Cam" - A – Cam, salikin və aşiqin mənəvi duyğular və ilahi mərifətlərlə dolu ürəyindən nişanədir.

B – Cam, eşq qələbəsində özlüyünü məhv etmiş ürəkdən nişanədir.

P – Cam, məcazi əngəllər və nəhayət, maddi küdurətlərdən xilas olmuş ürəkdən nişanədir.

T – Cam, aşiqlər təlimatçısı mürşüdün tükənməz mənəvi sərvətə xəzinədar olmuş ürəyindən nişanədir.

S – Cam, həzrəti-məşuqun lütf və məhəbbətini bütün vücudunda əks etdirən mürşüddən nişanədir.

Nişanə 2 – "Mey" - A – həzrəti-mürşüdün, yaxud aşiq tələbinin dünyəvi ilgilərini unutma bərəkətindən mənəvi maqnitlər və ilahi cazibələr qazanmış qəlbindən nişanədir.

B – Mey, şühud ləzzətini dadızdıran şövq meyvəsindən ibarətdir.[1]

Nişanə 3 – "Ayinə" - A – ayinə, ilahi camal nurunu əks etdirən qəlbdən nişanədir.[2]

B – Ayinə, ilahi sifətləri əks etdirən kamil insanın vücudundan nişanədir.

Nişanə 4 – "Afitab" - aşiqin mənliyini qoparan ilahi camal gözəlliklərindən nişanədir.

**Qeyd**: *Afitab, müxtəlif şəraitdə müxtəlif məqamlardan nişanədir.*

Nişanə 5 – "Dairə" - A – dairə, aşiqin heyran və sərgərdanlığını eyham edən nişanədir.

B - Hacılar dövr eləyən Allah evinin ehtiramını icra edərkən həzrət məhbubun başına dolanmaqdan başqa minnətdarlıqla yanaşı hacət diləməkdən nişanədir.

Nişanə 6 – "Hübab", məcazi varlığını soyunub mənəvi varlığa söykənən aşiqdən nişanədir.

Anlam: Təbiəti atıb Tanrıya söykənmək bərəkətinə görə həzrət məbud öz camal və cəlal nurunu mənim vücudumda əks etdirir.

Beyt 2: **Zahid sual edərsə ki, məndən nədir murad?**
**Bizdə səfadır ,onda küdurət, - cavab ona.**

---

[1] Qəzəl 1, beyt 2
[2] Qəzəl 4, beyt 3

Nişanə 1 – "Zahid": A – zahid dünyaya dal çevirib mənaya üz tutan insandan nişanədir.

B – Zahid, dini və şəriət prinsiplərini dəqiqliklə qoruyan inşandan ibarətdir, o, dünyəvi həyat hissəsində yalnız əql və məntiq hökmünü qəbul edə bilir.

**Qeyd** 1: *Arif, zahidi tənqid etməklə onunla düşmənlik yox, bəlkə dostluq edir. Deməkؘ* ‹‹كلّ ئن عليهافان›› [1] *ayəsini ona təfsir etmək, beləliklə də onu ayıq salmaq və inandırmaq istəyir çünki, hər şey müəyyən vaxt sona çatan kimi əql və elm də məxsus bir dünyəvi mərtəbədə nəhayətə çatmalıdır, zahid isə aşiq kimi bu mərtəbədə əql səviyyəsindən sovuşub eşq səmasına yüksəlməlidir. Ancaq zahid belə bir istəyi qəbul edə bilməyir və əqlin minus prinsipindən əl götürməyə razılıq verməyir.*

**Qeyd** 2: *Ürfan və ədəbiyyatın çox faizi "mütəzəhhid" ifadəsini zahid adıyla tənqid etmişdir çünki o, (mütəzəhhid) düzgün zahid deyildir, çünki onun xarakteri üzdə bir cür, arxada başqa cürdür.*

**Qeyd** 3: *Əql Kərbəla cihadında 72 nəfərin neçə yüz min nəfər qarşısında müharibəyə durmasını məntiqə uyğun görmədi. Amma, eşq elə bir əqlin məntiqsizliyini tarixin qanlı səhifələrində qiyamətə kimi qabarıq saxladı.*[2]

Nişanə 2 – "Mey" - bu beytdə qəlbi səfa məqamına hazırlayan əhval qələbəsindən nişanədir.

Nişanə 3 – "Səfa" - dünyəvi və məcazi istəkləri ürəkdən çıxaran və onu saf edən qüvvədən nişanədir.

Nişanə 4 – "Küdurət" - maddə yaranışda qaralıqla (küdurətlə) qatqı olduğuna görə maddi əlaqələr küdurət törədəndirlər. Beləliklə, küdurət səfanın əksi və maddi istəklər əlamətidir.

Beyt 3: **Qan-yaş töküb yanımda gəzər atəşin kəbab,**
**Məşuqə bənzər atəşü aşiq kəbab ona.**

Nişanə 1 – "Atəş" - ikinci misrada şühud mərtəbəsindən əvvəl şövq mənzilini dərk etmiş aşiq qəlbinə daxil olan ilk məhəbbətdən nişanədir. Bu məhəbbət ki, həzrət məbud ilgisindən başqa ilgiləri tamamilə yandırıb, külünü şühud nəsiminə tapşırar və aşiqi birinci beytdə qeyd

---

[1] Quran, Ərrəhman surəsi, ayə 26 ("Yer üzərində olan hər şey aənaya uğrar – müt.")

[2] همچنین در کربلا سلطان عشق... چون روان گردید بر میدان عشق
عقل آمد راه او را سخت بست عشق آمد از دوکونش رخت بست
عقل بر هان گفت و استدلال یافت عشق مستی کرد و استقلال یافت
عقل گفت... عقل گفت از زینب و شهر دمش عشق گفت از شهریار و سهر عشق
چون عشیق ازجام وحدت مست شد... اززخم بسیارم غمست عشق گفت اراونهد مرهم کمست
عقل باعشق آمد و همدست شد (زبده الاسرار،صفی علیشاه)

olunmuş "hübab" məqamına yüksəldər. "Nari-məhəbbət" ünvanı ilə tanınmış ürfani bir məqamdır.

Nişanə 2 – "Kabab": A – Kabab ikinci misrada aşiqi "nari-məhəbbət"də bişirib yetirməkdən nişanədir.

B – Aşiqin qəbz və hicr mənzilində etdiyi biqərarlıqlardan nişanədir.

Anlam: A – çöl həyat-əksliklərin barışığından hasil olduğu kimi[1] içəri həyat isə ürək atəşilə göz yaşının birləşməsindən nişanədir.

B – Çöl həyatı su (göz yaşı) silib apararkən içəri şəxsiyyəti od bişirir.

Beyt 4: **Eylər könüldə əşk xətin şövqünü füzun,**
**Oddan çıxar buxar saçıldıqca ab ona.**

Sözlük: Əşk = göz yaşı; xətt = qulaqla qaş ucu arasında təzə bitmiş tük; füzun = əlavə = çox; ab = su.

Nişanə 1 – "Xətt": A – xətt[2] bu beytdə dünyada yaşayan gözəl bir insanın camalında parlayan mənəvi hüsnlərdən nişanədir.

B – Xətt, cismdə əks etdirilmiş ruhi hüsnlərdən nişanədir.[3]

Anlam: Ötən beytin təkid və təkmilində buyurur: A – Od kababdan damcılayan damlaları buxar etdiyi kimi "nari-məhəbbət"[4] də aşiqin göz yaşını buxara döndərir.

**Qeyd**: *"Şövq və şühud" deyilən buxardan aid olur.*

*B – Nari-məhəbbət isə ürək qanını buxara döndərib su adıyla aşıqin gözündən axıdır.*

Beyt 5: **Çeşmin mərizi oldu könül ləldən əm et,**
**Rənci-xumarə düşdü ,dəvadır şərab ona.**

Sözlük: Çeşm = göz; məriz = xəstə; brənc = zəhmət = əzab

Nişanə1 – "Çeşm" - şühud məqamından nişanədir.

**Qeyd**: *Bir çox təbii gözəllikdə qeyri-təbii (mənəvi) gözəlliklərin dərki bir növ şühuddur.*

Nişanə 2 – "Məriz" - aşiqi mənliyindən qoparmağa hazırlayan nişanədir.[1]

---

[1] زندگانس آشتی ضدهاشش      مرگ آن کاندر میانشان جنگ خاست
( مثنوی مولوی ، دفتر اول ، بیت 1324)

[2] Xətt yeri gəldikdə qeyd və izah olunacaq.

[3] Fərhəngi Moin.

[4] Məhəbbət nari və nuri yerli-yerində qeyd və izah olacaqdır.

Nişanə 3 – "Ləl" - şeyx və mürşüdün mərifət maraqlarıyla aşıb-daşan ürəyindən nişanədir.

**Qeyd**: *Ləl birinci beytdə qeyd olunmuş "cam" nişanəsilə paralel bir məqamdır.*

Nişanə 4 – "Xumar" xumar, bu beytdə: A – dünya və məna arasında heyran qalmış aşiqdən nişanədir (dünya onu bir tərəfə çəkir, məna başqa tərəfə). Bu heyranlıq "məczubiyyət" ünvanlı cazibə mərtəbəsinə nailiyyət müqəddiməsidir. Fəlsəfə isə ürfan kimi bu müqəddiməni ən əhəmiyyətli tanıyarkən deyib: (dünya və məna arasında) heyran və sərgərdan qalmayan bir insana ilahi əhval – ilham nazil olmaz.[2]

Nişanə 5 – "Şərab" - heyranlıq çətinliyinə üstün gələn məqamdan nişanədir.

Anlam: Ey mehrban məhbub, heyranlıq çətinliklərini şühud cilalarında məhv edərək mənə dünyəvilikdən nicat bağışla.

Beyt 6: **Təklifi-cənnət eyləmə kuyində könlümə,**
**Çün cənnət əhlidir, nə verirsən əzab ona?**

Nişanə – "Cənnət" A - cənnət birinci misrada insanın ilhamını maraqlandıran behiştdən ibarətdir.

B – Cənnət ikinci misrada vəhdət mülkünün, yaxud yeganə məbud və məhbubun öz ərəfəsindən ibarətdir.[3] Birinci misra rizvan[4] behiştini və ikinci misra can behiştini göstərir.

Anlam: Ey yeganə məbud, sənin astananın ətrilə və fikrilə tanışlıq mənim özəl və əla behiştimdir, digər dünyaşünas əqlə bağlı zahidlər sevən behiştə hacətim yoxdur.

Beyt 7: **Məsduddur Füzuliyə meyxanələr yolu,**
**Ya Rəbb, hidayət eylə təriqi-səvab ona.**

Sözlük: məsdud = qapalı = bağlı; Səvab = müstəqim = düz = haqq = yarar = layiq.

Nişanə 1: "Meyxanə" - bu beytdə aşiqi özündən xəbərsiz edən mürşüd məktəbinin ülvi təlimatından nişanədir.

Nişanə 2 – "Hidayət " - bu beytdə aşiqi meyxanə mövqeiyyətilə tanış edən mənzildən ibarətdir.

---

[1] Məriz, başqa hallarda müstəqil və nəhəng bir mövzudur.

[2] Dovreyi-asari-Əflatun, cild 2, səh.1379

[3] Qəzəl 8, beyt 5 (nişanə: "sər--kuy")

[4] Rizvan = ruhun bədənlə birləşmə razılığı = behiştin başqa adı

Nişanə 3 – "Təriqi-səvab" - vəhdət ərəfəsinə həsr olunmuş müstəqim yoldan ibarətdir.

Anlam: Ey mehriban məhbub, zahidlər həm də "mütəzəhhid"lər törədən vəziyyətlər eşq, yaxud vəhdət ərəfəsinə yol aramağı mümkünsüz hesab ediblər, sən öz rəhmət və iqtidarınla aşiqləri bu düyünə düşməkdən xilas et.

## **Q Ə Z Ə L 10**

**(1) Dustum! Aləm səninçün gər olur düşmən mana,**
**Qəm deyil, zira yetərsən dust ancaq sən mana.**

**(2) Eşqə saldım mən məni pənd almayıb bir dustdən,**
**Hiç düşmən eyləməz onu ki, etdim mən mana.**

**(3) Canü-tən olduqca məndən dərdüdağ əskik deyil,**
**Çıxsa can ,xak olsa tən, nə can gərək, nə tən mana.**

**(4) Vəsl qədrin bilmədim firqət bəlasın çəkmədən,**
**Zülməti-hicr etdi çox mübhəm işi rövşən mana.**

**(5) Dudü əxərdir mana sərv ilə gül, ey bağiban,**
**Neylirəm mən gülşəni, gülşən sana, külxən mana.**

**(6) Qəmzə tiğin çəkdi ol mah, olma qafil, ey könül!**
**Kim, müqərrərdir bu gün ölmək sana,şivən mana.**

**(7) Ey Füzuli, çıxsa can çıxman təriqi-eşqdən,**
**Rəhqüzari-əhli-eşq üzrə qılın mədfən mana.**

Beyt 1: **Dustum! Aləm səninçün gər olur düşmən mana,**
**Qəm deyil, zira yetərsən dust ancaq sən mana.**

Nişanə 1 – "Dost" – dostluq bəndə ilə mütəal məbud arasında dünyəvi səbəblərdən və hədəflərdən kənar və mücərrəd bir məhəbbətdən ibarətdir.

Nişanə 2 – "Qəm" - bu beytdə dünyəvi heyfislənmək və məlulluqdan nişanədir.

Anlam: Ey mehriban məhbub, Səninlə dostluqa nailiyyət tapan aşiq dünya dolusu düşmənə qalib gəlməlidir.

**Qeyd**: *Bu beyt məlum edir ki:*

*A – Hər bir əməldə xüsusilə toplansal işlərdə ilk niyyət və hədəf mütəal Allahın razılığını nəzərə almağdır.*

*B – Aşiq Həzrəti Məbud önünüdə bütün xalqı hətta özünü unutmalıdır.*

*P – Əqlə istinad edənlərin etirazı eşq mülkü qanunlarının ən tanınmışıdır. Beləliklə, əql sahiblərinin düşmənliyi eşq heyranlarının həqiqətini sübut edən muştuluqdur.*

Beyt 2: **Eşqə saldım mən məni pənd almayıb bir dustdən**
**Hiç düşmən eyləməz onu ki, etdim mən mana.**

Sözlük: Pənd = öyüd = nəsihət.

Nişanə 1 – "Mən" - A – Birinci və üçüncü "mən", aşiqin həqiqi və batini mənindən (həqiqi özlüyündən) əlamətdir.

B – İkinci "mən" aşiqin məcazi və fani mənindən nişanədir.

**Qeyd**: *Hər bir həqiqi və batini "mən", ülvi və ilahi olduğuna görə, digər qeyri maddi və həqiqi "mən" lərlə bərabərlikdə, bəlkə də vahidlikdədir, bunun üçün də vəhdət aləmində ilham almış bir şair üçün fəxr etmək və özünü yaxud mənini vəsf və sitaiş etmək xudbinlik və xutbəsənlik sayılmaz, bəlkə də yararlılıq və ilahilik hesab olunar, çünki nəzərə alaq ki, düzgün iftixar bütün həqiqi "mən" ləri yaxud müxtəlif insan vücudundaki gizli mənzil etmiş vahid bir həqiqəti sitayiş və təbliğ etməkdən ibarətdir. Bu gizli həqiqəti öz vücudunda kəşf edib tanıyan bir insanın xudbəsənd olmağı isə həqiqətpəsənd olmağı ilə eyni və bərabər olmalıdır. Belə bir xudpəsəndliyi fəlsəfə ürfan kimi alqışlayıbdır. Aristotel onu (ürfani xudpəsəndliyi) mərifət meyvəsi və həqiqət təbliğı bilib. O, bu fukrə davam edərək deyib: "... hər bir insanı əxlaqi kamalın ən uca zirvəsinə qaldıran ilahi xudpəsəndlikdir". Beləliklə, o, əxlaqi üstünlük sayılan "yaxşılığın" düzgün eşq ilə əlaqədar olduğunu sübut*

*etdiyi bəhsdə, həqiqi tərbiyə və mədəniyyəti, xüsusilə, həqiqi "məni" təzahür etdirən cazibəni xatırlatdığı eşqdə sübut etmiş və bu fikirdə Əflatunun yolunu tutmuşdur.*[1]

Beyt 3: **Canü tən olduqca məndən dərdü dağ əskik deyil,**
**Çıxsa can, xak olsa tən, nə can gərək, nə tən mana.**

Sözlük: Xak = torpaq.

Nişanə 1 – "Can və tən" - bu beytdə aşiqin maddi varlığından və dünyəvi duyğularından nişanədir.

Nişanə 2 – "Dərdü dağ " - can və tən ilə, yaxud məcazi varlıqla əlaqədar çətinliklər və acılıqlardan nişanədir.

Nişanə 3 – "İkinci misra": A – ruhun bədən həbsindən və dünya torundan xilas olmasından və öz ülvi məqamına yetişməyindən nişanədir.

B – aşiqin موتوا قبل ا ن تموتوا[2] məqamına nailiyyətindən, yaxud fani yer mənliyini silib əbədi göy mənliyini tapmasından nişanədir.

Anlam: Həqiqi və ilahi "mən" cismi və zahiri mənə qalib gəlməsə qəmsiz və təhlükəsiz yaşamaq mümkünsüz olar.

Beyt 4: **Vəsl qədrin bilmədim firqət bəlasın çəkmədən,**
**Zülməti-hicr etdi çox mübhəm işi rövşən mana.**

Sözlük: Fərqət = hicran = ayrılıq = firqə = güruh; Hicr = hicran, rövşən = işıq = aydın = duru.

Nişanə 1: "Vəsl" A – Vəsl kəsrətdən vəhdətə qayıdış nişanəsidir.

B – Vəsl aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəsinə çatmasından nişanədir. Bunun üçün də məşuqdan başqa bütün varlıqları, hətta məfkurələri və təsəvvürləri də unutmaq aşiqə vacib gəlir, çünki hər bir vücudun həm özü həm də etdirdiyi təzahürü fasilə törədən və hicab qaldırandır.

P – Vəslin özəl dadı və tamı var. Ancaq onu hicrandan sonra dadmaq və düşünmək olar. İnsanın innəllah aləmindən yer kürəsinə enməsi bu dadı düşünmək üçündür, beləliklə, hicran qəbz kimi aşiqin tərbiyə tapmasında və məna şirinliyini dadmağında gərəkli bir mərhələdir, elə buna görə də bəzi şair və bir çox arif adamlar hicranı vüsaldan üstün tutmuşlar:

**Ey-rəqibi səngdil çox tənə vurma Əzhərə**

---

[1] Paydya Vərinrigər, səh.833 və 834

[2] Qəzəl 7, beyt 6

**Sən vüsalından xoş olsan mən də hicrandan xoşam.**[1]

Nişanə 2: "Zülməti-hicr" - fasilədən dikəlmiş maniədən nişanədir.

**Qeyd** 1: *Fasilə kəsrətdən və kəsrət küdurətlə qarışıq maddədən yarandığına görə hicr və zülmət iki mürəkkəbləşən bir vahiddir.*

**Qeyd** 2: *Hər şey öz əksini təzahur etdirdiyinə görə*[2] *hicran zülməti vüsal nurunu əks etdirən və qəm-qüssədən sərxoşluq törədən nemətdir.*

Anlam: Hicran məhrumunluğuna tuş gəlməzdən əvvəl, vüsal ləzzətini duya bilmədim. (Alqışla hicran acısını ki, vüsal şirinliyini mənə dadızdırdı).

Beyt 5: **Dudü əxərdir mana sərv ilə gül, ey bağiban,**
**Neylirəm mən gülşəni, gülşən sana, külxən mana.**

Sözlük: Dud = duda = qurum = tüstü; əxgər = qor = qığılcım; gülşən = gülüstan; külxən = zibil yeri = tulanbar.

Nişanə 1 – "Dud" - dünyəvi sıxıntılardan və məhrumluqlardan nişanədir.

Nişanə 2 – "Əxgər" - mənfi həyəcanlar və intizarlardan nişanədir.

Nişanə 3 – "Sərv" - dünyəvi tənasüblərin və məcazi gözəlliklərin davamiyyət nişanəsidir.

Nişanə 4 – "Gül": gül, ürək açan dünyəvi yöndəmlərdən nişanədir.

Nişanə 5 – "Bağban" - dünyəvi gözəllikləri qoruyanlar və təbliğ edənlərdən nişanədir.

Nişanə 6 – "Gülşən" - məcazi "bəst" mövqelərindən nişanədir (zahiri ürək genişliyi).

Nişanə 7 – "Gülxən" - mənəvi sınayıcı qəbzləri və müşkülləri eyham edən dünyəvi həqarətlər və məhrumluqlar nişanəsidir.

Anlam: Ey dünyəvi inkişaflarla maraqlanarkən mənəvi məqamları unudan insan: dünyəvi bəstlərə güvənmək sənin, mənəvi qəbzlərlə sərxoşluq etmək mənim.

Beyt 6: **Qəmzə tiğin çəkdi ol məh ,olma qafil, ey könül!**
**Kim, müqərrərdir bu gün ölmək sana,şivən mana.**

Sözlük: Mah = ay, müqərrər = müəyyən olunmuş.

Nişanə 1 – "Qəmzə": A – qəhr burulğanı ilə lütf nəsiminin birlikdə ürəyi çulğalamaq nişanəsidir.

---

[1] Əzhər Ərdəbilinin bir qəzəlindən beyt.

[2] Qəzəl 3 beyt 2 (əzvac və əzdad).

B – Qəmzə qəbz ilə bəstin birlikdə və vahid zamanda ürəyi əhatəyə almaq nişanəsidir.

**Qeyd**: *Qəmzə mərhələsində qəbz zahiri mənliyi tədrici halda silərkən, bəst batini mənliyi obrazlaşdırar.*

Nişanə 2 – "Mah" - kəsrət içində vəhdət günəşinin parlamasından nişanədir.

Nişanə 3 – "Könül" - bu beytdə ürəyin zahiri obraz – istəyindən nişanədir.

Nişanə 4 – "Ölmək" - könülə, yaxud içəri vücuda daxil olmuş dünyəvi mənin silinməsindən nişanədir.

Nişanə 5 – "Şivən" - dünyəvi mənin yaxud məna qarşısında dikəlmiş ən güclü əngəlin məğlubiyyətindən nişanədir, bu nişanə zahirin pozğunlaşması ilə yanaşı batinin sərxoşluğuna eyham edir.

Anlam: Ey Fizlulinin dünyəvi xarakteri, qəmzələr səni pozub – silərkən onun mənəvi sərxoş obrazını təzahur etdirir.

Beyt 7: **Ey Füzuli, çıxsa can çıxman təriqi-eşqdən**
**Rəhqüzari-əhli-eşq üzrə qılın mədfən mana.**

Sözlük: Rəhqüzar = yol; mədfən = məzar = qəbr.

A – Fizuli dünyasını dəyişəndə, onu zahiri vücudunun batin ilə sidaşlığı xatirinə aşiqlərin addımladıqları açan  yol üstündə qəbrə qoyun.

B – Onun maddi cismini ən xətərnak maneyi və düşməni olduğuna görə aşiqlər ayağı altında məhv edin.

## **Q Ə Z Ə L 11**

**(1) Kəmali-hüsn veribdir şərabi-nab sana,**
**Sana halaldır, ey müğbeçə, şərab sana.**

**(2) Səni mələk görəli yazmaz oldu eşqi günah**
**Vəli, yazıldı bu üzdən bəsi səvab sana.**

**(3) Ləbin sualına verməz cəvab üşşaqin,**
**Sual olursa bu səndən, nədir cəvab sana.**

**(4) Cəza günündə sorulmaz cəfalar eylədiyin,**
**Yetər fəqan ilə mən verdiyim əzab sana.**

**(5) Məni qərarım ilə qoymaz oldun ,ey gərdun,**
**Yeridir ahım ilə versəm inqilab sana.**

**(6) Şüai-covhəri-tiğindən umma rəhm, ey dil,**
**Saqınma su verə, ey təşnə, ol sərab sana.**

**(7) Füzuli, başına ol sərv sayə saldı bu gün,**
**Üluvvi-rəhmət ilə yetməz afitab sana.**

Beyt 1: **Kəmali-hüsn veribdir şərabi-nab sana,**
**Sana halaldır, ey müğbeçə, şərab sana.**

Sözlük: Nab = xalis = məhz; Müğbəçe = müğ övladı = meyxananın gənc oğlan xidmətçisi.

Nişanə 1 – "Hüsn": A –yeganə məbudun kamal və camal gözəlliklərindən nişanədir.

B – hər bir vücudun zahirindən və batinindəki tənasüblərdən nişanədir.

P – çətinliklər və müsibətlər önündə səbirsizlik və əxlaqsızlıq etməyin razılıq və sərxoşluq olduğunu göstərən insandan nişanədir.

Nişanə 2 – "Şərab": A – bu beytdə eşq mürşüdünün özünü özündən xəbərsiz edən ilahi cazibələrdən nişanədir. O bu şəraitdə əqldən – şərdən kənar "şəth" ya "şəthiyyat" ünvanlı iddialar edib sözlər danışar.[1]

**Qeyd** 1: *Əql tərəfdarları, yaxud ümumxalq "şəthiyyatı" əks düşünərkən mürşüdü məhkum edərlər.*

**Qeyd** 2: *Mürşüd özü isə adi halda özünü təndiq edərək şəthi inkar edər.*

**Qeyd** 3: *Şəthiyyat düşünülməz əhvalın və xəbərsizlik mərhələsinin məhsulu olduğuna görə, ariflər və alimlər hamılıqla onun xəlvət bir mühitdən kənarda baş verməsini yasaq etməyə məcbur olublar.*

B – Şərab dünyəvi anlayışa sığmayan mənəvi duyğularla dərk olunan bir haldan nişanədir.

Nişanə 3: "Müğbeçə": müğbeçə bu beytdə eşq və mənəviyyət ərəfəsinə hidayət edən "müğ", yoxsa mürşüddən ibarətdir.

**Qeyd** 1: *Müğbəçə sözlüyündəki "beçə" sözü uşaq mənasını təlqin edərək onun bir uşaq kimi saf ürəkli olmağını eyham edir.*[2]

**Qeyd** 2: *"Beçə" sözü, müğün içəri vücudunun, yaxud mənəvi durumunun dəmbədəm yeni doğulmasını və yeni həyat və mərifət tapmasını bildirir.*[3]

Anlam: Ey dəmbədəm ülvi və ilahi cilalər və cilvələr ilə gözəlliyi təzəcə parlayan gözəl, sənin camal və kamalındakı hüsnlər ilahi mənşəli olduğuna görə sənə "şəth" deməyi və təkəbbür göstərməyi[4] halal edibdir.

---

[1] Mənsur Həllacın "ənəlhəqq" deməsi, Bəyazid Bəstaminin (نيست اندر جبّه ام غير خدا) deməsi şəth nümunələrinin tanınmışı və aydınlaşmasıdır.
[2] Müğbəçənin digər ünvan və eyhamları vardır.
[3] Qəzəl 1, beyt 1 (daimi çevrilmək və yeniləşmək) .
[4] Qəzəl 10 beyt 2 (müsbət xüdpəsəndlik) .

Beyt 2: **Səni mələk görəli yazmaz oldu eşqi günah**
**Vəli, yazıldı bu üzdən bəsi səvab sana.**

Sözlük: Bəsi = bollu = çox-çox; Səvab = ehsan = əvəz = xeyir-cəza.

Anlam: Qəzəlin mətləibu beytini izah və təkidində buyurur:

Sənin əməllərini səbəb edən mələk xudpəsəndliyi və cövrü cəfanı başqalara(əql əhlinə) günah yazar, amma sənə günah yazmaz, ona görə ki: A - əql ölçüsündə mənfi tanınmış cövr, cəfa, təkəbbür və bir çox digər xətalar eşq ölçüsündə müsbətdirlər.

B – bəzi elmlər və hadisələrin zahiri mənfi olsa da batini xeyir və müsbətdir.[1]

Beyt 3: **Ləbin, sualına verməz cəvab üşşaqın,**
**Sual olursa bu səndən, nədir cəvab sana.**

Sözlük: Ləb = dodaq; üşşaq = aşiqlər

Nişanə 1 – "Ləb" - bu beytdə gizli sirlər nöqtəsindən nişanədir.

**Qeyd** 1: *Nöqtə açılmaz bir düyünə bənzər olduğuna görə elm və idrak gücü ilə açılmaz olan sirlərdən istiarədir.*

**Qeyd** 2: *Nöqtə təşbih və mübarizə səbəbi ilə gözəl və yığcam ağız-dan nişanədir, demək ağzın yığcam forması onun açılmaz hüsnünü təlqin edir.*

Anlam: Ötən iki beyti davam etdirərkən deyir: Ey gözəl mürşüd, yaxud ey gözəl məhbub, səndən baş vermiş cəfalar və rəhmsizliklər başı bağlı bir hikmət ilə (nöqtə) əlaqədardır, beləliklə aşiq nə qədər maddi vücudunu unutmayıb yaxud dünya həbsindən özünü xilas etməyibsə o, bağlı hikmətdən açıq bir cavab dinləyə bilməz (onu idrak etməz).

**İstəsən pərdə dalından səni agah edələr**
**Gərək əvvəl soyunub varlığı, üryan olasan.**[2]

Beyt 4: **Cəza günündə sorulmaz cəfalar eylədiyin**
**Yetər fəqan ilə mən verdiyim əzab sana.**

Sözlük: Cəza günü = qiyamət günü.

Anlam: Ey mürşüd, yaxud ey məşuq, qiyamət günü aşiqə etdiyin cəfalara görə səni mühakimə etməzlər, çünki sənin cəfaların onları tərbiyə edən, sınayan və kamal zirvəsinə qaldıran, istiqamət mənşəyidir, ancaq onların bir çoxunu sən etdiyin cəfaların (tərbiyə və təlimatın)

---

[1] Qəzəl 3., beyt 6.
[2] Müəllifin bir qəzəlindən beyt.

qədərini bilməz olduqlarına görə və zahirdə sənə əzab törətmələrinə xatir istintaq edərlər.

Beyt: 5 **Məni qərarım ilə qoymaz oldun, ey gərdun,**
**Yeridir ahım ilə versəm inqilab sana.**

Sözlük: Gərdun = fələk = zəmanə

Nişanə – "Ah" – nari-məhəbbət atəşində[1] dünyəvi ilgiləri yandırmaq və maddi qanunlardan xilas olmaq nişanəsidir.

Anlam: Ey fələk yaxud ey zəmanə, mən öz həyatımı alt-üst edərkən sənin qanunlarının qarşısını alıb onları pozacağam.

**Qeyd**: *Cövr, cəfa, hicran, həsrət habelə bir çox dünyəvi əzablar – acılıqlar insan vücudunun yalnız zahiri cəhəti ilə əlaqədar olduğuna görə əzdad qanununu düşünüb özlərini alt üst edən insanlar*[2] *yaxud zahirini öldürüb batinini – dirildənlər özlərini fələk qanunundan azad ediblər.*[3]

Beyt: 6 **Şüai-cövhəri-tiğindən umma rəhm ,ey dil,**
**Saqınma su verə ey təşnə, ol sərab sana.**

Nişanə – "Tiğ" və "Sərab" bu beytdə qəbz mərhələsində qət olunmuş ilahi cazibələrin həsrəti ilə aşiqin qəlbini döyündürən ətəşlər və tələblərdən nişanədir.

Anlam: Ey aşiq təcəllilərin qət olması sənin mənəvi sınaqlardan çıxmamağından nişanədir (tərbiyə və təlimata hacətin var).

Beyt 7: **Füzuli ,başına ol sərv sayə saldı bu gün**
**Ülüvvi-rəhmət ilə yetməz afitab sana.**

Sözlük: Ülüvv = ucalıq = ucaltmaq = qələbə; rəfət = ucalmaq; aftab = günəş.

Nişanə: "Sərv" - ilahi cazibələr və cəlalərin davametmə nişanəsidir.

Anlam: Ey Füzuli, qəbz mənzilindən xilas olarkən davamlı bəst məqamına nail olmaqla qəribə rüfət və əzəmət tapdın.

**Qeyd** 1: *Qəzəl şur və həyəcan sözü olduğuna görə əql və məntiqə biganə, məcnunluq və divanəliklə aşinadır, beləliklə beytlərində məna*

---

[1] Məhəbbət nari və nuru yeri gəldikcə qeyd və izah olunacaqdır.

[2] Qəzəl 3, beyt 2.

[3] Lisani-qeyb Hafiz bu mərtəbədə buyurub: بنیاد هستی تو چو زیر و زبر شود در دل مدار هیچ که زیر و زبر شوی

*cəhətindən qalibən bağlılıq görünməz və bu qəzəlin son beytləri kimi gah pərişanlıqdan gah sərxoş olmaqdan söz açılar.*

**Qeyd** 2: *Aşiq və şair dəmbədəm haldan – hala düşərkən (qəbz, bəst) bir halda göylərə qalib gələr, digər halda alçaq torpaqda tora düşər.*

## Q Ə Z Ə L 12

**(1) Riştədir cismim ki dövri-çərx vermiş tab ona,**
**Mərdümi-çeşmim düzər hər dəm düri-simab ona.**

**(2) Sayeyi-zülfün şəbistanındadır şəmi-rüxün,**
**Necə yetsin qədr ilə xurşidi-aləmtab ona.**

**(3) Dərd dürdidir səfabəxşi-hərif-bəzmi-eşq,**
**Saqiya! Çox etmə təklifi-şərabi-nab ona.**

**(4) Dürdi-mey tək qərqeyi-xunabə gördüm könlümü,**
**Gör nə gəldi başına, netdi şərabi-nab ona.**

**(5) Qaməti xəm birlə bir əhli-kəramətdir qaşın,**
**Daş olubdur guiya baş əyməmiş mehrab ona.**

**(6) Çeşmini əhli-nəzər qəsdinə təyin eyləyən**
**Tiri-qəmzəndən mühəyya eyləmiş əsbab ona.**

**(7) Tərləmiş rüxsar ilə xublar açarlar könlümü**
**Gör nə gülşəndir ki ,atəşdən verərlər tab ona.**

**(8) Silki-əhli-halə çəkmış  zahidi əşki-riya**
**Mən kimi kim, sim qədrin bildirir simab ona.**

**(9) Ey Füzuli, qalmamış qovğayi-Məcnundan əsər**
**Qaliba əfsaneyi-Leyli gətirmiş xab ona.**

Beyt 1: **Riştədir cismim ki dövri-çərx vermiş tab ona,**
**Mərdümi-çeşmim düzər hər dəm düri-simab ona.**

Sözlük: Riştə = rişmə = sap = rişta; Çərx = çarx = fələk; dövri çərx = zamanə; Tab = burulmaq = hərarət = qəzəb = bir şeyi quru-quru atəşdə qızartmaq; mərdümi-çeşm = göz bəbəyi; simab = civə.

Nişanə 1 – "Riştə" - incəlmək və naziklənmək nişanəsidir. Arif və aşiq riştə mərhələsində dünyəvi ilgilərini və büsbütün məcazi bağlantilarını qat – qat soya - soya öz vücudunu elə naziklǝndirər ki, əgər bir qat soysa o vücudu paralanarkən məhv olar. Bu əndazə incəlmək aşiqi dünyəvi təcrid mərtəbəsinə nail edər və ona təcrid aləmi ilə həmcins olduğu üçün mücərrəd, yaxud mənəvi vücudlara qovuşmaq imkanı bağışlayar.

**Qeyd** 1: *Xatırladığımız incəlmək ürfan ədəbiyyatında: "kəmər", "miyan" və "dəqiqə" başlıqlı nəhəng mövzular yaranmasına bais olmuş, "lisani-qeyb"i adlanan*

Hafiz bu mövzulara əsaslanaraq buyurmuşdur:

بدان "کمر" نرسد دست هر گدا حافظ     خزانه ای به کف آور ز گنج قارون بیش
"میان" او که خدا آفریده است از هیچ     "دقیقه" ایست که هیچ آفریده نگشاد

**Qeyd** 2: *İncəsənət sahibləri əsasən belə bir mövqeiyyətə çox-çox uyğundular.*

Nişanə 2 – "Tab" - məcazi varlığı dəridən şıxaran və riştə məqamına çatdıran çətinlikdən işarədir.

Nişanə 3 – "Düri simab" - aşiq gözündən şıdırğı yağan qan-yaşdan nişanədir.

Anlam: Zamanənin vəfasızlıq və zülmkarlığı bir tərəfdən, həkim məhbubun qəbz ilə əlaqədar qəhr və qəzəbləri ikinci tərəfdən ürəyimin qanını gözümdən yağdırarkən, bütün vücudumu qanlı selə verdi və nəhayət məni məndən ayırarkən özünə yaxınlaşdırdı:

Mənliyi yusan məndə, ey sənəm, onda Şahi olsam da mən sənəm,
Pəs mənim boyük düşmənim mənəm, bir Araz yetir məndə yu məni.[1]

Beyt 2: **Sayeyi-zülfün şəbistanındadır şəmi-rüxün,**
**Necə yetsin qədr ilə Xurşidi-aləmtab ona.**

Sözlük: Şəbestan = hərəmxana = yatacaq; Rüx = sima; xurşid = günəş; Aləmtab = dünyanı işıqlandıran.

Nişanə 1 – "Zülf":

---

[1] Müəllifin bir qəzəlindən beyt

A – Əsasən qara olduğuna görə "kəsrət" nişanəsidir.

**Qeyd**: *Kəsrətin maddi olduğu və küdurət ilə qatqılığı yuxarıda qeyd olunmuşdur.*

B – telləri saya gəlməz olduğuna görə kəsrətdən (çoxluqdan) nişanədir.

P – Dağınıq, pirtaşıq olduğuna görə dünyəvi və mənəvi mübhəmliklərdən nişanədir.

T – Əsasən canan camalının ətrafında örpək olduğuna görə məna qarşısındakı hicabdan nişanədir.

S – Camalın ətrafında örpək olmuş zülf haman camala ən yaxın olduğuna görə "qürb" əlamətidir.

C – gözün qabağını tutduğuna görə bəsirətsizlik nişanəsidir.

Ç – başda bitməyinə görə, başlayış və boy atmaq nişanəsidir.

H – hər şeyin başlayışı onun əvvəli olduğuna görə, zülf yardıcılıq nöqtəsinə hər şeydən yaxındır.

X – Boy atmaq, dikəlməkdən istiarə olduğuna görə zülf, bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəlmək nişanəsidir.

Nişanə 2: "Şəbistan" - ilahi müqəddəslikləri və hüsnləri qoruyan şəraitdən nişanədir.

Nişanə 3: "Şəmi-rüx" - bu beytdə mütəal məhbubun camalında parlayan nurdan nişanədir, ancaq bu nur gah mürşüdün vücudunu, gah da bir gözəl simanı güzgü edərək özünü onlarda təzahur etdirir. Elə buna görə də Mövləvi zənn

edir ki, saf qəlbli bir aşiq yer kürəsində yaşayan gözəl bir insan simasındakı hüsnlər qarşısında fədakarlığı və özünü unutmağı məşq edib öyrənərkən, özünü mütəal məhbubun şühud nurunda məhv etməyə hazırlayır.

ای بسا کس را که صورت راه زد قصد صورت کرد و بر الله زد[1]

Elə buna görə də pak və düzgün eşq məcazi və dünyəvi səviyyədə müqəddəsdir.

Nişanə 4: "Xurşidi-aləmtab" - bu beytdə cismi göz və dünyəvi mərifət vasitəsilə tanınmış nurani obrazlar və müsbət mərtəbələrdən nişanədir.

Anlam: Ey mütəal məhbub, hesaba gəlməz kəsrət örtükləri bir yandan və sənin öz camalından parlayan əqlə-idraka sığmaz saysız təcəllilər digər tərəfdən sənin hüsnünün həqiqi tanışlığını mümkünsüz edibdir.

---

[1] Məsnəviyi-Mənəviyi-Mövləvi, dəftər 2, beyt 1186

**Qeyd**: *"Qədr ilə" ikinci misrada:*

*A – mürəkkəb cümlədir, əndazə tutmaq və başa düşmək mənasını təlqin edərək aşiq və məşuq fərqini və fasiləsini bəlləndirmək istəyir.*

*B – etibar və mövqeiyyət mənasını eyham edərək məşuq önündə aşiqin etibarsızlığını və həqirliyini məlum edir.*

Beyt 3: **Dərd dürdidir səfabəxşi-hərifi-bəzmi-eşq,**
**Saqiya! Çox etmə təklifi-şərabi-nab ona.**

Sözlük: Dürd = camın təkinə çökən yağın, yaxud şərabın qaraya çalan maddəsi; Səfabəxş = səfa verən = səfalı; Bəzm = ziyafət məclisi = xeymə; nab = xalis = məhz.

Nişanə 1 – "Dürd" - bu beytdə qəmginliyi şadlıq ilə qatıb-qarışdıran əhval-ruhiyyədən nişanədir.

Nişanə 2 – "Dürd": A – dord, aşıqı məğlubiyyət mərhələsində özündən ayırmağa hazırlayan təcrid müqəddiməsindən yaxud eşq iqtidarından nişanədir.

B – aşıqın qəlbini dünyəvi ilgilərdən boşaldan və onu "ney" mərtəbəsinə nail edən şəraitdən nişanədir.[1]

Nişanə 3 – "Səfa bəxş" - vücudun işəri üzündən maddi küdurətləri qoparan və onu incəlik və mücərrədlik məqamına yaxınlaşdıran mənzildən nişanədir.

Nişanə 4 – "Saqi" - bu beytdə mənəvi vasitələr yaxud ilahi mürşüdlər əlamətidir.

Nişanə 5 – "Şərabi nab" - sıxıntısız – sınaqsız məğlubiyyətdən ibarətdir (həqirlik və məmlüklüyün yaddan çıxması).

Anlam: Ey mürşüd, yaxud ey vasitə, eşq sıxma-boğması dünyəvi ilgiləri aşıqın qəlbindən silib aparan və onu təcrid, bəsitlik şadlığını duyan şəraitə hazırlayan ehsandır. Bunun üçün onu bəlasız və müsibətsiz məğlubiyyətə dəvət etmə.

Beyt 4: **Dürdi-mey tək qərqeyi-xunabə gördüm könlümü,**
**Gör nə gəldi başına, netdi şərabi-nab ona.**

Nişanə 1: Dərd qarasayaq olduğuna görə bu beytdə maddi küdurətdən iz - əsər saxlamış qəlbdən nişanədir.

Nişanə 2: "Xunabə": A – xunabe şərabın qırmızılığını eyham edərək ürəyin qanını şüşəyə tökməkdən nişanədir.

B – sakinlik və qəmsizlik günahını duyan qəlbin sıxılmaq nişanəsidir.

---

[1] Qəzəl 1, beyt 2

P – qəlb sınağdan çıxmağını düşünərkən belə bir günahı silməyə və özünü maddi küdurətdən ayırmağa çalışdığı (döyüntü) mərhələdən nişanədir.

Nişanə 3: "Şərabi nab" - ötən beytdə qeyd olunmuş beşinci nişanənin təkrar əlamətidir.

Anlam: Davamsız şühuda razılıq verməyim, beləliklə ətəş və tələbin sakinliyi, habelə üryanlıq və bəsitlik məqamından qəflət etməyim, ürəyimin qanını şüşəyə tutarkən, məni bərk cəzalandırdı.

Beyt 5: **Qaməti xəm birlə bir əhli-kəramətdir qaşın,**
**Daş olubdur guiya baş əyməmiş mehrab ona.**

Sözlük: Xəm = ayrı = qövs = hilali; quiya = guya = şayəd; mehrab = iman camaatın məçiddə namaz qıldığı yer = məclisin, yaxud evi yuxarı başı.

Nişanə 1: "Kəramət": Peyğəbər göstərdiyi imkanasığmaz möcüzə adlı hadisəni "vəli" yaxud mütəal məbudun xalis dostu "kəramət" ünvanı ilə göstərər. Beləliklə kəramət məhəbbət möcüzəsidir.

Nişanə 2: "Qaş" - Həzrəti-məbudun həqiqətini örtən qələbə və əzəmət sifətlərindən ibarətdir.

Anlam: Ey iqtidarlı məhbub, mehrab sənin qələbə sifətlərini tanıya bilib baş endirsəydi daşa dönmək cəzasını görməzdi (möcüzə vasitəsilə mücazat olmazdı).

**Qeyd**: *Mütəal məhbub istədiyi bəndəsini bu dünyada mücazat edərkən qəlbini və məfkurəsini saf edib duruldar (eşqi-həkim ilə cəzalanmış bir insan müqəddəslik tapdığına görə müqəddəs mehraba təşbih olunmuşdur).*

Beyt 6: **Çeşmini əhli-nəzər qəsdinə təyin eyləyən**
**Tiri-qəmzəndən mühəyya eyləmiş əsbab ona.**

Sözlük: Çeşm = göz; mühəyya = hazır = hazırlanmış; əsbab = səbəblər, vasitələr.

Nişanə 1: "Çeşm" - şühud səmasında parlayan ilahi cilvələr və cilalardan nişanədir.

Nişanə 2: "Qəmzə" - şühud günəşinin dəmbədəm batıb-çıxmasından nişanədir (çaxıb parlama aşiqin qəlbinə ümüd – ilgi doldurar, lakin batıb-gizlənmə onu təəssüflərə və heyrətlərə düçar edər).

**Qeyd**: *Qəmzə məcazi eşqdə şadlığı qəmginliyi ilə mürəkkəbləşdirən bir mərtəbədir və gözü yumub-açanda aşiqin qəlbini söküb-tikər:*

**Gözlərin memari-mahirdir ürəklər payəsin**
**Gah yıxıb viran edər, gah qalxızıb abad edər.**[1]

Nişanə 3: "Nəzər": A – Nəzər bu beytdə insani baxışdan ibarətdir[2].

B – nəzər, mənəvi hüsnlər ilə tanış "bəsirət"dən nişanədir.

P – məcazi hüsnlərdə mənəvi əsər görən, beləliklə məcazdan mənaya yol tapan bəsirət əhlindən nişanədir.

Anlam: A – mütəal məhbub, yoxsa həkimi-mürşid şühud və hüzur qapılarını açıb-bağlamaqla aşiqi biqərarlıq məktəbində tərbiyə etmək istəyir.

B – məcazi gözəllərə naz və qəmzə öyrədən mütəal məhbub onları aşiqlərin tərbiyəsinə vasitələr yaratmışdır.

Beyt 7: **Tərləmiş ruxsar ilə xublar açarlar könlümü**
**Gör nə gülşəndir ki ,atəşdən verərlər ab ona.**

Sözlük: Rüxsar = sima = camal; xublar = gözəllər; Gülşən = gülüstan = bağ; ab = su.

Nişanə 1 – "Tər" - batini hüsnləri yeni-yeni təzahür etdirən zahiri obrazdan nişanədir. Bu obraz, məcazi məşuq hüsnünü ilahiləşdirən, beləliklə, biqərar aşiqi üryanlıq və bəsitlik məqamına yetirən obrazdır.

Nişanə 2 – "Gülşən" - "inbisat" ünvanlı məcazi bəst, yaxud dünyəvi genişlik tapan qəlbdən nişanədir.

Nişanə 3 – "Atəş" - dünyəvi istəkləri yandıran "nari-məhəbbət" nişanəsidir.

Anlam: Mənəvi hüsn ilə birgə dünyəvi gözəllikləri camalında əks etdirən gözəllər, yaxud vasitələr alovlu qəlbini bir gülüstan kimi çiçəkləndirirlər, qəribə burasıdır ki, gülüstanı su səfalandırar, ancaq mənim qəlbimi atəş (nari-məhəbbət) səfalandırır.

Beyt 8: **Silki-əhli-halə çəkmış zahidi əşki-riya**
**Mən kimi kim, sim qədrin bildirir simab ona.**

Sözlük: Silk = yol = təriq = mirvari sapı; Əşk = göz yaşı; simab = civə.

Nişanə 1 – "Əhli hal" - həm keçmişi, həm də gələcəyi önündən və nəhayət, maddi dünyanın zaman adlı güclü bir cəhətindən xilas olanlardan nişanədir[1] (maddi dünyada mənəvi aləmin ətrini alanlar).

---

[1] Mərhum "Tacüş-şüəra" Ərdəbilinin bir qəzəlindən beyt.
[2] Qəzəl 2, beyt 5.

Nişanə 2 – "Zahid ":   A – zahid "mütəzəhhid"dən nişanədir.[2]

B – zahid, əql və məntiqdən üstün və başqa bir qüvvəni inkar etmiş insandan ibarətdir.

Nişanə 3 – "Sim" - dünyəvi müsibətlər önündə ağlamaq nişanəsidir.

Nişanə 4: "Simab" - bitablıq və biqərarlıqda məhvlik ərəfəsinə çatmaq nişanəsidir.

Anlam: Zahid riyakarcasına ağlasa da, göz yaşı xasiyyətini unutmayıb və onu aşiq çəkən bir sıra qəmlərdən xəbərdar edibdir.

Beyt 9: **Ey Füzuli, qalmamış qovğayi-Məcnundan əsər**
**Qaliba əfsaneyi-Leyli gətirmiş xab ona.**

Sözlük: Qovğa = hay – həşir = fəryad = fəqan; Xab = yuxu.

Nişanə 1: "Əfsanə" - bu beytdə davamsız şur və həyəcandan nişanədir (köksüz eşq).

Nişanə 2: "Xab " - maddə və qeyri maddə sərhədində sərgərdanlıq və heyranlıq nişanəsidir.

Anlam: A – Ey Füzuli, sənin dərin eşqin Məcnunun köksüz eşqini dəyərdən salmışdır.

B – Məcnun özünü qurban etmək ilə eşqə son qoyub və sakitlik tapıb.

**Qeyd**: *Qurbanlıq eşq ərəfə yolunda dikəlmiş otuz mənzilin əvvəlidir.*[3]

---

[1] Qəzəl 1, beyt 7, nişaneyi-zövq

[2] Qəzəl 9, beyt 2

[3] Doktor Cavad Nurbəxş, "Sufi kist".

## Q Ə Z Ə L 13

**(1) Eşq ətvarın müsəlləm eylədi gərdun mana,**
**Bunca kim, yel tək yüyürdü, yetmədi Məcnun mana.**

**(2) Qıldı məndən rəf təklifi-nəmazi məstlik,**
**Saldı Həqq bir nəşeyi-cami-meyi-gülgun mana.**

**(3) Bağiban! Gər meyl qılmam sərvinə, məzur tut,**
**Sərvdən yeyrək gəlir ol qaməti-movzun mana.**

**(4) Dustlar, qan-yaş töküb qıldı məni rüsvayi-xəlq,**
**Vəh ki, düşmən çıxdı axir dideyi-pürxun mana.**

**(5) Olmazam hər yanda kim olsam, giriftar olmadan,**
**Bir bəladır göz, bir afətdir dili-məhzun mana.**

**(6) Ey Füzuli, navəki-ahimlə aldım intiqam,**
**Dönə-dönə gərçi bidad etdi çərxi-dun mana.**

Beyt 1: **Eşq ətvarın müsəlləm eylədi gərdun mana,**
**Bunca kim, yel tək yüyürdü, yetmədi Məcnun mana.**

Sözlük: Ətvar = yollar = təriqlər = ədalar = rəsmlər = hərəkətlər; Gərdun = fələk = zəmanə.

Nişanə 1 – "Eşq" - insan vücudunda qoyulmuş dünyanı sevən xislətləri avara qoyan məhəbbət qələbəsindən nişanədir.

Nişanə 2 – "Ətvar": A – ətvar, aşiqin və salikin dünyəvi ömur yolunda seyr etdiyi yeddi[1] çətin[2] yoldan nişanədir.

B – Ətvar salikin içəri vücudunda, yaxud ürəyində yeddi sıra ədədli yolu seyr etməsindən və yeddi mənəvi və Qurani mədən tapmasından nişanədir. Bu yeddi mədən aşağıdakılardan ibarətdir.

1 – "Sədr" – İslam gövhərini gizli saxlayan özəl mədən nişanəsidir.

فمن شرح الله "صدره" للاسلام فهو علی نور من ربه [3]

**Qeyd**: *Şeytan qəlbin bu mərtəbəsinə əl çatdırmaq imkanı tapa bilsə, xatirladığmız gövhəri oğurlayarkən onun yerini küfr zülmətilə doldurar.*

و من شرح الله بالکفر "صدر"[4]

2 – Qəlb: A - ürəkdəki gizli iman mədənindən nişanədir.

اولئک کتب فی قلوبهم الایمان[5]

B – Əql nurunun ürəkdəki mədənindən nişanədir,

فتکون لهم قلوب یعقلون بها[6]

**Qeyd**: *"Sədr" şeytandan qorunmasa yaxud ürəyin ilk və əvvəl mərtəbəsi saf və möhkəm olmasa iman və əql mədənini tanımaq, tapmaq mümkünsüz olar.*

3 – "Şəğaf" - məcazi müqəddəs eşqlərin, yaxud umumiyyətlə xalq məhəbbətinin mədən nişanəsidir. و قد شغفها حبا[7]

**Qeyd**: *"Sədr", şeytanın şərrindən qorunmasa, qəlbə yaxud əql və imana ifadə şəraiti törənə bilməz, beləliklə "şəğaf" məchul qalarkən ddünyəvi eşqlər və məhəbbətlər müqəddəslik imkanında nailiyyət tapa bilməz.*

4 – "Fuad": fuad müşahidə yaxud şühud mərkəzindən nişanədir. [1] ما كذب الفواد ما رای

---

[1] Bu yeddi yol say, sıra və tam ədəd nişanəsi deyil, bəlkə də kəsrəti (çoxluğu) təlqin edən bir nişanədir.

[2] Qəzəl 1, beyt 2, nişanə "mey"

[3] Quran, Zumər surəsi, ayə 22

[4] Quran, Nəhl surəsi, ayə 106

[5] Quran, Mücadilə surəsi, ayə 22

[6] Quran, Həcc surəsi, ayə 46

[7] Quran, Yusif surəsi, ayə 30

**Qeyd** 1: *Sədrini, qəlbini və şəğafini tapıb – tanıya bilməyən bir insan şühud məqamına nail ola bilməz.*

**Qeyd** 2: *Xalqı dost tutmaq mütəal Xaliqin şühudinə müqəddimədir.*

5 – "Hübbətül qəlb" - yalnız mütəal məhbubun məhəbbətini xəzinə etmiş mədən əlamətidir.

6 – "Suveyda" - görünməz məqamlı müşahidələrin, mücərrəd mənaların, mələklərin əli çatmaz hikmətin və ilahi sirrlərin mədənindən nişanədir.

6/1 – Süveyda ürəkdə bir qara nöqtədə mənəviyyət və mərifət günəşini gizlədən mərtəbədir.

7 – "Mühcətül qəlb" - ilahi parlamalar və təcəllilər mədənindən ibarətdir.

**Qeyd**: *Ürfan ədəbiyyatında bu yeddi mənzili salamat saxlayan insana ürək sahibi, yaxud əhval sahibi demişlər.*

Nişanə 3: "Gərdun" - qəza-qədərdən, yaxud ilahi yazıdan və hökmdən nişanədir.

Anlam: Təqdirin müəyyən etdiyi eşq sıxıntılarını açıq ürəklə elə alqışladım ki, Məcnun öz istiqamətinin naqisliyini etiraf etməyə məcbur oldu.

Beyt 2: **Qıldı məndən rəf təklifi-nəmazi məstlik,**
**Saldı Həqq bir nəşeyi-cami-meyi-gülgun mana.**

Sözlük: Gülgun = qırmızı gülə oxşar = qırmızıya çalan.

Nişanə 1 – "Məstlik" - məşuqun fikrində, eşqində və nurunda məğlub və məhv olmaq nişanəsidir.

Nişanə 2 – "Təklifi-namaz" - namazın zahiri adabından nişanədir.

Nişanə 3 – "Cami-meyi-gülgun" - büsbütün dünyəvi ilgilərdən boşalarkən yalnız şühud ətəşi ilə doğmuş ürəkdən nişanədir.

**Qeyd**: *Gülgunluk, ya qızılgül kimi qırmızıya çalmaq:*

*A – Qırmızılıq qələbə nişanəsi olduğuna görə dünyəvi əngəllərin və maneələrin məğlubiyyətinə eyham edir.*

*B – Qırmızlıq qan əlaməti olduğuna görə maddi varlığı qurban etmək nişanəsidir.*

*P – Gül-ürəyin lətafətini və nəhayət naziklik və bəsitliyini eyham edir.*[2]

---

[1] Quran, Nəcm surəsi, ayə 11

[2] Qəzəl 12, beyt 1, nişaneyi-riştə.

Nişanə 4 – "Nəşə" - mənəvi xəyallar və ilahi cazibələr adətindən nişanədir.

Anlam: Həzrəti-məbudun cazibələrinin əzəmətindən və şühud ehsanının adətindən özümü itirmişəm amma namazın batinini itirməmişəm.

Beyt 3: **Bağiban! Gər meyl qılmam sərvinə, məzur tut,**
**Sərvdən yeyrək gəlir ol qaməti-movzun mana.**

Sözlük: Məzur = üzürlü; movzun = mütənasib.

Nişanə 1 – "Bağban" - bu beytdə dünyəvi gözəllikləri mərifət ilə mühafizə edən insandan nişanədir.

Nişanə 2 – "Sərv" - bu beytdə məcazi hüsnlərin ayaqlanmasından nişanədir.

Nişanə 3 – "Qaməti-movzun": A –həzrəti məhbubun şühud nurunda dəmbədəm yeniləşən sifətlərindən nişanədir.

B – Aşiqin itaətini, mərifətini və biqərarlığını dəmbədəm yeniləşdirən mərtəbədən nişanədir.

Anlam: Ey bağban, yaxud, ey dünya gözəlliklərini üstün tutan insan, mən mənəvi gözəlliklərlə tanış olan çağdan etibarən dünyəvi gözəllikləri büsbütün aşağı sanmışam.

Beyt 4: **Dustlar, qan-yaş töküb qıldı məni rüsvayi-xəlq,**
**Vəh ki, düşmən çıxdı axir dideyi-pürxun mana.**

Sözlük: Vəh = afərin = alqış = əcaba; dide = göz; porxun = qan dolmuş = qan ilə dolmuş.

Nişanə 1 – "Qan-yaş" - yaş mənliyi yuyan və qan onu batil edən nişanədir.

Nişanə 2 – "Rüsva" - məlamət mərhələsində aşiqi camaatdan, yaxud kəsrətdən ayıran nişanədir.[1]

Nişanə 3 – "Düşmən" - mənliyi gözdən salan nişanədir.

Nişanə 4 – "Düşmən" - aşiqin sirrini ağardıb açan və onu qəbz ilə cəzalandıran göz yaşından nişanədir.

Anlam: A – gözümdən axan qan – yaşa minnətdaram ki,məni həm camaatdan, həm də mənliyimdən ayırdı.

B - Öz göz yaşım sirrimi açıb-ağartdı və bir düşmən kimi məni qəbz cəzasına giriftar etdi.

---

[1] Qəzəl 1, beyt 5 (məlamət).

Beyt 5: **Olmazam hər yanda kim olsam, giriftar olmadan,**
**Bir bəladır göz, bir afətdir dili-məhzun mana.**

Nişanə 1 – A – "Göz" və "dili məhzun" aşiqi qəbz cəzasına giriftar edən biqərarlıqlardan nişanədir.

B – Məlamət şəraitində aşiqi camaatdan və özündən ayıran nişanədir.

Anlam: Eşq çətinlikləri ilə tuş gəlməyimin baisi yalnız göz və ürəkdir.

**Qeyd**: *Bu beytdə göz həm də ürəyin düşmənliyini dostluq bilir və onların yararlı və qabil olmaqlarını təsdiq edir.*

Beyt 6: **Ey Füzuli, navəki-ahimlə aldım intiqam,**
**Dönə-dönə gərçi bidad etdi çərxi-dun mana.**

Sözlük: Navək = ox; çərx = fələk = zəmanə; Dun = həqir = alçaq.

Nişanə 1 – "Ah" - kəsrəti, xüsusilə, mənliyi yandırıb aradan qaldıran mərtəbədən nişanədir.

Nişanə 2 – "Çərxi-dun" - dünyəvi əlaqələrin və məcazi əngəllərin get-qayıt çeşidindən nişanədir.

Anlam: Ey Füzuli, zəmanə, yaxud dünyəvi əngəllər məni dönə-dönə sınağa çəkdilər, lakin mən qəlbimin mənəvi qüvvələri ilə onları məğlub etdim.

## Q Ə Z Ə L 14

**(1) Qəm diyarında əcəl peyki güzar etməz mana,**
**Yox sanıb varım məgər kim, etibar etməz mana.**

**(2) Yar cövr etməz mana əğyar təlim etmədən,**
**Billəh, əğyar eyləyən ehsanı yar etməz mana.**

**(3) Dağıdır hər ləhzə rəxti-eyşimi ahım yelı,**
**Hansı nahəq zülmidür kim, ruzigar etməz mana.**

**(4) Eşq zövqilə xoşam tərki-nəsihət qıl, rəfiq,**
**Mən ki, tiryakiməzacəm, zəhr kar etməz mana.**

**(5) Çərxdən aşırmadan yadınla ahi-atəşin,**
**Qədr edib gərdun şərərdən zər nisar etməz mana.**

**(6) Nəqdi-can taraci-qəmdən saxlamaq düşvardır,**
**Eşq ta səngi-məlamətdən həsar etməz mana.**

**(7) Yadi-ləlinlə Füzuli gözləyib rahi-ədəm,**
**Var bir tədbiri, amma aşikar etməz mana.**

Beyt 1: **Qəm diyarında əcəl peyki güzar etməz mana,**
**Yox sanıb varım məgər kim, etibar etməz mana.**

Sözlük: Peyk = çapar = xəbər aparan; güzar = yol etmək.

Nişanə: "Qəm" - maddi dünyaya gəlməkdən əvvəl ilahi aləmdə həqiqi yaşayışını xatırlayan bir aşiqin ilahi müraciətə ürəkdən çalışmaq nişanəsidir.

**Qeyd**: *Mənəvi yaşayışı yaddan çıxarmayan insanlara dünyəvi ömrün sona çatması özəl bir muştuluqdur. Elə buna görə də Hafiz buyurub:*

" خرم آن روز کزین منزیل ویران بروم     راحت جان طلبم وزپی جانان بروم"

Anlam: Hicran çətinliyinin mənim canımı aldığını təsəvvür edən əcəl çaparı məni yada salmayır.

Beyt 2: **Yar cövr etməz mana əğyar təlim etmədən,**
**Billəh, əğyar eyləyən ehsanı yar etməz mana.**

Sözlük: Billah = and olsun Allaha.

Nişanə 1 – "Cövr" - şühudun tətil olmasından, qəbz və qəhrdən, hicran mənzillərindən habelə müxtəlif ürək sıxan sınaqlardan nişanədir.

**Qeyd**: *Buna diqqət etsək ki, cövr, aşiqin kamal mərtəbəsinə çatmaq istedadını sübut edir, (mütəal məhbub istedadsız aşiqi özbaşına boşlar) eşq sahəsinin cəfalarını vəfaları ilə paralel bəlkə də onlardan üstün və gərəkli anar və düşünərik.*

Nişanə 2 – "Əğyar" - mütəal məhbubdan başqa hər bir vücuddan hətta təsəvvürdən, fikirdən və ictimai mülahizələrdən nişanədir.

Nişanə 3 – "Təlim" - bu beytdə dünyəvi adab və əlaqədən nişanədir.

Nişanə 4 – "Ehsan" - surətdə müsbət, amma mənada əks və mənfi tərbiyələr və ictimai mülahizələrdən nişanədir. Çünki təcrid məqamının ilk əngəli ictimai adabdan ibarətdir.

Anlam: Dünyəvi mülahizələri unuda bilmədiyi üçün mənəvi mərtəbələrdə tərbiyə görmək sınaqlarına (cövr və cəfaya) gərəkli istedad qazana bilməmişəm.

**Qeyd**: *Beyt kinayə və tənz ilə əğyarın ehsanını tənqid edir, çünki əğyarların ehsanı mənəvi imkanlar önündə maneələr qaldırandır.*

Beyt 3: **Dağıdır hər ləhzə rəxti-eyşimi ahım yelı,**
**Hansı nahəq zülmidür kim, ruzigar etməz mana.**

Sözlük: Rəxt = paltar = matah = ev vəsaiti; nahəq = nahaq.

Nişanə 1 – "Eyş": A – dünyəvi ürək açan maraqlardan nişanədir.

B – həzrəti-məbuda adətkərdə olmağın və onun eşqi ilə maraqlanmağın ləzzətindən nişanədir.

Nişanə 2: "Ah" aşiqin istedad və iqtidarından nişanədir.

Anlam: A – dünyəvi sərxoşluqdan məhrum olmağıma mənəvi tələblər bais oldu.

B – Mənəvi sərxoşluqdan məhrumluğuma dünyəvi tələblər bais oldu.

P – Qəbz və qəhr mərhələsini davamlandıran öz biqərarlığım oldu.

**Qeyd**: *"B" və "P" beytin nəzər və məqsədinə yaxın nəzərə çarpır*.

Beyt 4: **Eşq zövqilə xoşam tərki-nəsihət qıl, rəfiq,**
**Mən ki, tiryakiməzacəm, zəhr kar etməz mana.**

Nişanə 1: "Eşq zövqilə xoşam" - ictimai sərkiləri qulaq ardına vurmaqdan nişanədir.

Nişanə 2: "Tərki nəsihət" - birinci nişanəni təkid və təhkim edən nişanədir.

Nişanə 3: "Tiryaki-məzac" - əql və məntiqə baglı acıdil insanların sərkilərindən əks və müsbət nəticə almaqdan nişanədir (aşiq sərkilər qarşısında camaatdan və onların mötəbər saydığı mərtəbələrdən və nəhayət kəsrətdən, yaxud dünyəvi hicablardan ayrılmağa məcbur olarkən mənəvi məqsədlərə yaxınlaşar)

Anlam: Əql və məntiq miqyaslarıyla məni sərkilərdən qorunmağa dəvət edən dostum diqqət etməyib ki: A – eşq sahəsində acılıq şirinlik ilə eynidir.

B – Mən əql və məntiqdən üstün eşq tabeliyində yaşamağı ixtiyar etmişəm.

P – Mənəvi mövqelər ilə tanış olan çağdan dünyəvi mülahizələri unutmuşam.

Beyt 5: **Çərxdən aşırmadan yadınla ahi-atəşin,**
**Qədr edib gərdun şərərdən zər nisar etməz mana.**

Sözlük: Çərx = fələk = səma; atəşin = alovlu; gərdun = fələk = zəmanə; şərər = qığılcım = havaya qalxan od parçası.

Nişanə: "Zər" - bu beytdə dünyəvi imtiytazlar və inkşaflardan nişanədir.

Anlam: Mənim ahım göylərin uca xeymələrini yandırıb onlardan yüksək mərtəbələrdə dolandığına görə göylər qısqanc olduqları üçün məni zəmanə sərxoşluqlarından məhrum ediblər.

**Qeyd**: *Beyt qızılın atəşdə xalis olduğu miqyasda ürəyin eşq odunda xalisləşməyini eyham edir.*

Beyt 6: **Nəqdi-can taraci-qəmdən saxlamaq düşvardır,**
**Eşq ta səngi-məlamətdən həsar etməz mana.**

Sözlük: Düşvar = çətin = müşkül; səng = daş

Nişanə 1 – "Nəqdi can" - mənəvi həyat yaxud ürək həyatından ibarətdir[1].

Nişanə 2 – "Taraci qəm" - əql və məntiqin edən mühakiməsindən və camaatın danlağından nişanədir.

Nişanə 3 – "Həsar" – camaatı, yaxud kəsrəti aşiqin gözündən salan nişanədir.

Anlam: Mənəvi rəhmətlər və vasitələr yardım etməsə sərkilərdən xilas olmaq mümkünsüz olar.

Beyt 7: **Yadi-ləlinlə Füzuli gözləyib rahi-ədəm,**
**Var bir tədbiri-amma aşikar etməz mana.**

*Sözlük: Rah = yol; ədəm = yoxluq.*

Nişanə 1 – "Ləl": A – ləl, dodaqdan yaxud içəri vücudu dirildən mənəvi nəfslərdən nişanədir.

B –mürşüdünün ilahi cəlalərlə daşqın ürəyindən və nəhayət təlimatından nişanədir.

P – mütəal məhbubun mənəvi həyat bağışlayan özəl rəhmətindən nişanədir.

Nişanə 2 – "ədəm" - mənəvi həyat eşqilə dünyəvi həyata son qoymaq nişanəsidir.

Anlam: Ey mütəal məbud, yaxud ey ulu mürsüd, Füzuli ilahi cazibələr bərəkətindən öz maddi varlığından xilas olmaq üçün gizli tədbirlər görmüşdür.

---

[1] "زنده به جان خود همه حیوان بود    زنده به دل باش که جان آن بود"    "مخزن الاسرار" حکیم نظامی

## Q Ə Z Ə L 15

(1) Canımın cövhəri ol ləli-gühərbarə fəda,
Ömrümün hasili ol şiveyi-rəftarə fəda.

(2) Dərd çəkmiş başım ol xali-siyəh qurbani,
Tab görmüş tənim ol türreyi-tərrarə fəda.

(3) Gözlərimdən tökülən qətrəyi-əşkim gühəri,
Ləblərindən saçılan lölöi-şəhvarə fəda.

(4) Çak sinəmdə olan qanlı cigər parələri,
Məst çeşmində olan qəmzəyi-xunxarə fəda.

(5) Parə-parə dili-məcruhi-pərişanimdən,
Səri-kuyində gəzən hər itə bir parə fəda.

(6) Canü dil qeydini çəkməkdən özüm qurtardım
Cani cananəyə etdim, dili dildarə fəda.

(7) Ey Füzuli, nola gər saxlar isəm cani əziz,
Vəqt ola kim, ola bir şuxi-sitəmkarə fəda.

Beyt 1: **Canımın cövhəri ol ləli-gühərbarə fəda,**
**Ömrümün hasili ol şiveyi-rəftarə fəda.**

Sözlük: Gövhərbar = gövhər yağdıran.

**Qeyd**: *Bu qəzəlin məqsədi mütəal məhbubun özü olmasa da onun cilvələrini və xəbərlərini gətirən vasitələrdən, yaxud gözəl simasından ilahi hüsnlər nişanəsi olan dünyəvi bir candan ibarətdir.*

Nişanə 1 – "Cövhər" - içəri və həqiqi həyatdan nişanədir.

Nişanə 2 – "Ləl": A – İlahi cəlalər ilə daşqın olan mürşid ürəyindən nişanədir.

B – ləl, mənəvi həyat bağışlayan ilahi nəfəslərdən, yaxud, "ikinci nəfəs"dən nişanədir.

Nişanə 3 – "Gövhər" - yeni həyat bağışlayan ilahi özəl feyzlərdən (ikinci nəfəs) nişanədir.

Nişanə 4 – "Şiveyi rəftar" - həzrəti-məbudun, yaxud mürşidin, yoxsa bir dünyəvi gözəlin aşiqi tərbiyə edən cəfa və vəfasından nişanədir.

Nişanə 5 – "Fəda" - bu beytdə bir vücudun başqa vücud ilə qaynayıb-qarışmağından və özünü onda fani edərkən "istihlak" ünvanlı məhvlik məqamına çatdırmağından nişanədir.

Anlam: Ey gözəl məhbub, sənin nurunda məhv olmaq zövqilə mənliyimdən ayrılmağa çalışıram.

**Qeyd**: *İkinci misra dünyəvi mərətəbələrin ,hətta mənəvi məqamların alqı – satqı (müamilə) qanununa tabeliyini və hər bir məcazi, yoxsa həqiqi dərəcəyə çatmağa bir özəl sərmayə hazırlamağa eyham edir.*[1]

Beyt 2: **Dərd çəkmiş başım ol xali-siyəh qurbani,**
**Tab görmüş tənim ol türreyi-tərrarə fəda.**

Sözlük: Siyəh = qara; Tab görmüş = atəşdə quru-quru qızarmış = büryan = qəhr və qəzəb çəkmiş = iztirab çəkmiş; Tərə = alına tökülmüş tellər.

Nişanə 1 – "Baş": A – baş bu beytdə düyəvi fikir - xəyal, yaxud dünyəvi varlıq nişanəsidir.

B – baş mənəvi qazancın sərmayəsindən ibarətdir.

Nişanə 2 – "Xal" - görünməz aləmin (qeyb) açılmaz nöqtəsindən, yaxud vəhdət nöqtəsilə əlaqədar sözə, ibarəyə sığmaz hüsndən nişanədir.

Nişanə 3 – "Siyəh" - xal mərtəbəsinin əqli qaranlığa salan mübhəmliyindən ibarətdir.

---

[1] Qəzəl 3, qeyd 3

Nişanə 4 – "Tab görmüş tən" - qat-qat mənliyini soyunub təcrid məqamına yüksəlmiş vücuddan nişanədir.[1]

Nişanə 5 – "Türreyi-tərrar " - gözəl məşuqun ürək sınayıcı qəhr və qəzəbindən nişanədir.

Anlam: Ey gözəl məşuq, həsrət və tələb atəşində öz vücudunu gah büryan etmiş, gah qat – qat soymuş aşiqinə əqlə, idraka sığmayan gözəl cilvələr görüşünə nailiyyət bağışla!

Beyt 3: **Gözlərimdən tökülən qətrəyi-əşkim gühəri,**
**Ləblərindən saçılan lölöi-şəhvarə fəda.**

Sözlük: Əşk = göz yaşı; Gühər = gövhər; Lölö = gövhər = dürr; Şəhvar = şaha yaraşan.

Nişanə 1 – "Əşkim gühəri" - bu beytdə aşiqin mәna bazarına hazırladığı sərmayədən nişanədir.

Nişanə 2 – "Ləb və lölö" - mənəvi həyat bağışlayan feyzlərdən nişanədir. (İkinci nəfəs )

Anlam: Ey gözəl məhbub, gözümün ürək mənşəli qan-yaşını, kiçik bir sərmayə kimi feyz ummaq xəyalı ilə cilvə bazarına gətirmişəm.

Beyt 4: **Çak sinəmdə olan qanlı cigər parələri,**
**Məst çeşmində olan qəmzəyi-xunxarə fəda.**

Sözlük: Çak = rəxnə = sökülmüş = yarılmış; Çəşm = göz.

Nişanə 1 – "Cigərparələr " - aşiqin sıxıntılarda – sınaqlarda hazırladığı sərmayədən, yaxud onun tərbiyə tapmasından və öz istedadını göstərməsindən nişanədir.

Nişanə 2 – "Çəşm" - mənəvi şühud və dünyəvi görüş məqamından nişanədir.

Nişanə 3 – "Məst" - çəşm məqamının qələbələrindən nişanədir.

Nişanə 4 – "Qəmzə" - qəhr ilə qatqı lütfdən nişanədir.

Anlam: Bu beyt ötən beytin mənasını təkrar və təkid edir.

Beyt 5: **Parə-parə dili-məcruhi-pərişanimdən,**
**Səri-kuyində gəzən hər itə bir parə fəda.**

*Sözlük:* Dili məcruh = yaralanmış ürək.

Nişanə: "İt": it həqirlikdən nişanədir.

---

[1] Qəzəl 12, beyt 1

Anlam: Ey gözəl məhbub, ömür boyu çətinliklər çəkə - çəkə hazırladığın sərmayə (birinci misra) sənin ərəfəndə həqiranə gəzənlərə layiq deyil.

**Qeyd**: *Məhbub ərəfəsində həqiranə dolanmaq hörmətli bir üstünlük əlamətidir.*

Beyt 6: **Canü dil qeydini çəkməkdən özüm qurtardım**
**Cani cananəyə etdim, dili dildarə fəda.**

Sözlük: Dildar = məşuq = canan.

Nişanə 1 – "Canü dil" - bu beytdə dünyəvi həyat vasitələrindən ibarətdir.

Nişanə 2 – "Canan və dildar" - mütəal-məbudun üzündən, yaxud onun ərəfəsinə hidayət edən mürşiddən və vasitələrdən nişanədir.

Anlam: Dünyəvi varlıq səbəblərini büsbütün canana qurban etmək ilə məcazi həyat qayğısından xilas oldum

Beyt 7: **Ey Füzuli, nola gər saxlar isəm cani əziz,**
**Vəqt ola kim, ola bir şuxi-sitəmkarə fəda.**

Nişanə: "Sitəmkar ": A - sitəmkar aşiqi qəbz və qəhr ilə sınağa çəkmək və tərbiyə etmək nişanəsidir.

B - əql və məntiq ölkəsində, üstünlük mütənasib bir məhdudluq ilə paralel olduğu kimi, eşq və məhəbbət sahəsinin də özünə münasib məhdudluqları var, demək, nazirlik, liderlik, ruhaniyyət və habelə, başqa mərtəbələr, insanı bəzi toplantılardan, vərdişlərdən və bir çox bu çeşid mübah işlərdən məhdud etdiyi kimi, gözəllik məşuq həzrətlərinə rəhmi, insafı və bir çox əql və məntiq müsbətliyini yasaq edər.

Anlam: Ey Füzuli, yalnız məhbub həzrətinə qurban etmək qəsdilə canımı dünyəvi həyatımdan ötrü mühafizə edirəm.

## Q Ə Z Ə L 16

**(1) Qəmdən öldüm demədim hali-dili-zar sana,**
**Ey güli-tazə, rəva görmədim azar sana.**

**(2) İç meyi-nab ki, bağrından edər cümlə kabab,**
**Atəşi-eşq ilə üşşaqi-cigərxar sana.**

**(3) Meyi-gülgunda degil nərgisi-məstin əksi,**
**Qədəh olmuş göz açıb aşiqi-didar sana.**

**(4) Arizin gül-gül edibdir meyi-gülguntabi,**
**Vəh ki, bir güldən açılmış neçə gülzar sana.**

**(5) Bağə seyr et bu rüxü ləl ilə kim, ğönçəvü gül**
**Göstərə xuni-dülü dideyi-xunbar sana.**

**(6) Der idim qamətinə sərv, vəli özgə imiş,**
**Hərəkatü rəvişü şiveyi-rəftar sana.**

**(7) Əgilib tərfi-binaguşina dərdi-dilimi**
**Ya o tağın deyə, ya türreyi-tərrar sana.**

**(8) Ta giriftarınam, azad ola bilmən qəmdən,**
**Hiç kim olmasın, ey sərv, giriftar sana.**

**(9) Ləli-nabın həvəsi bağrımı qan eylədigin,**
**Ah kim, qanlı yaşım qılmadı izhar sana.**

**(10) Ey Füzuli, fələkin var sən ilə nəzəri**
**Kim, qəmü möhnətini verdi nə kim var sana.**

Beyt 1: **Qəmdən öldüm demədim hali-dili-zar sana,**
**Ey güli-tazə, rəva görmədim azar sana.**

Nişanə 1 – "Qəm" - bu beytdə qəbz sıxıntılarıyla paralel həsrət çətinliklərindən nişanədir.

Nişanə 2 – "Güli-tazə": A – güli tazə həzrəti mürşüdün ilahi cəlalərilə bəst tapmış ürəyindən və nəhayət güzgü məqamına çatmış vücudundan nişanədir.

B –simasında mənəvi hüsnlərdən nişanə görünən dünyəvi canandan ibarətdir.

Nişanə 3 – "Azar" - qəbz və qəhr şəraitinin çətinliklərindən gileylilik etməklə səbrsiz və ədəbsiz olmaq nişanəsidir.

Anlam: Ey mütəal məhbub, qəbz və həsrət atəşində yanmağa və kül olmağa dözdüm lakin, gileylənməyi yararlı bilmədim.

Beyt 2: **İç meyi-nab ki, bağrından edər cümlə kabab,**
**Atəşi-eşq ilə üşşaqi-cigərxar sana.**

Sözlük: Nab = xalis = məhz; üşşaq = aşiqlər; cigərxar = möhnətkeş = daşqın qəmlərə giriftar = başqaların qəmini çəkən.

Nişanə 1 – "İç meyi-nab" - iqtidarlı məşuqun qəhr və qələbə sifətlərini alqışlamaq nişanəsidir.

Nişanə 2 – "Cigərxar" - aşiqin fədakarlıq sifətindən nişanədir.

Anlam: Ey gözəl canan, aşiq sənin qəhr və qələbə sifətlərinin önündə minnətdarlığını göstərmək üçün qəbzlər həbsində sıxıntılar çəkmiş vücudunu qurban etmək istəyir.

**Qeyd**: *Məşuqun qəhri isə lütf kimin hörmətlidir.*

Beyt 3: **Meyi-gülgunda degil nərgisi-məstin əksi,**
**Qədəh olmuş göz açıb aşiqi-didar sana.**

Sözlük: Gülgun = gül kimi = qırmızı = gülə mayil; əks = təsəvvür; didar = görüş.

Nişanə 1: "Meyi-gülgun": A – bu beytdə həzrəti-mürşüdün ilahi cəlalər ilə daşqın ürəyindən və nəhayət mərifət bağışlayan təlimatından nişanədir.

B – Aşiqin cazibələr şəraitində məğlub olmuş ürəyindən nişanədir.

**Qeyd** 1: *"A"və "B" şəraiti həzrəti məbudun görünməz cilvələrini ürək güzgüsündə təzahur etdirən mərtəbələrdən ibarətdir.*

**Qeyd** 2: *İlahi cilvələrə güzgü olmuş bir ürəyin ürfani ünvanı "piyalə"dən ibarətdir.*[1]

Nişanə 2 – "Nərgisi-məst" - bu beytdə şühud nurunun qələbələrindən nişanədir.

Anlam: Ey gözəl məhbub aşiqin şühud şəraitində güzgü məqamına nailiyyət tapmış ürəyində sənin cilvələrini görmək marağı ilə gözünü piyalə kimi açıbdır.

**Qeyd**: *Piyalə, aşiqin heyrətamiz halından istiarədir.*

Beyt 4: **Arizin gül-gül edibdir meyi-gülguntabi,**
**Vəh ki, bir güldən açılmış neçə gülzar sana.**

Sözlük: Ariz = sima = surət = camal; gülgun = gülə mayil = qırmızı; tab = hərarət = nur; vəh = alqış = əcəba; gülzar = gülüstan.

Nişanə 1 – "Ariz" - aşiqin ürəyində iman nurunu təzahür etdirmək səbəbilə bəzi mənəvi sirrləri açıb-ağardan ilahi cilvələrdən nişanədir.

Nişanə 2 – "Gül – gül" - aşiqin qəlbinə hər dəm yeni bir bəst bağışlayan təzə təcəllidən nişanədir.

Nişanə 3 – "Meyi gülguntabi" - bu beytdə: A – ilahi cilvələri dəmbədəm yeniləşdirən rəhmət qələbəsindən nişanədir.

B – mürşüd məktəbində hər dəm bir hidayətə nail olmaq nişanəsidir.

P – məhəbbət hərarətində hasil olmuş parlamalar nişanəsidir.

Nişanə 4 – "Gülzar" - ruha genişlik şəraiti törədən bəstdən nişanədir.

Anlam: Ey gözəl məhbub, sənin camalın dəmbədəm cilvələnərkən layiq ürəklər isə dəmbədəm bəstlənir.

Beyt 5: **Bağə seyr et bu rüxü ləl ilə kim, ğönçəvü gül**
**Göstərə xuni-dül dideyi-xunbar sana.**

Sözlük: Rüx = surət = sima = camal; xuni dil = ürək qanı, dide = göz; xunbar = qan ağlayan = qanyaş yağdıran.

Nişanə 1 – "Bağ, qönçə, gül": A– hər üçü dünyəvi və məcazi imtiyazlar və hüsnlərdən nişanədir.

B – bağ, bəst məqamından nişanədir.

Nişanə 2 – "Rüx": İlahi camaldan parlayan təcəllilərdən nişanədir.

Nişanə 3 – "Ləl": mənəvi nəfəslərdən yaxud ikinci nəfəsdən nişanədir.

---

[1] ما در "پیاله" عکس رخ یار دیده ایم ای بی خبرزلذت شرب مدام ما (حافظ)

Nişanə 4 – "Xuni-dülü dideyi-xunbar " - dünyəvi imtiyazlar (bağ, qönçə, gül) sahiblərinə mənəvi mərifət bağışlayarkən onları öz həqirliklərindən xəbərdar edən məqamdan nişanədir.

Anlam: A – Ey gözəl məhbub, öz mənəvi hüsnlərindən bir neçə cilvə nişan vermək ilə, bütündünyəvi hüsnlərin həqirliyini biləndir.

B – ey gözəl canan, özlərini kamal zirvəsində hiss edən aşiqlərə görünməz hüsnlərindən bir neçə cilvə göstərərkən onları öz həqirlik və möhtaclıqlarından xəbərdar edib qürurlanmaqdan mühafizə et.

Beyt 6: **Der idim qamətinə sərv, vəli özgə imiş,**
**Hərəkatü rəvişü şiveyi-rəftar sana.**

Sözlük: Rəveş = nazlana – nazlana addım atmaq.

Nişanə 1 – "Qamət" - şühud səmasında parlayan ilahi cilvələrin davam şəraitindən nişanədir.

Nişanə 2 – "Sərv" - bu beytdə qamət mərtəbəsinin idrakını iddia etmiş aşiqdən ibarətdir.

Nişanə 3 – İkinci misra hər dəm yeni bir görkəmdə zahir olmuş cilvələrdən nişanədir.

Anlam: Ey mütəal məhbub, sənin hüsnlərini duyub – düşünmək iddiası ilə özümü ulu bir mərifət sahibi təsəvvür etmişdim lakin dəmbədəm yenilənən cilvələrin ilə öz təsəvvürümün batilliyindən xəbərdar oldum.

Beyt 7**: Əgilib tərfi-binaguşina dərdi-dilimi**
**Ya o tağın deyə, ya türreyi-tərrar sana.**

Sözlük: Binaquş = sırğalıq; tərrə = alına tökülmüş tellər; tərrar = oğru.

Nişanə 1 – "Binaquş" - mütəal məbudun gizli sirrini və əqlə və idraka sığmayan həqiqətini iyham edən "dəqiqə" ünvanıyla tanınmış ürfani nişanədən ibarətdir.

Nişanə 2 – "Tağ": - tellərin iki bölgüyə ayrılmış yeri yaxud onların bitmək yeri olduğuna görə mütəal məhbubun zahir olmuş sifətlərinin o məhbubun gizli həqiqətiləəlaqədarlığından nişanədir.

**Qeyd** 1: *Tellərin çoxluğu (kəsrət) ilahi sifətlərin çoxluğundan nişanədir.*

**Qeyd** 2: *Tellərin qalibən qaraca olduğu sifətlər ilə həqiqətin mübhəm və açılmaz əlaqələrindən əlamətdir.*

**Qeyd** 3: *Tellər öz bitdiyi yerə ən yaxın olduğuna görə qərbdən nişanədir.*

**Qeyd** 4: *Tel, bitdiyi yerdən həyat almağına görə həyat mənbəyilə, yaxud vəhdət nöqrəsilə bağlılıq nişanəsidir.*

Nişanə 3 – "Türreyi-tərrar" - aşiqin qəlbini məğlub edən təcəllilərdən nişanədir.

Anlam: Ey ulu canan, tələb və ətəş dərdimi sənin müxtəlif sifətlərin ilə sənə çatdırmaq istəyirəm.

Beyt 8: **Ta giriftarınam, azad ola bilmən qəmdən,**
**Hiç kim olmasın ey sərv! Giriftar sana.**

Nişanə 1 – "Qəm " A – həsrət və tələb halında qəlbin çalışmağından nişanədir.

B – qəm, şövqlənməkdən hasil olmuş biqərarlıqdan nişanədir.

Nişanə 2 – "Sərv" - bu beytdə ilahi cilvələrin davamlı tətilindən nişanədir.

Anlam: A – Ey təcəllilərin tətil etmiş həkim məhbub, bəst ardında olan qəbz bəlasından xilas lomaq biqərar aşiqə mümkünsüz bir arizidir.

B – ey gözəl məhbub, biqərarlıq şühud şəraitində isə məni özbaşıma buraxmayır.

**Qeyd** 1: *İkinci misra: eşq bəlalarının çətin olduğuna görə digər insanlara onunla tanış olmamaq arzulayıram.*

**Qeyd** 2: *İstiqamətini təkmil etməyən bir aşiqə eşqdən kənarlıq istəyir.*

Beyt 9: **Ləli-nabın həvəsi bağrımı qan eylədigin,**
**Ah kim, qanlı yaşım qılmadı izhar sana.**

Sözlük: Nab = xalis =məhz.

Nişanə 1 – "Ləli-nab ": A – bu beytdə yoxluqdan varlıq tapmaq nişanəsidir.

**Ta qoşun çəkdin qaşından tarimar etdin məni,**
**Ta ki qoşdun yoxlara, ey şux, var etdin məni.**[1]

Nişanə 2 – "Həvəs " - qəlbin ilahi inkişaf və müşahidə tələbilə özəl ətəşindən nişanədir.

Nişanə 3 – "Qanlı yaş " - gizli "həvəsi" açıb- ağardan haldan nişanədir.

**Qeyd**: *Qanlı yaş mərhələsi eşq sirrini aşkar etməyinə görə aşiqi qəbz və qəhr ilə cəzalandıran mərhələdir.*

---

[1] Müəllifin qəzəlindən bir beyt.

Anlam: Ey həkimi-məhbub, göz yaşım eşq sirrini açıb – ağartmasına görə məni cəzalanmaya məhkum qıldı.

Beyt 10: **Ey Füzuli, fələkin var sən ilə nəzəri**
**Kim, qəmü möhnətini verdi nə kim var sana.**

Anlam: Ey Füzuli, fələk səni qəmlərə giriftar edərkən mənəvi sərxoşluqla tərbiyə edir. Beləliklə, sən də ona minnətdarlıq və hörmət göstərməlisən.

## Q Ə Z Ə L 17

**(1) Qəmzəsin sevdin könül, canın gərəkməzmi sana?**
**Tiğə vurdun cismi üryanın, gərəkməzmi sana?**

**(2) Atəşin ahımla eylərsən mənə təklifi-bağ,**
**Bağban, gülbərgi-xəndanın gərəkməzmi sana?**

**(3) Yelə vermə dağıdıb hər yan, ayaqlardan götür,**
**Ey pəri, zülfi-pərişanın gərəkməzmi sana?**

**(4) Ey kəman-əbru rəqibə vermə qəmzəndən nəsib,**
**Ox atarsan daşə, peykanın gərəkməzmi sana?**

**(5) Yandırıb canın cahansuz etmə bərqi-ahımı,**
**Asiman, xurşidi rəxşanın gərəkməzmi sana?**

**(6) Küfr zülfündən məni mən eyləmək layiqmidir?**
**Sufi, insaf eylə, imanın gərəkməzmi sana?**

**(7) Tutalım kim, əşk seylabına yoxdu etibar**
**Ey Füzuli, çeşmi-giryanın gərəkməzmi sana?**

Beyt 1: **Qəmzəsin sevdin könül, canın gərəkməzmi sana?**
**Tiğə vurdun cismi üryanın, gərəkməzmi sana?**

Nişanə 1: "Qəmzə" - qəhr ilə qatqı lütfdən nişanədir.

Nişanə 2: "Tiğ" - məcazi duruma və maddi bağlantılara rəxnə salan və aşiqi mənliyindən xilas edən nişanədir.

Nişanə 3: "Üryan" - dünyəvi varlığını qat – qat soyunub bəstlik məqamına hazırlaşan vücuddan nişanədir.

Anlam: Ey Fizuli qəmzə şəraitini istiqbal edərkən özünü təhlükəyə saldın.

**Qeyd**: *Beyt, aşiqi məlum təhlükələrlə qorxudarkən onu naməlum məqamlara ləyaqət hissi ilə yaşamağı və nail olması münasibətilə təbrik edir. Beləliklə ona təhlükə təhdidini yox, bəlkə də təhlükəni alqışlamamaq qorxusunu xatırladır, ona görə ki, özünü ölümdən və şəhadətdən qoruyan bir aşiq müddəidir və düzgün eşq ilə tanışlıq ləyaqətini tapa bilməyib.*

Beyt 2: **Atəşin ahımla eylərsən mənə təklifi-bağ,**
**Bağiban, gülbərgi-xəndanın gərəkməzmi sana?**

Sözlük: Gülbərg = gül yarpağı.

Nişanə 1: "Ah" A – Ah, bu beytdə ürəyin maddi hissəsini, yaxud müşahidə məqamına maneə törətmiş küdurətlərini "nari-məhəbbət" mərhələsində yandırarkən onu "nuri-məhəbbət" vasitəsilə güzgü məqamına hazırlayan mənzildən nişanədir.

**Qeyd**: *"Nuri-məhəbbət" ürəyi ilahi nur ilə doldurar.*

**Qeyd** 2: *"Nuri-məhəbbət" ürəkdə ilahi nuru təzahur etdirər.*

B – "Ah", batin vücuda mənəvi hərəkət bağışlayan və onu vəhdət və İnnəllah məqsədinə yönəldən hərarətdən ibarətdir.

P – "Ah", ürəyi bişirən tərbiyədən ibarətdir.

Nişanə 2: "Bağ" və "güli-xəndan" - bu beytdə maddi hüsnlər və dünyəvi bəstlərdən nişanədir.

Nişanə 3: "Bağban" - bu beytdə məcazi gözəlliklərlə tanış olmuş və onları istiqbal etmiş insandan nişanədir.

Anlam: Mən özüm öz içimdəki geniş ruhani aləmi seyr edərkən ilahi hüsnlər və cəlaləri idrak edirəm, digər çöl dünyada, yaxud Yer kürəsində olan fani səfaların seyrinə rəğbət etmirəm.

Beyt 3: **Yelə vermə dağıdıb hər yan, ayaqlardan götür,**
**Ey pəri, zülfi-pərişanın gərəkməzmi sana?**

Nişanə 1: "Pəri" A – gözəl təlimatlı mürşüddən nişanədir.

B – bəşəri simada ilahi hüsnlərdən əsər və nişanə göstərən gözəl insandan nişanədir.

P – pəri, aşiqin batini gözünü yaxud fuadını[1] güzgü etmiş ilahi parlamalardan nişanədir.

Nişanə 2: "Zülf" - bu beytdə vəhdət nöqtəsinə hidayət edən kəsrətdən nişanədir.[2]

Nişanə 3: "Pərişan" - vəhdəti cürbəcür təzahur etdirmək səbəbilə aşiqi "təfriqə"yə girifdar edən kəsrətdən nişanədir.

**Qeyd** 1: *Aşiq öz xidmətində və itaətində özünü nəzərə alsa "təfriqə" mənzilindədir.*

**Qeyd** 2: *Aşiq öz məhəbbət və itaətində yalnız yeganə məbudu nəzərə alsa "cəm" məqamındadır.*

**Qeyd** 3: *Təfriqə-kəsrətdən və-cəm vəhdətdən nişanə olduğuna görə, ikisi də məbudun iqtidarına bağlıdır. Beləliklə, cəmsiz təfriqə mütəal məbudun özünü və təfriqəsiz cəm, yaxud kəsrətsiz vəhdət onun iqtidarını inkar etməkdir.*[3]

Anlam: Ey gözəl məhbub, kəsrət, yaxud yaranış güzgüsündə təcəlli etməsən yaranmışlar nəyə gərəkdir.

Beyt 4: **Ey kəman-əbru rəqibə vermə qəmzəndən nəsib,**
**Ox atarsan daşə, peykanın gərəkməzmi sana?**

Sözlük: Kəman-əbru = kaman qaşlı; peykan = süngü = ox = ox ucu.

Nişanə 1: "Kaman- əbru" - həzrəti-məhbubun həqiqətini gizlədən qəhr və qəzəb sifətlərindən nişanədir.

Nişanə 2: "Ox" və "peykan" - bu beytdə zahirə rəxnə salarkən batinə nüfuz edən mənəviyyatlardan nişanədir.

Nişanə 3: "Rəqib" - müddəilərdən[4], yaxud tərbiyə sınaqlarını görməyən aşiqlərdən nişanədir.[5]

Nişanə 4: "Qəmzə " - qəmlər ilə bağlı şadlıqlardan nişanədir.

---

[1] Qəzəl 13, beyt 1.
[2] Qəzəl 12, beyt 2.
[3] Fərhəngi-istilahat və təbirati-ürfani.
[4] Qəzəl 6, beyt 2
[5] Qəzə 7, beyt 5

Anlam: Ey gözəl məhbub, rəqib tərbiyə sınağına çəkilmədiyindən və eşq ərəfəsinə məhrəm olmadığına görə: A – sənin qəmzələrindən fayda apara bilməz.

B – Qəmzələr, onu yolundan çaşmağa və müddəiliyə giriftar edər.

Beyt 5: **Yandırıb canın cahansuz etmə bərqi-ahımı,**
**Asiman, xurşidi-rəxşanın gərəkməzmi sana?**

Sözlük: Cahansuz = dünyanı yandıran; Xurşid = günəş; rəxşan = derəxşan və parlaq.

Nişanə 1: "Asiman " - aşiqi əngəllər və istəklər hicabına giriftar edən fələk və zəmanədən nişanədir.

Anlam: A – Ey fələk, mənimlə məhbub arasında maneələr törətməyi davam etdirsən alovlu ahımı göylərə qaldırarkən səmavi iqtidarlar və imtiyazları, o cümlədən, günəşi yandırıb, külə döndərərək səmaları zülmətə giriftar edərəm.

**Qeyd**: *Beyt eşqin iqtidarını göstərmək istəyir.*

*B – Ey məhbub, mənim alovlu ürəyim eşq səmasının günəşi olduğuna görə onu qəbzlər atəşində kül edərkən eşq səmasının günəşsiz qalmağına razı olma.*

Beyt 6: **Küfr zülfündən məni mən eyləmək layiqmidir?**
**Sufi, insaf eylə, imanın gərəkməzmi sana?**

Sözlük: Mən = mane olmaq = cilovlamaq; Sufi = təsəvvüf məktəbinin ümməti = təsəvvüf təmsilçisi.

Nişanə 1: "Zülf" - bu beytdə vahid məbudun kəsrət güzgüsündə təzahür etdirilmiş nurundan nişanədir.

Nişanə 2: "Küfr " - aşiqi camaatın nəzərindən və nəhayət, ictimai hicablardan xilas edən sərkilərdən nişanədir.

Nişanə 3: "Sufi" A – sufi saf qəlbli mürşiddən nişanədir.

B – Həzrəti-məbudun qəlbi safa çıxardan cəlalərindən nişanədir.

P – Təsəvvüf və mənəviyyət qüruruna giriftar olmuş müddəi liderdən nişanədir[1].

Nişanə 4: "İman " - bu beytdə həzrəti məbudun bəndələrinə bəxş etdiyi hidayət və mənəviyyətdən nişanədir.

---

[1] İlk mənzildə mənliyini məhv etmiş aşiq 29 mənzil seyr edəndən sonra İslamın təsdiq etdiyi sufilik məqamında nailiyyət tapır. ( Bu haqda doktor Nurbəxşin " Sufi kist" ünvanlı kitabında kərəkli izahlar aparılıbdır)

Anlam: A – Ey mürşid, kəsrət güzgüsündə vəhdət cəlalərindən məhrumluğun, insafından və mənim imanımdan uzaqdır.

B – Ey mütəal məhbub, məhrumluğun imanıma rəxnə vurmasından qorxuram.

Beyt 7: **Tutalım kim, əşk seylabına yoxdu etibar**
**Ey Füzuli, çeşmi-giryanın gərəkməzmi sana?**

Sözlük: Əşk = göz yaşı; seylab = sellənmək; çeşm = göz.

Nişanə 1: "Əşk ": A – su zahiri vücudu paklayan kimi, əşk içəri vücudun paklanma nişanəsidir.

B - Əşk, ürəyi şəffaflaşdırarkən onu güzgü məqamına çevirən nişanədir.

Nişanə 2: "Seylab" - mənliyi yuyan vasitədən nişanədir.

Anlam: A – Ey Füzuli, əşk mövqeiyyəti çox davamlı olmasa da, mənlik hicabını yumağın miqdarı davam edir.

B - Əşk mövqeiyyətinin etibarı olmasa da, göz digər etibarlar ilə özünü güzgü etməyə qadirdir.

## Q Ə Z Ə L 18

**(1) Gərçi, ey dil, yar üçün yüz verdi yüz möhnət sana,**
**Zərrəcə qəti-məhəbbət etmədin, rəhmət sana.**

**(2) Saxlama nəqdi-qəmi-eşqini, ey can, zahir et**
**Kim, verəm həbsi-bədəndən çıxmağa rüxsət sana.**

**(3) Çareyi-behbudimi sordum müalicdən, dedi:**
**Dərd dərdi eşq isə mümkün degil səhhət sana.**

**(4) Tutaram yarın qiyamətdə, həbibim, damənin,**
**Məstsən qəflət şərabından, bu gün möhlət sana.**

**(5) Eşq əhlin atəşi-hicranə eylərsən kəbab ,**
**Dönə-dönə imtəhan etdim, budur adət sana.**

**(6) İncidir naləm səni, vəh nola gər bir tiğ ilə,**
**Çəşmi-cəlladın edə ehsan mana, minnət sana.**

**(7) Səndə dün gördüm, Füzuli, meyli-mehrabü namaz,**
**Tərki-eşq etməkmi istərsən, nədir niyyət sana?**

Beyt 1: **Gərçi, ey dil, yar üçün yüz verdi yüz möhnət sana,**
**Zərrəcə qəti-məhəbbət etmədin, rəhmət sana.**

Nişanə 1: "Möhnət" - məhəbbət ilə paralel aşiqin nöqsanını, yaxud kamalını üzə çıxaran canı və ürəyi sınaqlara çəkən qəbzlərdən nişanədir.

Nişanə 2: "Məhəbbət" A – Aşıb-daşan ürəyin məşuq tələbində dayanmaz döyüntülərindən nişanədir.

B – Məşuqu aşiqin fikir – xəyal ilə hazır saxlayaraq onun bütün əməllərini – hərəkətlərini məşuqun razı düşməyi ilə müvazinətləşdirən mərtəbələrdən nişanədir. Aşiq məhəbbət mənzilində məşuqun az lütfünü çox, özünün çox itaətinmi az bilir.[1]

Anlam: Ey ürək, ya da ey Füzulinin həqiqi vücudu, çox da məşuq atəşində saysız sıxıntılar – sınaqlar çəkdin, lakin sədaqətdə bir zərrə geri çəkilmədin, beləliklə, bəst feyzinə nailiyyət axtaran istedadını nişan verdin.

Beyt 2: **Saxlama nəqdi-qəmi-eşqini, ey can, zahir et**
**Kim, verəm həbsi-bədəndən çıxmağa rüxsət sana.**

Nişanə 1: "Nəqd-qəm-eşq" - məna səmasına yüksəlməyə hazırlanan sərmayə və istedaddan nişanədir.[2]

Nişanə 2: "Həbsi-bədən" - əbədi vüsal və ölümsüz həyata mane olmuş dünyəvi həyatdan nişanədir.

**Qeyd**: *Həqiqi və mənəvi "mənə", dünyəvi və maddi "mən" ilə bədən şəraitində qatqı və vahid yaşamağına görə daimi vüsal fürsəti mümkünsüzdür, buna görə də ölüm aşiqləri ülvi və əbədi aləmə köçürdən ölümsüz həyat muştuluğudur.*[3]

Anlam: Ey aşiq, fədakarlıq və qurbanlıq istedadını zahir edərkən özünün canana yetmək ərəfəsində ölümsüz yaşayışını bərqərar et.

Beyt 3: **Çareyi-behbudimi sordum müalicdən, dedi:**
**Dərddərdi eşq isə mümkün degil səhhət sana.**

Sözlük: Behbud = tədrici tərqi = xəstəlikdən qurtarmaq; müalic = əlac edən.

Nişanə 1: "Səhhət və sağlamlıq" - əbədi vüsal sahəsində daimi aramlıq – səbrü-qərar tapmaqdan nişanədir.

---

[1] Fərhəngi-loğat və istilahat və təbirati-ürfani.
[2] Qəzəl 3, beyt 3.
[3] Qəzəl 2, beyt 7, qeyd 5.

Nişanə 2: "Müalic" - Cəbrail adlı müqqədəs mələkdən, yaxud digər səmavi vasitədən, ya da həzrəti-mürşiddən nişanədir.

Anlam: Aşiqi məhbub ərəfəsində daimi aramlıqla – səbrü-qərara çatdırmaq yalnız dünyəvi ömrü başa vurmaqla mümkün olur (daimi vüsalın yeganə sərmayəsi ölümdür).

**Qeyd**: Dünyəvi yaranış qanununda hər bir yaranmışın fasidliyi onun sakinliyi ilə əlaqədardır, beləliklə, zavalsız aramlıq (sağlam sakinlik) yalnız dünyanı dəyişmək, yaxud ölüm vasitəsilə dünyadan mənaya köçməkdən ibarətdir.[1]

Beyt 4: **Tutaram yarın qiyamətdə, həbibim, damənin,**
**Məstsən qəflət şərabından, bu gün möhlət sana.**

Sözlük: Damən = ətək.

Nişanə 1: "Damən tutmaq" - ətəkdən sarılmaq, gileyllənmək və iltimas etməkdən nişanədir.

Nişanə 2: "Məst" - mütəal məhbubun yaxud həzrəti-mürşidin qələbə sifətindən nişanədir.

Nişanə 3: "Qəflət" A – aşiqin sınağa çəkilmiş şəraitində yalvar - yaxarını dinləməyən məşuq sifətindən nişanədir.

B – Həzrəti-mürşidin vəhdət dənizində itib – batmasından, özündən xəbərsiz olmağından və nəhayət eşq tələblərinin iltimasını unutmağından nişanədir.

Anlam: A – Özünü vəhdət dənizində məhv etmiş mürşidə bu dünyada dərdimi demək imkanını tapa bilmədim, amma o dünyada ətəyini tutarkən gileylimi qulağına çatdıracağam.

B - bu dünyada mənəvi hüsnlərin biri olan gözəl canan cəfalarından o dünyada özünə şikayətçi olacağam.

Beyt 5: **Eşq əhlin atəşi-hicranə eylərsən kəbab,**
**Dönə-dönə imtəhan etdim, budur adət sana.**

Nişanə 1: "Kbab" - etmək aşiqin nöqsanlarını silib onun ülvi iste-dadlarını üzə çıxarma çətinliklərinin nişanəsidir (tərbiyə və sınaq müş-külləri).

Nişanə 2: "Adət" - şəriətdə "sünnət" adı ilə tanınmış qanunlar ki-mi, təriqətdə "qəbz" və "bəst" ünvanlı özəl qanunlardan nişanədir.

---

[1] Qəzəl 1, beyt 1, nişanə "salik".

Anlam: Aşiqi sınaqlara – sıxıntılara düçar etmək eşq mülkününün sabit qanunudur.

Beyt 6: **İncidir naləm səni, vəh nola gər bir tiğ ilə,**
**Çəşmi-cəlladın edə ehsan mana, minnət sana.**

Sözlük: Vəh = alqış = əcəba; çeşm = göz.

Nişanə 1: "İncitmək" - eşq mülkünün qanununa etiraz etməyə eyham nişanıdır.

Nişanə 2: A – Tiğə (xəncərə) etirazamiz nalələr önündə aşiqi tənbeh etməkdən nişanədir.

B – Tiğ aşiqi bədən hicabından və maddə həbsindən xilas edən şühud qələbələrindən nişanədir.

Nişanə 3: "Çəşmi-cəllad" - "tiğ" nişanəsini təkrar edən tərkibdir.

Nişanə 4: "Minnət" - mütəal məhbubun öz sifətinin öz həqiqətindən məmnunluq nişanəsidir.

Anlam: Ey mütəal məhbub, mənim nalələrim sınaqdan çətin çıxmağımı və nəhayət sənin razılığ mənzilindən kənar düşməyimi göstərir. Buna görə də ilahi bir qalib cazibə ilə özlüyümdən çıxmaq və qurbanlıq məqamına nail olmaq istəyirəm. Belə bir cazibə mənə ehsan olduğu kimi sənin iqtidarlı hikmət və həqiqətindən sənə təşəkkür etməkdir.

Beyt 7: **Səndə dün gördüm, Füzuli, meyli-mehrabü namaz,**
**Tərki-eşq etməkmi istərsən, nədir niyyət sana?**

Sözlük: Mehrab = qiblə = imami camaatın məsciddə namaza durduğu yer = məclisin yuxarı başı.

Nişanə 1: "Mehrab və namaz" A – Namazın və digər ibadətlərin şəri və zahiri adəd-ənənələrini qurmaqdan nişanədir.[1]

B – Dini riyakarlıqlar ilə dünyəvi qazanc axtarmaqdan nişanədir.

Anlam: Ey Füzuli, zahiri adəd-ənənələrini mayilliyin eşq mülkündən əql mülkünə qayıdışını göstərir.

---

[1] Qəzəl 13, beyt 2 .

## Q Ə Z Ə L 19

(1) Ey bivəfa ki, adət olubdur cəfa sana
Billah, cəfadır, olma demək bivəfa sana.

(2) Gəh nazü gəh kirişməvü gəh işvədir işin,
Canın sevənlər olmasa yey aşina sana.

(3) Min can olaydı kaş məni-dilşikəstədə
Ta hər birilə min gəz olaydım fəda sana.

(4) Eşqində mübtəlalığımı eyb edən sanır
Kim, olmaq ixtiyar elədir mübtəla sana.

(5) Ey dil! ki hicrə dözməyib istərsən ol məhi,
Şükr et bu halə, yoxsa gəlir bir bəla sana.

(6) Ey gül, qəmində əşk rüxi-zərdim etdi al,
Bildirdi ola surəti-halım səba sana.

(7) Düşməz çü şah qürbi, Füzuli, gədalərə ,
Ol şəhdən iltifat nə nisbət mana, sana.

Beyt 1: **Ey bivəfa ki, adət olubdur cəfa sana**
**Billah, cəfadır, olma deмək bivəfa sana.** .

Sözlük: Billah = and olsun Allaha!

Nişanə 1: "Bivəfa və cəfa" - birinci misrada mənəvi və dünyəvi məhbubun müsbət sifətlərindən nişanədir. Mütəal məhbub bu sifətlərilə aşiqin kamal zirvəsinə yüksələrkən öz istiqamət və istedadını üzə çıxarmaq istəyir.

Nişanə 2: "Cəfa və bivəfa" - ikinci misrada mənfilik və ədalətsizlik sifətlərindən nişanədir.

Nişanə 3: "Adət" - eşqin yaxud, təriqət mülkünün sabit qanunlarından nişanədir.[1]

Anlam: Ey qeyz və qəhr qanunları ilə aşiqi kamal zirvəsinə qaldıran mütəal məhbub, hər kim bu qanunları cəfakarlıqdan nişanə bilsə, özünü mənfi anlayışa və alt-üst mərifətə giriftar edibdir.

Beyt 2: **Gəh nazü gəh kirişməvü gəh işvədir işin,**
**Canın sevənlər olmasa yey aşina sana.**

Sözlük: Gəh = gah; kirişmə = qəmzə = qaş göz ilə işarə etmək.

Nişanə 1: "Naz və kirişmə və işvə" - aşiqi gah qüvvətləndirən, gah qüvvətsiz edən, gah da ona bərk məstlik verən cilvələrdən nişanədir.

Anlam: Həqir aşiqi onun mənəvi varlığına maneçilik törədən dünyəvi varlıqdan tədricən xilas edib təcrid məqamına yüksəldən ey həkimi-məhbub! Öz məcazi həyatını qoruyan bir aşiq sənin eşqinlə tanışlıq imkanını tapa bilməyib mücərrədlik və bəsitlik məqamından məhrum qalmalıdır.

Beyt 3: **Min can olaydı kaş məni-dilşikəstədə**
**Ta hər birilə min gəz olaydım fəda sana.**

Sözlük : Delşikəstə = qəlbi sınıq = qəlbi yaralı = qəlbi yarılmış.

Nişanə 1: "Min" - kəsrət, yaxud çox sayılılıqdan nişanədir.

Nişanə 2: "Can" - fədakarlıq, yaxud, eşq bazarının özəl sərmayəsindən ya da mənəvi alqı – satqının dünyəvi sərmayəsindən nişanədir.

Nişanə 3: "Dilşikəstə" - cazibələr qələbəsində özünü unutmağa istedad tapmış ürəkdən nişanədir.

Anlam: Ey gözəl məhbub, kaş ki min canım, yaxud min sərmayəm olaydı ki, qurbanlıq bazarında min dəfə fədakarlığa nail olaydım.

---

[1] Qəzəl 18, beyt 5.

**Qeyd**: *Beyt qurbanlığın ləzzətilə paralel məşuq cəfalarının qiymətliliyinə və aşiqin qiymətşünaslığına eyham edir.*

Beyt 4: **Eşqində mübtəlalığımı eyb edən sanır**
**Kim, olmaq ixtiyar illədir mübtəla sana.**

***Qeyd**: "İxtiyar"-Füzuli və Hafiz Şirazi baxımında məcburiyyət qarşısında qeyd olmuş fəlsəfi obyektdən başqadır, demək ixtiyarsızlıq məcburluğu sübut etməyir, ona görə ki, ixtiyar və məcburiyyət, dünya və məna mülkünün ayrı-ayrı, möhkəm, müstəqil və dəyişilməz qanunlarından ibarətdirlər. Suyun axması, nurun işığı, atəşin hərarəti və habelə digər özəl xasiyyətli fenomenlərin maddi dünyada müstəqil və sabit bir qanun tabeliyində olduğu kimi məlamət, rüsvaylıq və mübtəlalıq isə məna mülkünün, yaxud eşq aləminin möhkəm və tanınmış qanununa bağlıdırlar.*

*İnsanlar maddi dünyaya gəlməzdən əvvəl mənəvi aləmdə, yaxud "ələst"[1] aləmində Allahın hüzurunda əql və məntiq ilə bağlı (şəriət) əhd etməkləri kimi: (sədaqət, ədalət, indaf, iman və ... qeyri əhdlər) eşq və məhəbbət ilə əlaqədar təəhhüdnamələrə də qol çəkmişlər (məlamət görmək, qəbzi, qəhri və ...qəbul etmək təəhhüdləri). Bu təəhhüdlər dünya və məna, yaxud əql və eşq qanunlarını təsdiq və qəbul etməkdən ibarətdir, beləliklə, hər bir ürək "ələstdən", yaxud yuxarı aləmdən gətirdiyi xarakterini salim saxlayıbsa, onun aşiq olmağı və bəlalar çəkməyi təbii və qanuni bir prinsipdir, bunun üçün cəfadan şikayət etmək, qanunsuzluq tabeliyinə meyl göstərmək gərəkdir. Nəhayət, bu nəticəyə gəlmək olar ki: sağlam ürək, yaxud ələsti batin şəxs aşiq olmağa məcburdur, ancaq bu məcburiyyət ixtiyarsızlıq yox, sağlamlıq və qanunilikdir, necə ki, salim bir gözün görmə məcburluğu onun etibarlı olmasını nişan verir.*

Anlam: Aşiqlərə etiraz edən camaat, ələst əhdini yaddan çıxararkən ürək güzgüsünü qanunsuzluq ləkələri ilə paslandırıblar.

Beyt 5: **Ey dil Ki, hicrə dözməyib istərsən ol məhi,**
**Şükr et bu halə, yoxsa gəlir bir bəla sana.**

Sözlük: Məh = mah = ay = mahtab.

Nişanə 1: "Məh" - qaraca maddə ağ nuru təzahür etdirən canan camalından nişanədir.

[1] Quran, "Əraf" surəsi, 172 – ci ayə

Nişanə 2: "Şükr" - bu beytdə qəbzlərin bəstlər kimi xeyrli və gərəkli olmasına və yeganə məhbubun qəhr və lütfünün vahidliyinə etiraf etməkdən mişanədir.

Nişanə 3: "Bəla" - bu beytdə ilahi lütflər və cəzibələrin qəti olmasından nişanədir.[1]

Anlam: Ey aşiq, hicran sıxıntılarında razılıq ilə istiqamət və istedad qazana bilməsən, vüsal nemətindən, yaxud şühud cilvələrindən həmişəlik məhrum olarsan.

Beyt 6: **Ey gül, qəmində əşk rüxi-zərdim etdi al,**
**Bildirdi ola surəti-halım səba sana.**

Sözlük: Əşk = göz yaşı; rüx = üz = sima = surət.

Nişanə 1: "Gül" - bu beytdə şühud nuru ilə aşiqin qəlbinə bəst bağışlayan məhbubdan nişanədir.

Nişanə 2: "Qəm" - şühud həvəsində (tələb) hümmət etmək və çalışmaqdan nişanədir.

Nişanə 3: "Zərd" - seyr yolunda yorğun-arğın dayanıb-durmaqdan nişanədir.

Nişanə 4: "Surəti-hal" - "zərd" mərhələsini təkrar etməkdən nişanədir.

Nişanə 5: "Al " - yorğun salikin seyrini yenidən davamlandıran istiqamətləndirici lütf cilvələrindən nişanədir.

Nişanə 6: "Səba" - həzrəti-Cəbrayıldan, yaxud digər səmavi və ilahi vasitələrdən nişanədir.

Anlam: Ey mehriban məhbub, yəqin səba vəsatət edibdir ki, mənim "zərd"lik günahımı əfv edərkən yenidən seyr etməyimə istiqamət bağışlayıbsan.

Beyt 7: **Düşməz çü şah qürbi, Füzuli, gədalərə,**
**Ol şəhdən iltifat nə nisbət mana, sana.**

Sözlük: Çu = çünki = bir vaxt ki; Qürb = mərtəbə = dərəcə = yaxınlıq; şəh = şah.

Nişanə 1: "Şah" - həzrəti-məhbubun özünü, yaxud dünyəvi əngəllərə qalib gəlmiş həzrəti-mürşidi təlqin edən nişanədir.

Nişanə 2: "Qürb" A –yuxarıda xatırladığımız "ələst" əhdinə vəfa etmək mərtəbəsindən nişanədir.

---

[1] "Bəla" müxtəlif ülvi mərtəbələrdə qeyd olunacaqdır.

B – aşiq ilə məşuq arasındakı vasitələrin təmamilə süqut etməsindən nişanədir.

P – "A" və "B" mərtəbələrinə nailiyyət tapmış aşiqi fərəhləndirən ilahi təvəccöhlərdən nişanədir.

Nişanə 3: "Gəda" - bu beytdə aşiqin həqirliyini, həm də istiqamətsizliyini təlqin edən nişanədir.[1]

Nişanə 4: "İltifat" - ilahi lütf və cazibədən nişanədir.

Anlam: Ey Füzuli, bu naqis istiqamət və istedad ilə həzrəti-məşuq qürbünü tələb etmək münasibətsizlik və mərifətsizlikdən nişanədir.

[1] "Gəda", müxtəlif ürfani məqamlarda dərin məzmunlu bəhslərə daxildir.

## Q Ə Z Ə L 20

(1) Şəb ki, miftahi-məhi-nov ola gəncinə güsa,
Qıla peymaneyi-gərduni-cəvahir-peyma.

(2) Gizləyib çeşmeyi-xurşid suyun kuzəyi-çərx,
Qətrə - qətrə qıla əncüm rəşəhatın peyda.

(3) Laləræng ola şəfəqdən, fələki-minafam,
Dişrə salmış kimi əksi-meyi-gülgunmina.

(4) Məhi-nov camını dövrə gətirə, saqiyi-dəhr,
Əncümi-çərxə sala nəşeyi-təsiri-həva.

(5) Mən həm ol ruhfəza rahi tökəm sağərə kim,
Nəxli-işrət rəşəhatindən ala nəşvü nüma.

(6) Tutar olsam, nə əcəb, mey ətəgin dürdsifət,
Eyləyibdir neçə torpağı bu iksir tila.

(7) Cam dövründə, Füzuli, oxuram mey vəsfin:
Atəşi-xirməni-qəm, abi - həyati-hükəma.

Beyt 1,2,3,4,5: **Şəb ki, miftahi-məhi-nov ola gəncinə güsa,**
**Qıla peymaneyi-gərduni-cəvahir-peyma.**

**Gizləyib çeşmeyi-xurşid suyun kuzəyi-çərx,**
**Qətrə - qətrə qıla əncüm rəşəhatın peyda.**

**Lalərəng ola şəfəqdən, fələki-minafam,**
**Dişrə salmış kimi əksi-meyi-gülgunmina.**

**Məhi-nov camını dövrə gətirə, saqiyi-dəhr,**
**Əncümi-çərxə sala nəşeyi-təsiri-həva.**

**Mən həm ol ruhfəza rahi tökəm sağərə kim,**
**Nəxli-işrət rəşəhatindən ala nəşvü nüma.**

Sözlük: Şəb = gecə; miftah = açar; məhi – nov = hilal; gəncinegüşa = xəzinəçi = xəzinə qapısını açan; peymanə = cam = piyalə = ölçü qabı = mənəvi nuru təzahür etdirən; gərdun = səma = fələk; cəvahirpeyma = cəvahir ölçən = cəvahir içən = cəvahir ilə dolu bir yolda seyr edən; xurşid = günəş, çərx = çarx = fələk; əncüm = ulduzlar; rəşəhat = qətrələr = tər, yaxud suyun süzülməsi; minafam = abi rəngə bənzər = abiyə çalan, gülgun = gülə mayil = qırmızı; hri - zəmanə = əsr; ruhfəza = ruhpərvər = ruhverici; rah = şərab; sağər = cam = piyalə; nəxl = xurma ağacı = ağac = xurma pöhrəsi; nəşvü nüma = bitmək = boy atmaq.

**Qeyd**: *Yuxarıdakı beytlərdə qeyd olunmuş: şəb, məh, peymanə və digər kinayəli kəlmələrin hər biri bir maddi və dünyəvi yöndəmi təlqin edərək, qeyri-maddi və mənəvi mənzərəyə də eyham etmək istəyir. Bu eyhami işarələr aşağıdakılardan ibarətdir:*

*1. "Şəb" - keçmiş zamanlarda alış-verişlər, bazarlıqlar və ümumiyyətlə, ictimai çalışmalar gecə vaxtı aparılmadığı üçün "gecə" dünya işlərini saxlamaqdan, beləliklə, dünyəvi bağlantıları qırıb-tökməkdən və nəhayət, xəlvət bir şəraitdə əngəlsiz vücuda, yaxud bəstlik məqamına nail olmaqdan nişanədir.*

*2. "Məhi nov" – ay gecənin qara qoynunu ağ nur ilə işıqlandırdığına görə kəsrətin vəhdət nuruna güzgü olmasından, yaxud nurani mənanın küdurətli maddədə təzahür etməsindən nişanədir.*

*3. "Cəvahirpeyma" – ürfani əhvali-ruhiyyənin, mənəvi rəmzlər və məqamların çoxsaylı olmasından, yaxud dəmdədəm yenilənməsindən, bir də seyr mərtəbələrinin çoxluğundan nişanədir.*

*4. "Çeşmeyi xurşid"– tohid günişini eyham edən nişanədir.*[1]

*5. "Əncüm" – cəvahirpeyma ilə paralel nişanədir.*

*6. "Lalə" – mənəvi mərifətlərin meyvəsindən, yaxud şühud məqamına nail olmaqdan nişanədir.*

*7. "Şəfəq" – aşiqin kəsrət ilə vəhdət arasındakı qurbanlıq vəziyyətindən nişanədir.*

*8. "Meyi-gülgun" – həzrəti-mürşidin zahirə qalib gəlmiş batinindən, yaxud şühud nurunun qələbələrindən nişanədir.*

*9. "Saqi" – həzrəti-Cəbrayılı, yaxud digər ilahi vasitələri eyham edən nişanədir.*

*10. "Əncümi-çərx" – dünyəvi müsbət seyrlər vasitəsilə mənəvi mərtəbələrə hidayət tapmaqdan nişanədir.*

*11. "Nəşə" – kəsrət güzgüsündə vəhdət cilvələrini görməklə sərxoş və məst olmaqdan nişanədir.*

*12. "Sağər" – həzrəti-mürşidin ilahi cilvələr ilə dolu ürəyindən nişanədir.*

*13. "İşrət" – həzrəti-məhbub tanışlığından hasil olmuş fərəhdən nişanədir.*

*14. "Rəşəhat" – mənəvi həyatın tədrici təzələnməsindən nişanədir.*

*15. "Nəşvü nüma" – mənəvi yetişdirmədən nişanədir.*

Anlam: Gecənin gözəl və heyrətamiz maddi və zahiri yöndəmininin görünməz və ölməz mənəvi mənzərələr ilə əlaqədarlığını gördüyümə görə dünyəvi sahələrdən tədrici sovuşub mənəvi sahələrlə tanışlıq tapdım.

**Qeyd**: *Dünya gözəllikləri məna gözəlliklərinə hidayət edən nişanələrdir, ancaq onları müstəqil bilən və məfkurəsini, həyatını yalnız onlarla (dünyəvi gözəlliklərə) məşğul edən bir insan bu müsbət nişanələr vasitəsilə mənfiliyə - nadanlığa giriftar olar.*

Beyt 6: **Tutar olsam, nə əcəb, mey ətəgin dürdsifət,**
**Eyləyibdir neçə torpağı bu iksir tila.**

Sözlük: dürd = yağın, yaxud şərabın dibə çökmüş qara maddəsi; Tila = qızıl = altun.

[1] Qəzəl 1, beyt 1

Nişanə 1: "Mey" - məşuq xəyalında özünü məğlub etmiş qəlbdən nişanədir.

Nişanə 2: "Dürd" - bu beytdə məğlubluq və məmlüklük nişanəsidir.

Nişanə 3: "Topraq" - insanın maddi vücudunun həqirliyindən nişanə olaraq onun torpaqdan yaranmasına eyham edir.

Nişanə 4: "İksir" - real – ölümsüz həyata hidayət edən mürşiddən nişanədir.

Nişanə 5: "Tila" - iksirin nişan verdiyi əbədiyyətdən ibarətdir.

**Qeyd**: *Tila mərtəbəsinə nail olmağım birinci şərti məcazi varlığı qat-qat soymaq və mücərrədlik şəraitinə hazırlaşmaqdan ibarətdir.* [1]

Beyt 7: **Cam dövründə, Füzuli, oxuram mey vəsfin:**
**Atəşi-xirməni-qəm, abi - həyati-hükəma.**

Sözlük: Abi həyat = dirilik suyu; hükəma = həkimlər.

Nişanə 1: "Mey" - həzrəti-mürşidin, yaxud şühud nurunun batini zahirə qalib etdirən rəhmət və bərəkətindən nişanədir.

Nişanə 2: "Qəm" - bu beytdə dünyəvi və mənəvi müşküllərdən nişanədir.

Nişanə 3: Abi – həyat: abi - həyat yaxud ieksir aşiqi əbədiyyata qovuşduran bəsitlik və təcriddən nişanədir.

Nişanə 4: "Hükəma" - ilahi hikmətlər ilə tanış ariflərdən nişanədir.

Anlam: Ey Füzuli, şühud nurunda, yaxud mürşid məktəbində oxuduğum və öyrəndiyim mərifət, dünyəvi və mənəvi çətinliklərə qələbə edən və real – ölümsüz həyat bağışlayan eşq hikmətindən ibarətdir.

---

[1] دست از مس وجودچومردان ره بشوی        تا کیمیای عشق بیابی و زر شوی
لسان الغیب حافظ

## Q Ə Z Ə L 21

**(1) Fəqr mülki təxtü aləm tərki əfsərdir mana,**
**Şükr lillah, dövləti–baqi müyəssərdir mana.**

**(2) Zülfü ruxsari xəyalilə nədir halım, demən,**
**Öyləyəm kim, gecəvü gündüz bərabərdir mana.**

**(3) Hurü Tuba vəsfin, ey vaiz, bugün az eylə kim**
**Həmdəm ol Tuba-qiyamü hurpeykərdir mana.**

**(4) Aradan, ey şəm, çıx, bir guşə tut kim, bu gecə,**
**Bəzm bir xurşidtələtdən münəvvərdir mana.**

**(5) Verdi badi - sübh bir xurşidtələt müjdəsin,**
**Şəmvəş vəh kim, bu dəm ölmək müqərrərdir mana.**

**(6) Zahida, sən qıl təvəccüh guşeyi-mehrabə kim,**
**Qibleyi–taət xəmi-əbruyi-dilbərdir mana.**

**(7) Ey Füzuli, cəm olur peyvəstə el nəzzarəmə,**
**Ərseyi-dəşti-cünun səhrayi-məhşərdir mana.**

Beyt 1: **Fəqr mülki təxtü aləm tərki əfsərdir mana,**
**Şükr lillah, dövləti-baqi müyəssərdir mana.**

Sözlük: Fəqr = fağırlıq; Əfsər = tac; Şükr lillah = Allaha şükr; Döləti baqi = daimi dövlət = əbədi dövlət; müyəssər = mümkün.

Nişanə 1: "Fəqir" - qat –qat dünyəvi varlıqlarını soymuş bir vücuddan zərrəcə qalan, yaxud aşiq vücudunun son bəst zərrəsindən nişanədir. Ürfan, bir qətrə özünü dənizdə itirib – batıran kimi bəsit vücudu, yaxud fəqr mərtəbəsinə çatmış aşiqi, mənəviyyət və vəhdət dənizinə qoşulmağa hazırlanmış bilir.[1]

**Qeyd**: *Yuxarıda xatırladığımız kimi, vəhdət dənizinə qoşulmağın əsas şərti, büsbütün dünyəvi varlıqlardan ayrılmaq olduğuna görə fəqr, məqamına nail olmuş bir aşiq, camaatın gözündə zahiri dünyada bir əliboş insan kimi fağır və sərmayəsiz görünməlidir, ancaq bu fağırlıq yuxarıda "Əzdad" mövzusunda izah etdiyimiz kimi[2] əks nəticə verərkən, yer kürəsinin malikiyyətlərini tərk etmiş fağıra "istiğna" ünvanlı səmavi malikiyyətlər nailiyyətini bağışlayır. Beləliklə, yerdən əlini üzmüş fəqir, əlçatmaz göylərə əl taparkən buludlara fərman vermək, ölünü danışdırmaq və habelə bir dua ilə aləmə təkan vermək iqtidarına malik olmaq imkanı tapır.*

Nişanə 2: "Aləm" - dünyəvi iqtidar – imtiyazdan nişanədir.

Nişanə 3: "Əfsər" - on iki tərk ilə on iki tələb təhsilindən nişanədir.

**Qeyd**: *Aşiq hər bir çirkinliyi tərk edərək bir yararlı və ülvi fel əncamını tələb etmək ilə özünü fəqir məqamına hazırlayır.*

Nişanə 4: "Dövlət" - bu beytdə neçə hüsnün bir vücudda cəmləşməyindən nişanədir. Bu mərtəbə "əzəl", yaxud əvvəli olmayan zamana bağlı bir ilahi ehsandan ibarətdir. Beləliklə, "dövlət" ardında qəzəb olmayan rəhmətdən nişanədir.

Anlam: Allah şükr ki, fəqr mülkünə daxil olarkən zavalsız bir dövlətə yetdim.

Beyt 2: **Zülfü ruxsari xəyalilə nədir halım, demən,**
**Öyləyəm kim, gecəvü gündüz bərabərdir mana.**

Sözlük: Ruxsar = sima = surət = camal.

Nişanə 1: "Zülf" A – zülf, aşiqi məşuqdan ayıran kəsrətdən nişanədir.

---

[1] Qəzəl 2, beyt 1

[2] Qəzəl 3, beyt 2

B – zülf kəsrət güzgüsündə məşuq nurunu əks etdirən nişanədir.

Nişanə 2: "Ruxsar" - mütəal məhbubun camalında parlayan cilalərdən nişanədir.

Nişanə 3: "Xəyal" – ucu-bucağı görünməz, geniş üfüqlü, ürfani bir yöndəmə qapı açan, yaxud özünü Tanrıya çatdırmaq istəyən yer adamını göylərə qaldıran özəl bir qüvvədən ibarətdir. Elə buna görə də əsrlərcə davam edib və nəsillər dəyişdikcə sərbəst şeirlər ərsəyə çıxarkən vəzndə, qafiyədə və bir çox qanun – qaydada müstəqillik və digər təğyirlər törənsə də xəyal elementi təğyirsiz və dəyişilməz, sabit qalmışdır. Çünki xəyal hər ərsədə və hər nəsildə maddi vücudu, mənəvi duyğular səmasına qaldırmağa və görünməz məqamları göstərməkdə nəhəng, güclü bir qüvvədən ibarətdir. Elə buna görə də, çağdaş adlı arif "Oşu" zənn edib ki:"..., insanı mütəal məbud ərəfəsinə yaxınlatmaqda bütün vasitələrdən iqtidarlı və üstünü xəyal vasitəsidir"[1]. Habelə, "Niçə" isə fikir edir ki,: "..., yer kürəsi xəyalpərvər adamlardan xali olsa, insanları ən böyük bir faciəyə giriftar etməlidir."[2]

Anlam: A – kəsrət əngəlləri törətmiş hicran və həsrət çətinlikləri gündüzümü də gecəm kimi qaranlıqlaşdırıbdır (şikayət).

B – fəqr bərəkətindən mən gündüz də gecədəki kimi "tətil" və "xəlvət" mənzillərini seyr etməkdəyəm.

P – kəsrət güzgüsündə əks etdirilmiş vəhdət nuru gecəmi də gündüzüm kimi işıqlandırıbdır (şükür).

**Qeyd**: *"B" və "P" - digər beytlər ilə, xüsusən, mətlə beytilə münasib nəzərə gəlir.*

Beyt 3: **Hurü Tuba vəsfin, ey vaiz, bugün az eylə kim**
**Həmdəm ol Tuba-qiyamü hurpeykərdir mana.**

Sözlük: Hur = huri; tuba = behişt = şadlıq = müxtəlif ətirili bir behişt ağacı; Tuba qiyam = tuba qamət = tuba kimi qayğılı; peykər = surət = təsvir = cəsəd = cism = heykəl = licim.

Nişanə 1: "Hurü Tuba" - behişt imtiyazlarından nişanədir.

Nişanə 2: "Tuba-qiyam" , "Hurpeykər" - qeyz və ehsanını davam etdirən mütəal məhbubdan, yaxud təlimatını tətil etməyən yubandırmayan mürşiddən nişanədir.

**Qeyd** 1: *İnsanların kərim, rəhim, əzim və digər belə adlardan və sifətlərdən bəşəri səviyyədə məlumatları olduğuna görə, həkimi-məbud*

---

[1] Xəllaqit, oşu,tərcümə Mərcan Lütfi, səh.92
[2] Xəllaqit, oşu, səh.167.

*onlara belə adlar və sifətlər ilə özündən maarif vermişdir, yoxsa Allahın sifətləri də həqiqəti kimi idraka, anlama, sözə və bəyana sığışmaz.*

**Qeyd** 2: *Yuxarıda misal gətirdiyimiz adlar-sifətlər olmasa əql əhli öz iradət və sədaqətini Allahına izhar edə bilməz və o məbud ilə əıaqə saxlamaq imkanını tapa bilməz .*

**Qeyd** 3: *Eşq əhli isə sədaqət və iradətlərini mütəal məbuda nişan verdiyinə görə hur, tuba, qamət, camal, qaş, göz və habelə bəşəri səviyyədə təcrübə əxz etmiş nişanələrə və istiarələrə möhtacdırlar. Yoxsa həzrət məbud belə söz və ibarələrə sığmaz bir Tanrıdır.*

**Qeyd** 4: *Mütəal məbudu əql, yaxud eşqi vəsf etdiyi adlar və sifətlərlə məhdudlaşdırmaq mütəallıqdan və kafirlikdən nişanədir.*

**Qeyd** 5: *Bəşər ad və sifətdən üstün əzəmətlərə "bənzətmə" "təşbih" vasitəsilə meyl və ixlasını göstərmək istər. Gözə dəniz, üzə ay, qamətə sərv demək və digər bənzətmələr bəşərin vəsf naçarlığından nümunələrdir.*

**Qeyd** 6: *İnsan bütün yaranmışlardan üstün olduğuna görə:*

*A – Aşiq həzrət məbud ilə əlaqə saxlmağa və o həzrətə ürək sözünü bəyan etməyə bənzətmə məcburiyyətini qəbul etməlidir.*

*B – İnsani hüsnlər digər yaranmışların hüsnündən üstün olduğuna görə aşiq "camali-vilayət" ünvanlı bənzətmə ruxsətilə həzrət məbudu bir gözəl insana bənzədərsə ona öz ixlas və iradətini izhar edər, beləliklə, tubaqiyam və huripeykər və digər bənzətmələr və sifətləri həzrəti-məbudun həqiqi vəsfi kimi düşünmək nadanlıq və kafirlikdir.*

**Qeyd**: *Həzrət məbudu aşiqanə istiarələr ilə çağırmaq yalnız hal qələbələrində itib-batmaq vəziyyəti ilə mümkündür.*

Anlam: Ey əql və məntiqdən başqa qüvvələri inkar edən vaiz, gözəl məbudun özəl cilvələri, yaxud ilahi mürşidin ürfan səfalı məktəbi mənim özəl behiştimdir. Sən vəsf etdiyin behiştə mənim heç bir meylim və ehtiyacım yoxdur.

**Qeyd** 1: *Aşiq behişti inkar etmək istəməyir, bəlkə ilahi cazibələrin hüsnünün behişti hüsnlərdən üstünlüyünü sübut etmək istəyir.*

**Qeyd** 2: *"Rizvan behiştini" əql vəsf edir, "can behiştini eşq"* .

Beyt 4: **Aradan, ey şəm, çıx, bir guşə tut kim, bu gecə,**
**Bəzm bir xurşidtələtdən münəvvərdir mana.**

Sözlük: Bəzm = məclis = ziyafət məclisi = əncümən = xeymə; xurşid = günəş ; tələt = görüş = camal = sima; münəvvər = nurani = işıq = parlaq.

Nişanə 1: "Şəm" - bu beytdə dünyəvi cəlalərdən nişanədir.

Nişanə 2: "Xurşidi-tələt": A – xurşidi tələt, ilahi cəlalərlə dolu ürək - mürşiddən bir nişanədir.

B – xurşidi tələt, dəmbədəm cilvələrini ehsan edən məbudun özündən nişanədir.

Anlam: Ey dünyada yüksək mövqe tutmuş əql və məntiq mülahizəçisi, özünü bir guşədə gizlətməsən, mənim aşiqanə mənəvi üstünlüyümün qarşısında zəlillik və həqirliyə giriftar olarsan.

Beyt 5: **Verdi badi-sübh bir xurşidtələt müjdəsin,**
**Şəmvəş vəh kim, bu dəm ölmək müqərrərdir mana.**

Sözlük: Şəmvəş = şəm kimi; müqərrər = təyin olunmuş = bəyan olmuş

Nişanə 1: "Badi-sübh" - vəhdət nurunu əks etdirən vasitədən, yaxud həzrət-mürşidin işarələrindən nişanədir.[1]

Nişanə 2: "Xurşidtələt" - ötən beytdə bəyan olmuş nişanədən ibarətdir.

Nişanə 3: "Şəm" - bu beytdə üryanlıq və qurbanlıq məqamına yaxud təcrid və bəstlik mərtəbəsinə hazırlaşmış aşiqdən nişanədir.

Nişanə 4: "Ölmək" - qurbanlıq məqamına nail olmaqdan nişanədir.

Anlam: A – Dünyəvi həyatımı həzrəti-məbud ərəfəsindən xəbər gətirən vasitəyə muştuluq verdim.

B – İlahi səviyyənin xəbərdaredici cilvələrini görərkən bəşəri səviyyəni boşladım.

Beyt 6: **Zahida, sən qıl təvəccüh guşeyi-mehrabə kim,**
**Qibleyi-taət xəmi-əbruyi-dilbərdir mana.**

Sözlük: Mehrab = qiblə = imam-camaatın namaza durduğu yer = məclisin yuxarı başı; taət = itaət; xəm = ayrı = bilali; əbru = qaş; dilbər = canan = məhbub.

Nişanə 1: "Zahid" - əql üslublarını kamil bilə-bilə eşqi inkar edən insandan ibarətdir.

Nişanə 2: "Mehrab" - dini əməlllərin, xüsusilə, namazın zahiri adabına diqqətcillikdən nişanədir.[2]

Nişanə 3: "Xəmi-əbru" - aşiqi adab və əqldən ayıran mənəvi paralamalar və hallardan nişanədir.

---

[1] Qəzəl 9, beyt 2 .

[2] Qəzəl 13, beyt 2 və qəzəl 18, beyt 7.

Anlam: Ey zahid, ilahi ibadətlərdə sənə əql tabeliyi gərəkli olan kimi mənə isə eşq tabeliyi gərəklidir.

Beyt 7: **Ey Füzuli, cəm olur peyvəstə el nəzzarəmə,**
**Ərseyi-dəşti-cünun səhrayi-məhşərdir mana.**

Sözlük: Peyvəstə = həmişə = dalbadal = daim; nəzzarə = tamaşa = tamaşaçı; dəşt = çöl = biyaban; cünun = məcnunluq = divanəlik.

Nişanə: "Cünun" - əql mənzillərinin seyrini başa çatdırıb eşq mülkünə hidayət edən haldan ibarətdir (əql tabeliyini qurtarıb eşq tabeliyinə başlamaq).

**Qeyd**: *Aşiq cünunluq mənzilinin ərəfəsində özündən-özgədən gah xəbərdar olar, gah xəbərsiz. Beləliklə sərkilər və rüsvaylıqlar onu tədricən özgədən və özündən ayırar.*

Anlam: A – Ey Füzuli, qəbzlər və bəstlər mənzilində tez-tez ölüb-dirilərkən qiyamət əhvalatını dəmbədəm təcrübə edirəm, camaat isə gah tənqid, gah heyrət ilə belə bir qiyamətə tamaşa edir.

B – Ey Füzuli , eşq maarifini inkar edən camaatın dəmbədəm danlaq vurmaları və mühakimə etmələri bu dünyada mənə qiyaməti göstərdiyi halda o dünya məni qiyamətindən və sual – cavabından azad edibdir.

## Q Ə Z Ə L 22

**(1) Şərbəti-ləlin ki, derlər çeşmeyi- heyvan ona,**
**Ol verir can dəmbədəm üşşaqəvü mən can ona.**

**(2) Oxlarından kim, tikan tək sancılıbdır hər tərəf,**
**Gülbüni-xəmdir qədim, hər qönçə bir peykan ona.**

**(3) Xalü xətdir bilməm ol ayineyi-rüxsar üzə,**
**Ya gözümdən əks salmış mərdümü-müjgan ona.**

**(4) Tutma, ey qan, dəmbədəm tuğyan edib tən çakini,**
**Qoy bu mənzərdən dəmi-nəzzarə qılsın can ona.**

**(5) Bəhrə, lölö dişlərin vəsfin məgər söylər səba**
**Kim, qulaq tutmuş sədəf içrə düri-ğəltan ona.**

**(6) Könlümə salmış xətin zövqün fələk qan uddurub,**
**Tifl tək kim, oxudarlar zəcr ilə Quran ona.**

**(7) Ey Füzuli, ol sənəm əfğanına rəhm eyləməz,**
**Daşə bənzər bağrı, təsir eyləməz əfğan ona.**

Beyt 1: **Şərbəti-ləlin ki, derlər çeşmeyi- heyvan ona,**
**Ol verir can dəmbədəm üşşaqəvü mən can ona.**

Sözkük: Çeşmeyi-heyvan = həyat mənşəyi = dirilik suyu; üşşaq = aşiqlər.

Nişanə 1: "Şərbəti – ləl" - aşiqə bəşər aləmində ilahi sifətlər bağışlayan rəhmani nəfslərdən nişanədir.

Nişanə 2: "Çeşmeyi-heyvan": A – mənəvi maarif xəzinəsindən nişanədir.

B – yalnız vəhdət nöqtəsilə əlaqə saxlamaqdan nişanədir.

Nişanə 3: Əvvəlki "can" mənəvi batini həyatından, ikinci "can" isə dünyəvi həyatından ibarətdir.

Anlam: Ey mehriban məhbub, sənin rəhmani nəfslər bağışlayan cazibələrin mənə də başqa aşiqlər kimi mənəvi həyat bəxş edərkən, dünyəvi həyat hicabından tədrici xilas olmaq imkanını bağışlayır.

Beyt 2: **Oxlarından kim, tikan tək sancılıbdır hər tərəf,**
**Gülbüni-xəmdir qədim, hər qönçə bir peykan ona.**

Sözlük: Gülbün = gül butası; xəm = ayrı = hilali, peykan = ox ucu = ox.

Nişanə 1: "Oxlar " - aşiqin qəlbini ardıcıl yaralayan qəbzlər çətinliklərilə bəstlər heybətindən nişanədir.

**Qeyd**: *Hər bir yaranmış üzvün fiziki enerjidən ayrılmağı:*

*A – onu maddi qüvvələrdən ayırıb mənəvi qüvvələrə mindirmək müqəddiməsidir.*

*B – onu təhlükəyə məruz edərkən qurbanlıq məqamına hazırlayan müqəddimədən ibarətdir.*

Nişanə 2: "Gülbüni-xəm" - aşiqanə boyun əymək, hörmət etmək və təslim olmaq nişanəsidir.

Nişanə 3: "Peykan " - birinci misrada qeyd olunmuş "oxlar"ı təkid və təkrar edən nişanədir.

Nişanə 4: "Qönçə":

A – qönçə ürək yaralarının yararlı olmağından nişanədir.

B – qönçə eşq müşküllərinin gizli hikmətindın nişanədir.

Anlam: A - Məşuq vuran yaralar lətif qönçə və gözəl gül kimi səfa bağışlayan və ürək açandır.

B: Güllər budağı ədib qoparan kimi, qəbzlər yaralı vücudumu əymişlər.

Beyt 3: **Xalü xətdir bilməm ol ayineyi-rüxsar üzə,**
**Ya gözümdən əks salmış mərdümi-müjgan ona.**

Sözlük: Mərdum = bəbək; müjgan = kipriklər.

Nişanə 1: "Xal ":

A – nöqtəni açmaq və içərisini görmək mümkünsüz olduğuna görə əqlə, idraka sığmayan gizli və görünməz vəhdət nöqtəsindən nişanədir.

B – qaranlıqda mərifət qazanmaq imkanı yox dərəcəsinə yaxın olduğuna görə qara xal vəhdət nöqtəsilə mükəmməl tanışlığın mümkünsüz olmağını bildirmək istəyir.[1]

P – riyaziyyatçılar istidlal etdiyi kimi bütün həndəsi şəkillər və xətlər nöqtənin hərəkətindən hasil olmuşdur. Belə olan halda xal yaxud, vəhdət nöqtəsi bütün yaranmışların, yaxud kəsrətin ilk mənşə və mənbəyindən ibarətdir.

Nişanə 2: "Xət" - bu beytdə mütəal canan cəmalından parlayan nurların mənəvi həyatı bitirən mərtəbələrindən nişanədir.[2]

Nişanə 3: "Ayineyi - rüxsar" - təcəlla sifətlərinin parlamasından nişanədir.[3]

Nişanə 4: "Mərdüm" və "Müjgan":

A – mərdum və müjgan mənəvi bazara dünyəvi sərmayə (fədakarlıq) gətirməkdən nişanədir.

B – tələb və ətəş biqərarlığından nişanədir.

Anlam: Ey gözəl məhbub, sənin cilvələrinin bağında özümü elə itirmişəm ki, "istehlak" yoxsa fəna və vəhdət ərəfəsinin ətrini, yaxud sənə qovuşmaq nailiyyətini hiss edirəm.

**Qeyd**: *Ölməkdən əvvəl Tanrıya qovuşmaq hissi "istiğraq" ünvanlı bir geniş ürfani bəhsdir.*

Beyt 4: **Tutma, ey qan, dəmbədəm tuğyan edib tən çakini,**
**Qoy bu mənzərdən dəmi-nəzzarə qılsın can ona.**

Sözlük: Çak = yarıq; mənzər = tamaşa yeri = göz; dəmi = bir dəm = bir an = bir ləhzə; nəzzarə = tamaşa.

Nişanə 1: "Qan" - bu beytdə qurbanlıq nailiyyətinə yetmək üçün çalışan aşiqin maddi vücudundan qalmış iz - əsərdən nişanədir.

---

[1] Qəzəl 1, beyt 1 ("ənar" yaxud nur nişanəsi )

[2] "Xət" aşağısda izah olacaq.

[3] "Təcəlli" - şühud nurunun qəlbə nüfuz etməyindən nişanədir.

Nişanə 2: "Tən çaki" - ikinci beytdə qeyd olunmuş birinci nişanənin təkrarı, yaxud fiziki enerjisini əldən vermiş maddi vücud əngəlindən xilas olmaq müqəddiməsindən ibarətdir.

Nişanə 3: "Can" - bu beytdə aşiqin həqiqi "mən" adlı batinindən ibarətdir.

Anlam:

A – Ey qan, bir əngəl və hicab kimi ilahi tamaşalara maneçilik törətmə.

B – Ey bədən, dünyəvi həyatını hifz etməyə istiqamətlənmə.

Beyt 5: **Bəhrə, lölö dişlərin vəsfin məgər söylər səba,**
**Kim, qulaq tutmuş sədəf içrə düri-ğəltan ona.**

Sözlük: Bəhr = dəniz ; lölö= inci; düri ğəltan = girdə inci.

Nişanə 1: "Bəhr ":

A – vücud aləmini tam və bütöv təlqin edən nişanədir.

B –aşiqin mənəvi həyata yiyələnmiş ürəyindən nişanədir.

Nişanə 2: "Lölö" yaxud "lölö diş" - batinə ilham bağışlayan mənəvi və dünyəvi hüsnlərdən nişanədir.

Nişanə 3: "Səba " - İlahi vasitədən, yaxud həzrəti-Cəbrayıldan nişanədir.

Nişanə 4: "Sədəf "və "düri-ğəltan": sədəf sinədən və düri-ğəltan qəlbdən nişanədir.

Anlam: Ey gözəl məhbub, yalnız mən yox, bəlkə də bütün aləm sənin vasitələrlə gələn ilhamlara müntəzir və möhtacdırlar.

**Qeyd**: *Diş, dodaq, xal, xət və digər bu kimi istiarələrdən, "Cəmal-vilayət "mövzusunda, həm də hal və hican məqamında izah aparılmışdır*[1].

Beyt 6: **Könlümə salmış xətin zövqün fələk qan uddurub,**
**Tifl tək kim, oxudarlar zəcr ilə Quran ona.**

Sözlük: Xət = camalın gözıl nişanələrindən biri ; zəcr = azar = əziyyət.

Nişanə 1: "Xət" - bu beytdə vəhdət nöqtəsindən öz parlaq hərəkətini bağışlayaraq yer kürəsinə yetişib sakin olmuş hüsnlər və imtiyazlardan nişanədir.

Nişanə 2: "Zövq" - mənəviyyət dadını aşiqə dadızdıran şühud məqamının ilk mərtəbəsindən nişanədir.[1]

---

[1] Qəzəl 21, beyt 3

Nişanə 3: "Fələk" - bu beytdə "ələst"[2] əhdindən və ilahi sabiqədən nişanədir.

Nişanə 4: "İkinci misra":

A – İkinci misra qəbz və qəhr sınaqlarında aşiqin bir uşaq kimi zəifliyini və iztirabını bildirir.

B – Aşiqin uşaq kimi saf qəlbli olmağına eyham edir.

P – Uşağın xeyri məktəb çətinliklərində və müəllim sıxma – boğmasında olduğu kimi aşiqin isə inkişafı eşq məktəbinin sıxıntı – sınaqlarındadır.

Anlam: Görünməz yaşayışda gördüyüm və təcrübə etdiyim ülviyyəti və ələsti aləmə qaytarmaq istəyirəm amma qəbzlər və imtahanlar naqisliyimi nişan verərək müraciətimi imkansız edirlər.

Beyt 7: **Ey Füzuli, ol sənəm əfğanına rəhm eyləməz,**
**Daşə bənzər bağrı, təsir eyləməz əfğan ona.**

Sözlük: Əfğan = fəğan = nalə.

Nişanə 1: "Sənəm":

A – Sənəm ilahi sifətlərin təcəlla nurunda təzahur etməyindən nişanədir.

B – Sənəm həzrəti-mürşiddən, yaxud kamal zirvəsinə hidayət edən digər vasitədən nişanədir.

Nişanə 2: "Daşa bənzər" - aşiqin tərbiyə və tərəqqisinə gərəkli olan çətinliklərdən nişanədir.

Anlam: Ey Füzuli, səni xeyr və kamal zirvəsinə qaldıran və ülvi – ilahi aləmə yüksəldən qəbz və qəhr sıxma-boğmasından ibarətdir, bunun üçün də sənin xeyrini istəyən həkimi-məhbub sənin yalvar - yaxarını qulaq ardına vurur.

---

[1] Qəzəl 8, beyt 5 .

[2] Qəzəl 19, beyt 4.

## Q Ə Z Ə L 23

**(1) Hər zaman mənzur bir şuxi-sitəmgərdir mana,**
**Qanda olsam bir bəla Həqdən müqərrərdir mana.**

**(2) Ol xəmi-əbruyə qılsam səcdə hər saət nola,**
**Qiblə ilə ol xəmi-əbru bərabərdir mana.**

**(3) Qəm degil, cismimdə gər səngi-məlamət zəxmi var,**
**Şəhnəyi-bazari-sevdayəm, bu zivərdir mana.**

**(4) Gözdə xunaludə peykanın xəyalılə xoşam,**
**Hər biri guya ki, bir bərgi-güli-tərdir mana.**

**(5) Zəxmlərdən min ağız açdım ədayi-şükrə kim,**
**Hər oxun bir neməti ğeyri-mükərrərdir mana.**

**(6) Əql irşadilə bulmaq kam mümkündür, vəli,**
**Dami-rah ol həlqeyi-zülfi-müənbərdir mana.**

**(7) Əxtəri-bəxtim vəbalin gör ki, ol məhdən gələn**
**Mehrlərdir özgəyə, cövrü cəfalərdır mana.**

**(8) Ey Füzuli, mənzili-məqsudə yetsəm nə əcəb,**
**Xidməti-piri-muğan irşadi rəhbərdir mana.**

Beyt 1: **Hər zaman  mənzur bir şuxi-sitəmgərdir mana,**
**Qanda olsam bir bəla Həqdən müqərrərdir mana.**

Sözlük: Sitəmgər = sitəmkar = zalım; müqərrər = müəyyən olunmuş.

Nişanə 1:  "Şux":

A –  "mənəvi kəsrət" ünvanlı mərhələdə aşiqin ətəş və atəşini coşqunlaşdıran şıdırğı şühud və müşahidə cəlalərindən nişanədir.

B – gözəl insani simalarda təzahür etdirilmiş ilahi hüsnlərdən nişanədir.

**Qeyd**: *Hafiz Şirazi  "A" və "B" mərhələsinin mənəvi kəsrət, yaxud mənəvi vasitələrini: luli,şux, şirinkar və şəhraşub sifətlərilə belə vəsf edir:*

فغان کاین لولیان شوخ شیرین کارشهرآشوب
چنان بردند صبرازدل که ترکان خوان یغمارا

Nişanə 2:  "Sitəmgər" - mürşid, yaxud məbudun aşiq tərbiyəsinə gərəkli olan qəhr və qəbz sifətlərindən nişanədir.

Nişanə 3:  "Bəla" - aşiqi sınağa çəkən ikiyönlü sıxıntıdan nişanədir:

A –  tənbih və cəzalandırmaq bəlasıdır: bu bəla dünyəvi müşküllər və təhlükələr önündə aşiqin ixtiyar və tədbirini qüvvətləndirən nişanədir.

B –  rəhmət və razılaşdırmaq bəlasıdır: bu bəla aşiqin fəqrini  və məmlüklüyünü özünə bəlləndirərkən onun ixtiyar və tədbirini yox dərəcəsinə yaxınladan qüvvətsizlikdən və onu "mən"lik tərkilə məbud dərkinə nail edən haldan nişanədir.

**Qeyd**: *Bəla peyğəmbərlərə qida kimi və imamlara paltar kimidir. İslamın ulu peyğəmbəri buyurmuşdur ki, ən şiddətli bəla peyğəmbərlərin qismətidir, sonra imamların, sonra isə digər mənəvi insanların*[1] .

**Qeyd**: *Mütəal-məbudun xalis dostlarından bəziləri bir an bəlasız olsalar gileyləri, nalələri və hay- həşirləri göylərə qalxar.*

Anlam:   Hər yerdə və hər şəraitdə mütəal məhbubun ardıcıl qəhr və lütf qələbələri, yaxud bəlaları tərbiyə və hidayət qəsdilə qəlbimi əhatə edir.

**Qeyd**: *Hər bəladan yeni bir mərifət hasil olan kimi, hər mərifətdən məna səmasına bir təzə qapı açan  atəş və ətəş  hasil olur.*

Beyt 2: **Ol xəmi-əbruyə qılsam səcdə hər saət nola,**
**Qiblə ilə ol xəmi-əbru bərabərdir mana.**

Sözlük:   Xəm = ayrı = hilali;   əbru = qaş.

---

[1] Fərhəngi -istilahat və təbirati-ürfani.

Nişanə 1: "Xəmi-əbru" - həzrət-məhbub əzəmətini əks etdirən qəhr sifətindən nişanədir.

Nişanə 2: "Qiblə" - qəlbi, fikri və bütün vücudu yalnız mütəal məhbubla məşğul etməkdən ibarətdir.

**Qeyd** 1: *Bütün insanlar ilahi dostluq iddiası etdiklərinə görə mütəal məhbub onları birbəbir qəhr və lütf ünvanlı bəlalarla sınağa çəkdi, bir-birini sərvət, bir-birini məqam, bir-birini övlad, bir-birini ibadət və bir-birini ad-san ilə məşğul edərək onların iddialarının aydın və dostluq yollarını xali etdi.*[1]

**Qeyd** 2: *Mütəal məhbub batinlərin qibləsi olduğu kimi, batin-qəlbin qibləsi, qəlb-bədənin qibləsi, bədən üzvlərin qibləsi, üzvlər isə dünyanın qibləsidir.*[2]

Nişanə 3: "Səcdə" - şühud nurunda, yaxud tələb atəşində bütün vücudu yaddan çıxarmaqdan nişanədir.

Anlam: Mütəal məhbubun əzəmət və qələbəsi ilə bütün vücudu yaddan çıxartmaq Füzulinin vacib olmuş ibadət və itaətindən ibarətdir.

Beyt 3: **Qəm degil, cismimdə gər səngi-məlamət zəxmi var,**
**Şəhnəyi-bazari-sevdayəm, bu zivərdir mana.**

Sözlük: Səngi-məlamət = sərki daşı; zəxm = yara; şəhnə = güdükçü = hərbiçi = yasovul = hökumət nümayəndəsi; sevda = müamilə = alqı-satqı = sevdə, zivər = zinət.

Nişanə 1: "Qəm" - bu beytdə dünyəvi qüssələnməkdən nişanədir.

Nişanə 2: "Səngi-məlamət" - eşq və mənadan xəbərsizlərin şıdırğı sərkilərindən nişanədir.

Nişanə 3: "Zəxm" - danlaqların pərişan etdiyi zahiri xarakterdən nişanədir.

Nişanə 4: "Sevda" - mənəvi alqı – satqı sərmayəsini hazırlamaqdan nişanədir.[3]

Anlam: Sərkilər, xəlqi gözümdən salmaqla məni bir çox kəsrət hicabından xilas edərək mənəvi alqı – satqı bazarına hazırlaşdırdılar, bunun üçün təhqirçilərə razılıq etməyimi gərəkli bilirəm

Beyt 4: **Gözdə xunaludə peykanın xəyalılə xoşam,**
**Hər biri guya ki, bir bərgi-güli-tərdir mana.**

---

[1] 1 və 2 – Fərhəngi-lüğat və təbirati-ürfani.

[3] Qəzəl 3, beyt 3

Sözlük: Xunaludə = qanlı; peykan = ox ucu = ox; bərg = yarpaq, tər = təzə.

Nişanə 1: "Xunaludə peykan" - mütəal məhbubun əzəmətini onun qəhr sifətilə əks etdirmək vasitəsilə aşiqi şühud, yaxud qurbanlıq məqamına hazırlayan nişanədən ibarətdir.

Nişanə 2: "Gülli-tər" - yeniləşən lütflər və bəstlərdən nişanədir. Anlam: Ey gözəl məhbub, sənin qəhr və lütf təsəvvüründən başqa bir təsəvvürə heç də ehtiyacım yoxdur.

Beyt 5: **Zəxmlərdən min ağız açdım ədayi-şükrə kim,**
**Hər oxun bir neməti ğeyri-mükərrərdir mana.**

Sözlük: Zəxm = yara; qeyri-mükərrər = təkrar edilməz.

Anlam: Ötən beytləri təkid və təkrar etmək qəsdilə belə buyurur: Ey həkimi-məhbub, hər bir bəla və hər bir qəhr yeni bir mərifət bağışladığına görə, hər bəla önündə özəl bir alqış və yeni bir şükür etməyi vacib bilirəm.

Beyt 6: **Əql irşadilə bulmaq kam mümkündür, vəli,**
**Dami-rah ol həlqeyi-zülfi-müənbərdir mana.**

Sözlük: Rah = yol; müənbər = ətir saçan = ətirli.

Nişanə 1: "Kam" - dünyəvi inkişaflar və başı ucalıqlardan nişanədir.

Nişanə 2: "Zülfi müənbər" - vəhdət nurunu əks etdirən kəsrət vasitələrindən nişanədir.

Anlam: A – Mən də əqlin göstərdiyi dünyəvi inkişaflara çatmaq yollarına tanışlıq imkanını anlayıram, ancaq eşq o yollarda bir addım belə yollanmağa rüxsət verməyir.

B – hər bir yaranmışda yaradıcı məhbubun nurunu və nişanəsini görməsəydim, əql irşadını dinləyərək məhəbbət yoluna qədəm qoymazdım.

Beyt 7: **Əxtəri-bəxtim vəbalin gör ki, ol məhdən gələn**
**Mehrlərdir özgəyə, cövrü cəfalərdır mana.**

Sözlük: Əxtəri-bəxt = bəxt ulduzu; vəbal = vabal = günah = əzab, məh = ay; Mehr = məhəbbət = günəş.

Nişanə 1: "Əxtəri bəxt " - dünyəvi alın yarısından ibarətdir.

Nişanə 2: "Məh" - qara maddə ağ rənglə cilvələnən, yaxud kəsrət səhifəsini vəhdət güzgüsü edən şühud nurundan nişanədir.

Nişanə 3: "Cövrü-cəfa" - aşiqi kamal zirvəsinə hazırlayan qəbzlərdən və qəhrlərdən, yaxud mənəvi tərbiyədən nişanədir.

Nişanə 4: "Özgələr":

A – özgələr, digər aşiqlərdən ibarətdir.

B – özgələr, qəlb sınaqlarından qurtarmış bəst məqamında sərxoşluq edənlərdən nişanədir.

Anlam: Mənim qəbzlər həbsində və müşküllər məcburiyyətində əzab çəkməyim və başqa aşiqlərin bəst məqamı ilə maraqlanmaları dünyəvi ilgilər - əngəllərdən gərəkli qədər kənar olmağımı nişan verir.

Beyt 8: **Ey Füzuli, mənzili-məqsudə yetsəm nə əcəb,**
**Xidməti-piri-muğan irşadi rəhbərdir mana.**

Sözlük: Piri-muğan = Zərdüşt məktəbinin rəhbəri.

Nişanə 1: "Mənzili-məqsud" - qeyri maddi həyat ilə vəhdət mülkünə köçməkdən ibarətdir.

Nişanə 2: "Piri-muğan": piri muğan, aşiqi mütəal məhbub ərəfəsinə hidayət edən "vasiteyi-feyz" ünvanlı ilahi rəhbərdən nişanədir.

**Qeyd** 1: *Piri-muğan dini baxımda yer adamını Tanrıya qovuşduran məsum imamdan ibarətdir.*

**Qeyd** 2: *İmam ilham məmbəyindən aldığı maarifdən hər bir ümmətə onun istedadı qədər nəql etmək ilə dini məfkurələrin canlı qalmağına səbəb olur.*

**Qeyd** 3: *Piri muğan – yalnız aşiqi hidayət edən vasitədir, lakin imam bütün insanları, həm də bütün canlı-cansız yaranmışları yaradıcı mütəal məbud ilə əlaqədar edən vasitədən ibarətdir. Demək imam bütün yaranmışları ilahi nur ipinə bağlayarkən, onların varlığının davam etməsinə səbəbkar olur . Beləliklə, imam rəhmət nurunun bütün aləmdə yayılmasına bais olarkən varlığa ümumiyyətlə "iqamə" ünvanlı həyat davamı bağışlayan bir vasitədən ibarətdir.*

**Qeyd** 4: *İmam adlı, yaxud piri-muğan ünvanlı ilahi vasitədən fəlsəfi araşdırmalarda "məczubluq" başlığı ilə izahlar aparmışlar. Əflatun ilham əks etdirən şeirlər bəhsində əbədiyyətə söykənmiş həmasə törədən şairləri məczubluq nailiyyətində dünyəvi mənlikdən kənar olmuş ilahi insanlar kimi tanımışdır.*[1] *Beləliklə, piri-muğan məczubluq vasitəsindən nişanədir.*

**Qeyd** 5: *İmam və piri-muğan ünvanlı ilahi vasitələr yunan maarifində "məğnatis" başlığı ilə mənəvi bəhslərə imkanlar törətmişdir, demək*

[1] Doreri asari Əflatun, tərcümə Məhəmmət Həsən Lütfi, cild 2 səh.576.

*vəhdət nöqtəsi bir maqnit kimi ilahi vasitəyə cazibə bağışlayarkən qüvvəsi onu da aşiq tələbələri maqnit kimi cəzb etməyə vadar edir. Demək dəmir halqaların yalnız biri maqnit mərkəzinə söykənərkən digər halqalarında maqnitləşdiyi kimi feyz vasitəsi də aşiqlərin biri-birinə çəkilməsinə imkan yaradır. Beləliklə, Əflatun zənn edir ki, "..., mütəal Tanrı "Homer" ə maqnit mənbəyi olan kimi, Homer də homerşünaslara cazibə mərkəzi olur, homerşünaslar isə başqa ədəbiyyatçılara və şair ..."*[1]

Anlam: Ey Füzuli, piri-muğanın bağışladığı ilahi cazibələr qüvvəsi ilə vəhdət mülkünə yüksəlməyim heç də təəccüblü deyildir.

---

[1] Yenə orada, cild 2 səh. 365

## Q Ə Z Ə L 24

**(1) Rəhm et, ey şəh, dili-dərviş çəkən ahlərə**
**Ki, gəda ahı əsər eylər olur şahlərə.**

**(2) Mehri yox mahlərə ah əsər etməz, yarəb!**
**Ver bir insaf bu mehri yox olan mahlərə.**

**(3) Qaşların tağinə versəm dili-suzan, nə əcəb,**
**Rəsmdir asıla qəndil nəzərgahlərə.**

**(4) Maili-sərv qədin vəslinə yetməz, nişə kim,**
**Bəxt şayəstə degil himməti kutahlərə.**

**(5) Saqiyi-bəzmi-cünun nərgisi-məstindir kim,**
**İçirir badeyi-qəflət dili-agahlərə.**

**(6) Baxma, ey didə, zənəxdanına məhbublərin,**
**Gəzmə qafil, həzər et düşməyəsən çahlərə.**

**(7) Ey Füzuli, vərə əhli rəhi – məscid tutmuş,**
**Sən rəhi – meykədə dut, uyma bu gümrahlərə!**

Beyt 1: **Rəhm et, ey şəh, dili-dərviş çəkən ahlərə**
**Ki, gəda ahı əsər eylər olur şahlərə.**

Sözlük: Şəh = şah; dil = dil, ürək; gəda = dilənçi.

Nişanə 1: "Şəh" - bu beytdə təlimatını dayandırmış mürşiddən, ya da cilvələrini qət etmiş mütəal məhbubdan nişanədir.

Nişanə 2: "Ah" - aşiqin istedadını yeniləşdirən və artıran biqərarlıqdan nişanədir.

Nişanə 3: "Dərviş" və "gəda" - bu beytdə aşiqin şühud nailiyyətlərinə istedadsız və nalayiq olduğundan nişanədir[1].

Nişanə 4: İkinci misra "sünnət" ünvanlı ilahi qanundan nişanədir. [2] Bu nişanə məşuqun aşiqə rəhmsiz olduğunu təlqin edərək Allahın sünnətini ona bildirmək istəyir.

**Qeyd** 1: *Bir çox hal baş verə bilər ki, aşiq həyacan, hicran, məcnunluq və məğlubiyyət vəziyyətində mürşidin özünə, hətta mütəal məhbuba giley və etirazlar edər*[3]*, ancaq məcnunluq məğlubiyyətində olduğuna görə cəzalanmaqdan azad olar, ona görə ki, məcnunluq divanəlikdir və şəriət divanəni mühakimə etməyə hökm verməmişdir.*

**Qeyd** 2: *Etiraz və şikayət mütəal məhbubun iqtidarını və ululuğunu qeyri-ixtiyari təsdiq etməkdən nişanədir.*

**Qeyd** 3: *"Əsər eylər" – mütəal mənbubun lütf və rəhmətini yad etmək nişanəsidir.*

Anlam: Ey məhbub, ulu iqtidar sahibinin bir məmlük və müflisə rəhm etməsi və yardım durması təbii bir ehsan olduğuna görə sənin rəhmət və lütfündən bəhrələnmək istəyirəm.

Beyt 2:**Mehri yox mahlərə ah əsər etməz, yarəb!**
**Ver bir insaf bu mehri yox olan mahlərə.**

Sözlük: Mehr = məhəbbət = mehribanlıq = günəş; Mah = ay.

Nişanə 1: "Mehri yox" - mütəal məşuqun "istiğna" ünvanlı ilahi məqamda aşiqin yalvar – yaxarını qulaqardına vurmaq sifətindən nişanədir.
Nişanə 2: "Mah"

A – mah, bu beytdə gah kəsrət örtüyündə camalını gizlədən, gah da kəsrət güzgüsündə camalını əks etdirən canandan nişanədir.

---

[1] Ürfan ədəbiyyatında mənəvi əlçatmaz məqamlara yüksəlmiş "dərviş" və "gəda" ünvanlı aşiqlərdən geniş məlumat verilmişdir.
[2] Qəzəl 18, beyt 5
[3] Məcnunluq məğlubiyyətindəki məstliklər və iddiaların ürfani ünvanı "şəth" yoxsa "şəthiyyat"dan ibarətdir.

**Qeyd**: *"İstiğna" – məqamı dini ədəbiyyatda "səmədiyyət" başlığıyla tanınmış əlçatmaz bir mərtəbədən ibarətdir.*

Nişanə 3: "Ah" - aşiqin birərarlığıyla qatqı mərifətini təlqin edən sifətdən nişanədir.

Anlam: Ey mehriban məhbub, cəfa məşuqun tanınmış sünnəti olarsa, rəhmət və ehsan isə onun başqa bir sünnətidir. Beləliklə, bu möhtac aşiqin lütf və rəhmətdən məhrum olmağına razılıq vermə.

Beyt 3: **Qaşların tağinə versəm dili-suzan, nə əcəb,**
**Rəsmdir asıla qəndil nəzərgahlərə.**

Sözlük: Taq = qövs = hər bir hilali şəkil; suzan = büryan = yanan; nəzərgah = tamaşaxana = tamaşalı bir yer.

Nişanə 1: "Qaş" - bu beytdə karıxdırıcı davamsız cilvədən nişanədir, ancaq bu cilvə ilahi mənbə ilə əlaqədar olduğuna görə hörmətli və əziz tutulmalıdır.

Nişanə 2: "Dili-suzan" və "qəndil": dili suzan və qəndil ürfani "şəm" mərtəbəsini təlqin edən istiarələrdən ibarətdir ki, aşiqin şam kimi yanıb əriməyini, yaxud mənliyinin yox olmasını eyham edir.

**Qeyd** 1: *Dini dəsturlarda atəş su kimi paklayan bir maddə olduğuna görə dili suzan, yoxsa şəm batini paka çıxardan və ilahi cazibələrə layiq edən istiarələrdən ibarətdir .*

**Qeyd** 2: *Qəndil qəlbi, yaxud dili-suzanı təkrar edən nişanə olduğuna görə onu nur məqamına[1] hazırlayan istedad əlamətidir.*

Nişanə 3: "Nəzərgah" - gözün ətrafı olduğuna görə şühud mövqiyyətinin ətir və təsirindən nişanədir.

Anlam: Ey gözəl canan, qəndil nəzərgahdan asıldığı kimi, mənim yanar qəlbim də sənin tamaşalı qələbə və qəhrindən asılmışdır, nə olar ki, onu mənəvi arzusuna nail edəsən.

**Qeyd**: *Şam qaranlıq bir yari işıqlandıran kimi, qaraca maddi məhitimi, qəlbimin atəşilə işıqlandırmaq istəyirəm.*

Beyt 4: **Maili-sərv qədin vəslinə yetməz, nişə kim,**
**Bəxt şayəstə degil himməti kutahlərə.**

Sözlük: Şayəstə = yararlı, kütah = alçaq = aşağı.

Nişanə 1: "Sərv qəd" - bəst və görüş mərtəbəsini davamlandıran ilahi lütflərdən nişanədir.

---

[1] Qəzəl 1, beyt 1, nişanə "Ənar"

Nişanə 2: "Bəxt" - sınaqlardan sovuşmayan və mənəvi sərmayəsini hazırlamayan aşiqin bəzi nailiyyətlərə çatmasından nişanədir.

Nişanə 3: "Himmət" - qəlbin məşuq tələbində bütün qüvvələri ilə çalışmasından nişanədir.

Anlam: Ey megriban məhbub, məni davamlı şühud nurundan və görüş nemətindən məhrum edən öz himmətimin alçaqlığıdır.

**Qeyd**: *Belə bir anlam, məbud həzrətinə xoş gələn ətrafdan ibarətdir.*

Beyt 5: **Saqiyi-bəzmi-cünun nərgisi-məstindir kim,**
**İçirir badeyi-qəflət dili-agahlərə.**

Sözlük: Bəzm = məclis = ənümən = ziyafət; nərgis = nərgizgülü; dili-agah = ayıq qəlb = xəbərdar ürək.

Nişanə 1: "Saqi" - həzrət-Cəbrayıldan, yaxud digər ilahi vasitədən nişanədir.

Nişanə 2: "Bəzmi-cünun" - əql və məntiqə sığmayan nişanədir.

Nişanə 3: "Nərgisi-məst" - şühud mərtəbəsində, yaxud məcnunluq qələbəsində fərəhlənməkdən və batinin sərxoşluğundan nişanədir.

**Qeyd**: *Nərgisi-məst məqamına çatmış qəlb, yer kürəsinə, bəlkə də bütün aləmə sığmayan bir genişlik tapır.*

Nişanə 4: "Badeyi-ğəflət" - dünyəvi ilgiləri və elmi tanışlıqları aşiqin yadından çıxaran, eşq və hal qələbələrindən nişanədir.

Nişanə 5: "Dili-agah" - mənəvi məqamlar ilə tanış olmuş qəlbdən nişanədir.

Anlam: Ey mehriban məhbub, sənin cazibələrin və cilvələrin mənəvi maarif tapmış qəlbləri dünyanın özündən və etibarlarından xəbərsiz edir.

Beyt 6: **Baxma, ey didə, zənəxdanına məhbublərin,**
**Gəzmə qafil, həzər et düşməyəsən çahlərə.**

Sözlük: Didə = göz; zənəxdan = çənə; çah = quyu.

Nişanə 1: "Zənəxdan" və "çah" - aşiqin müvəqqəti həbsdə istiqamətini sınayarkən onu daimi həbsdən xilas edən qələbədən nişanədir.

**Qeyd** 1: *Dönə-dönə dediyimiz kimi zənəxdan quyusunda həbs olunmaq, istiqamətlənmək və tərbiyə görmək üçün gərəkli bir mərhələdən ibarətdir.*

**Qeyd** 2: *Çah (quyu), sübut etmək, yaxud aşağı düşmək mənasını təlqil edərək ucalmaq şövqünü eyham edir.*

**Qeyd** 3: *Dediyimiz şövq insanı mənəvi yüksəkliyə qaldıran əsas bir vasitə olduğuna görə zənəxdan bəhsində ürfan araşdırıcılarının diqqətini özünə çəkmiş və müxtəlif izahlara və ifadələrə səbəb olmuşdur, o cümlədən Molla Sədra zənn etmiş ki: "..., şövq şöləlari məhəbbətdən saçılan maddi əlaqə - əngəlləri yandıran, intizar qaydasını xarab və aşiqi biqərar edən bir atəşdən ibarətdir" . O əlavə etmiş ki: "..., demək onların (zənəxdan quyusuna süqut edən aşiqlərin) şövqlü olduqlarına görə bir şeyləri vardır və bir şeyləri yoxdur, çünki onlar daimi hicrana düşməyib-lər, onların demək hələ nakamlıq və ətəş halındakı görüşdən və vüsaldan payları və bəhrələri var (bir şey), beləliklə, onlar hicran vəziyyətində vüsala çatmış aşiqlərdirlər, onları bir çeşid həm əzabverici, həm də ləzzət aparmalı sonu məlum olmayan vəhşət və heyrət bürüyüb"*[1]

**Qeyd** 4: *Aşiqi zənəxdan quyusunda həbs edən qəhr "dəfi-qəhr" ünvanlı mənfi qəhr deyil, bəlkə vüsal ərəfəsinə çatdıran "cəzbi-qəhr" ünvanlı müsbət vasitədir. Beləliklə, zənəxdan əzablarından özünü qoruyan bir aşiq yolunu çaşmışdır və eşq dairəsindən kənara çıxmalıdır. Elə buna görə ikinci misra "həzər et" dəsturunu qabağa çəkmişdir.*[2]

Beyt 7: **Ey Füzuli, vərə əhli rəhi-məscid tutmuş,**
**Sən rəhi-meykədə dut, uyma bu gümrahlərə!**

Sözlük: Vərə = pəhrizkarlıq; rəh = yol = təriq; gəmrah = yolunu azmış = yoldan çıxmış.

Nişanə 1: "Vərə və məscid" - ibadət – itaətin zahiri adabında dəqiqlik və məğlubiyyət nişanəsidir.[3]

Nişanə 2: "Meykədə" - aşiqi bəşəri sifətlərdən ayırıb ilahi sifətlərlə əsaslandıran mövqeiyyətdən nişanədir.

**Qeyd**: *Müflislik müsibətini yaxud dünyanı tərk etmək çətinliyini bir ürək açan nemət kimi əziz və qənimət bilməyən aşiqin meykədə mənzilinə meyl etməyi mənfi və səhv bir hərəkətdir, çünki meykədə yolu dünyəvi istiqamətlərə sığmayan ən çətin təhlükələr ilə doludur. Elə buna görə də lisanül-qeyb Hafiz dünyanı hələ tam unutmayan bir aşiqə meykədə yoluna qədəm basmağı yararlı bilməyir və deyir:* زراه میکده یاران بگر دانید

[1] "Mübdə və məad", Molla Sədrayi-Şirazi, tərcümə Əhməd İbn Muhəmməd Əl-Həsəni Ərdəkani, səh. 181.
[2] Mülləf, "Ta Qafi-əndişə" kitabının 4 – cü cildində zənəxdan mərtəbəsindən geniş bəhs etmişdir.
[3] Qəzəl 13, beyt 2 .

## Q Ə Z Ə L 25

**(1) Su verər hər sübhdəm göz yaşı tiği-ahimə**
**Kim, tökəm qanın sipəhrin, salsa mehrin mahimə.**

**(2) Şəmi-rüxsarın odu qıldı məni atəşpərəst,**
**Çaki-sinəmdən təmaşa eylə atəşgahimə.**

**(3) Tutiya tək çeşmi-ərbabi-nəzərdir mənzilim,**
**Gərçi xaki-rəhgüzarəm dideyi-bədxahimə.**

**(4) Qəm kimi öldürsə, qanlı tək qaçar məndən yana,**
**Şahi-dərdəm, iltica eylər ülüvvi-cahimə.**

**(5) Bir fəqirəm, durmasın kimsə mənə təzim üçün,**
**Qanda getsəm, ey gözüm, su səp qübari-rahimə.**

**(6) Qafiləm sirri-ləbi-canpərvərindən ta xətin,**
**Qondurubdur gərd mirati-dili-agahimə.**

**(7) Ey Füzuli, yarə döndərdim üzüm əğyardən,**
**Xəsmi çox gördüm, sığındım sidqilə Allahimə.**

Beyt 1: **Su verər hər sübhdəm göz yaşı tiği-ahimə**
**Kim, tökəm qanın sipəhrin, salsa mehrin mahimə.**

Sözlük: sübhdəm = səhər çağı; sipehr = səma = göy, mehr = məhəbbət = mehribanlıq = günəş; mah = ay = məhtab.

Nişanə 1: "Sübh" - insanı tovhid günəşinə yaxınladan üryanlıq və mücərrədlikdən nişanədir.

**Qeyd** 1: *Gecə alqı-satqıların və ümumi ictimai çalışmaqların dayandığı* [1] *və "sübh"ün başlama zamanı olduğuna görə ikisi də vahid paraleldə aşiqi kəsrət əngəllərindən kənar edərək vəhdət nailiyyətinə hazırlayan mücərrədlik və bəstlikdən nişanədir.*

**Qeyd** 2: *Sübh gündüzün doğuş çağı olduğuna görə hər bir insanın doğum gününün günahsız olmağına eyham edərək onun məsum mücərrədlər ilə yanaşmaq müqəddiməsindən nişanədir.*

**Qeyd** 3: *Mövləvi zənn etdiyi "hər bir cinsin öz cinsinə mail olması və hər bir ayrılmışın öz bütünlüyünə təbii cazibəsi kimi"*[2] *sübh məqamına nailiyyət tapmış bir insan dünyəvi məşğuliyyətlərdən mücərrəd olduğuna görə səmavi mücərrədlər ilə həmcins olarkən, onlara qovuşmağa özündə təbii bir təmayül görür.*

**Qeyd** 4: *Sübh - canan ərəfəsinə yaxınlaşmaqdan nişanədir.*

**Qeyd** 5: *Bəstlik və təcrid mövqeiyyəti yaratmış günorta çağına, yaxud gecə yarısına ürfan ədəbiyyatında "sübh" demişlər.*

Nişanə 2: "Göz yaşı":

A – dünyəvi əlaqələri – ilgiləri və məcazi mənliyi silib – atmaqdan nişanədir.

B – batini paklayan nişanədir.

P – ətəş və tələbi əlavələndirən biqərarlıqdan nişanədir.

Nişanə 3: "Tiğ ah" - içərini paklayan göz yaşı ilə paralel "nari-məhəbbət" atəşindən nişanədir.

**Qeyd**: *Od və su dini dəsturlarda paka çıxardan səbəblərdəndirlər.*

Nişanə 4: "Sipəhr" - küdurətə qatqı kəsrəti, yaxud rəqibləri əngəl və hicab edən şəraitdən nişanədir.

Nişanə 5: "Mah" - qara kəsrəti şəffaf güzgüyə çevirərkən onlarda təcəlla nurunu əks etdirən mövqiyyətdən nişanədir.

Anlam: Kəsrət əngəlləri, yaxud məhəbbət rəqibləri məni sübh mövqiyyətindən, yaxud canan ərəfəsindən kənar salmaq istəsələr, onların

---

[1] Qəzəl 20, nişanə 1.

[2] ذوق جنس از جنس خود باشد یقین          ذوق جزو از کلّ خود باشد ببین
مثنوی معنوی مولوی ، دفتر اوّل ، بیت 902

hamısını bir ah silahilə aradan qaldıraram ( beyt "istiğna" məqamını eyham etmək istəyir).

Beyt 2: **Şəmi-rüxsarın odu qıldı məni atəşpərəst,**
**Çaki-sinəmdən təmaşa eylə atəşgahimə.**

Sözlük: Rüxsar = camal = sima =surət; çak = yarıq.

Nişanə 1: "Şəmrüxsar" - ilahi camaldan parlayan təcəlla nurundan ibarətdir.

Nişanə 2: "Atəşpərəst" - nari-məhəbbət nailiyyətinə sitayiş etməkdən ibarətdir.

Nişanə 3: " Çaki-sinə" - bəstlik şəffaflığına nail olmaq nişanəsidir.

Nişanə 4: "Atəşgah " – nari-məhəbbət qələbəsində dünyəvi ilgiləri yandırıb kül etmiş mənəvi təcəllilərə güzgü olan ürəkdən nişanədir.

Anlam: Ey gözəl məbud, ürəyimi saflandırarkən sənin ona mənəvi güzgü təcəssümü bağışlayan təcəlla nuruna sitayiş edirəm.

Beyt 3: **Tutiya tək çeşmi-ərbabi-nəzərdir mənzilim,**
**Gərçi xaki-rəhgüzarəm dideyi-bədxahimə.**

Sözlük: Çeşm = göz; didə = göz; rəhgüzar = yoldan qalxan torpaq = yoldan ötən bir şəxsin addımı altında qalan torpaq.

Nişanə 1: "Tutiya" - aşiqin şühud istedadını qüvvətləndirən səbəbdən nişanədir.

Nişanə 2: "Çeşm " - bu beytdə hörmətə çatmaq nişanəsidir.

Nişanə 3: "Ərbabi-nəzər" - zəngin fikirli mənəviyyatşünaslardan ibarətdir.

Anlam: Şühud istedadlı mənəviyyatşünasların alqış – ehtiramından törənən sərxoşluq mərifətsiz düşmənləri məğlub etməyə qadir olan silahdır.

Beyt 4: **Qəm kimi öldürsə, qanlı tək qaçar məndən yana,**
**Şahi-dərdəm, iltica eylər ülüvvi-cahimə.**

Sözlük: Ülvi = ucalıq = yüksəlmək; cah = məqam = dərəcə = şan;

Nişanə 1: "Qəm" və "Dərd " - dünyəvi və mənəvi müsibətlər və müşküllərdən nişanədir.

Nişanə 2: "Şah " - öz dünyəvi ilgilərini məğlub edərək mənəvi ilgi – iqtidara nail olmuş aşiqdən ibarətdir. Belə bir iqtidar həzrəti-İbrahimin atəşə,[1] və həzrəti-Musanın dənizə qalib gəlmsinə səbəb oldu[2].

Nişanə 3: "Şahi-dərd" - mənəvi seyr yolunda bütün müşkülləri xidmətçi edən edən salikdən ibarətdir. Demək o, hər bir təhlükə önündə təzə bir istiqamət göstərməklə yeni bir yüksəkliyə nailyyət tapır, beləliklə müşküllər onun xidmətçisi olarlar.

Nişanə 4: "Ülüvvi cah" - ilahi yüksəklikdən nişanədir.

Anlam: Qəm bir çox insanlara qalib olarkən mənə məğlub və xidmətçidir.

Beyt 5: **Bir fəqirəm, durmasın kimsə mənə təzim üçün,**
**Qanda getsəm, ey gözüm, su səp qübari-rahimə.**

Sözlük: Təzim = hörmət saxlamaq qəsdilə ayaq üstə durmaq.

Nişanə 1: "Fəqir" - dünyəvi malikiyyətləri, yaxud kəsrətə bağlı varlıqları bütünlüklə silib – atarkən öz məmlüklüyünü anıb – düşünən aşiqdən ibarətdir.

**Qeyd** 1: *Aşiqin zərrəcə dünyəvi ilgilərə bağlı təmayülatı olsa bir o qədər məşuq ərəfəsindən kənarda qalmalıdır. Bunun üçün də məmlüklük və fəqirlik ona edilən etibar və fəxrdir*[3].

**Qeyd** 2: *Ürfan mədəniyyətində bütün mərtəbələr, məqamlar, sözlər məna cəhətdən deyildikcə şərab, meyxanə, qumar və bir çox mənfi mənalı kəlmələr, müsbət mənalar kəsb eləmiş, özünü yoxsul ("fəqir") edən bir aşiq isə hüquqi varlığıyla nailiyyət tapmışdır. Beləliklə, ürfan baxımı fəqiri şah bilir və şahi fəqir*[4]*, elə bu mədəniyyət və bu baxımla Xaqani buyurmuş:*

پس از سی سال روشن گشت برخاقانی این مطلب که سلطانیست درویشی و درویشست سلطانی

Anlam: Dünyəvi hörmətlər və dikəlməklər, məqam və malikiyyət nişanəsi olduğuna görə, Füzuli hətta yollandığı yolda addımlarından qalxan tozu ayaq üstə duran bir şəxsə bənzədir, onu hörmət nişanəsi bilir və göz yaşıyla yatmaq istəyir.

---

[1] Quran, "Ənbiya" surəsi, ayə 69.قلنا يانار كونی برداً و سلاما على ابراهيم
("Dedik: Ey od, İbrahimə qarşı sərin və salim ol)

[2] Quran, "Şüəra" surəsi, ayə 63. فاوحينا الى موسى ان ضرب بعصاک البحر فانفلق فکان کل فرق کالطود العظيم, ("Musaya vəhy etdik ki, əl ağacını dənizə sal. Dəniz parçalandı və hər parça hündür dağ kimi oldu").

[3] Qəzəl 2, beyt 1, qeyd 1

[4] Təsəvvüf və ürfan tarixinin bu məqamda müstəqil bəhsləri və izahları vardır.

Beyt 6: **Qafiləm sirri-ləbi-canpərvərindən ta xətin,**
**Qondurubdur gərd mirati-dili-agahimə.**

Sözlük: Canpərvər = can təzələyən; xət =üzün təzə bitmiş yumşaq tükü; Gərd = toz = qubar; mirat = güzgü; deli-agah = ayıq ürək.

Nişanə 1: "Ləb" - rəhmani və mənəvi həyat bağışlayan "feyz" ünvanlı mərtəbədən nişanədir.

Nişanə 2: "Xət" - bu beytdə kəsrət güzgüsündə əks etdirilmiş vəhdət nuruna və ilahi ətrə razılıq vermək və məşğul olmaq ilə ətəş və tələbi sakinləşdirmək və mütəal məhbubun aşiqi fəna edən özəl təcəllilərindən qəflət etmək nişanəsidir.

**Qeyd**: *Tələb və ətəşi əlavə edən təcəllilər aşiqin istedadını mükəmməl etməyə lazımdırlar.*

Beyt 7: **Ey Füzuli, yarə döndərdim üzüm əğyardən,**
**Xəsmi çox gördüm, sığındım sidqilə Allahimə.**

Sözlük: Xəsm = düşmən; sidq = ixlas = məbud önündə zahir ilə batini bərabərləşdirmək.

Nişanə 1: "Yar" - mütəal məbudu sifət ilə tanımaqdan nişanədir.

Nişanə 2: "Əğyar" - həzrəti-məbuddan başqasını məmlük və möhtac bilərkən onlardan umsunmaq və yalnız yaradıcı məhbubdan yardımçılıq immaq nişanəsidir.

Nişanə 3: "Xəsm ": xəsm, ilahi səviyyələr qarşısında maneçilik edən əğyardan ibarətdir.

Nişanə 4: "Sidq " - aşiqi zahiri və batini cəfalar və vəfalar önündə razılıq bildirmək və düzləşmək halında saxlayan sifətdən nişanədir.

Anlam: Ey Füzuli, mütəal məbuddan başqalarını ümumən məmlük və möhtac görərkən mən yalnız o iqtidarlı və mehriban məbuda ürək bağladım.

## Q Ə Z Ə L 26

**(1) Könül ta var əlində cami-mey təsbihə əl urma,**
**Namaz əhlinə uyma, onlar ilə durma, oturma.**

**(2) Əgilib səcdəyə salma fərağət tacını başdan,**
**Vüzudən su səpib, rahət yuxusun gözdən uçurma.**

**(3) Saqın, pamal olursan buriya tək, məscidə girmə**
**Və gər naçar girsən onda minbər kimi çox durma.**

**(4) Müəzzin naləsin alma qulağə, düşmə təşvişə,**
**Cəhənnəm qapısın açdırma, vaizdən xəbər sorma.**

**(5) Cəmaət izdihami məscidə salmış küdurətlər,**
**Küdurət üzrə lütf et, bir küdurət sən həm arturma.**

**(6) Xətibin sanma sadiq, vaizin qövlilə fel etmə,**
**İmamin tutma aqil, ixtiyarın ona tapşurma.**

**(7) Füzuli, bəhrə verməz taəti-naqis, nədir cəhdin,**
**Kərəm qıl, zikri-taət surətində həddən aşurma.**

Beyt 1: **Könül ta var əlində cami-mey təsbihə əl urma,**
**Namaz əhlinə uyma, onlar ilə durma, oturma.**

**Qeyd**: *Bu qəzəl başdan-başa:*

*A – Dünyəvi imtiyazlara qatqı riyalardan qorunmağı sifariş etmək istəyir.*

*B – Dini adab məhdudluğunda özünü həbs etmiş və əql və elmdən üstün məqamlardan xəbərsiz qalmışlara vaysınmağı göstərmək istəyir.*

Nişanə 1: "Cami-mey " - aşiqin salikin və mürşüdün maddi varlığına və bədən mənliyinə qələbə çalmış ilahi cilvələr ilə daşqın ürəyindən nişanədir.

Nişanə 2: "Təsbih" - bu beytdə səbəblər məşğuliyyətində səbəbkardan qəflət etməkdən nişanədir.

Nişanə 3: "Namaz əhli" - bu beytdə:

A – Əql və elmi dini əməllərin kamil və yeganə miqyası bilənlərdən nişanədir.

B – Dini vasitələr ilə dünyəvi məqamları izləyən riyakardan nişanədir.

Anlam:

A – Ey könül, cəhd et ki, aşkar səbəblər məşguliyyəti gizli səbəbkarın yaddan çıxarmasına bais olmasın.

B – Ey aşiq, həzrəti-mürşüddən, yaxud digər mənəvi vasitələrdən, yaxud öz ilahi cəlaları ilə daşqın ürəyindən qəflət edərkən, əql və elmin təsdiq etdiyi umumi səbəblər məhdudluğunda özünü məşğul etmə.

Beyt 2: **Əgilib səcdəyə salma fərağət tacını başdan,**
**Vüzudən su səpib, rahət yuxusun gözdən uçurma.**

Sözlük: Vüzu = dəstəmaz.

Nişanə 1: "Səcdə":

A – özünü yaddan çıxarmayan ibadətkardan nişanədir.

B – dünya fikrini təmamilə başından atmayan dindardan nişanədir.

P – batinə sədd çəkən əlaqələr və ilgilərdən nişanədir.[1]

Nişanə 2: "Fərağət" və "rahət" - batinə sədd çəkən səbəblərdən təmamilə xilas olmaq nişanəsidir.

Nişanə 3: "Vüzu" - təsbih ilə paralel və tənləşmiş nişanədir.

Anlam: A – dini adab və əməllərin zahirində dəqiqlik etməklə batini feyzləri yaddan çıxartma.

---

[1] Fərhəngi-istilahat və təbirati-ürfani.

B – öz zahiri adətlərini layiq və kamil bilib, onlarla fəxr etmək və məğrur olmaqla özünü mənəvi yüksəklik məhrumluğuna giriftar etməyə razılıq vermə.[1]

Beyt 3: **Saqın, pamal olursan buriya tək, məscidə girmə**
**Və gər naçar girsən onda minbər kimi çox durma.**

Sözlük: Pamal = ayaqaltı; buriya = həsir .

Nişanə 1: "Buriya" - həqirlikdən nişanədir.

Nişanə 2: "Məscid" və "minbər": İçəri vücudu mənəvi maarifdən məhrum edən zahiri vasitələr məhdudluğundan nişanədir.

Anlam: A – dini əməllərin məntiqi zahiri səviyyələrini kamil zənn etməklə özünü onların əql və elmdən üstün mərtəbələrindən məhrumluğa giriftar etmə.

B – riyakar dindarlar ilə bir sırada dayanmaq və sinifdaş olmaq ilə özünü həqiqi həqirliyə giriftar etmə.

Beyt 4: **Müəzzin naləsin alma qulağə, düşmə təşvişə,**
**Cəhənnəm qapısın açdırma, vaizdən xəbər sorma.**

Sözlük: Müəzzin = azançı.

Nişanə 1: "Müəzzin" və "vaiz" - mənəvi maarifdən xəbərsiz dini işlərlə məşğul olanlardan nişanədir.

Anlam: Vaizin cəhənnəmdən söz açması, və öz dünyəvi vücudunu qoruması ilə məcazi varlığına bağlılığını məlum edir. Beləliklə, onun özündən xəbərdar olması məşuqdan xəbərsizliyini sübut edir, sən isə müəzzinin dəvətini qəbul edərək özünü ona ortaq etmə.

**Qeyd**: *Bəşəri səviyyəni tərk edib ilahi eşq mərtəbəsinə yüksəlmiş bir insan özündən xəbərsiz olduğuna görə behişt və cəhənnəmdən də xəbərdar olmaz və yalnız mütəal məhbubun xəyalı ilə tanış olar.*

Beyt 5: **Cəmaət izdihami məscidə salmış küdurətlər,**
**Küdurət üzrə lütf et, bir küdurət sən həm arturma.**

Nişanə 1: "Küdurət"-maddə qara olduğuna görə maddi əlaqələr də şühud nurunun qarşısında qara maneəni qaldıran kəsrətdən nişanədirlər.

**Qeyd** 1: *Mehriban məbud "ələst" aləmində [2], "misaq" ünvanlı əhd bağlanan gün öz əks etdirdiyi sifətlər ilə insanları tanış edərkən onları*

---

[1] Qəzəl 3 beyt 4

[2] Qəzəl 19, beyt 4 .

*lütf ilə danışdırıb dostluq əhdi bağladı, sonra onlara maddi aləmə göndərib hər birinə gözəl camal, mütənasib bədən, lazımi görünüş, elm, əql, idrak və mədəniyyət bağışlamaqla zahir və batinlərini maraqlandırdı, zahirdə çalışıb-öyrənməyi (tərbiyə) və batində şühud və müşahidəni bir ulu nemət kimi onlara ehsan etdi və nəhayət, onlara "Minacat" mövqeiyyətini bağışladı ki, ta hər vaxt istəsələr mehriban məbudu çağırıb ona sirlərini və hacətlərini ərz etmək ilə yüngül və rahat olsunlar, ...*[1] *belə bir ilahi əlaqələrə maneçilik törədən səbəblərin ürfani ünvanı küdurət, yaxud kəsrətdir.*

Nişanə 2: "Camaət"- əql və elmdən üstün eşq və ürfan mərtəbəli səviyyələrdən xəbərsiz qalanlardan ibarətdir.

Nişanə 3: "Məscid":

A – bu beytdə dünyaşünas əql və məntiq məhdudluğuna şərait törədən mövqeiyyətdən ibarətdir.

B – dini çalışmalar ilə dünyəvi mərtəbələri axtarmaqdan ibarətdir.

P – dini çalışmalar ilə mənəvi mərtəbələri axtarmaqdan ibarətdir.

T – riyakarlıq şəraitindən ibarətdir.

Anlam:

A – mənliyini yaddan çıxarmayan camaət vəhdət qarşısında maneələr qaldıran kəsrətə yetişdiklərindən onlara qoşulmaqla küdurətli kəsrəti artırmağa bais olma.

B – Dini əməllər ilə dünyəvi qazanclar axtaran camaata qoşulmaqdan çəkin.

Beyt 6: **Xətibin sanma sadiq, vaizin qövlilə fel etmə,**
**İmamin tutma aqil, ixtiyarın ona tapşurma.**

Sözlük: Xətib = vaiz = söz sahibi, aqil = ağıllı.

**Qeyd** 1: *Xətib, vaiz və imam bu beytdə eşq mərtəbəsini inkar etmiş dini rəhbərdən, yaxud dini əməllər ilə dünyəvi məqamlar axtaran müddəilərdən, ya da riyakar dindarlardan ibarətdir.*

**Qeyd** 2: *Ürfana görə, eşq bütövlənmiş və kamil olmuş əql olduğuna görə aqil bu beytdə aşiq mənasını ifadə edir.*

Anlam: Bu beyt də ötən beytin mənasını təkrar edir.

Beyt 7: **Füzuli, bəhrə verməz taəti-naqis, nədir cəhdin,**
**Kərəm qıl, zikri-taət surətində həddən aşurma.**

---

[1] Fərhəngi-istilahat və təbirati-ürfani.

Sözlük: Taət = itaət .
Nişanə 1: "Taəti naqis "- eşq və ürfandan kənar ibadətdən, yaxud təriqətsiz şəriətdən ibarətdir.

Nişanə 2: "Zikr"- bu beytdə dəmbədəm mütəal məbudun adını çəkib, ancaq o adın mənası ilə tanışlığı olmayan insanlardan nişanədir.
Anlam: Ey Füzuli, hər an mütəal məbudun adının heybətindən əql və idrakın tikə - tikə parçalanmasa, o adın əzəmətindən maddi dünyadan üstün bir mərifət qazana bilməsən, bu adın zikr olunması itaət olsa da bu əməl naqislikdən kənar deyil .

**Q Ə Z Ə L 27**

**(1) Mənim tək hiç kim zarü pərişan olmasın, yarəb!**
**Əsiri – dərdi – eşqü daği – hicran olmasın, yarəb!**

**(2) Dəmadəm cövrlərdir çəkdiyim birəhm bütlərdən,**
**Bu kafərlər əsiri bir müsəlman olmasın, yarəb!**

**(3) Görüb əndişeyi - qətlimdə ol mahi, budur dərdim**
**Ki, bu əndişədən ol məh pəşiman olmasın, yarəb!**

**(4) Çıxarmaq etsələr təndən çəkib peykanın ol sərvin**
**Çıxan olsun dili-məcruh, peykan olmasın, yarəb!**

**(5) Cəfavü cövr ilə motadəm, onlarsız nolur halım?**
**Cəfasinə hədü cövrinə payan olmasın, yarəb!**

**(6) Demən kim, ədli yox, ya zülmü çox hər hal ilə olsa,**
**Könül təxtinə ondan qeyri sultan olmasın, yarəb!**

**(7) Füzuli buldu gənci-afiyət meyxanə küncündə,**
**Mübarək mülkdür, ol mülk viran olmasın, yarəb!**

Beyt 1: Mənim tək hiç kim zarü pərişan olmasın, yarəb!
Əsiri – dərdi – eşqü daği – hicran olmasın, yarəb!

Nişanə: "Zar, pərişan, dərdi-eşq, daği-hicran": hər dörd nişanə bu beytdə aşiqin tərbiyəsinə gərəkli qəhr və qəbz mərhələsinin davamlı olmasını təlqin edir.

Anlam: Ey yaradıcı məhbub, heç aşiq qəbzlərin və qəhrlərin qapalı qəfəsində mənim kimi giriftar olmasın.

**Qeyd**: *Beyt davamlı qəbzlər önündə başqa aşiqlərin istiqamətsizliyini hiss edərək onlara dua edir.*

Beyt 2: Dəmadəm cövrlərdir çəkdiyim birəhm bütlərdən,
Bu kafərlər əsiri bir müsəlman olmasın, yarəb!

Sözlük: Dəmadəm = dəmbədəm, birəhm = rəhmsiz, büt = sənəm.

Nişanə 1: "Birəhm bütlər":

A – "mənəvi kəsrət" ünvanlı mərhələdə aşiqin ətəş və atəşini coşğunlandıran touhid günəşinin dəmbədəm çıxma – batma şəraitinə eyham edən istiarədir.[1]

B – Aşiqi sınaqlara çəkən ilahi vasitələrdən nişanədir.

P – Büt – daşdan yonulduguna görə, aşiqin əqlini, idrakını və bütün bədən qüvvələrini "heyrət" ünvanlı ürfani mərtəbədə daş kimi qurudub işdən qoyan gözəllərə, yaxud ilahi cazibələr və vasitələrə büt demişlər.

Nişanə 2: "Kafir" – kəlməsinin bir mənası da "örtücü" olduğuna görə:

A – Aşiqin əql və idrakının üstünü örtən məşuqun özünə yoxsa vasitələrinə "kafir" demişlər.

B – Dini mədəniyyətdə camalın üstünü örtmək və onu naməhrəm gözlərdən qorumaq vacib olduğuna görə camalını örtən gözəllərə kafir (örtücü) demişlər.

P – Aşiqi ətəş və tələb atəşində yandırmaq (tərbiyə) hədəfi ilə camalını örtüb gizlətməyə görə məşuqa kafir (örtücü) demişlər.

Nişanə 3: "Müsəlman":

A – əql və məntiqə təslim olunmuşlardan nişanədir.

B – Müsəlman dünyəvi xarakterini eşq sahəsinin sərkilərindən qorumuş və salim saxlamış insanlardan nişanədir.

Anlam: Həkimi məhbubun cəfa ilə vəfasını vahid bilməyən şəxs qoy eşq sınağlarına giriftar olmasın.

---

[1] Qəzəl 23 beyt 1, nişanə 1 .

Beyt 3: **Görüb əndişeyi-qətlimdə ol mahi, budur dərdim**
**Ki, bu əndişədən ol məh pəşiman olmasın, yarəb!**

Sözlük: Mah = ay = məhtab.

Nişanə 1: "Mah, məh" – qara maddə kəsrət güzgüsündə, öz ağ nurunu əks etdirən vəhdət günəşindən nişanədir.

Nişanə 2: "Qətl" – dünyəvi və mənəvi sərmayələr ilə fədakarlıq və qurbanlıq istedadına nail olmaqdan nişanədir.

**Qeyd** 1: *Maddi ilgiləri, fiziki və təbii təmayülatı və məcazi varlığı təmamilə məşuq xəyalında itirib-batırmaq və nəhayət mənliyi unutmaq dünyəvi sərmayədan ibarətdir.*

**Qeyd** 2: *Bütün yaranmışlarda, hətta öz vücudunda (kəsrətdə), baş-dan-başa yaradıcı məhbubun hüsnünü və nurunu görmək, bəşəri dünyada ilahi yaşamaq mənəvi sərmayədan ibarətdir.*

Anlam: Kəsrət güzgüsündə əks etdirilmiş vəhdət cilaları, "pərişanlıq", "zarlıq, "hicran dağı" və "dərd əsiri" ilə (birinci beyt) paralel bəlkə də vahidlikdə, mənə qurbanlıq muştuluğu verən nişanədir, ancaq qorxuram belə bir nailiyyətə layiq olmadığına görə, həzrəti-məbud məni qətl və qurbanlıq ehsanından məhrum edə.[1]

Beyt 4: **Çıxarmaq etsələr təndən çəkib peykanın ol sərvin,**
**Çıxan olsun dili-məcruh, peykan olmasın, yarəb!**

Sözlük: Peykan = ox ucu = ox, dili-məcruh = yaralanmış ürək.

Nişanə 1: "Peykan" – aşiqin maddi həyatına sədəmə toxunduran və onu enerjidən, işdən qoyan və nəhayət mənliyindən ayıran lütflərlə baglı qəhrlərdən nişanədir.

Nişanə 2: "Dili-məcruh" – qurbanlıq məqamına hazırlanmış sərmayədan ibarətdir.

**Qeyd** 1: *"Dili-məcruh" dünyəvi həyatdan istiarə olduğuna görə (ürəksiz həyat mümkünsüzdür) eşq oxu ilə yaralanmaq ölümün müqəd-diməsidir. Belə bir müqəddimə qurbanlıq nailiyyətinin əsas şərtidir.*

**Qeyd** 2: *"Dili-məcruh", mənəvi həyatdan istiarə olduğuna görə[2] eşq oxu ilə maddi bədəndən və məcazi dünyadan ayrılmaq və vəhdət dənizinə qatışmaq aşiqin birinci ilahi hədəfindən ibarətdir.*

---

[1] Qəzəl 7, beyt 2 .
[2] Qəzəl 13, beyt 1.

Anlam: Ötən beytləri davam etdirmək qəsti ilə deyir: Ey həkimi-məhbub, mənim nalələrimi qulaq ardına vurub qurbanlıq məqamına gərəkli cəfalar və bəlalarını qət etməyə razı olma.

Beyt 5: **Cəfavü cövr ilə mötadəm, onlarsız nolur halım?**
**Cəfasinə, hədü cövrinə payan olmasın, yarəb!**

Sözlük: Mötad = adətkərdə = tərk edilməz adət, payan = son.

Anlam: "Cəfa və cövr" – aşiqin bədən adlı ən xətərnak düşməninə bilavasitə sədəmə toxundurmağına görə onu fiziki və təbii səviyyədən mənəvi və ilahi mərtəbəyə intiqal etməyə birinci əsas şərtdir. Bunun üçün də Füzuli ötən beytləri davam etdirərkən həkimi-məşuqdan cəfakarlıq xahiş edir.

Beyt 6: **Demən kim, ədli yox, ya zülmü çox hər hal ilə olsa,**
**Könül təxtinə ondan qeyri sultan olmasın, yarəb!**

Sözlük: Ədl = ədalət

Nişanə 1: "Könül təxti" – batini real həyatdan nişanədir.

Nişanə 2: "Sultan" – hüsnü cəmalı aşiqin əhval – ruhiyyə mənşəyi və əməllər səbəbi olmuş məhbubdan nişanədir.

Nişanə 3: "Ədl" və "zülm" – hikmətşünaslardan biganə dünyaşünasların etibarsız nəzərlərini eyham edən nişanələrdirlər.

Anlam: Mütəae məhbub vahid olduğu kimi sifətləri də vahiddir, demək onun cəfaları ilə vəfalarını fərqləndirmək vəhdət mərtəbəsinə yaraşmaz bir söz, aşiqə aydın xəbərsizlik və ağır bir günahdır. Buna görə də aşiq ədli və zülmü vahidlikdə görür və yeganə məhbubun yalnız hökmranlığını xahiş edir, beləlikə, özünü həqiqi malik və sahibinə baglayır.

Beyt 7: **Füzuli buldu gənci-afiyət meyxanə küncündə,**
**Mübarək mülkdür, ol mülk viran olmasın, yarəb!**

Sözlük: Gənc = xəzinə

Nişanə 1: "Gənc" – aşiqi mənəvi məqamlara nail edən sərmayədən nişanədir.

Nişanə 2: "Meyxanə":

A – Meyxanə, özünü kamal zirvəsinə qaldırmış bir arifin batinindən nişanədir.[1]

B – Qeyri maddi və ilahi yüksəklikdən nişanədir.[2]

P – Aşiqi, təbii vücuduna bağlı sifətlərindən ayıran və ona qeyri təbii və səmavi sifətlər bağışlayan mərhələdən nişanədir. Elə bu

---

[1] Fərhənge luğat və istelahat və təbirate ürfani, doktor Seyyid Cəfər Səccadi.

[2] Fərhənge luğat və istelahat və təbirate ürfani, doktor Seyyid Cəfər Səccadi.

mərhələni yada salmaq qəsdi ilə Hafiz Şirazi təbii dünyada, yaxud torpaq kürəsində həqiqi bir insan tapmağı mümkünsüz bilərkən demişdir:

آدمی در عالم خاکی نمی آید به دست        عالمی دیگر بباید ساخت وزنو آدمی

Hafiz ilahi hökmlərin təbliğçisi, Quranı əzbər etmiş bir arifdir, beləliklə, o dəqiq və gözəl nizamlı dünyaya çirkin və nizamsız demişdir, buna görə də irad və etiraz etmək qəsdi ilə özünü kafir etmək istəmir, bəlkə o, yer kürəsində səmavi şərait törədən və fiziki bədənə qeyri fiziki əhval-ruhiyyə verən mövqeiyyət (başqa dünya) və xarakterdən (başqa adam) xəbər vermək istəyir. Belə mövqeiyyət və xarakter ilə insan bütün mövcudlara üstün gələrkən "و لقد کرمنا بنی آدم" tacına layiq və nail olur.[1] İnsanı yer kürəsində bəlkə göylərə sığmaz edən bu yeni şəxsiyyətidir, Nəsiminin "Mən bu cahana sığmazam"deməsi, Hafizin yer kürəsində adam tapmaması, Mövləvinin çıraq əldə insan axtarmasından söz açması[2] və sair bu yeni xarakteri yada salmaq və təbliğ etməkdən nişanədir.

T – Aşiqi özlüyünü tanımayan bir movqeiyyətdə, məşuq ilə tanış edən mərtəbədən nişanədir.[3]

Anlam: Füzuli məcazi dünyasını xarab edərkən mənəvi dagılmaz dünyasını abad etdi.

---

[1] Quran, İsra surəsi ayə 70: “Və biz Adəmin övladlarına kəramət bagışladıq”

[2] دی شیخ گرد شهر همی گشت باچراغ        کز دیو ودد ملو لم و انسان آرزوست
"دیوانی شمس"

[3] به میخانه آی و صفار ببین        مبین خویشتن را خدا را ببین
رضی الدین آرتیمانی

## Q Ə Z Ə L 28

(1) Ey navəki-şövqün sipəri-sineyi-əhbab,
Zülfün xəmi ərbabi-vəfa seydinə qullab.

(2) Mehrabdə şəkli-xəmi-əbruyi-lətifin,
Vacib bu cəhətdən hamıya səcdeyi-mehrab.

(3) Suzim der idim şəm sana eyləyə rövşən,
Nəzzareyi-rüxsarinə yox şəmdə həm tab.

(4) Xurşid cəmalindən o məh saldı niqabın,
Sübh oldu, dur ,ey bəxt ,nədir bunca şəkərxab.

(5) Dün sübh yetirdim fələkə mövci-sirişkim,
Qərq etdi fələk üzrə olan əncümü girdab.

(6) Saqi ,məgər ol ləl sözün der meyi-nabə
Kim, düşdü ayağinə, əlin öpdü meyi-nab.

(7) Cəmiyyəti-əsbabə könül vermə, Füzuli
Kim, təfriqədir xatirə, cəmiyyəti-əsbab.

Beyt 1: **Ey navəki-şövqün sipəri sineyi-əhbab,**
**Zülfün xəmi ərbabi vəfa seydinə qullab.**

Sözlük: Navək = ox; əhbab = dostlar; xəm = əyri = hilali; seyd = ov, qüllab = çəngəl = balıq tutma çənbəri.

Nişanə 1: "Şövq":

A – Şövq, bu beytdə aşiqi hicran halında vüsala çatdıran haldan ibarətdir.[1]

B – Mütəal məhbubun ərəfəsini itirəndən sonra tapmaq məstliyindən nişanədir.[2]

Nişanə 2: "Sine" – qurbanlıq məqamına hazırlıq görən yaralanmış ürəkdən nişanədir.[3]

Nişanə 3: "Əhbab":

A – "Nari-məhəbbət"də yetişib sınaqdan çıxan aşiqdən işarədir.

B – Yalnız mütəal məşuqu fikirləşən aşiqdən ibarətdir.

Nişanə 4: "Zülfün xəmi" – ilahi sirlərdən nişanədir.[4]

Nişanə 5: "Ərbabi vəfa" –"ələst" əhdinə [5] əməl etmiş aşiqlərdən ibarətdir.

**Anlam:** Ey gözəl məhbub, sənin cəfalarını vəfalarından fərqləndirməyən "ələst" əhdinə əməl etmiş aşiqlər hicran həbsində də vüsaldan məhrum deyillər, beləliklə, onların qəlbi bəla toruna düşməyi canan ərəfəsinə yaxınlaşmaq dilərkən, hicran acılığını da vüsal şirinliyi kimi alqışlayır.

Beyt 2: **Mehrabdə şəkli-xəm-əbruyi-lətifin,**
**Vacib bu cəhətdən hamıya səcdeyi-mehrab.**

Sözlük: Mehrab = imam cümənin məsciddə namaza durduğu yer = məclisin yuxarı başı, xəm = əyri = hilali

Nişanə 1: "Mehrab" – ürəyi özünə məşğul edən məqsəddən nişanədir.

Nişanə 2: "Əbru" – mütəal məhbubun camalını örtən qəbz və qələbə sifətlərindən nişanədir.

Nişanə 3: "Lətif" – "əbru" nişanəsinin ürəklərə nüfuz etmə sifətindən ibarətdir.

---

[1] Qəzəl 24, beyt 6 .
[2] Fərhənge-istelahat və təbirate-ürfani.
[3] Qəzəl 27, beyt 4, nişanə 2
[4] Fərhənge-təbirate ürfani.
[5] Qəzəl 19, beyt 4

**Qeyd** 1: *Əbru şəkilcə mehraba oxşar olduğuna görə müqəddəsliyə eyham edən nişanədir.*

**Qeyd** 2: *Kamana, yaxud dairənin 1/4 - nə oxşar olduğuna görə mütəal məbudun başına dolanmağa (təvaf) eyham edən nişanədir.*

*P – Başa dolanmağa eyham edərək ürfani heyranlığı və sərgərdanlığı təlqin edir.*

*T – Hilali olduğuna görə boyun əyməni hörmət etməyi, həm də məcazi özlüyü və mənliyi təhqir etməyi təlqin edir.*

*Nişanə 4: "Səcdə" – hörmət göstərməkdən, həm də başda olan məğrurluğu torpağa tapşırmaqdan nişanədir.*

Anlam: Ey gözəl məhbub, mehrab sənə hörmət göstərmək qəsdi ilə əyilmişdir, elə buna görə də özünə hörmət qazanmışdır və camaat onun bərabərində səcdəyə durur.

**Qeyd**: *Mehrab sözünün bir mənası da müharibə meydanı olduğuna rəgmən camaat namaz qılmaq halında özlərinin xətərnak iti nəfsləri ilə, yaxud zahiri mənlikləri ilə mübarizəyə məşğul olurlar. Buna görə də mehrab mütəal məbudun əbru (qəhr-qələbə) sifəti kimi əngəl həyatın qanını tökəndir, nəhayət müqəddəs və hörmətlidir.*

Beyt 3: **Sözüm der idim şəm sana eyləyə rövşən,**
**Nəzzareyi-ruxsarinə yox şəmdə həm tab.**

Sözlük: Rövşən = işıq = aydın = bəyan;
nəzzarə = tamaşa = nəzər etmək;
ruxsar = camal = surət.

Nişanə 1: "Şəm" – ilahi cilalar ətəşilə dolu ürəkdən nişanədir.

Nişanə 2: "Ruxsar" – ilahi camaldan, yaxud vəhdət günəşindən nişanədir.

Anlam: Ey mütəal məbud, ürəyim ilahi cülalər ətəşilə doludur, ancaq yenə də sənin camalını görməyə və üzbəüz hacətimdən söz açmağa mənim istedadım yoxdur.

Beyt 4: **Xurşid cəmalindən o məh saldı niqabın,**
**Sübh oldu dur ,ey bəxt ,nədir bunca şəkərxab.**

Sözlük: Xurşid = günəş; məh = ay; şəkərxab = şirin yuxu.

Nişanə 1: "Xurşidcəmal" – ötən beytdə qeyd olunmuş rüxsardan ibarətdir.

Nişanə 2: "Məh " – mənəvi nurun maddi güzgüdə, yaxud vəhdətin kəsrətdə əks etdirilməsindən nişanədir.

Nişanə 3: "Sübh" – kəsrət əngəllərindən kənar olmaq, yaxud təcrid mövqeiyyətinə nail olmaqdan nişanədir.

Nişanə 4: "Bəxt" – aşiqin istedadından əlavə onu ilahi cazibələrə nail etməkdən nişanədir.

Nişanə 5: "Şəkərxab" – qəflət yuxusundan nişanədir.

Anlam: Ey Füzuli, mehriban məhbub, ötən beytdə qopan nalələrə rəhm edərək şühud nurunu ehsan etdi. Amma bütün vücudu ürək döyüntüsündə məğlub etməsən və başdan-başa atəşlənməsən o təcəllidən bəhrələnmək imkanını tapa bilməzsən.

Beyt 5: **Dün sübh yetirdim fələkə mövei-sirişkim,**
**Qərq etdi fələk üzrə olan ənncümü girdab**

Sözlük: Sirişk = göz yaşı,
əncüm = ulduzlar,
girdab = dənizin, yaxud arxın dərin yeri.

Nişanə 1: "Sübh" – mücərrədlik mövqeiyyətindən nişanədir.

Nişanə 2: "Fələk " və "əncüm" – dünyəvi iqtidarlar və üstünlüklərdən nişanədir.

Nişanə 3: "Mövei sirişk":

A – şövq biqərarlığında törənmiş istedad və istiqamətdən nişanədir.

B – zahiri-məni selə suya verərkən batini-məni üzə çıxarmaqdan nişanədir.

Nişanə 4: İkinci misra aşiqin mənəvi istedad və iqtidarından nişanədir.

Anlam: Ətəş və döyüntü dənizində qərq olduğuma görə qürb və şühud istedadına nail oldum.

Beyt 6: **Saqi ,məgər ol ləl sözün der meyi-nabə**
**Kim, düşdü ayağına, əlin öpdü meyi-nab.**

Sözlük: Nab = xalis = məhz

Nişanə 1: "Saqi " – özünü kamal zirvəsinə qaldırmış mürşiddən, yaxud mənəvi muştuluq gətirən ilahi vasitələrdən, ya da Həzrəti Cəbraildən nişanədir.

Nişanə 2: "Ləl" – mürşidin ilahi cilaları ilə dolu ürəyindən nişanədir.

Nişanə 3: "Meyi-nab" – məcazi mənliyə və dünyəvi ilgilərə üstün gələn əhval-ruhiyyədən nişanədir.

Anlam: Yəqinən həzrəti-mürşid ilahi sirlər ilə dolu ürəyini nişan verdi ki, dünyəvi üstün əhval-ruhiyyələr (meyi-nab) ona hörmət göstərərkən məğlub oldular.

Beyt 7: **Cəmiyyəti-əsbabə könül vermə, Füzuli**
**Kim, təfriqədir xatirə, cəmiyyəti-əsbab.**

Sözlük: Cəmiyyət = cəmləşmə, əsbab = səbəblər = vasitələr

Nişanə 1: "Əsbab" – ariflərin fikrincə yaradıcı məhbub ilə yaradılmış insanlar arasında mövcudlugu göstərən vəsilələrədən ibarətdir, bu vəsilələr, yaxud vasitələr o şeylərdir ki, fəlsəfə onların varlığını başqa bir varlıqla, yoxluğunu isə başqa bir yoxluqla məşrut bilir, beləliklə, səbəblər fəlsəfi illətlərdən ibarətdirlər.

Hər bir salik və aşiq səbəbin işini səbəbkardan bilməsə yaxud səbəbdə səbəbkarı görməsə, vəhdaniyyət inkarına yaxud "şirk" kafirliyinə giriftar olur. Elə buna görə Hafiz buyurmuşdur:

به کوی میکده هر سالکی که راه دانست          دری دگرزدن اندیشه تبه دانست

Yəni, Meykədə qapisından, ya da münacat qapısından başqa bir qapını döymək, yaxud mütəal məbuddan baçqasını yardımçı bilmək kafirlikdən ibarətdir. Beləliklə, salikə və aşiqə iki mərifət gərəklidir:

A – "Birinci mərifət" – aşiqi mənəviyyat yoluna hidayət edən mərifətdir.

B – "İkinci mərifət" – aşiqi ilahi məqsəd, yaxud vəhdət mənşəyi ilə tanış edən mərifətdən ibarətdir.

Birinci mərifəti qazanmış aşiq ilahi cazibələrə, yaxud canan ərəfəsinə hidayət edən ətirə yetişir, demək məqsədi vahidliyi ilə tanış olmaq ikinci mərifətə aiddir. Bu mərifət ilahi vahid məqsəddən başqa məqsədlərin qeyri müstəqil səbəblər olmasını aydın göstərərkən, yalnız yaradıcı vahid səbəbkara ürək bağlamağı lazım bilir.

Mövləvi ruzi qorxusundan özünü dağ-daşa salan və bir çox düz yoldan çaşan insanlara özünün bir ibrətamiz hekayəsində belə dərs öyrətmək istəyir:

"..., ruhları qüvvələndirən zəhmətsiz və səbəbsiz ruzi, peyğəmbərlər bəyənən səbəbsiz ruzidən ibarətdir. İnsanlar peyğəmbərlər ilə və nəhayət ruzi verən mehriban iqtidarlı məbud ilə düzgün tanış ola bilsələr, özlərini bir belə səbəblərə və vəsilələrə əsir etməzlər, əfsuslar olsun ki, insanların çoxu səbəbləri səbəbkar Tanrıya şərik edərkən səbəbsiz yerə iqtidardan qəflətdə qalmışlar.

Peyğəmbərlərə möcüzə iqtidarını bağışlayan, səbəbsiz mənalar tanışlığıdır.

Onlar səbəbsiz, vasitəsiz dənizlər yardılar, toxum səpməmiş hasil götürdülər, ... və habelə Qurani-Kərim başdan-başa səbəbləri, illətləri tərk etmədən söz açır, ... ovçunun təqlid etdiyi o quş səsi özünün ruzi səbəbi bilərkən tovlanıb tora düşür. İnsanları isə tovlayıb yolundan

çaşdıran yalnız səbəblərdir. Beləliklə, Mövləvi səbəblərə söykənən alim insanı mütləq cahil bilib.[1]

Sədi Şirazi isə səbəbsiz iqtidarları, bu müəllifi tərcümə etdiyi kimi bir hekayədə belə izah edir:

Mən ilə bir əhli-namaz və dua    Yetişdik qərib ölkədə bir suya.
Gəmi sahibi aldı bir dirhəmi[2],    Məni mindirib başladı yol gəmi.
Pulu olmayıb qaldı yol yoldaşım,    Qəmində onun daşlanıb göz yaşım
Gülüb aglamağıma ol mübtəla    Dedi səbrdən çıxma, ey bavəfa.
O ki, od için gülşənə döndərər,    Məni dalğaya mindirib, göndərər
Su üzrə sərib canəmazın[3] o dəm    Oturdu onun üstdə bidərdü-qəm.
Gecə yatmadım, sübh ol seyyidi    Gözüm gördü sahildə, güldü, dedi:
Çolaqlar kimi taxta[4]gətdi səni    Xuda öz ayağımla, gətdi məni
Özün eşqdə qürb edib hər bəşər    Gecə-gündüz Allah onu hifz edər.
Nədən etməsin əhli-məna nəzər    Ki aşiq od içrə, su içrə gəzər[5]

Anlam: Ey Füzuli, səbəblərə ürək bağlamaq və onları yardımçı bilmək, səni səbəbkar məbud yardımından xəbərsiz və məhrum edər.[6]

[1] روزی بی رنج می دانی که چیست    قوت ارواح است و ارزاق نبیست
چسم بر اسباب، از چه د.ختیم    گرز خوش چشمان کرشم آموختیم
هست بر اسباب، اسبابی دیگر    در سبب منگر، در آن افکن نظر
انبیا، در قطع اسباب آمدند    معجزات خویش ، بر کیوان زدند
بی سبب، مربحر را بشکافتند    بی زراعت، چاش گندم کاشتند
همچنین زآغاز قرآن، تا تمام    رفض اسباب است و علت و السلام
از صیادی بشنود، آواز طیر    مرغ ابله می می کند، آن سوی سیر
نقد را از قلب نشناسد، غویست    هین از او بگریز، اگرچه معنویست
این چنین کس گر، ذکی مطلقست    چونش این تمیز نبود، احمفست
" "مثنوی معنوی مولوی، دفتر 3 ،بیت 2550 و...

[2] Dirhəm = gümüş pul

[3] Canamaz = namazlıq

[4] Taxta - gəmiyə istiarədir

[5] Bustani-Sədi, bab 3

[6] Dünyanın işi bir səbəb və illətə bağlı olduğuna görə, dünyəvi və məcazi səbəbi olmayan möcüzəni tanımaq mümkünsüzdür.

## Q Ə Z Ə L 2 9

**(1) Sübh çəkmiş çərxə, çalmış daşə tiğin afitab,**
**Zahir etmiş ol məhi-dəllakə eyni-intisab.**

**(2) Dəmbədəm təhriki-tiğindən bulur başlar səfa,**
**Öylə kim,su movc urub zahir qılır hər dəm hübab.**

**(3) Hər səri-muyimdə bir baş olsa muyi-sər kimi,**
**Kəssə varım tiği-xunrizindən etmən ictinab.**

**(4) Kəşfi-əsrari-məlamət cövhəri-tiğindədir**
**Kim, alır başlardakı sevda cəmalından niqab.**

**(5) Qüssəsindən başimin qıl kimi incəlmiş tənim**
**Kim, tənimlə tiği ortasında başımdır hicab.**

**(6) Tiği-çabuk seyrinə ahuyi-Çin dersəm nola,**
**Seyr qıldıqca tökər səhrayi-Çinə müşkinab.**

**(7) Muyi-julidəmlə tiğindən ümidim kəsməzəm**
**Ey Füzuli ,xali olmaz bərqi-lamedən səhab.**

Beyt 1: **Sübh çəkmiş çərxə, çalmış daşə tiğin afitab,**
**Zahir etmiş ol məhi-dəllakə eyni intisab.**

Sözlük: Aftab = günəş məh = mah = ay

Nişanə 1: "Sübh" – maddi qaranlığı, yaxud kəsrət küdurətini aradan qaldıran mücərrədlik məqamına movqeiyyət törədən nişanədir.[1]

Nişanə 2: "Çərx" və "daş" – kəsrətdəki enerji və əhatədən nişanədir.

Nişanə 3: "Məhi-dəllak" – kəsrət bağrını yaran vəhdət cilalarından nişanədir.

Nişanə 4: "Eyni intisab"– qəhrlər, lütflər və digər müxtəlif ilahi sifət və cilvələri vahid mənşəsini təlqin edən nişanədir (vəhdət).

Anlam: Gecəni dünyəvi məşğuliyyətlərdən kənar xəlvət mövqeiyyətini təcrid məqamına "eyn" qəbul edib cilalarını ehsan edən canan, sübhü isə hələ ictimai işlərə və maneələrə qoşulmamağına, həmçinin zamanın doğum məsumluğuna görə güzgü edib gecə ehsan etdiyi nuru ona təkrar etdirir.[2]

**Qeyd**: *Bu qəzəl əvvəldən axıra kimi üryanlıq və qurbanlıq məqamını təbliğ etmək istəyir*.

Beyt 2: **Dəmbədəm təhriki-tiğindən bulur başlar səfa**
**Öylə kim ,su movc urub zahir qılır hər dəm hübab.**

Sözlük: Hübab = köpük

Nişanə 1: "Təhrik" – hərəkət verməkdən və hərəkət həyatından bir nişanədir.

Nişanə 2: "Tiğ" – A – maddə bağrını yaran ilahi nurdan nişanədir.

B – qurbanlıq məqamına nail edən mənəvi səbəbdən nişanədir.

Nişanə 3: "Başlar" – A – başlar, idraklar və fikirlərdən nişanədir.

B – mənəvi həyata mane törətmiş maddi həyatlardan nişanədir.

Nişanə 4: "Səfa" – bu beytdə,aşiqin zehni açıqlıq qüvvəsi ilə axtardığı istəklisini öz içərisindən zəhmətsiz tapmaq nişanəsidir.

Anlam: Köpük içərisindən zahiri varlıq havasını boşaldarkən aşiqlər özünü yox edib, dənizə qatıçdıran kimi başlarını (həyatlarını) məşuq ərəfəsində qurban etmişlərsə də vəhdət dənizinə, yaxud əbədiyyətə qoşulmuşlar.

Beyt 3: **Hər səri-muyimdə bir baş olsa muyi-sər kimi,**
**Kəssə varım tiği-xunrizindən etmən ictinab.**

[1] Qəzəl 25, beyt 1
[2] Qəzəl 25, beyt 1

Sözlük: Səri-mu = tükün başı, muyi sər = başın tükü, xunriz = qan tökən

Nişanə 1: "Baş " – bu beytdə təbii həyatdan nişanədir.

Nişanə 2: "Tiğ-xunriz " – qurbanlıq məqamına hazırlayan qəbz və bəst qələbələrindən nişanədir.[1]

Anlam: A – Başımın tükləri cayca canım olsa belə hamısını canan ərəfəsində qurban edərəm.

B – Həkim məhbub min yol qəmzə və qəhr ilə canımı alsa da, bir yol giley, yaxud şikayət etmərəm.

Beyt 4: **Kəşfi-əsrari-məlamət cövhəri-tiğindədir**
**Kim ,alır başlardakı sevda camalından niqab.**

Sözlük: Kəşf = açıb-ağartmaq = aşkara çıxarmaq; əsrar = sirlər

Nişanə 1: "Kəşf " – A – görünməz mənəvi mərtəbələrin və batini həqiqətlərin salik gözünə görünməsindən nişanədir.

B – gizli mərtəbələrin və görünməz mənaların maddi və təbii hicabların arxasında görünməsindən ibarətdir.

**Qeyd**: *Ariflər iki çeşid kəşfi təsdiq və təbliğ etmişlər:*

*A – "Mənəvi kəşf" – fiziki vəsilələr və hissi qüvvələrə sığmayan cism ilə ruh arasındakı mənalardan ibarətdir.*

*B – "Suri kəşf " – yaxud zahiri və səthi kəşf maddi vasitələr və cismi qüvvələrlə idrak olunan, o cümlədən eşidilən və görünən gizli həqiqətlərdən ibarətdir.*

Nişanə 2: "Məlahət" – heç bir elm və fikir nəhayətini dərk etməyən ilahi kamaldan nişanədir.

Nişanə 3: "Cohəri-tiğ " – qəbzlər və qəhrlərin mahiyyət və hikmətini eyham edən nişanədir.

Nişanə 4: "Sevda camalından niqab açmaq " – aşiqin elmi və əqli ölçülərini batil etməkdən və onun qeyri-müstəqilliyini və məmlüklüyünü[2] özünə göstərməkdən ibarətdir.

Anlam: Ey gözəl məhbub, sənin hikmət mənşəli qəhr və qələbələrin dünyəvi təcrübələri və bilikləri batil edərək elm və təcrübədə üstün mənalardan xəbər verir.

Beyt 5: **Qüssəsindən başimin qıl kimi incəlmiş tənim**
**Kim, tənimlə tiği ortasından başimdir hicab.**

[1] Qəzəl 1, beyt 6

[2] Qəzəl 1, beyt 6, nişanə "hərfi-vücud".

Nişanə 1: "Qüssə " - üryanlıq və qurbanlıq mərhələsində gərəkli istiqamət və istedad qazanmağın çətinliklərindən nişanədir.

Nişanə 2: "Baş" - dünyəvi həyatdan nişanədir.

Nişanə 3: "İncəlmiş tən" - dünyəvi əlaqələri qat – qat soyub üryanlıq və mücərrədlik məqamına hazırlaşmış aşiqdən nişanədir.

Anlam: Təbii və maddi əlaqələri, ümumiyyətlə tərk edərkən qeyri-təbii, yaxud mənəvi aləmə intiqal etmək ərəfəsinə yaxınlaşmışam, ancaq quru bit nəfəsin dünyəvi həyatdan iz və nişan olduğuna görə bu intiqala mane olur.

Beyt 6: **Tiği-çabuk seyrinə ahuyi-Çin dersəm nola**
**Seyr qıldıqca tökər səhrayi-Çinə müşki nab.**

Sözlük: Çabuk seyr = sürətli seyr edən = iti; səhra = çöl = biyaban.

Nişanə 1: "Tiğ" - aşiqi özlüyündən ayıran ilahi qəhr və lütf sifətlərindən nişanədir.

Nişanə 2: "Çabuk seyr " - tiğ nişanəsinin gözəlliklə bağlı nüfuz və qələbəsindən ibarətdir.

Nişanə 3: "Ahuyi çin" və "Səhrayi çin" - dünyəvi təcrübədən üstün mənəvi gözəlliyi təcrübələşdirən təmsildən ibarətdir.

Anlam: Ey mütəal məhbub, sənin can alıcı qalib cilvələrin (qəhr və lütf ) gözəl və mahiranə seyr edən bir ahu kimi könüllər aləminə yayılan ətirlər və ilgilər bağışlayır.

Beyt 7: **Muyi-julidəmlə tiğindən ümidim kəsməzəm,**
**Ey Füzuli, xali olmaz bərqi-lamedən səhab**.

Sözlük: Muy = tük; julide = pərişan = pırtlaşıq;
bərqi-lame = şimşək = parlaq bərq; səhab = bulud.

Nişanə: "Muyi julide" - cismani həyatın, xüsusilə, əql və idrakın pərişanlığından nişanədir.

Anlam: Ey həkimi-məhbub, əql və idrakım pərişan olsa da hələ dünyəvi təhlükələr və qaranlıqlarda sənin rəhmət və hikmətindən saçan can alıcı cəlalərə mərifətim vardır.

## Q Ə Z Ə L 30

**(1) Sübh salıb mah rüxündən niqab**
**Çıx ki, təmaşayə çıxa afitab.**

**(2) Rişteyi-canım yetər, et pürgireh,**
**Salma səri-zülfi-səmənsayə tab.**

**(3) Məst çıxıb, salma nəzər hər yanə,**
**Görmə rəva kim, ola aləm xərab.**

**(4) Kəsmə nəzər canibi-üşşaqdən,**
**Naleyi-dilsuzdan et ictinab.**

**(5) Şamlər əncüm sayıram sübhə tək,**
**Ey şəbi-hicrin mənə ruzi-hesab.**

**(6) Duzəxə girməz sitəmindən yanan,**
**Qabili-cənnət degil əhli-əzab.**

**(7) Saldı ayaqdan qəmi-aləm məni,**
**Ver mənə qəm dəfinə, saqi, şərab.**

**(8) Rəhm qıl üftadələrin halına,**
**Hiç gərəkməzmi sənə bir səvab?**

**(9) Yar sual etsə ki, halın nədir,**
**Xəstə Füzuli, nə verirsən cavab?**

Beyt 1: **Sübh salıb mah rüxündən niqab**
**Çıx ki, təmaşayə çıxa afitab.**

Sözlük: Mah = ay = məhtab; rüx = üz = surət = yanaq; aftab = günəş.

Nişanə 1: "Sübh" - aşiqin dünyəvi məşğuliyyətlərdən kənar, təcrid müqəddiməsi törədən xəlvət şəraitindən ibarətdir.

Nişanə 2: "Mah rüx" - qara kəsrəti güzgü edən vəhdət cilalarından ibarətdir.

Nişanə 3: "Aftab" bu beytdə, dünyəvi etibarlar və üstünlüklərdən nişanədir.

Anlam:

A – Ey aşiq cəhd elə ki, maddi dünya səmasının günəşi heyran qoymuş ilahi camalından parlayan cəlalardan xəbərsiz qalmayasan.

B – Ey mürşüd, yaxud ey camalında ilahi hüsnlərdən nur və nişanə olan yer adamı, sübhün mücərrəd movqeiyyətində nurani üzündən niqab açmaq ilə səmanın parlayan günəşini heyrətə salıb, onu öz naqisliyindən və nursuzluğundan xəbərdar et.

**Qeyd**: *Beyt, dünyəvi üstünlüklərin məna qarşısında etibarsızlığını təlqin etmək istəyir.*

Beyt 2: **Rişteyi-canım yetər, et pürgireh,**
**Salma səri-zülfi-səmənsayə tab.**

Sözlük: Pürgireh = düyünlü = düyün-düyün; sər = baş = uc;
səmən = yasəmən, səmənsa = yasəmən gülünə oxşar = yasəmən kimi;
tab = çin = qıvrılmaq = burulmaq.

Nişanə 1: "Pürgireh" və "tab":

A – tənbih etməkdən nişanədir.

B – qürb və vüsaldan nişanədir.

Nişanə 2: "Zülf": vəhdət nöqtəsi ilə əlaqədar kəsrətdən nişanədir.

Anlam:

A – Ey həkimi-məhbub, qəhr və qəzəblə aşiqi tənbih etmək qəsdin olsa da kəsrət vasitələrindən ətrini müzayiqə etmə.

**Qeyd**: *Tənbih, cərimə etməkdən və cəriməni günahdan paklanmaqdan nişanə olduğuna görə aşiq tənbih istəyərək paka çıxmaq, layiq olmaq və qürb tapmaq diləyir, elə buna görə də kəsrətdən güzgü və hidayət şəraiti yaratmağı xahiş edir.*

Anlam:

B – Ey mürşid, yaxud ey dünyəvi canan,  canımı riştə kimi zülfünə bağlayıb dəmbədəm dügün vurmağınla:

A –  onun zülfə bağlılığını möhkəm et.

B –  onu yaxınlıq, yaxud "qürb" məqamına nail et.

**Qeyd**: *Düyünün çoxluğy riştənin gödəlməyinə və nəhayət fasilənin azalmağına səbəb olur, buna görə də pürgireh qürb və vaslə də eyham edir.*

Beyt 3: **Məst çıxıb, salma nəzər hər yanə,**
**Görmə rəva kim, ola aləm xərab.**

Nişanə 1: "Məst" - bu beytdə gözəl məhbubun "istiğna" və "səmədiyyət" sifətlərilə aşiqi heyran və sərgərdan edən təcəllilərdən nişanədir.

**Qeyd** 1: *"İstiğna" və "samədiyyət" içi doluluqdan, içi doluluq kamaldan və kamal hacətsizlikdən nişanədir.*

**Qeyd** 2: *Məşuq istiğna məqamında aşiqin nalələrinə baxmayaraq onu müxtəlif bəlalar ilə mənlik afiyətindən, yaxud mənfi sağlığından ayırır.*

Anlam:

A – Ey gözəl məhbub, öz kamil hüsnünü aşkar etmək ilə naqis və aciz dünyanın xarab olmasına razılıq vermə.

**Qeyd** 1: *Anlamın eyhamı şərif ayəyə əsaslanmasından ibarətdir ki, buyurur:*

و لمّا جآء موسى لميقاتنا وكلّمهُ ربُّهُ ، قالَ ربِّ ارنى انظر اليکَ ، قالَ لن ترانى و لاكن انظر الى الجبل فان استقرّ مكانهُ فسوف ترانى فلما تجلّا ربهُ للجبلِ جعلهُ دكّاً و خرَّ موسى صَعِقا، ..[1]

*(və o zaman ki Musa yetmiş nəfər öz ümmətinin böyükləriylə birlikdə müəyyən vaxt vədələşdiyi məkana gəldi, mütəal məbud onunla danışdı, Musa ərz qıldı: Ey mənim Tanrım, özünü mənə açıq – aşkar ( o cür ki ümmət istəyir) göstər ki, səni hicabsız müşahidə edim. Mütəal məbud buyurdu: "Məni heç vaxt görməyəcəksən, bax o dağa, əgər o dağ (öz möhkəmliyi ilə) yerində dura bilsə, sən də məni görə bilərsən. Sonra mütəal məbudun təcəlla nuru dağa saçıldı, dağ parçalanıb tikələndikdə Musa huşsuz torpağa düşdü və huşa gəldikdə dedi: "Ey mənim Tanrım sən pak və üstünsən və mən tövbə edərək sənə birinci iman gətirən oldum).*

---

[1] Quran, Əraf surəsi, ayə 143

*İnsanlara, ona görə mütəal məbudun adını cəsarətlə çəkirlər ki, o adın Tur dağını parçalayan heybətindən xəbərsizdirlər*[1].

**Qeyd** 2: *Quran özü isə ilahi bir təcəlla olduğuna görə elm və əqldən üstün kamillik nişanəsidir, elə buna görə də şərif ayə buyurmuş:*

" لو انزلنا هذا القرآن علی جبل لرایته خاشعاً متصد عامن خشیه الله و تلک الامثال نضربها للناس لعلهم یتفکرون"[2]

*(Biz Quranı dağa nazil etsəydik görərdün ki dağ Allahın qorxusundan (heybətindən) zəlillik göstərərkən parçalanır və...)*

Anlam:

A – Ey gözəl məbud, kamil hüsnünü əql əhlinə göstərmə, yoxsa onlar da aşiqlər kimi dünyanı yaddan çıxarlar, onu özbaşına buraxarlar, dünya abadlığına çalışmazlar və nəhayət dünya xarab olar.

B – Ey iqtidarlı məhbub, aşiqlərin məmlüklüyünü, acizliyini nəzərə alaraq onların uzlərini və dünyalarını istiğna təcəlliləri ilə təhlükəyə salma.

Beyt 4: **Kəsmə nəzər canibi-üşşaqdən,**
**Naleyi-dilsuzdan et ictinab.**

Sözlük: Canib = cəhət = tərəf = tərəfdarlıq; üşşaq = aşiqlər; delsuz = ürək yandıran.

Nişanə: "İctinab" - bu beytdə rəhm etməkdən nişanədir.

Anlam: Ey mütəal məhbub, qəbz və həsrət atəşində qəlbi alovlu aşiqlərə rəhm qılmasan onların nalələri bütün dünyanı viran edər.

Beyt 5: **Şamlər əncüm sayıram sübhə tək,**
**Ey şəbi-hicrin mənə ruzi-hesab.**

Sözlük: Əncüm = ulduzlar; şəbi-hicr = hicran gecəsi;
Ruzi-hesab = qiyamət günü.

Nişanə: "Əncüm saymaq" - gecə oyaq qalmaqdan və intizar çəklməkdən nişanədir. Bu məqamda ustad Şəhriyar buyurmuş:

*Ulduz sayaraq gözləmişəm hər gecə yari,*
*Gec gəlmədədir yar, yenə olmuş gecə yari.*

Anlam: Ey mütəal məhbub, hicran gecəsi (təcəlli və şühud nurundan məhrumluq) qiyamət günü kimi əzab vericidir.

Beyt 6: **Duzəxə girməz sitəmindən yanan,**

---

[1] Qəzəl 1, beyt 1, nişanə "Ənar"

[2] Quran, Həşr surəsi, ayə 21

**Qabili-cənnət degil əhli-əzab.**

Sözlük: Duzəx = cəhənnəm; sitəm = zülm; cənnət = behişt bağı.

Anlam: Ey gözəl məbud, ilahi şühud və müşahidə həsrətində yanan bir aşiq cəhənnəm atəşinə yanmaz, çünki, eşq atəşi də su kimi paka çıxardan səbəbdir.

**Qeyd**: *İkinci misra, eşq əhlinin məşuq qarşısında məmlüklük və həqirliyini və günahkar əql əhlinin behiştə layiq olmadığına eyham edir*.

Beyt 7: **Saldı ayaqdan qəmi-aləm məni,**
**Ver mənə qəm dəfinə, saqi, şərab.**

Nişanə 1: "Birinci misra":

A – aşiqin taqətsizliyindən nişanədir.

B – aşiqin özlüyündən ayrılarkən mənəvi səciyyə və ilahi istedad tapmağından nişanədir.

Nişanə 2: "Qəm" - tələb və atəş biqərarlığından nişanədir. Həm də, maddi maneələr törədən müşküllərə və zəhmətlərə eyham edir.

Nişanə 3: "Saqi" - həzrəti-mürşüddən yaxud həzrəti-Cəbraildən, ya da digər ilahi vasitələrdən nişanədir.

Nişanə 4: "Şərab" - kamal əhlinin qəlbinə girmiş ilahi ilgilərdən nişanədir.

Anlam: Ey saqi, ilahi cilvələrlə məni istiqamətləndir, yoxsa bəlalar önündə məğlubluğa giriftar olaram.

Beyt 8: **Rəhm qıl üftadələrin halına,**
**Hiç gərəkməzmi sənə bir səvab?**

Sözlük: Səvab = ehsan = əvəz = müzd = yaxşı əməlin ilahi müzdü.

Anlam: Ey həkimi-məhbub, sənin "istiğna" və "səmədiyyət" sifətlərin savaba hacətsiz olduğunu aydın nişan verir, ancaq giriftar aşiqə rəhm etmək ilə onu bir savaba nail eylə.

Beyt 9: **Yar sual etsə ki, halın nədir,**
**Xəstə Füzuli, nə verirsən cavab?**

Nişanə: "Xəstə":

A – xəstə, aşiqin istedadsızlığndan nişanədir.

B – xəstə, aşiqin qurbanlıq məqamına hazırlaşdığı müqəddimədən nişanə olduğuna görə onun istedadını təlqin edir.

Anlam: Ey Füzuli, mütəal məhbub sənin dualarını qəbul etsə, ondan layiqli bir hacət xahiş etməyə özünü hazırlamaq gərəkdir.

## Q Ə Z Ə L 31

**(1) Qaliba bir əhli-dil toprağıdır dürdi-şərab,**
**Kim, qılıb hörmət, binalər tutmuş ustündə hübab.**

**(2) Bərqü baran sanma kim, gördükcə ahü əşkimi,**
**Bilməzəm nəmdir mənim, ağlar mana, yanar səhab.**

**(3) Ey soran halım, bu istiğna sualından nə sud,**
**Halım eylərsən sual əmma eşitməzsən cavab.**

**(4) Dəşti-qəmdə xaki-qəbrim üzrə sərvi-girdbad,**
**Çəksə baş, ol sərvdən su kəsmə ey seyli-sərab.**

**(5) Yetməyib vəslinə ol Leylivəşin bir ömrdür**
**Mən kimi Məcnun olub səhrayə düşmüş aftab.**

**(6) Ol büt əbrusun qoyub mehrabə döndərməm üzüm,**
**Qoy məni, zahid, mana çox vermə Tanrıyçün əzab.**

**(7) Nəqdi-ömri bir sənəm eşqində sərf etdim tamam**
**Ey Füzuli, ah əgər səndən sorulsa bu hesab!**

Beyt 1: **Qaliba bir əhli-dil toprağıdır dürdi-şərab,**
**Kim, qılıb hörmət, binalər tutmuş ustündə hübab.**

Sözlük: Dürd = yağdan, yaxud şərabdan camın dibinə çökmüş qara maddə,

hübab = köpük

Nişanə 1: "Əhli del" – içərisini təbii bulaşıqlardan pak saxlamış və özündə ilahi cilaları əks etdirmiş mürşüd mənasındadır.[1]

Nişanə 2: "Dürdi-şərab" – aşiqin büsbütün dünyəvi cismi və zehni qüvvələrini məğlub etmiş ilahi əhval-ruhiyyədən nişanədir.

Nişanə 3: "Hübab" – dünyəvi varlığından qurtarıb, vəhdət dənizində məhv olmaq istedadına nailyyət tapmış vücuddan nişanədir.

Anlam: Maddi və müvəqqəti varlığı ölməz həyata çevirən mənəvi və ilahi batindən xəbər verir.

Beyt 2: **Bərqü baran sanma kim, gördükcə ahü əşkimi,**
**Bilməzəm nəmdir mənim, ağlar mana, yanar səhab.**

Sözlük: Baran = yağış; əşk = göz yaşı; səhab = bulud

Nişanə: "Ahü əşk" – atəş və su kimi içərini dünyəvi ilgilər bulaşığından təmizləyən biqərarlıqdan nişanədir.

Anlam: Mənim ahü əşkimi buluda, yağışa və şimşəyə oxşatmaq insafsızlıqdır, çünki, onlar mənim halıma ağlayan zəif səbəblərdirlər.

**Qeyd**: *Beyt mənəvi səviyyənin dünyəvi bərabərliklərə sığmaz olduğunu, həm də aşiq nəzərində dünyəvi iqtidarların zəif və həqir olmasına eyham etmək istəyir.*

Beyt 3: **Ey soran halım, bu istiğna sualından nə sud,**
**Halım eylərsən sual, əmma eşitməzsən cavab.**

Sözlük: İstiqna = toxluq = özünü tox tutmaq = naz = ehtiyacsızlıq

Sud = fayda = bəhrə

Nişanə: "İstiqna" – bu beytdə bəşəri istiqnadən yəni mənəvi mərifətlərə nail olmuş aşiqdən dünyəvi etibarları həqir sanmasından, beləliklə əql əhlinin nəsihətlərini və etirazlarını yersiz bilmək sifətindən nişanədir.

Anlam: Eşq aləmindən xəbərsiz insanların yüngül nəsihətləri kimi sualları da havayıdır.

Beyt 4: **Dəşti-qəmdə xaki-qəbrim üzrə sərvi-girdbad,**

---

[1] Qəzəl 13, beyt 1,(Ətvar)

**Çəksə baş, ol sərvdən sukəsmə ey seyli-sərab.**

Sözlük: Dəşt = çöl = biyaban; xak = torpaq; girdbad = qasırğa,
sərvi-girdbad = sərvə oxşar qasırğa,
sərab = əks etdirilmiş nur, yaxud hərarət ki, uzaqdan su kimi nəzərə çarpır

Nişanə 1: "Sərvi-girdbad" – dünyəvi imtiyazları – durumları bərbad edən eşq məna iqtidarından nişanədir.

Nişanə 2: "Seyli sərab" – ardı-arası kəsilməyən bəlalardan nişanədir.

Anlam: A – Ey eşq və məhəbbətə bağlı bəlalar, qəbrim üstünə şıdırğı yağış tək yağmaqla məni yada salın.

B – Ey bəlalar, su sərv ağacına həyat verib boy atmağına səbəb oldugu kimi, siz də mənim eşqə bağlı hekayəmə həyat və davam bağışlayın.

**Qeyd**: *Beyt eşq müsibətlərinin hörmətinə eyham edərək onlara minnətdarlıq göstərmək istəyir, çünki, həmin müsibətlər həm gözəl məhbubun əmr və ərəfəsilə əlaqədardır, həm də aşiqi kamala və vüsala tərbiyə edən səbəblərdir. Buna görə də imamlar, peygəmbərlər və Allahın özəl dostları bircə an da qəmsiz, bəlasız yaşamağa razılıq verməyiblər.*[1]

Beyt 5: **Yetməyib vəslinə ol Leylivəşin bir ömrdür**
**Mən kimi Məcnun olub səhrayə düşmüş aftab**.

Sözlük: Leylivəş = Leylaya oxşar; aftab = günəş

Nişanə 1: " Leylivəş" – A – Leylivəş, dünyəvi camalında mənəvi hüsnlərdən nişanə olan və məcazi aşiqi həqiqi aşiq edən gözəldən ibarətdir.

B – aşiqin naqis istedad və istiqamətini nəzərdə tutaraq, ilahi hüsnləri alçaq səviyyədə onun gözünə göstərməkdən nişanədir.

Nişanə 2: "Məcnun" – dünyəvi təcrübələri və təbiətşünas əqli həqir bilən aşiqdən ibarətdir.

Nişanə 3: "Aftab" – dünyəvi imtiyazların əla dərəcəsindən nişanədir.

Anlam: Həzrəti-mürşüdün, yaxud ilahi vasitələrin, ya da səmavi hüsnü olan yer adamının bir əsir kimi arxasına düşüb dolanan yalnız mən deyiləm, bəlkə günəş də o səmavı və nurani mərtəbəsilə mənim kimi onun arxasında dolanarkən feyz və ehsan umub, yalvar – yaxar edir.

Beyt 6: **Ol büt əbrusun qoyub mehrabə döndərməm üzüm,**
**Qoy məni, zahid, mana çox vermə Tanrıyçün əzab.**

---

[1] Qəzəl 23, beyt 1,(Bəla)

Sözlük: Büt; əbru = qaş;  mehrab = imam cümənin məsciddə namaza durduğu yer = məclisin yuxarı başı

Nişanə 1:  "Büt": A – əqli idrakı heyrətlə bir daş kimi qurudub işdən salan vahid məhbubdan nişanədir.

B – Vəhdət günəşinin nurunu təzahur etdirən kəsrətdən nişanədir.[1]

**Qeyd**: *Ariflər hər bir zərrədə yaradıcı məbudun ətrini, nurunu gördüklərinə görə hər zərrəyə büt demişlər.*[2]

Nişanə 2:  "Əbru"  –  mütəal məbudun həqiqətini gizlədən örtücü sifətlərinin bütün vücudlara durum və səciyyə bağışlayan nişanəsidir.

Nişanə 3:  "Mehrab" –  namazın, həm də digər ibadətlərin zahiri adab və qanunlarından başqa bir qanunu inkar etmək mövqeiyyətindən nişanədir.

Nişanə 4:  "Zahid" –  bu beytdə ibadətini – idrakını "mehrab" məhdudluğunda həsr etmiş dini rəhbərdən ibarətdir.[3]

Anlam:  Ey zahid, heyrət sərgərdanlığında əqlini və idrakını bərbad etmiş və aşiqə məntiq və dəlillər sözü açmaqla özünü yersiz zəhmətə giriftar etmə.

**Qeyd**: *Mənəvi qanunlardan xəbərdar olan dünyəvi qanunlardan xəbərsiz olar.*

Beyt 7: **Nəqdi-ömri bir sənəm eşqində sərf etdim tamam**
**Ey Füzuli, ah əgər səndən sorulsa bu hesab!**

Nişanə:  "Sənəm" sənəm, ötən beytdə qeyd olunmuş "büt" nişanəsindən ibarətdir.

Anlam:  Ey bütün ömrünü eşq səviyyəsində sərf etmiş Füzuli, qiyamət günü əql və məntiqdən sual etsələr cavabın nədir ?

---

[1] Qəzəl 27,beyt 2

[2] Fərhəngi-istilahat və təbirati ürfani.

[3] Qəzəl 9 beyt 2.

## Q Ə Z Ə L 32

**(1) Qılsa vəslin şamımı sübhə bərabər yox əcəb**
**Rəsmdir fəsli-bahar olmaq bərabər ruzü şəb.**

**(2) Gün ki, sayən düşdüyü yerdən durar, bir vəchi var,**
**Gəlsə aliqədrlər fəqr əhli durmaqdır ədəb.**

**(3) Olmadan meyxaneyi – eşqində məsti – cami – zövq,**
**Düzmədi bəzmi – fələkdə Zöhrə qanuni –tərəb.**

**(4) Cənnəti – vəslindir ol məqsəd ki, iman əhlinə,**
**Qılsa Həqq ruzi cəhənnəm atəşi, oldur səbəb.**

**(5) Qaliba məqsəd vüsalındır ki, dün gün durmayıb,**
**Çərx sərgərdan gəzər, bilməz nədir rəncü təəb.**

**(6) Bəsteyi - zənciri – zülfündür nəsimi – tərməzaç,**
**Təşneyi – cami – vüsalındır mühiti – xüşkləb.**

**(7) Qılma feyzi – neməti – vəslin Füzulidən dəriğ,**
**Yoxdur özgə məqsədi, səndən səni eylər tələb.**

Beyt 1: **Qılsa vəslin şamımı sübhə bərabər yox əcəb ;**
**Rəsmdir fəsli-bahar olmaq bərabər ruzü şəb.**

Sözlük: Vəsl = vüsal, ruz = gündüz, şəb = gecə

Nişanə 1: "Şam" – bu beytdə kəsrət küdurətinin şühud məqamına mane olmasından nişanədir (Hicran qaranlığı).

Nişanə 2: "Sübh" – bu beytdə kəsrət güzgüsündə vəhdət nurunu əks etdirən mərtəbədən nişanədir.

Nişanə 3: Birinci misra "bərabər" lik, fərsizlik, mənasını ifadə etdiyinə görə vəhdət məqamına eyham edən nişanədir.

**Qeyd**: *Mövcudların çoxsaylı olması onların zahirdə, batində, məkanda, məfkurədə və habelə digər səciyyəvi sifətlər və ruhiyyələrdə fərqli olmasını aydın nişan verir, beləliklə, "fərq" heç olmasa ikilikdən nişanədir və ikilik kəsrətin ilk əlamətidir.*

Nişanə 4: "Bahar" – batini baharına eyham edərək, aşiqin içəridən dəyişməsini və yeni bir heyət və həyat tapmasını təlqin edir.

Anlam: Ey mehriban məbud, təbii baharda gündüzlə gecə bərabər olduğu kimi, şühud baharında hicran əzabı çəkdiyim qədər vüsal məstliyini ummağın heç də yersiz deyil.

Beyt 2: **Gün ki, sayən düşdüyü yerdən durar, bir vəchi var,**
**Gəlsə aliqədrlər fəqr əhli durmaqdır ədəb.**

Sözlük: Vəch = dəlil = qəsd = niyyət; aliqədr = şanlı = alicənab = alişan; fəqr əhli = yoxsullar = həqirlər

Anlam: Ədəb - ərkanlı adamlar ayağa durub yerini yüksək təbəqəyə verdikləri kimi günəş də nurunu bir yana çəkərak sənin kölgənə yer verməklə öz iradəsini - ədəbini göstərmək istəyir.

**Qeyd** 1: *Şair bu beytdə təbii bir yöndəmə mənəvi bir illət bəyan etməklə "hüsn təlil" ünvanlı ədəbi sənətdən istifadə etmişdir.*

**Qeyd** 2: *Beyt mənəvi yüksəlmələr qarşısında dünyəvi dikəlmələrin həqirliyini təlqin etmək istəyir.*

Beyt 3: **Olmadan meyxaneyi – eşqində məsti – cami – zövq,**
**Düzmədi bəzmi – fələkdə Zöhrə qanuni –tərəb.**

Sözlük: Bəzm = ziyafət məclisi = əncümən = xeymə = şadlıq məclisi; tərəb = şadlıq, işrət

Nişanə 1: "Meyxanə"– bu beytdə bütün varlıqları (canlı – cansız) maddi mahiyyətdən ayıran ilahi qüvvədən nişanədir.

Nişanə 2: "Məst"– meyxanə mövqeiyyətində maddi mahiyyətin məhv və məglub olmasından nişanədir.

Nişanə 3: "Zövq"– şühud məqamının ilk mərtəbəsində aşiqin tələbini - ətəşini coşduran müşahidə və mükaşifə meyvəsindən ibarətdir.[1]

Nişanə 4: "Qanun" – santura oxşar bir musiqi aləti olduğuna görə "ürfani rəqs" halını, yaxud dünyəvi əngəllərə ayaq basıb onları zəlil və məhv etməkdən nişanədir.

Nişanə 5: "Tərəb" – mütəal məbuda adətkərdə olmaqdan nişanədir.

Anlam: Zöhrənin şadlıq və biqərarlığına səbəb olan meyxanə mövqeiyyətində yetişdiyi zövqdür.

**Qeyd** 1: *Beyt ariflərin "səma" ünvanlı "rəqs" və şadlıq etmələrini və nəhayət dünyadan xəbərsizliklərinə eyham edir.*

**Qeyd** 2: *Zöhrə şərq və Azərbaycan ədəbiyyatında eşq, gözəllik və şadlıqdan nişanə olduğuna görə ilahi məstliyi təlqin edir.*

Beyt 4: Cənnəti – vəslindir ol məqsəd ki, iman əhlinə,
Qılsa Həqq ruzi cəhənnəm atəşi oldur səbəb.

Sözlük: Cənnət = behişt bağı

Anlam: Ey gözəl məbud, sənin eşqində əsir olmaq həqiqi behiş olduğuna görə, belə bir üstün behişti boşlayıb qəsr və hurilər behiştini axtaran ibadətçilər cəhənnəm atəşi ilə cəzalansalar yersiz olmaz.

**Qeyd**: *Beyt eşqin behiştini əql bəyənən behiştdən üstün oldugunu bildirib şərif ayəyə əsaslanaraq buyurur:*

فادخلی فی عبادی و ادخلی جنتی

*(Mənim özəl bəndələrimin sırasına gəl və mənim behiştimə daxil ol)*[2] *Quran icmalçıları "mənim behiştim" ifadəsinin gözəl məbudun özəl behişti, ya da camal ziyarəti oldugunu izah etmişlər.*

Beyt 5: **Qaliba məqsəd vüsalındır ki, dün gün durmayıb,**
**Çərx sərgərdan gəzər, bilməz nədir rəncü təəb.**

Sözlük: Rənc = zəhmət = azar; təəb = çətinlik = ayaqdan düşmək

Anlam: Ey mütəal məhbub, bütün səmavi kürələr:

A – Sənin başına dolanmaq qəsdilə(təvaf) dairəvi, yaxud "müstədir" hərəkətlə məşğuldurlar.[3]

B – Onlar sənin hüsnündən heyrətə düşüb sərgərdan dolanırlar.

**Qeyd**: *Dairəvi dolanmaq təkrari və məqsədsiz bir hərəkət olduğuna görə sərgərdanlığa eyham edir.*

---

[1] Qəzəl 8, beyt 5 .
[2] Quran, Fəcr surəsi, ayə 29 - 30
[3] Qəzəl 1, beyt 1 (Hərəkət)

P – Bütün yaranmışların o cümlədən səmavi kürələrin muxtəlif cür hərəkətləri olduğuna görə beyt onların hamısının birlikdə uzununa hərəkət etmələrini təbii təcrübə göstərdiyi kimi, fikri "innəllah"[1] ünvanlı bir məqsədə yönəltmək istəyir.

Beyt 6: **Bəsteyi - zənciri – zülfündür nəsimi – tərməzaç,**
**Təşneyi – cami – vüsalındır mühiti – xüşkləb.**

Sözlük: Bəstə = bağlı = düyünlənmiş; tərməzac = təzə = təbiəti xoş; mühit = dəniz; xoşkləb = dodağı qurumuş (dəniz qırağı)

Nişanə 1: "Zənciri-zülf" – bu beytdə ardı – arası kəsilməyən təcəlli parlamalarından, yaxud mənəvi cazibələrdən, ya da bütün kəsrəti güzgü edən ilahi nurlar – nişanlardan ibarətdir.

Nişanə 2: "Xüşkləb" – təşnəlikdən və qurbanlıq məqamına müqəddimə olan can çəkişmədən nişanədir.

Anlam: Ötən beyti davam etdirmək qəsdilə deyir:

Ey mütəal məhbub yalnız səmavi kürələr deyil, bəlkə dənizlər və küləklər, habelə bütün təbiət sənəqovuşmaq məqsədilə biqərarlıq edirlər.

Beyt 7: **Qılma feyzi – neməti – vəslin Füzulidən dəriğ,**
**Yoxdur özgə məqsədi, səndən səni eylər tələb.**

Sözlük: Dəriğ = müzayiqə = imtina etmək = mümaniət

Nişanə 1: "Feyz" – ürəyə ilham verən əvəzsiz ilahi ehsandan ibarətdir.

Nişanə 2: "Vəsl" – aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəsinə çatmağından ("qürb") nişanədir.

Nişanə 3: "Tələb" – həzrəti-məhbubu tanıyıb-tapandan sonra hasil olmuş ətəşdən və xahişdən ibarətdir.

**Qeyd** 1: *Mütəal məhbubu tanıyıb-tapmaqdan əvvəl onu tələb etmək alçaqlıq və ləyaqətsizlik nişanəsidir.*[2] *Beləliklə, tələb mütəal məhbub camalından nümunə gördükdən sonra hasil olmuş ətəşdən nişanədir. Demək, tələb aşiqi biqərarlıq səbəbilə ilahi məqsəd yoluna yönəldən nişanədir.*

**Qeyd** 2: *Aşiq istəyini, yaxud tələb etdiyi məhbubu tam şəkildə tapmaq istəyir, lakin onu tamamilə öz batinində, yaxud özündə tapmalıdır,çünki məhbubu qıraqdan görmək ikilikdən nişanə olduğuna görə vəh-*

---

[1] انا لله و انا اليه راجعون Quran, Bəqərə surəsi, 156-cı ayədən bir hissə

[2] Fərhənge-istilahat və təbirate-ürfani.

*dət ilə müxalif olmaqdan əlamətdir. Mövləvi bir hekayədə vəhdətdən belə danışır:*

*Bağdad əhlindən biri Misir şəhərində müəyyən bir məkanda tələb etdiyi tükənməz sərvət xəzinəsini yuxuda görüb Misirə yollanır. O, gecə Misirə çatıb dilənçilik bəhanəsilə yuxuda gördüyü yeri axtarmağa başlayır, ancaq bilmir ki, xəlifə camaatın malına, canına xəyanət edən quldurları, oğrubaşıları tutdurmaq məqsədilə gecə şəhərdə gediş-gəlişi yasaq elan etmişdir, Buna görə də bir yasaqçı onu qəfildən yaxalayıb, incidir. O, həmin yasaqçıdan izn alıb, yuxusunu ona bəyan edir. Yasaqçı onun sədaqətini sözlərindən hiss edərək belə deyir: Ey sadə ürəkli adamcığaz, mən özüm dönə-dönə yuxumda Bağdad şəhərində filan evdə gizli tükənməz bir xəzinə müşahidə etmişəm, lakin inanmayıb izi onun ilə getməmişəm, amma sənə bax ki, sadəlövhlük edib bir yuxuya inanaraq bir belə yol ölçmüsən. Bağdadlı öz ölkəsinin, evinin ünvanını yasaqçıdan eşidərək heyrətə dalır, çox şad və məstanə halda öz şəhərinə- evinə qayıdıb, vəsfini eşitdiyi xəzinəni taparkən öz-özünə sərkilər vura-vura deyir: "Məni bədbəxt etmiş qəflətə bax ki, özüm xəzinə üstdə əyləşə-əyləşə aclıqdan ölürəm". Beləliklə, məqsədinə nail olur, yüz yol səssiz-sədasız əlhəmd oxuyur və şükr edir.*[1]

Nəticə: İnsanı bədbəxt və xoşbəxt edən yalnız insan özüdür, onun vücudu yerə- göyə sığmayan bir aləmdir. Beləliklə, insan hər bir istəyi özündən tələb etməlidir.

Peyğəmbərlər və imamlar oda – suya gələn ilahi iqtidarı və məzmunu öz batinlərindən təhsil etmişlər, bu təhsili din və ürfanla yanaşı fəlsəfə də alqışlamışdır. Hanri Beroksin adlı bir filosof zənn etmişdir ki: "..., həqiqi idrak, idrak edən ilə idrak olunanın birləşməsindən (vəhdət) ibarətdir ( aqil ilə məqulun birliyi) ki, bu hal "təsəvvür" [2] və "təsdiq" [3] ilə yox, bəlkə başqa bir elm və qüvvə ilə hasil olar ki ... bu qüvvənin Beroksin bəyan etdiyi istilaha yaxın tərcüməsi "batin gözü", yaxud "can gözü"dür.[4]

Can gözün aç ki, eyləsin yarı,
Pərdəsiz gör, görünməyin yarı.[5]

---

[1] Məsnəviye-mənəviye-Moləvi, dəftər 6, beytlər 4241 və ....
[2] "Təsəvvür": Fəlsəfi təsəvvür bir şeyin surətini işarə ilə zehində hasil etməkdən ibarətdir.
[3] "Təsdiq": Fəlsəfi təsdiq zehində hazır olmuş təsəvvürə hökm verməkdən ibarətdir.
[4] Seyri hikmət dər Arupa, Mühəmməd Əli Foruği, cild 3, səh.296 və 297
[5] Müəllifin bir tərciindən beyt.

Beləliklə, batini görmək özündə görmək, yoxsa özünü görmək və nəhayət, vəhdətə nail olmaqdan nişanədir. Elə bu mərtəbəni sifariş etmək qəsdilə mütəal məbud buyurmuş: "نحن اقرب اليه من حبل الوريد ": Mən sizə şah damarınızdan da yaxınam.[1]

Anlam: Ey mütəal məhbub, Füzuli dünyəvi ilgiləri - əlaqələri, yaxud ikiliyi (kəsrəti) unudarkən, ümidini yalnız sənə bağlamışdır, beləliklə, onun vəhdət xəzinəsindən ehsan ummağı yersiz deyil.

[1] Quran, "Qaf" surəsi, 16 – cı ayə.

## Q Ə Z Ə L 33

(1) Sən üzündən aləmi rövşən qılıb saldın niqab,
Yazıya salsın bu gündən böylə nurun afitab.

(2) Sən nə nuri-paksən, ey məzhəri-süni-ilah
Nur alır şəmi-rüxündən afitabü mahtab.

(3) Əksi-ruyin suya salmış sayə, zülfün toprağa,
Ənbər etmiş toprağın adın, suyun ismin-gülab.

(4) Yeldə bulmuş buyi-zülfün, suda əksi-arizin
Kim, yeli bağrına basıb, suya göz dikmiş hübab.

(5) Ləlgun meydir əlində sağəri-simin ilə,
Ya nigini-ləldir, rəşki-ləbindən oldu ab?

(6) Kilki-qüdrət lövhi-sinəmdə səni qılmış rəqəm,
Eyləyib məhbublər məcmuəsindən intixab.

(7) Ey Füzuli, hər əməl qılsan xətadır qeyri-eşq,
Budurur mən bildigim, "vəllahü ələm bis-səvab".

Beyt 1: **Sən üzündən aləmi rövşən qılıb saldın niqab,**
**Yazıya salsın bu gündən böylə nurun afitab.**

Sözlük: Rövşən = işıq = nurani; afitab = günəş

Anlam: Ey gözəl mürşüd, yaxud ey feyz vasitəsi [1], sənin camalından parlayan ilahi cilalar ilə, dünya elə işıqlanıb ki, daha səmavi günəşin nur saçmasına ehtiyac yoxdur, buna görə də o, gərək bundan belə nurunu çöllərə, biyabanlara salsın(faydasız və gərəksiz nurunu çölə atsın).

Beyt 2 **Sən nə nuri – paksən, ey məzhəri – süni – ilah**
**Nur alır şəmi rüxündən, afitabü mahtab.**

Sözlük: Məzhər = zuhur güzgüsü = nümayəndə, afitab = günəş ,
sün = yaranış = ehsan = yoxdan var etmək = ibda

Nişanə 1: "nur":

A – nur, nur mütəal məbudun adlarından biridir ki, buyurmuşdur: "الله نور السماوات و الارض"

B – arifin ilahi cilalar ilə dolu ürəyindən, həm də kamil əqldən ibarətdir.

**Qeyd**: *Nur mərtəbəsinə nail olmuş qəlb və əql, tutulma-batması olmayan ay və günəşdir.*

*Nurani ürək, yaxud məhəbbət nuru isə dünyəvi ay və günəş kimi həm özü işıqdır, həm də başqalarını işıqlandıran, yaxud başqalarına ilahi tanışlıq (mərifət) bağışlayan həqiqət cilvələrindən ibarətdir.*[2]

**Qeyd**: *Su və güzgü, şəffaf və işıq olsalar da, başqalarını işıqlandırmayan olduqlarına görə nur deyildirlər.*[3]

Nişanə 2: "Pak" - maddi küdurətdən tam təmizlənməkdən ibarətdir.

Nişanə 3: "Süni-ilah" - bağışlayan məbudun dünyəvi və mənəvi əvəzsiz ehsanından nişanədir.

Nişanə 4: "Şəmi-rux" - həzrəti-mürşüdün ehsan etdiyi ürfan nurundan nişanədir.

Nişanə 5: "Afitab və mahtab" - dünyəvi və mənəvi istedadlar və üstünlüklərdən nişanədir.

Anlam: Ey həzrəti-mürşüd, sən mütəal məbudun tükənməz ehsan xəzinəsindən dünyəvi və mənəvi feyz bağışlayan ilahi vasitə və özəl rəhbərsən.

---

[1] Qəzəl 23, beyt 1
[2] Qəzəl 1, beyt 1
[3] Fərhənge-istelahat və təbirate-ürfani.

Beyt 3: **Əksi-ruyin suya salmış sayə, zülfün torpağa,**
**Ənbər etmiş torpağın adın, suyun ismin-gülab.**

Sözlük: Ruy = camal = üz = surət.

Nişanə 1: "Əksi-ruy" - həzrəti-mürşüdün nurani camalından yaxud cilalar ilə daşqın qəlbindən əks etdirilmiş ilahi təcəllilərdən nişanədir.

Nişanə 2: "Zülf" - kəsrətin vəhdətə bağlı cəhətindən, yaxud yaradıcı məbudun ətrini saçan yaranışdan ibarətdir.

Nişanə 3: "Su, topraq" - həyat mənşəyi olduqlarına görə müqəddəslikdən nişanədirlər.

Nişanə 4: "Ənbər, gülab" - mütəal məhbubun ərəfəsindən saçılan rayihələrdən ibarətdirlər.

Anlam: Ey mehriban mürşüd, sən iki – maddi və mənəvi dünya arasındakı ilahi feyz vasitəsi olarkən, dünyəvi və fani vücudlara (su, topraq) mənəvi üstünlük (ənbər, gülab) və əbədiyyətə qoşulmaq istedadını bağışlayan rəhbərsən.[1]

Beyt 4: **Yeldə bulmuş buyi-zülfün, suda əksi-arizin**
**Kim, yeli bağrına basıb, suya göz dikmiş hübab.**

Sözlük: Buy = rayihə = ətir = iy; ariz = surət = camal, hübab = köpük

Nişanə 1: "Buyi-zülf" - gözəl məbudun ərəfəsindən saçan davamlı rayihələrdən nişanədir.

Nişanə 2: "Ariz" - ürfan qapılarını açan iman nurundan və ilahi camal cəlalarından nişanədir.

Anlam: Ey gözəl məbudun nurunu özündə əks etdirmiş mürşüd, köpük yeldən və sudan sənin ətrini alarkən birini bağrına basır, birində özünü məhv edir.

**Qeyd** 1: *Həqir köpük vəhdət ətrini kəsrətdən (sudan, havadan) alarkən, əgər həmin ətri şərif insan almasa, həqiqətən, özü özünə insafsızlıq və zülmkarlıq etmiş olar.*

**Qeyd** 2: *Beyt hər bir yaranışı yaradıcı məhbuba möhtac və bağlı bilir.*

Beyt 5: **Ləlgun meydir əlində sağəri-simin ilə,**
**Ya nigini-ləldir, rəşki-ləbindən oldu ab?**

Sözlük: Ləlgun = ləl kimi = lələ bənzər; sağəri simin = gümüş cam;

---

[1] Qəzəl 23, beyt 8

nigini = ləl = daş-qaş; rəşk = qısqanclıq = qışqanış; ab = su.

Nişanə 1: "Ləlgün" - qırmızı rəng qələbə əlaməti olduna görə, ləlgün, eşq qələbələrindən nişanədir.

Nişanə 2: "Mey" - ilahi cazibələrin qələbələrindən nişanədir.

Nişanə 3: "Ləlgün mey" - qəlbə üstün gəlmiş qələbədən nişanədir.

Nişanə 4: "Sağəri simin" - həzrəti-mürşüdün görünməz aləmdən ilahi nuru əks etdirən "meykədə", "meyxana", “xumxana” ünvanlı qəlbindən nişanədir.

Nişanə 5: "Negini ləl" - dünyəvi etibar və qələbələrdən nişanədir.

Nişanə 6: "Ləb" - həyat bağışlayan rəhmani[1] feyzlərdən nişanədir.

Nişanə 7: "Oldu ab" - su olmaq, xəcalətdən yerə girməkdən, yaxud məhv olmaqdan nişanədir.

Anlam: Ey həzrəti-mürşüd, dünyəvi dəyərləri etibarsız edən həqiqət, sənin ilahi mərtəbə və məqamından nişanədir.

Beyt 6: **Kilki-qüdrət lövhi-sinəmdə səni qılmış rəqəm,**
**Eyləyib məhbublər məcmuəsindən intixab.**

Sözlük: Kilk = qələm; lövh = lövhə = səhifə.

Nişanə 1: " Kilki – qüdrət" - bu beytdə ilahi alın yazısı və "ələst" əhdindən[2] nişanədir.

Nişanə 2: "Lövhi-sinə" - ilahi əhd yaxud ələst əhdinə vəfadar qalmış ürəkdən nişanədir.

Anlam: Ey mehriban mürşüd, mənələst aləmində səninlə bağladığım aşiqlik əhdimə bu maddi dünyanın həbsində də vəfadar qalmışam.

**Qeyd**: *Beyt bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəlməyin yalnız ələst qanununa məğlubluqda və tabelikdə mümkün olduğunu təlqin edir*.

Beyt 7: **Ey Füzuli, hər əməl qılsan xətadır qeyri-eşq,**
**Budurur mən bildigim, "vəllahü ələm bis-səvab".**

Sözlük: Vəllahü ələm bis-səvab = düzgün həqiqət Allaha məlumdur.

Anlam: Ey Füzuli, ələst aləmində bağladığım eşq əhdindən başqa bir əhd və əməl etmək xəta və səhvdir.

---

[1] Qəzəl 23, beyt 8

[2] Qəzəl 19, beyt 4

**Qeyd**: *Beyt gözəl camala aşiq olmaq kimi bütün dünyəvi işlərdə yaradıcı məhbubun razılığını nəzərə alaraq ona aşiqanə əml etməyi eşqin ələsti ilə bağlı olduğunu təlqin edir.*

## Q Ə Z Ə L 34

(1) Kuhkən Şirinə öz nəqşin çəkib vermiş fərib,
Gör nə cahildir, yonar daşdan öziçün bir rəqib.

(2) Qaşların yayı bir ox lütf eyləmiş hər aşiqə,
Mən həm ondan eylərəm bir ox təmənna, ya nəsib.

(3) Tutiyayi-xaki-payin feyzinə yol bulmasam,
Nuri-çeşmim, eyb qılma, kor olur derlər qərib.

(4) Müztəribdir çareyi-dərdimdə, vəh kim bilməyib,
Bir dəvasız dərdə uğratmış üzün miskin təbib.

(5) Bərqi-ahimdən evim hər guşə bulmuş rəxnələr,
Gəl gör, ey gül, kim, giriftari-qəfəsdir əndəlib.

(6) Ey mənə səbr et deyən hali-dilimdən bixəbər,
Eşq olan yerdə nədir aram, ya neylər şəkib?

(7) Ey Füzuli, incimə səndən təğafül qılsa yar,
Rəsmdir kim, göstərə əhbabə istiğna həbib.

Beyt 1: **Kuhkən Şirinə öz nəqşin çəkib vermiş fərib,**
**Gör nə cahildir, yonar daşdan öziçün bir rəqib.**

Sözlük: Kuhkən = dağ yonan; fərib = hiylə = hiylə işlətmək.

Anlam: Fərhad Bisütun dağına Şirindən nəqş salmaqla nadanlıq edərək özünə bir rəqib yondu.

**Qeyd** 1: *Şirin bəşəri camalda ilahi hüsndən rəng və rayihə göstərərkən, Fərhadı bütün dünyəvi bağlantılardan ayırıb təcrid mərtəbəsinə yaxınlaşdırdı, beləliklə o (Şirin) yer adamına səmavi eşq müqəddiməsi törətmiş məcazi bir gözəldən istiarədir.*

**Qeyd** 2: *Naxışın rəqib olması büsbütün canlı-cansız yaranmışların yaradıcı yeganə məhbub eşqində əsir və sərgərdan olmasına eyham edir.*

**Qeyd** 3: *Fərhad vüsalı dağ yonmağın şərti bilərkən:*

*A – Öz iqtidarını bilər-bilməz təsdiq edərək, məğrurluğa məhkum olundu.*

*B – Dağı, külüngü, iqtidarını özünü görməklə neçəliyə, yaxud kəsrətə giriftar oldu və vəhdət ərəfəsindən kənar düşdü.*

*P – O, vüsal şərtinin öz mənəmliyini, mənliyini və vücudunu qat-qat yonmaqda olduğunu bilməyib, dağ yonmağı ilə öz nadanlığını sübut etdi. O, bunu düşünmədi ki, eşq yolunda ilk addım bütün bəşəri ilgiləri soyub-töküb ayaq altına salmaqdan ibarətdir.*

Beyt 2: **Qaşların yayı bir ox lütf eyləmiş hər aşiqə,**
**Mən həm ondan eylərəm bir ox təmənna, ya nəsib.**

Sözlük: Ya nəsib = ümüd etmək vaxtı bəyan olan nida cümləsidir.

Nişanə 1: "Qaş" - mütəal məbudun həqiqətini örtmüş bütün vücudlara camal bağışlayan ilahi sifətlərdən nişanədir.

Nişanə 2: "Ox" - istedadsız aşiqin qəlbini çırpıntılar və biqərarlıqla tənbih və tərbiyə edən mənəvi qəmzələrdən nişanədir.

Anlam: A – Ey həqir aşiqlərə əvəzsiz ehsan edib istedad bağışlayan məhbub, mən də o ilahi əvəzsiz ehsana ümüd bağlamışam.

B – Ey hər aşiqin qəlbini bir növ yarıb öz eşqini ora daxil edən mütəal məhbub mənim də qəlbimə yarılmaq nemətini ehsan elə.

Beyt 3: **Tutiyayi-xaki-payin feyzinə yol bulmasam,**
**Nuri-çeşmim, eyb qılma, kor olur derlər qərib.**

Sözlük: Xaki-pay = addım qoyulan torpaq; nuri-çeşm = göz işığı.

Nişanə 1: "Tutiya" - məhbub ərəfəsinin canın gözünü işıqlandıran torpağından nişanədir.[1]

**Qeyd**: *Ürfan mədəniyyətində bütün etibarlar, dəyərlər və mənalar baş-ayaq*[2] *olan kimi tutiya mərtəbəli torpaq də hər gözə dolsa, ona zərər-ziyan əvəzinə qazanc-qüvvə bağışlamalıdır. Bunun üçün də "Fəxrəddin Əraqi" VII əsrin məşhur arifi və şairi yüz min günəş ziyafətində iştirak etmək istedadını və ləyaqətini eşq ərəfəsindən canın gözünə bir zərrə düşmüş torpağa məşrut bilir.*[3]

Nişanə 2: "Qərib" - üç çeşid qürbətzədəlikdən nişanədir:

A – "vətən qürbəti": bütün maddi dünyanı atıb – unutmuş bir aşiqə vətən qəribliyi mənasız bir sözdür.

B – "Hal qürbəti": ailəsi, övladı, əməkdaşları və bütün əql əhli, ürfanı əhval – ruhiyyəsini dərk etməyən bir aşiq öz ölkəsində və öz evində də hal qürbətində yaşamağa məcburdur.

**Qeyd**: *Aşiq dünyadan və dünya əhlindən xəbərsiz olduğuna görə, bizim göstərdiyimiz "A" və "B" mərhələsindən şikayətçi olsa öz naqisliyini sübut edir.*

C – "Tələb qürbəti": vəhdət nöqtəsinə(ənəllaha) qəribsəməklə, yaxud, mütəal məbudu tələb etmək məqsədilə təbii dünyanı qəriblik və sərgərdanlıq yeri bilməkdən ibarətdir.

Anlam: Ey mehriban məhbub, məni vəhdət ərəfəsindən uzaq salan, ixlas – iradətimin azlığı deyil, bəlkə də qürbət itkinliyidir.

Beyt 4: **Müztəribdir çareyi-dərdimdə, vəh kim bilməyib,**
**Bir dəvasız dərdə uğratmış üzün miskin təbib.**

Sözlük: Vəh = əcəba = vah

Nişanə 1: "Dəvasız dərd": A – dəvasız dərd təbii ömür boyu aşiqi biqərar etmiş tələb qürbətindən nişanədir.

B – Dəvasız dərd eşq ətəşindən ibarətdir.

Nişanə 2: "Təbib" - aşiqi əql yoluna hidayət edən nəsihətçidən ibarətdir.

Anlam: Əql və elm sahibləri mənim tələb dərdimə tədbir görməkdən acizdirlər.

---

[1] Qəzəl 25, beyt 3
[2] Qəzəl 25, beyt 5
[3] یک ذره گر از این خاک بر چشم جانت افتد        با صد هزار خورشید افتد تورا ملاقات

Beyt 5: **Bərqi-ahimdən evim hər guşə bulmuş rəxnələr,**
**Gəl gör, ey gül, kim, giriftari-qəfəsdir əndəlib.**

Sözlük: Əndəlib = bülbül

Nişanə 1: "Bərqi-ah " - aşiqi üryanlıq və qurbanlıq məqamına hazırlamağın müqəddiməsi olan biqərarlıq və tələb etmək atəşindən ibarətdir.

Nişanə 2: "Ev"və"qəfəs" - hal qürbəti törətmiş maddi vücuddan və fiziki şəraitdən nişanədir.

Nişanə 3: "Rəxnə" - bərqi-ah meyvəsindən nişanədir.

Nişanə 4: "Gül" - aşiqin qəlbinə bəst bağışlayan ilahi cazibələrdən nişanədir.

Anlam: Ey mütəal məbud, nalələrimi sənin astanına çatdırmaq üçün dünyəvi həyatdan üstün mənəvi yaşayış qarşısında dikəlmiş sədləri bərqi-ahimlə yarmaq istəyirəm.

Beyt 6: **Ey mənə səbr et deyən hali-dilimdən bixəbər,**
**Eşq olan yerdə nədir aram, ya neylər şəkib?**

Sözlük: Şəkib = səbr = aram.

Nişanə 1: "Səbr"və "şəkib" - bu beytdə ətəş və tələbi tərk etmək qəsdindən ibarətdir.[1]

Nişanə 2: "Bixəbər": bixəbər, aşiqə irad etiraz edən nəsihətçidən ibarətdir.

Anlam: Mənim qürbət dərdimə ətəş və tələb tərkilə tədbir görənlər eşq dərdinin tədbirsizliyindən xəbərsizdirlər.

Beyt 7: **Ey Füzuli, incimə səndən təğafül qılsa yar,**
**Rəsmdir kim, göstərə əhbabə istiğna həbib.**

Sözlük: Təğafül = özünü qafil göstərmək; əhbab = dostlar;
istiğna = ehtiyacsız olmaq = naz = toxluq = özünü tox tutmaq.

Nişanə: "İstiğna" - bu beytdə mütəal məhbubun "səmədiyyət" sifətindən ibarətdir.[2]

Anlam: Ey Füzuli, həkimi-məhbub özünü sənin biqərarlıq və halsızlığına diqqətsizlik göstərməklə səni tərbiyə etmək və vüsala hazırlamaq istəyir.

---

[1] "Səbr və şəkib" digər ürfani mərtəbələrdə geniş izahlı bəhslərə daxildir.
[2] Qəzəl 30, beyt 3

## Q Ə Z Ə L 35

**(1) Ol ki, hər saət gülərdi çeşmi – giryanım görüb,**
**Ağlar oldu halıma birəhm cananım görüb.**

**(2) Eyləyən təyini - əczayi – müdava dərdimə,**
**Tərk edib, cəm etmədi hali – pərişanım görüb.**

**(3) Lalərüxlər köksümün çakinə qılmazlar nəzər,**
**Hiç bir rəhm eyləməzlər daği – hicranim görüb.**

**(4) Tut gözün, ey dudi – dil, çərxin ki, dövrün tərk edib,**
**Qalmasın heyrətdə çeşmi – gövhərəfşanım görüb.**

**(5) Pərtövi – xurşid sanman yerdə, kim dövri – fələk,**
**Yerə vurmuş afitabın mahi – tabanım görüb.**

**(6) Suda əksi – sərv sanman, kim qoparıb bağiban,**
**Suya salmış sərvini, sərvi – xuramanım görüb.**

**(7) Ey Füzuli, bil ki, ol gül arizin görmüş degil,**
**Kim ki, eyb eylər mənim çaki – giribanım görüb.**

Beyt 1: **Ol ki, hər saət gülərdi çeşmi – giryanım görüb,**
**Ağlar oldu halıma birəhm cananım görüb.**

Sözlük: Çeşm = göz

Nişanə 1: "Çeşmi – giryan" – bu beytdə biqərar aşiqin özünü – dünyasını bərbad etmiş ətəş və tələbdən nişanədir.

Nişanə 2: "Birəhm" - aşiqi sıxıntıya – sınağa çəkmiş ilahi qəhrlər və qəbzlərdən nişanəsir.

Anlam: Qəbzlər və qəhrlər sınağında pərişan halət və çarəsizliyim hətta eşqi inkar etmiş camaatı vaysınmağa vadar edir.

Beyt 2: **Eyləyən təyini - əczayi – müdava dərdimə,**
**Tərk edib, cəm etmədi hali – pərişanım görüb.**

Sözlük: Əczayi müdava = müxtəlif xasiyyətli dərmanlar

Nişanə 1: Birinci misra nəsihətçilərin hidayət etdikləri əql və məntiq yolundan nişanədir.

Nişanə 2: İkinci misra eşq müşkülünə əql ilə tədbir görməyi mümkünsüz təlqin edən nişanədir.

Anlam: Ötən beyti davam etdirmək qəsdilə dünyəvi ömur möhlətində eşq qayğısının çarəsizliyindən təkid etmək istəyir.

Beyt 3: **Lalərüxlər köksümün çakinə qılmazlar nəzər,**
**Hiç bir rəhm eyləməzlər daği – hicranim görüb.**

Sözlük: Çak = yarıq

Nişanə 1: "Laləruxlər" – A – aşiqin qəlbini bürüyən ilahi cilvələrdən nişanədirlər.

B – gözəl məbudun ətrini-ilhamını gətirən vasitələrdən ibarətdirlər.[1]

P – bəşəri camalda ilahi hüsnlər əks etdirmiş gözəllərdən nişanədirlər.

**Qeyd**: *Lalə qırmızı olduğuna görə lalərüxlərin qalibliyinə eyham edir.*

Nişanə 2: "Köksün çak olması": "lalə" ürfan istilahında maarif nəticəsi olsuğuna görə çak olmuş köks ilə paralel üryanlıq, yaxud mücərrədlik məqamına hazırlaşmağı eyham etmək istəyir.

Anlam: A – Səmavi vasitələr bir ilahi cilvə gətirmək ilə alovlar çulğalayan qəlbimə rəhm etmirlər.

---

[1] Qəzəl 23, beyt 1

B – Bəşəri camalda ilahi hüsnü olan gözəllər bir nəzər salmaq ilə qəlbimi sakitləşdirməzlər.

Beyt 4: **Tut gözün, ey dudi – dil, çərxin ki, dövrün tərk edib,**
**Qalmasın heyrətdə çeşmi – gövhərəfşanım görüb.**

Sözlük: Dud = duda = qurum = tüstü; dudi-del =alovlu ürək tüstüsü;

çeşm = göz; gövhərəfşan = gövhər yağdıran

Nişanə: "Heyrət" – bu beytdə fiziki və təbii enerjini daş kimi qurudub qüvvədən salan mərtəbədən ibarətdir.

Anlam: Ey alovlu ürəyimdən qopan tüstü, çərxi-fələyin üzünü pərdələndir, yoxsa mənim gözümdən yağan ulduzlar onu heyrət içində daşa döndərib hərəkətindən saxlayar.

**Qeyd**: *Beyt, eşq atmosferinin əql səmasından üstünlüyünü göstərmək istəyir.*

Beyt 5: **Pərtövi – xurşid sanman yerdə, kim dövri – fələk,**
**Yerə vurmuş afitabın mahi – tabanım görüb.**

Sözlük: Pərtövü-xurşid = günəş işığı = əks etdirilmiş nur; afitab = günəş; mahi- taban = nurlu ay = məhtab.

Nişanə 1: "Mahi – taban ":

A – Qaraca kəsrəti şəffaf güzgü edib onda camal nurunu əks etdirmiş vahid məhbubdan nişanədir.

B – İçəri vücudu maddi ləkələrdən təmizləyən mürşid həzrətlərindən, yaxud digər ilahi vasitədən, ya da bəşəri camalda mənəvi hüsnlər əks etdirmiş bir gözəldən nişanədir.

Anlam: Mənim mahcamal cananımın nurunun qarşısında səma öz günəşini nursuz və həqir görərkən onu yerə çırpıbdır. Beləliklə, yer səthinin işığı günəşin nur saçmasından deyil, bəlkə də onun atılmasından və süqutundandır.

**Qeyd**: *Beyt dünyəvi üstünlükləri mənəvi mərtəbələr qarşısında həqir göstərmək istəyir.*

Beyt 6**: Suda əksi – sərv sanman, kim qoparıb bağiban,**
**Suya salmış sərvini, sərvi-xuramanım görüb.**

Sözlük: Xuraman = naz və təkəbbürlə addım atan.

Nişanə 1: "Sərv" – dünya üzərində davamlı dikəlməklər və dəyərlərdən nişanədir.

Nişanə 2: "Bağban" – bu beytdə dünyəvi hüsnlər qoruyucusu və xidmətçisindən ibarətdir.

Nişanə 3: "Suya salmaq" – gözdən atmaq və qərq etməkdən nişanədir.

Nişanə 4: "Sərvi xuraman " – cazibələrini davam etdirmiş mütəal canandan nişanədir.

Anlam: Bağban ilahi sərvqamət cananımı görcək gülüstan sərvinin həqirliyini idrak edərkən onu kökdən qoparıb selə-suya tapşırdı.

**Qeyd**: *Mənəviyyatlə tanış olmuş bir insan dünyəvi başçıları selə-suya tapşırar.*

Beyt 7: **Ey Füzuli, bil ki, ol gül arizin görmüş degil,**
**Kim ki, eyb eylər mənim çaki – giribanım görüb.**

Sözlük: Ariz = camal = surət, çaki giriban = açılmış yaxa (yaxa açmaq)

Nişanə 1: "Güli-ariz" – mütəal məhbubun bəst bağışlayan cilalərindən nişanədir.

Nişanə 2: "Çaki giriban "– qayğı çəkməklər və biqərarlıqlar nişanəsidir.

Anlam: Ey Füzuli, mənim biqərarlığıma irad – etiraz edənlər özlərini bəşəri səviyyədə məhdud etmiş ilahi gözəlliklərdən xəbərsizlərdirlər.

## Q Ə Z Ə L 36

**(1) Ruzigarım buldu dövrani – fələkdən inqilab,**
**Qan içər oldum, əyağın çəkdi bəzmimdən şərab.**

**(2) Şöleyi – ahimlə yandırdım dili – sərgəştəni**
**Bir od oldum, cizginən çevrəmdə olmazmı kəbab?**

**(3)Ləlin ilə badə bəhs etmiş, zəhi gümrahlıq,**
**Oldu vacib eyləmək ol biədəbdən ictinab.**

**(4) Verməz oldu yol vüsalə piçi – zülfün, ah, kim,**
**Rişteyi – tədbirdən dövrani – kəcrov açdı tab.**

**(5) Olmadı ol mahə rövşən yandığım hicran günü,**
**Yandığın şəb ta səhər şəmin nə bilsin afitab.**

**(6) Göz ki, peykanin xəyalilə saçar hər yan sirişk,**
**Bir sədəfdir, qətreyi – barani eylər dürri – nab.**

**(7) Oldu əbri – dudi – ahim pərdeyi – rüxsari – mah,**
**Ah kim, almaz cəmalından hənuz ol məh niqab.**

**(8) Kəsmədi məndən səri – kuyində azarın rəqib,**
**Ey Füzuli, necə cənnət içrə yox derlər əzab.**

Beyt 1: **Ruzigarım buldu dövranı – fələkdən inqilab,**
**Qan içər oldum, əyağın çəkdi bəzmimdən şərab.**

Sözlük: Bəzm = ziyafət məclisi = əncümən = xeymə

Nişanə 1: "Ruzigar" – dünyəvi mühitdə ömür sürməkdən nişanədir.

Nişanə 2: "Dövrani – fələk"– müqəddəratı təyin edən təbii qüvvələrdən üstün iqtidardan nişanədir.

Nişanə 3: "İnqilab"– A – fələyin üz döndərməsindən nişanədir.

B – qaradan ağ və kəsrətdən vəhdət törəyən kimi, "baş – ayaq", yaxud "alət – ust" ünvanlı əksinə nəticələr verən ürfani məqamdan nişanədir.

Nişanə 4: "Qan işər" – qan udmaq, yaxud əzab çəkməkdən istiarə olduğuna görə sınağa çəkilmək çətinliyini, tərbiyə görməyi və nəhayət qurbanlıq məqamına hazırlaşmağı bildirən nişanədir.

Nişanə 5: "Ayağın çəkdi" – aşiqin ayaq çəkmək və əlaqəsizlik ilə paralel ürəyi mənəvi mariflə dolu mürşüdün diqqətsizliyindən, yaxud ilahi təcəllilərdən kənar olmasını təlqin edən nişanədir.

Nişanə 6: "Şərab" – təcəlla mərtəbəsinə yüksəldən cazibələrdən nişanədir.

Anlam: Bu amansız ruzigarda bəstlərlə arxa – arxaya gəzən qəbzlər və vüsal dalını yerə vurən hicranlar məni dünyəvi və mənəvi sərxoşluqdan məhrum etdilər.

Beyt 2: **Şöleyi – ahimlə yandırdım dili – sərgəştəni,**
**Bir od oldum, cizginən çevrəmdə olmazmı kəbab?**

Sözlük: Dili – sərgəştə = sərgərdan və heyran olmuş ürək

Nişanə 1: "Şöleyi - ah" – ürəyin dünyəvi yönünü, yaxud şühud məqamına maneələr törətmiş maddi bağlantılar küdurətlərini "nari-məhəbbət" mərhələsində yandırarkən onu "nuri-məhəbbət" mərtəbəsinə hazırlayan biqərarlıqdan ibarətdir.[1]

Nişanə 2: "Dili – sərgəştə" – heytət məqamında dünyəvi enerjilərini məhvlik dərəcəsinə yaxınlaşdirmış mənəvi qüvvələr almağa səy edən ürəkdən nişanədir.

Nişanə 3: "Kəbab" – dünyəvi atəşdə yanıb bişməkdən nişanədir.

**Qeyd**: *Kabab atəşi görməklə ziyafət məclisinə hazırlanan kimi ürək isə ilahi şühud və təcəlli ziyafətinə nailiyyət istedadını atəş, tələb, qəbz və həsrət atəşində yanmaqdan tapmalıdır. Beləliklə, kabab çiy halda məcli-*

---

[1] Qəzəl 17, beyt 2

*sə yararlı olmadıgı kimi eşq atəşində yanmayan ürək də şuhud məclisinə yaramazdır. Elə buna görə də ariflər və şairlər eşq atəşini alqışlayıblar:*

*Bir od bürüyüb qəlbimi heç kim dözə bilməz,*
*Bir ləhzə bu od sönsə işim müşkülə düşdü*[1]

*İranın çağdaş məşhur filosof, alim və Quran icmalçısı mərhum Əllamə Təbatəbayi maraqlı bir məsnəvisində daşı, dəmiri atəşsiz ürəkdən dəyərli bilmişdir*[2].

Anlam: Atəş ilə təbii nisbəti olmuş kabab da mənim alovlu qəlbimin atrafına dolanmaqdan çəkinir.

Beyt 3: **Ləlin ilə badə bəhs etmiş, zəhi gümrahlıq,**
**Oldu vacib eyləmək ol biədəbdən ictinab.**

Sözlük: Zəhi = əcəba = əfsus; gümrahlıq = inhiraf = yoldan azmaq

Nişanə 1: "Ləl" – dodaga istiarə olduğuna görə ürfan terminində "mühadisə" ünvanlı mərtəbədən nişanədir. Mühadisə – ürəyin mütəal məbud ilə danışmasından, öz atəşini – tələbini bəyan etməsindən, yaxud özəl münacatından ibarətdir.

**Qeyd** 1: *Mühadisə ərəb dilinin "müfaələ" babında olduğuna görə, üz-üzə durmaq-danışmağı (müqabilə), yaxud hüzur mərtəbəsinə nailyyət tapmağı ifadə edir.*

**Qeyd** 2: *Dodaq və nəfs ilə əlaqadar olduğuna görə batini həyata nəfəs bağışlayan ilahi feyzdən də nişanədir.*

**Qeyd** 3: *"Canı dodaqdan çıxmaq", yaxud"canı ağzına gəlmək" ölümə istiarə olduğuna görə ləl, yaxud mühadisə dünyəvi həyatdan ölməyi və "موتو ا قبل ان تموتوا"*[3] *mərhələsində mənəvi həyat ilə dirilməyi eyham edir.*

**Qeyd** 4: *Ləl qırmızı olduğuna görə mənəvi qüvvələr və qələbələrdən istiarədir.*

Nişanə 2: "Badə" – bu beytdə əql və elm maneələrini aradan qaldıran dünyəvi vasitələr və qələbələrdən nişanədir.

**Qeyd** 1: *Məcazi badə dünyəvi olduğuna görə badə əhlini mənaşünaslığa hidayət edə bilməz, ancaq dünyaşünas əql və elmdən məhrum edər.*

**Qeyd** 2: *Mövləvi dediyi kimi, məcazi badənin dünyəvi əngəllərə qələbə göstərməsi müvəqqətidir, lakin mənəvi badənin qələbəsi dünya durduqca davam edərək axirətdə də intiqal olmalıdır.*[4]

---

[1] Mərhum hansı ərdəbilli? Ərdəbilinin bir qəsidəsindən bir beyt

[2] آهن و سنگی که شراریش هست        بهتر از آن دل که نه یاریش هست

[3] Qəzəl 7, beyt 2

[4] ان باده بجز یک دم دل رانکند بیغم        هرگز نبرد غم را هرگز نکشد کسن را

Anlam: Dünyəvi hüsnləri mənəvi hüsnlər ilə müqayisə etmək nadanlıq və cahillik əlamətidir.

**Qeyd** 1: *Şərab qırmızılıqda və qələbədə özünü sənə bənzətməklə böyük bir günahkarlıq edibdir bunun üçün də ondan çəkinmək vacibdir.*

**Qeyd** 2: *Şair şərabın haram olmasına ədəbi bir illət bəyan etməklə "hüsni-təlil" ünvanlı incəsənətdən istifadə etmişdir.*

Beyt 4: **Verməz oldu yol vüsalə piçi – zülfün, ah, kim,**
**Rişteyi – tədbirdrən dövrani – kəcrov açdı tab.**

Sözlük: Dövrani – kəcrov = başqası üçün fırlanan zamanə = hiyləbaz zamanə;

tab = düyün = sap

Nişanə 1: "Vüsal" – aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəsinə çatmağından ibarətdir (qürb).

Nişanə 2: "Piçi - zülf" – aşiqi kəsrət küdurətində şühud nurundan məhrum edən qəbzlərdən nişanədir.

Nişanə 3: "Açdı tab" – aciz qoymaq və batil etməkdən nişanədir.

Anlam: Əfsus ki, hiyləbaz zəmanənin saysız əngəlləri şühud nurunun davam etməyinə mane oldular.

**Qeyd**: *Beyt dünyəvi ömürdə və maddi həyatda davamlı bəst və müşahidə nailyyətinin mümkünsüz oldugunu təlqin etmək istəyir.*

Beyt 5: **Olmadı ol mahə rövşən yandığım hicran günü,**
**Yandığın şəb ta səhər şəmin nə bilsin afitab.**

Sözlük: Rovşən = aydın = nurlu; şəb = gecə; afitab = günəş

Nişanə 1: "Mah" – A – qara kəsrətdə şəffaf güzgü kimi müşahidə nurunu əks etdirmiş mütəal məhbubdan nişanədir.

B – zehnə cilalar və fikri açıqlıqlar bağışlayan mehriban məhbubdan nişanədir.

Nişanə 2: "Afitab" – bu beytdə mənəvi kamil hüsnü dünyəvi naqis hüsnə bənzətməklə ilahi gözəlliyi bəşəri əqlə sığışdırmaq istəyən nişanədir.

Nişanə 3: "Rövşən olmadı" və "nə bilsin" – bu iki nişanə zahirən bilməmək mənasını ifadə etsə əqlə sığmaz iqtidarı olan mütəal məhbuba acizlik və mənfilik sifətini nisbət verməklə kafirliyi təlqin edər, beləliklə "rövşən olmadı nə bilsin" ifadəsi məhbubun acizliyi deyil bəlkə də aşiqin istedadsız bir həqir olmasını təlqin edərək, onun nalələrində ilahi ərəfəyə yüksəlmək ləyaqətini yox dərəcədə bəyan etmək istəyir. Bunun üçün də

---

یک جرعه از این ساغر کار تو کند چون زر        جانم بفدا باشد ، این ساغر زرین را

şəmin günəş qarşısında həqirlik təmsilini qabağa çəkmək ilə aşiqə öz kamalsız və istedadsızlığını başa salmaq fikrindədir.

Anlam: Həqir bir şəmin günəş ərəfəsinə nur və hərarət bağışlamağı imkansız oldugu kimi mənim də hicran atəşində yanan qəlbimin mütəal məbud ərəfəsinə nalə çatdırması mümkünsüzdür.

**Qeyd**: *Yemək, içmək, danışmaq və habelə başqa təbii işlər insana üstünlük sayılmayan kimi ürəyin eşq atəşində yanmağı təbii olduğuna görə aşiqə bir etibar, yaxud bir zəhmət törətməz. Beləliklə qəlbi yanan bir aşiq hələ həqirdir və onun nalə ehtiyacı məbud ərəfəsinə ucalmaq istedadını özündə tapa bilməyib, ancaq içərisində şölə çəkən alovlar onun tərbiyə görməsi və məqsədə yetişməyi üçün vasitələrdir.*

Beyt 6: **Göz ki, peykanin xəyalilə saçar hər yan sirişk,**
**Bir sədəfdir, qətreyi – barani eylər dürri-nab.**

Sözlük: Peykan = ox ucu; sirişk = göz yaşı; baran = yagış; dürri-nab = xalis dürr

Nişanə 1: "Peykan" – istedadsız aşiqin qəlbini yaralamaq ilə onu kamal mərtəbəsinə tərbiyə edən və yetişdirən qəmzə satmaqdan ibarətdir.

Nişanə 2: "Düri - nab" – əbədiyyətə qovuşmuş ölməz ilahi həyat nailyyətindən nişanədir.

Nişanə 3: "İkinci misra" – aşiqin sınaqlardan çıxmaq istedadını qazanmasından nişanədir.

Anlam: Ötən beytdə qeyd olmuş həqirlik və istedadsızlıqdan xəbərdar olmaq aşiqi öz eyblərini (mənlik və mənəmlik) göz yaşıyla yuyub məhv etməyə vadar edərkən ona "qürb" və şühud muştuluğunu vermək istəyir.

Beyt 7: **Oldu əbri – dudi – ahim pərdeyi – rüxsari – mah,**
**Ah kim, almaz cəmalından hənuz ol məh niqab.**

Sözlük: Əbr = bulud; dud = duda = tüstü; ruxsar = camal = surət; hənuz = hələ; məh = mah = ay

Nişanə 1: "Mah" – birinci misrada dünyəvi ucalmaqdan nişanədir.

Nişanə 2: "Məh" – ikinci misrada maddi dünyada mənəvi cilaları əks etdirən mütəal məhbubdan nişanədir.

Anlam: Alovlu ürəkdən ucalmış nalələrim ( əbr, dud, ah) hündürlüklərə çatdıgı halda canan ərəfəsinə çatmadı.

**Qeyd**: *Beyt hətta mənəvi sərmayələri eşq bazarında yersiz və dəyərsiz təlqin etmək istəyirş* [1]

---

[1] Qəzəl 3, beyt 4

Beyt 8: **Kəsmədi məndən səri – kuyində azarın rəqib,**
**Ey Füzuli, necə cənnət içrə yox derlər əzab**

Sözlük: Səri-kuy = ərəfə ağzı

Nişanə 1: "Rəqib" – aşiqin müşahidə nurunda məhvinə mane olmaqdan nişanədir.

**Qeyd**: *Vəhdət məqamına mükəmməl mərifət tapan bir aşiq hətta ilahi vasitələri özünə mane (rəqib) bilir.*

Anlam:

1 – Ey Füzuli, mütəal məhbubun ərəfəsində də (cənnət) ətəş və tələb əzabı məndən əl çəkməyir.

2 – Ey Füzuli, mütəal məşuqun öz ərəfəsindəki mülklər və vasitələr (rəqib) mənim vəhdət dənizində yaxud" ənəllah" nöqtəsində məhvliyimə mane törətmək ilə qəlbimə əzab verirlər.

**Qeyd**: *Aşiqə maddi dünyada kamil məhvlik (fəna) mümkünsüz olduğuna görə ətəçsiz - əzabsız yaşamaq da imkansızdır.*

## Q Ə Z Ə L 37

**(1) Dərdi – eşqim dəf'inə zəhmət çəkər daim təbib,**
**Şükr kim, olmuş ona zəhmət, mənə rahət nəsib.**

**(2) Bir zəbandır şərhi – qəm təqririnə hər bərgi – gül,**
**Eyləməz bihudə gül gördükdə əfğan əndəlib.**

**(3) Bilsə zövqüm vəsldən firqətdə əfzun olduğun,**
**Vəsldən mən'im rəva görməzdi rəşkindən rəqib.**

**(4) Tə'ni – qəflətdir pəritələtlərə izhari – hal,**
**Sanma kim, əhbab halından olur qafil həbib.**

**(5) Ah, bilmən neyləyim, qurtulmaq olmaz qeyddən,**
**Mən hərifi – sadədil, xüban cəmali dilfirib.**

**(6) Şəm qürbilə təfaxür qılma, ey pərvanə, kim,**
**Xirməni – ömrün göyər bərqi – fənadan ənqərib.**

**(7) Nola ağlarsa Füzuli rövzeyi – kuyin görüb,**
**Lacərəm giryan olur qılcaq vətən yadın qərib.**

Beyt 1: **Dərdi – eşqim dəf’inə zəhmət çəkər daim təbib,**
**Şükr kim, olmuş ona zəhmət, mənə rahət nəsib.**

Nişanə 1: "Dərdi-eşq" – aşiqi mənliyindən ayırıb mücərrədlik məqamına hazırlayan bəlalardan ibarətdir.[1]

Qeyd: *A – Hicran və uzaqlıqdan hasil olmuş eşq dərdi aşiqi başıaşağı və həqir edən dərddən ibarətdir, ancaq belə bir dərd aşiqə canan qarşısında öz həqirıiyini bildirmək üçün özəl mərhələlərdə gərəklidir.*

*B – Yaxınlıq (qürb) və tanışlıqdan törənmiş eşq dərdi aşiqin günahlarını təmizləyib onun başını uca və hörmətini çox edən dərddir. Xacə Abdullah Ənsari bu çeşid dərd-bəlanı alqışlayaraq demişdir: "..., eşq dərdi aşiqi heyran-sərgərdan qoymuş, ağlar-gülər etmişdir və şipşirin şərbət ilə qarışıq bir zəhərdən, müsibət qulpundan asılı üstün bir nemətdən və qəm-qüssələrlə dolu toy- bayramdan ibarətdir.[2]*

Nişanə 2: "Təbib" – bu beytdə eşq dərdinə əql və elm ilə tədbir göstərən nəsihətçilərdən nişanədir.

Nişanə 3: "Rahət"– aşiqin batini iradəsi və ürək istəyi ilə paralel bir haldan ibarətdir.

***Qeyd:*** *Eşq dərdinə tədbir etməklə batini müşküllər və məhrumluqların artması kimi daxili rahatlıq da eşq hadisələrinə tamamilə təslim olmaqdadır.[3] Bunun üçün də ariflər və alimlər islam dinini təslim dini bilərkən " ‹‹الاسلام هوتسليم››* [4] *deməklə onun aşiqanə bir din olmağını təsdiq etmişlər. Beləliklə, ilk addımda məşuqa təslim olmuş düzgün bir aşiq haldan-hala düşməyi yalnız mütəal məhbubun iradəsinə bağlı bilir.5 Bunun üçün də pozğun halı onunla əlaqədar bilib özünü minnətdar göstərir. Belə bir baxışı təsdiq etmək məqsədilə demişlər: "Ürfan məktəbini alqışlayan bir tələbə Mahan şəhərinə varid olub ancaq bir çox müddətdən sonra həzrəti mürşüdün (Şah Nemətullah Vəlinin) ziyarətinə çatarkən özünün gecikmək səbəbinin hər bir şeydən və hər bir şəxsdən ümüdsüz halda olduğunu bəyan edərək üzrxahlıq etdi, mürşüd buyurdu:*

---

[1] Qəzəl 23, beyt 1.
[2] Fərhənge -istelahat və təbirate-ürfani.
[3] راحه النفس کلها فی التسلیم و بلائها فی التدبیر
" اسرار توحید"
4 Doktor Cavad Nurbəxş, Sufi kist s. 16
[5] Bu baxımla mütəal məbuda "lülivvəhüm -lavhə" محوّل الاحوال yəni “halları dəyişdirən” demişlər.

*"الذكر المميتى" yaxud peyğəmbər buyurduğu "موتوا قبل ان تموتوا " halına*[1]*, ya da mənəvi üstünlüklərə mane olmuş dünyəvi xarakterə və mənəm-mənəmliyi məğlub və məhv etməyə vərdiş edirdin və bu vərdiş ən yaxşı bir hal idi, çünki o halda bir ölü kimi eşqə təslim olmuşdun.*[2]

Anlam: Dünyaşünas əql və təcrübə məhdudluğunda aşiqin üstün özəl aləmindən xəbərsiz qalan nəsihətçi bəlalər və biqərarlıqlardan törənmiş ilahi nemətlə tanışlıq imkanını tapmadığına görə mənə yol göstərməyi ilə özünü yersiz rəhmətə giriftar edər.

Beyt 2: **Bir zəbandır şərhi-qəm təqririnə hər bərgi-gül,**
**Eyləməz bihudə gül gördükdə əfğan əndəlib.**

Sözlük: Təqrir = bəyan etmək = aydın etmək; bərgi-gül = gül yarpağı;
bihudə = batil = boş = mənasız = faydasız; əfğan = fəğan = nalə;
əndəlib = bülbül.

Nişanə 1: "Qəm" – həsrət və hacət ilə dolu ürəyi əhatə etmiş mütəal məhbubun rəhmət sifətilə əlaqədar bəlalarından yaxud eşq dərdindən ibarətdir.

Nişanə 2: "Bərgi – gül" – A – bəst mərtəbəsinin şövqündə, yaxud nailyyətində aramsız yeniləşən əhval – ruhiyyədən nişanədir.[3]

B – xüsusilə bu beytdə hər bir yaranışda əks etdirilmiş yaradıcı məhbubun lütf və hüsnündən, yaxud kəsrətin vəhdət güzgüsü olmasından nişanədir.

Nişanə 3: "Əndəlib" – bəst və şühud məqamında da ətəşi – biqərarlığı sakitləşməyən aşiqdən nişanədir.

Nişanə 4: İkinci misra təbii nümunə göstərməyi ilə idraka sığmayan ilahi əhval – ruhiyyəni bəşəriləşdirib – başa salmaq istəyindən nişanədir.

Anlam: Hər bir gül yarpağı bir çeşid ilahi hüsn əks etdirib bülbülə cazibələr törədərkən özəl bir bəyan ilə eşq və ürfandan söz açır.

**Qeyd**: *Həzrəti-Sədi belə bir baxımla hər bir yarpaqda bir kitab mənəvi marif idrak edərək, təbiətin "tovhid günəşinə"*[4] *güzgü oldugunu israr edir*[5] .

---

[1] Qəzəl 7, beyt 2

[2], Doktor Cavad Nurbəxş, Sufi kist səh. 14, 15

[3] "Bərgi – gül" - bahar ünvanlı mərtəbədə, həm də mərifət məqamında özəl və dərin bəhsli bir termindir

[4] Qəzəl 1, beyt 1

[5] برگ درختان سبز در نظر هوشیار هرورقش دفتریست معرفت كردگار

Beyt 3: **Bilsə zövqüm vəsldən firqətdə əfzun olduğun,**
**Vəsldən mən’im rəva görməzdi rəşkindən rəqib.**

Sözlük: Firqət = hicran = ayrılıq; əfzun = artıq; mən = mümaniət = qabağını almaq; rəşk = qısqanclıq = paxıllıq.

Nişanə 1: "Zövq ". Zahiri zövq müxtəlif tamları tanıtdıran dil qüvvəsi və dad hissi olduğu kimi, batini zövq isə şühud məqamının ilk dərəcəsində ardıcıl saçılan ilahi cəlalər ilə mənəvi eşq və gözəllik ləzzətini daddıran haldan nişanədir.

**Qeyd** 1: *Zövq mənəvi kamillik tapmaqla "şorb" ünvanlı özəl və üstün bir mərtəbəyə çevrilər.*

**Qeyd** 2*: "Şorb" yalnız rahatlıqda və vüsalda hasil olar, lakin zövq həm vüsalda, həm də hicranda aşiq ürəyini biqərar edər. Elə buna görə də bəla zövqü, ətəş zövqü, məhvlik zövqü və habelə başqa tərkiblər ürfan ədəbiyyatına varid olmuşdur.*[1]

Nişanə 2: "Rəqib": vəhdət nöqtəsindən ayrı, yaxud mütəal məhbubdan başqa hər bir mövcud, hətta ilahi vasitələr, xüsusilə zahidlər və nəsihətçilər kimi fəna (məhvlik) qarşısında mane olmuşlar və rəqibdirlər.

Anlam: A – Hicran mütəal məhbubun istədiyi və məsləhət bildiyi olduğundan vüsaldan, yaxud aşiq istəyindən üstündür.

B – Hicran aşiqi tərbiyə edən və yetişdirən mərhələ olduğuna görə əzizdir. Elə buna görə də demişlər:

**Ey rəqibi səngdil, çox tənə vurma Əzhərə,**
**Sən vüsalından xoş olsan mən də hicrandan xoşam**[2]

P – Hicranda vüsal ümüdü və vüsalda hicran qorxusu olduğuna görə ümüdü qorxudan və hicranı vüsaldan üstün bilmişlər.[3]

Beyt 4: **Təni-qəflətdir pəritələtlərə izhari-hal,**
**Sanma kim, əhbab halından olur qafil həbib.**

Sözlük: Tə’n= tənə = sərki vurmaq = atmaca atmaq = nizələmək, pəritələt = pəriçöhrə; əhbab = dostlar

Nişanə 1: "Pəritələtlər":

---

"گلستان سعدی "

[1]Fərhənge -istelahat və təbirate ürfani.

[2] Əzhər Ərdəbilinin bir qəzəlindən bir beyt

[3] هست در قرب همه بیم زوال     نیست در بعد جز امید وصال

"دیوان اشعار جامی"

A – mürşüdlərdən və ilahi vasitələrdən nişanədir.

B – eganə məhbubun qəbz, bəst, qəmzə və digər müxtəlif mərtəbələrdə zühur etməyindən nişanədir.

P – Pəri tələtlər, bəşəri camalda ilahi hüsnlər əks etdirən dünya gözəllərindən nişanədir.

Anlam: Mürşid həzrətlərinə, axud ilahi vasitələrə, ya da mütəal məhbuba şikayətçi olan, yaxud hacət aparan bir aşiq öz xamlıq və nadanlığını sübut etmək istəyir, çünki şərif ayədə buyurulduğu kimi,[1] bütün dünya zahir və batinlə birlikdə mehriban və iqtidarlı məhbubun əhatəsindədir.[2]

**Qeyd** 1: *Aşiqin şikayət etməsi kimi hacət istəməyi də nadanlıq əlamətidir, çünki:*

*A – Mütləq təslim halında olan bir aşiqə şikayət etmək və hacət istəmək təslimdən qıraq düşməkdən ibarətdir.*

*B – Özünü özünə malik bilməkdən, beləliklə, məmlüklükdən kənar düşməkdən ibarətdir.*

*P – Mütəal məhbub həkim iqtidarlı və mehriban olduğuna görə qəhrini lütfdən ayırmaq, beləliklə, şikayət etmək, yaxud hacət diləmək yaramazlıq və məhkumluq əlamətidir.*

*T – Mütəal məhbub aşiqin özündən özünə yaxındır "* نحن اقرب اليه من حبل الوريد*"*

*S – Mütəal məhbubun rəhməti ucu – bucağı yox bir dəniz olduğuna görə hamının o cümlədən aşiqin də o dənizdə payı və qisməti var.*

*C – Yuxarıda dediyimiz qeydlər bir çox başqa paralel dəlillər olduğuna görə Mövləvi hətta dua etməyi aşiqə eyb – irad bilərkən demişdir: "Mən mütəal məhbubun "övliya" ünvanlı özəl dostlarından bir çoxunu tanıyıram ki, onlar ağzlarını duadan isə bağlayıblar" .*[3]

**Qeyd** 2: *Dua özünü bir şəxs yoxsa bir vücuda malik bilib hacət diləməkdir və zikr deməkdən, münacatdan və məmlüklük izhar etməkdən başqa və fərqli.*

Beyt 5: **Ah, bilmən neyləyim, qurtulmaq olmaz qeyddən,**
**Mən hərifi-sadədil, xüban cəmal dilfirib.**

Sözlük: Qeyd = həbs = bənd = əhd = şərt; sadədil = sadə ürəkli; xublar = gözəllər; dilfirib = dilara = dilbər

---

[1] الا انّه بكلّ شئى محيط، Quran, Fussilət surəsi, 54-cü ayə

[2] Qəzəl 2, beyt 1

[3] قوم ديگر شناسم زوليا    كه دهانشان بسته باشد از دعا
"1910 مثنوى معنوى مولوى ،دفتر 3 ، بيت

Nişanə 1: "Dilfirib" - istidrac" ünvanlı ürfani mərhələdə aşiqi sınaqlara çəkən dilbərdən ibarətdir.

Nişanə 2: "Sadədil" - aşiqin məşuq qarşısında həqirliyini təlqin edərək onun kəsrət küdurətlərini qat-qat soyub, üryanlıq və mücərrədlik məqamına istedad tapmış ürəyinə eyham edir.

Anlam: Beyt ilahi cilvələrin dəmbədəm yeniləşməyinə görə mənəvi ətəşlərə son qoymağı və nəhayət ürək sakitliyini mümkünsüz təlqin edərək eşq sınaqlarından xilas olma imkanını yox dərəcədə bəyan etmək istəyir.

Beyt 6: **Şəm qürbilə təfaxür qılma, ey pərvanə, kim,**
**Xirməni-ömrün göyər bərqi-fənadan ənqərib.**

Sözlük: qürb = yaxınlıq = yaxın düşmək; təfaxur = fəxr etmək = nazlanmaq; bərqi fəna = fanilik atəşi = məhv edən bərq; ənqərib = tezcə = tezliklə

Anlam: Zamanın dayanmaz hərəkəti və maddənin dəmbədəm təğyir etməsi bütün yaranmışların xüsusilə insanların dünyəvi atmosferdə ömür sürməkləri ilə paralel dəyişməklərini göstərərkən onların sifət və hallarının da davamsız yeniləşməkdə və çevrilməkdə olduğunu sübut edir, beləliklə davam kəlməsinin dünya üzərində mənasız bir söz olduğu məlum olur, amma insan, ömrün çevrilən anlarının arxa – arxaya verməyini davam təsəvvür edib, bir sırada biri birinə söykənmiş xəttə bənzər nöqtələr kimi ömrün arxası olmayan çevrilən anlarını da öz zehnində arxa – arxaya söykənmiş təsəvvür etməklə, davam sözündə qeyri-həqiqi bir məna düzəltmişdir. Beləliklə beyt müsbət, yaxud mənfi dünyəvi durumların etibarsız olduğunu təlqin edərək, pərvanənin şəm vüsalına çatmağını davamsız təmsil etməklə ürfani bəst məqamlarının arxasınca qəbz müşküllərinin hazır olmasını isə eyham etmək istəyir.

Beyt 7: **Nola ağlarsa Füzuli rövzeyi – kuyin görüb,**
**Lacərəm giryan olur qılcaq vətən yadın qərib.**

Sözlük: Rövzə = bağ = gülüstan; lacəzəm = naçar

Nişanə 1: "Rövzeyi-kuy" və "Vətən" - vəhdət mülkünün ərəfəsindən, insanın maddi dünyaya düşməsindən əvvəl onun mənəvi yaşayış səviyyəsindən nişanədir.

Nişanə 2: "Qərib" - maddi dünyada mənəvi yaşayışı yaddan çıxarmayan və öz ilahi əslinə müraciət etmək və qovuşmaq istəyən,

kəsrət atmosferində vəhdət havalı aşiqdən nişanədir. [1]
Anlam: Qərib bir insan vətən həsrətində göz yaşını yagdıran kimi Füzuli də "innəllah"[2] mülkünün həsrətində və şövqündə giryan olmuşdur.

[1] Qəzəl 34, beyt 2
[2] انا لله و انا اليه راجعون Quran, Bəqərə surəsi, 156 cı ayə

## Q Ə Z Ə L 38

**(1) Payibənd oldum səri-zülfi-pərişanın görüb,**
**Nitqdən düşdüm ləbi-ləli-dürəfşanın görüb.**

**(2) Oda yazdım şəmvəs canım baxıb rüxsarına,**
**Çərxə çəkdim dudi-dil sərvi-xuramanın görüb.**

**(3) Gəzdirər hər yan gözüm əşk içrə bağrım parəsin,**
**Xələti-gülgun ilə rəxş üzrə cövlanın görüb.**

**(4) Bir zaman keçməz ki, dil tiğindən olmaz çak-çak,**
**Açılır hər dəm tutulmuş könlüm ehsanın görüb.**

**(5) Könlümü tənhalıq eylərdi pərişan sinədə,**
**Olmasaydı cəm hər yanında peykanın görüb.**

**(6) Bəndü zindani-qəmü möhnətdən olmuşdum xilas,**
**Ah kim, düşdüm yenə zülfi-zənəxdanın görüb.**

**(7) Ey Füzuli, bunca kim tutdun nihan hali-dilin,**
**Aqibət fəhm etdi el çaki-giribanın görüb.**

Beyt 1: **Payibənd oldum səri-zülfi-pərişanın görüb,**
**Nitqdən düşdüm ləbi-ləli-dürəfşanın görüb.**

Sözlük: Payibənd olmaq = ayağı yanmaq = giriftar olmaq = mübtəla;

dürəfşan = mirvari yağdıran

Nişanə 1: "Zülfi-pərişan"- hər bir çeşiddə ilahi camal nurunu əks etdirmiş kəsrət güzgülərindən ibarətdir.

Nişanə 2: "Nitqdən düşmək" - heyranlıq və sərgərdanlıq məqamından, yaxud əql və idrak ünvanlı ən iqtidarlı əngəllərdən xilas edən yeni və üstün bir mərifətdən hasil olmuş mərtəbədən nişanədir.

**Qeyd**: *Nitq fikirə, fikir əqlə, əql elm və təcrübə, elm və təcrübə isə maddi dünyaya bağlı olduğuna görə, nitqdən düşmək maddənin güclü bir cəhətini ayırıb-atmaqdan və o atılmış maddə qədər də mənəvi səviyyəyə yaxınlaşmaqdan ibarətdir.*

Nişanə 3: "Ləbi-ləli-dürəfşan" - yox imkanda var törədən, həm də içəri xarakteri dəmbədəm diriləndən ilahi feyzlər və rəhmani nəfəslərdən ibarətdir .

Anlam: İçəri və çöl vücudumu, ətraflı əhatə etmiş ilahi cilvələr bəşəri mahiyyətimi iqtidardan və etibardan saldı.

Beyt 2: **Oda yaxdım şəmvəs canım baxıb rüxsarına,**
**Çərxə çəkdim dudi-dil sərvi-xuramanın görüb.**

Sözlük: Şəmvəş = şam kimi; rüxsar = camal = sürət;

dud = duda = tüstü; xuraman = nazlı və təkəbürlü yerimək

Nişanə 1: "Şəm vəş yanmaq" - fəna məqamına hazırlaşmaqdan nişanədir.

Nişanə 2: "Rüxsar" - gözəl məhbub cəmalından saçılmış cilalardan nişanədir.

Nişanə 3: "Sərvi-xuraman" - "istiqna" və "səmədiyyət" məqamında[1] qəmzə satmağı davamlandıran mütəal məhbubdan nişanədir.

Anlam: İlahi camal cəlalərilə bəşəri əngəl ilgilərini yandırıb tüstüsünü səmaya qaldırmaqla şühud nurunu yoxsa müşahidə nemətini ehsan etmiş dilbərə minnətdarlıq göstərdim.

Beyt 3: **Gəzdirər hər yan gözüm əşk içrə bağrım parəsin,**
**Xələti-gülgun ilə rəxş üzrə cövlanın görüb.**

[1] Qəzəl 30 beyt 3, nişanə "Məst".

Sözlük: Əşk = göz yaşı; gülgüun = gül kimi (qırmızı, yaxud mühəmmədi gül kimi); rəxş = ağa qarışıq qırmızı = əsl, at = ağ-sarı-qırmızı rəngarəng dərisi üstündə sarışın qırmızı gülləri olan, Rüstəmin özəl və əsl atı[1]

Nişanə 1: "Əşk" - zahiri əngəl xarakteri yuyub-təmizləyən biqərarlıqdan nişanədir.

Nişanə 2: "Bağrım parəsi":

A – qırmızıya və qana eyham edərək eşq qələbəsilə mənlik və mənəmliyin batil olmasını təlqin edən nişanədir.

B – Bağrım parəsi, yaxud urək və cigər, mənəvi vüsala maneələr törətmiş dünyəvi həyatın məğlubluğunu təlqin edən nişanədir.

Nişanə 3: İkinci misra mütəal məbudun səmalar üstündə seyr edən camal cilvələrini Rüstəmin qırmızı xələt geyinib at oynatmağına bənzətməklə ilahi təcəllilərin dünyəvi təmayülatı məhv edən qələbələrini təlqin etmək istəyir.

**Qeyd**: *Rüstəm ürfan terminində bəşərin ilahi bir xəlifəsi olduğunu və onun mənəvi iqtidarına eyham olunan nişanədən ibarətdir. Bunun üçün də Mövləvi Rüstəmi həzrət Əmirəlmövminin Əli (ə) in sərdarı bilərkən bu sayxaşlıqlar və məfkurəsizliklər çulğalayan dünyanın nicatını əlçatmaz yüksəkliklərə əsaslı hazırlanmasını Əli(ə) iqtidarlı və Rüstəm qeyrətli insanların qiyamına bağlamışdır.*[2]

Anlam: Ürək qanını gözdən yağdırmaqla dünyəvi mahiyyətdən xilas olub, mənəvi müşahidələrə hazırlaşmağımı elan etmək istəyirəm.

**Qeyd**: *İkinci misra məcazi təsəvvürlə, mənəvi bir yöndəmi dünyəviləşdirib başa salmaq istəyir*.

Beyt 4: **Bir zaman keçməz ki, dil tiğindən olmaz çak-çak,**
**Açılır hər dəm tutulmuş könlüm ehsanın görüb.**

Sözlük: Çak-çak = parça- parça

Nişanə 1: "Tiğ" - üryanlıq və qurbanlıq məqamının müqəddiməsi olan qəbzlər və bəstlərdən nişanədir.

Nişanə 2: "Çak-çak" - aşiqi bəşəri mahiyyətdən ayıran müqəddimədən nişanədir.

Nişanə 3: "Açılmış könül" - maddi məhdudluğa qalib gələn əhval - ruhiyyədən nişanədir.

---

[1] Fərhənge-Moin, Alam.

[2] زین همراهان سست عناصر دلم گرفت      شیرخدا و رستم آرزوست
"دیوان شمس"

Nişanə 4: "Ehsan":

A – Ehsan, ibadət halında mütəal məhbubun cilaları ilə ziyalanmaqdan nişanədir.

B – Ehsan mütəal məhbub qarşısında özünü və bütün dünyanı həqir və heç görüb yalnız yaradıcı məhbuba möhtaclıq göstərməklə öz bəndəliyini kamil etmiş aşiqin ilahi lütflərə nailiyyət tapmağından nişanədir.

Anlam: Hər an yeni bir ətəş və təzə bir mərifət tapmaqla mütəal məhbubun açıq ehsanından istifadə edirəm.( Hər dəm özümdən – özlüyümdən ayrılıram)

Beyt 5: **Könlümü tənhalıq eylərdi pərişan sinədə,**
**Olmasaydı cəm hər yanında peykanın görüb.**

Sözlük: Peykan = ox ucu

Nişanə 1: "Könül" - bu beytdə qeyri maddi içəri şəxsiyyətdən nişanədir.

Nişanə 2: "Tənhalıq" - bu beytdə tələb qürbətindən nişanədir.[1]

**Qeyd**: *Həzrəti-məbud ərəfəsindən kənara düşmüş bir adam heç bir qapıdan həqiqi yardımçılıq görə bilməyib tənhalıq təhlükəsində qalmalıdır.*

Nişanə 3: "Peykan" - qəbz bəlaları ilə birləşmiş bəst ətəşlərindən nişanədir.

Anlam: Həqiqi və batini şəxsiyyətimi dağılmaq və məhv olmaqdan mühafizə edən yalnız ilahi bəlalar və cilalardır.

Beyt 6: **Bəndü zindani-qəmü möhnətdən olmuşdum xilas,**
**Ah kim, düşdüm yenə zülfi-zənəxdanın görüb.**

Sözlük: Zənəxdan = çənə = çənənin çökük hissəsi

Nişanə 1: Birinci misra aşiqin keçmişdə maddi maneələrdən azadlıq şəraitini onun yadına salan həsrətdən nişanədir.

Nişanə 2: "Zülfi zənəxdan" - bu beytdə aşiqin istiqamətlənməyinə və tərbiyəsinə gərəkli tənbihlərdən nişanədir, (cazibələrin saxlanması)[2], mehriban məhbub bu mərhələdə qəzəb qarışıq rəhmət ilə aşiqə əbədi zülmətdən nicat vermək məqsəddilə onu müvəqqəti zülmətə, yaxud kəsrət və küdurət əngəllərinə giriftar edər.[3]

---

[1] Qəzəl 34, beyt 3

[2] Qəzəl 24, beyt 6

[3] Müəllif " Ta Qafe əndişe" kitabının 4-cü cildində 436- cı qəzəldə "Zindan" mərtəbəsi barədə geniş izahat vermişdir.

Anlam: Əfsus ki, kəsrət qaldıran maneələr (zülf) bəst nailiyyətinə çatmış qəlbimi yenidən qəbz sıxıntılarına (zənəxdan) giriftar etdi.

Beyt 7: **Ey Füzuli, bunca kim tutdun nihan hali-dilin,**
**Aqibət fəhm etdi el çaki-giribanın görüb.**

Sözlük: Nəhan = gizli; çaki-giriban = yaxa açmaq halı =
açılmış yaxa = eşq atəşində yanmaq = özünü unutmaq

Nişanə 1: "Çaki giriban" - biqərarlıqdan və qayğı çəkməkdən nişanədir.

Anlam: Ey Füzuli, çox cəhd və tədbirlə ürəkdə gizli saxladığım eşqi amansız qayğılar və biqərarlıqlar üzə çıxardı.

## Q Ə Z Ə L 39

**(1) Qeyrə eylər bisəbəb min iltifat ol nuşləb,**
**İltifat etməz mənə mütləq, nədir bilmən səbəb.**

**(2) Cövr olur adət qəzəb vəqti, nə adətdir bu kim,**
**Cövrün az eylər mənə ol mah çün eylər qəzəb.**

**(3) Nola qəmzən fikri düşdisə dili-suzanimə,**
**Zalimin gər olsa atəş mənzili, olmaz əcəb.**

**(4) Dəmbədəm gər dürri-əşkim düşsə gözdən vəchi var,**
**Yaş uşaqlardır yetim, onlarda yox rəsmi-əcəb.**

**(5) Cövri könlümdür çəkən, gözdür görən rüxsarını,**
**Allah-Allah, kam alan kimdir, çəkən kimdir təəb!**

**(6) Yar bidad eyləməz üşşaq fəryad etmədən,**
**Hər necə ruzi müqəddər olsa, vacibdir tələb.**

**(7) Mütrib, ağlatma sürudinlə Füzuli xəstəni,**
**Seyli-əşkindən saqın, qopmaya bünyadi-tərəb.**

Beyt 1: **Qeyrə eylər bisəbəb min iltifat ol nuşləb,**
**İltifat etməz mənə mütləq, nədir bilmən səbəb.**

Sözlük: Nuşləb = şirin ləb

Nişanə 1: "Qeyr", "Bisəbəb": Qeyr və bisəbəb, mütəal məbud lütfinə nailyyət tapmış başqa aşiqlərin istedadsızlığını təlqin edən nişanələrdir.

Nişanə 2: "İltifat" - aşiqi müşahidə ziyası ilə tərbiyə edən sifətdən ibarətdir.

Nişanə 3: "Nuşləb" - yox imkana varlıq bağışlayan rəhmani feyzlərdən nişanədir.

Anlam: Həkimi-məhbub bir çox mənəvi sərmayəsız və həqiqi istedadsız aşiqə müşahidə ziyasını ehsan edərək məni məhrumluqdan xilas etməyir.

Beyt 2: **Cövr olur adət qəzəb vəqti, nə adətdir bu kim,**
**Cövrün az eylər mənə ol mah çün eylər qəzəb.**

Nişanə 1: "Cövr və qəzəb" - aşiqi kamal zirvəsinə qaldırmaq qəsdilə onun qəlbini əhatə edən sıxıntılardan ibarətdir.

**Qeyd** 1: *Cövr aşiqi tərbiyə edən sifət olduğuna görə, bir növ iltifatdır.*

**Qeyd** 2: *Cövr və iltifat vahid mənşəli (vəhdət nöqtəsilə əlaqədar) olduğuna görə, aşiq onları biri birindən fərqləndirsə gühahkarlıq etmişdir.*

**Qeyd** 3: *Cövr və iltifatdan başqa şey görən aşiq ikiliyə ( bir cövr bir də iltifat), yaxud kəsrət mənşəyinə giriftar olmuşdur. Bunun üçün də cövrü iltifat kimi alqışlamaq aşiqə vacibdir.*

Anlam: Qəzəblənmiş məşuq cəfalarını əlavə edər, əksinə mənim həkim məhbubum qəzəb vaxtı cəfalarını az ehsan edir.

**Qeyd**: *Bu anlam cövrü cəfanın iltifat olmasını məlum edir.*

Beyt 3: **Nola qəmzən fikri düşdisə dili-suzanimə,**
**Zalimin gər olsa atəş mənzili, olmaz əcəb.**

Sözlük: Dili-suzan = alovlu ürək

Nişanə 1: "Qəmzə" - aşiqin qəlbində qorxuyla yanaşı ümüd törədən həkimi-məhbubun rəhmətinə bağlı qəzəbindən nişanədir.

Nişanə 2: "Zalim" Mənlikdən zərrə saxlamaq əngəl becərmək və rəqiblik hissi yaratdığına görə maddi həyatını tam unutmayan aşiq öz həqiqi həyatına zülm etdiyini hiss edərək atəşlə cəzalanmağını xahiş edir.

Beyt 4: **Dəmbədəm gər dürri-əşkim düşsə gözdən vəchi var,**
**Yaş uşaqlardır yetim, onlarda yox rəsmi-əcəb.**

Sözlük: Əşk = göz yaşı; vəch = dəlil = illət

Nişanə 1: " Dürri - əşk":

A – Bəşər mənliyi göz yaşıyla yumaqdan və onu ürək qanıyla batil etməkdən nişanədir.

B – Dünyəvi sərmayəni eşq bazarında bərbad etməkdən nişanədir.

Nişanə 2: "Düşsə gözdən":

A – Göz yaşını şıdırğı yağdırmaqdan nişanədir.

B – Təbii vücudun, yaxud dünyəvi sərmayənin həqirliyindən nişanədir.

Nişanə 3: "Yaş":

A – bilavasitə göz yaşını təlqin edir.

B – bilavasitə yetkinlik çağına yetişməyi təlqin edir.

P – Dürriəşk, göz yaşı ilə ürək qanının birgəliyindən istiarə olduğuna görə yaş, napaklığa və xalis olmamağa da eyham edir.

Nişanə 4: "Yetim" - tərbiyə imkanından uzaqlığa və nəhayət ədəbsizliyə eyham edir.

Anlam: Göz yaşımı ədəbsiz uşaqlar kimi nəzərdən salan və səmərəsiz edən onun öz napak və nalayiq olmasıdır.

**Qeyd** 1: *Füzuli qana qatqı göz yaşının napaklığını təsdiq edərək ötən beytdə qeyd etdiyi zalimliyi təkrar və izah etmək istayir.*

**Qeyd** 2: *Öz giryanlıq və biqərarlığının dəyərsiz və səmərəsiz olmağını dəlilləşdirmək istayir.*

Beyt 5: **Cövri könlümdür çəkən, gözdür görən rüxsarını,**
**Allah-Allah, kam alan kimdir, çəkən kimdir təəb!**

Sözlük: Rüxsar = camal = surət; təəb = çətinlik = incitmə

Nişanə 1: "Könül" - bu beytdə ürəyin təbii və maddi şəraitini bəyan edən nişanədir.

Nişanə 2: "Göz" - bu beytdə mənəvi cilaları idrak edən bəsirət adlı batini bir qüvvədən nişanədir.

Nişanə 3: "Ruxsar" - ilahi camal cilalarından və lürf sifətlərindən nişanədir.

Nişanə 4: "Allah - Allah" - bir çox təəccüblənməkdən və heyranlıqdan nişanədir.

Anlam: Necə heyran qalmayım ki, ürək qəbz sıxıntılarında qazandığı şühud nemətindən gözü kama çatdırdığı halda özü kamsız qalır.

**Qeyd**: *Beyt mənəvi kam almağı dünyəvi kamsızlıqdan üstün bilib ilahi mərtəbəyə yüksəlməyin bəşəri fədakarlıq və qurbanlıqla bağlı olduğunu demək istəyir.*

Beyt 6: **Yar bidad eyləməz üşşaq fəryad etmədən,**
**Hər necə ruzi müqəddər olsa, vacibdir tələb.**

Sözlük: Üşşaq = aşiqlər

Nişanə 1: "Bidad ":

A – bidad, aşiqi kamal mərtəbəsinə qaldırmaq məqsədilə tərbiyə edən hicran və qəbz sıxıntılarından nişanədir.

B – bidad, aşiqi mənəvi maarif və kamaldan məhrum edən nişanədir.

Nişanə 2: "Fəryad etmə":

A – dözümsüz aşiqin narazılıq və gileyindən nişanədir.

B – dözümlü aşiqin cəfalar və bəlalar qarşısında alqış və minnətdarlıq göstərməyindən nişanədir.

Anlam:

A – Mütəal məhbub istiqamətsiz və dözümsüz aşiqin bəlalarını qət etməklə onu ilahi maarifdən məhrum edər. Bunun üşün aşiq bəlalarla bağlı təyin olunan öz mənəvi həyat ruzisini dözüm göstərmək və fəryad etməməklə tələb etməlidir.

B – Fəryad və nalə, yaxud biqərarlıq aşiqin münacatı, yaxud mütəal məhbubun sevgisi olduğuna görə məhrumluq bidadını bitirən nişanədir. Bunun üçün də aşiq nalə və fəryad ilə mənəvi ruzisini qazanmalıdır.

Beyt 7: **Mütrib, ağlatma sürudinlə Füzuli xəstəni,**
**Seyli -əşkindən saqın, qopmaya bünyadi-tərəb.**

Sözlük: Əşk = göz yaşı, tərəb = şadlıq; sürud = mahnı = nəğmə = milli və vətənpərbəlik mənasını ifadə edən ahəngdar bir şeir = qədim bir musiqi ahəngi.

Nişanə 1: "Mütrüb ":

A – kamal zirvəsinə yüksəlmiş mürşiddən nişanədir.

B – aşiqin viran olmuş qəlbini abad edən ilahi feyz və rəhmət vasitəsindən ibarətdir.[1]

Nişanə 2: "Sürud, tərəb" - bu beytdə müşahidə və vüsal nailiyyətinin şadlıqlarından ibarətdir.

---

[1] Qəzəl 23, beyt 8

Anlam: Ey mütrüb, müşahidə nailiyyətində bir çox naz satmaqla məhrum qəlbimin həsrət atəşindən qopan tüstünü göylərə qaldırıb ,özünü isə müşahidədən məhrum etmə ( tüstü müşahidəyə maneədir).

## Q Ə Z Ə L 40

**(1) Vəslin mənə həyat verir firqətin məmat,**
**Sübhanə xaliqən xələqəl movtə vəl-həyat.**[1]

**(2) Hicranına təhəmmül edən vəslini bulur,**
**Tuba limən yüsaidühüs-səbrü vəs-səbat.**[2]

**(3) Mehrindir iqtinayi-məqasid vəsiləsi,**
**Maşaə mən əradə bihil fovzə vən-nicat.**[3]

**(4) Tökmüş riyazi-təbimə barani-şövqünü,**
**Mən ənzəlqəl-miyahə və əhya bihən-nəbat.**[4]

**(5) Həqq afərinişə səbəb etdi vücudini,**
**Əvcəbtə biz-zühuri, zühurəlm-ükəvvənat.**[5]

**(6) İzəd səriri-hüsnə səni qıldı padişah,**
**Əla kəmalə zatikə fi əhsənis-sifat.**[6]

**(7) Qıldın ədayi-nət, Füzuli, təmam qıl,**
**Kəmmülhü bis-səlati və təmmimhü bis-səlat.**[7]

---

[1] Məni yaradan pak və müqəddəsdir, ölümü və həyatı yaratmışdır.
[2] O adam xoşbəxtdir ki, möhkəmlik və səbr ona köməkdir.
[3] Hər kəs istəsə onunla nailiyyət və nicat tapar.
[4] Yağışı yağdırıb, bitkiləri dirildən.
[5] Zühurunla varlığın zühuruna səbəb oldun.
[6] Zatının kəmalını gözəl sifətlərlə yüksəltdi.
[7] Salam ilə tamamla, dua ilə qurtar

Beyt 1: **Vəslin mənə həyat verir firqətin məmat,**
**Sübhanə xaliqən xələqəl movtə vəl-həyat.**

Sözlük: Vəsl = vüsala yetmək; firqət = hicran = ayrılıq

Nişanə 1: "Vəsl" – məşuqla aşiq arasında olan fasilənin yox dərəcəsinə çatmış "əqrəb" ünvanlı mərtəbədən nişanədir.

**Qeyd**: *Vəsl, yaxınlıq yaxud qürb mərhələsinin nəhayəti olduğuna görə mərifətin də nəhayətindən ibarətdir, çünki tanışlıq yaxınlıqla müstəqim əlaqədardır.*

Nişanə 2: "Həyat" mütəal məbud ərəfəsində ilahi nur içində boğulmağıyla yenidən hasil olmuş mərifət ünvanlı ölməz bir varlıqdan ibarətdir, belə bir varlıq imkanını tapan aşiq cəhl küdurətindən həmişəlik xilas olaraq mərifət nurunda əbədi bir yaşayışa nail olar.

**Qeyd** 1: *Bütün insanlar nəbz döyüntüsü və nəfəs çəkməklə dirilikdən bəhrələnirlər lakin mütəal məbudun özəl dostları ölüm əli çatmaz mərifət ünvanlı həyatlrı ilə diridirlər.*

**Qeyd** 2: *Mətifət adlı ölməz həyatın aşağıdakılardan ibarət üç nişanəsi var:*

*A – Mütəal məbud qarşısında bütün kainatı, xüsusilə mal-dövlət və iqtidar – etibar sahiblərini həqir və heç bilər.*

*B – Mütəal məhbub ilə xəlvət etmək.*[1]

*C – Yalnız mütəal məhbubun adını çəkmək və yalnız O Həzrəti duşünmək.*[2]

Nişanə 3: "Firqət" – aşiqin tərbiyəsinə gərəkli qəbzlər mərhələsindən, yaxud camaatın tərifinə layiq olmaq və onların irad – etirazını nəzərdə tutmaq günahkarlığına görə zühur nurunun və camal cilvələrinin qət olmasından nişanədir.

Nişanə 4: "Məmat" – təbii və fiziki həyata maraq göstərməklə mərifət nurundan hasil olmuş içəri namütənahi həyat məhrumluğundan nişanədir.

Nişanə 5: "Sübhan" – şərif ayənin buyurduğu kimi mütəal məbudu idraka – anlama gələn sifətlərdən və adlardan təmamilə üstün və pak bilməkdən nişanədir.[3]

**Qeyd**: *Mütəal məbudun həqiqətilə tanışlıq bəşərin anlayışından üstün olduğuna görə insan belə qənaətə gəlmişdir ki kamili naqisə bənzətmək kimi Rəhim, Kərim, Məbud, Məhbub və habelə bəşəri təcrübə*

---

[1] Qəzəl 1, beyt 4

[2] Fərhəng istilahat və təbirati- ürfani.

[3] سبحان ربک ربالعزة عما یصفون (sənin Rəbbin - o əziz və qüdrətli Pərvərdigar onun vəsfində deyilən hər şeydən pakdır). Quran, Saffat surəsi, ayə 180

*və idraka sığan adları və sifətləri mütəal Allaha nisbət verməklə onunla münacat etməyə danışıq imkanı yaratsın, elə Quran özü də bəşərin acizliyini nəzərdə tutaraq onun anlamına sığan adlar və ibarələrlə mütəal Allahdan tanışlıq vermişdir.*

Anlam: Ey ölüm-dirim törətmiş əqldən, idrakdan üstün yaradıcı məbudum, yaxud ey yaradıcı məbudla bilavasitə əlaqədar ulu peyğəmbər, sənin nurunda boğulmaq, həqiqi və namütənahi bir həyat olduğu kimi, müqəddəs ərəfəndən uzaq düşməksə həqir bir ölümdür.

Beyt 2: **Hicranına təhəmmül edən vəslini bulur,**
**Tuba limən yüsaidühüs-səbrü vəs-səbat.**

Sözlük: Təhəmmül = dözüm = taqət gətirmək = təvazökarlıq

Nişanə 1: "Hicran " – canan cazibələrini qəlbində mühafizə etdiyi halda müşahidə nurundan məhrumluq nişanəsidir.

Nişanə 2: "Vəsl" – ötən beytdə bəyan edilən "əqrəb" mərtəbəsindən ibarətdir.

**Qeyd**: *Maddi dünyada ömür sürən, yaxud təbii dünyasını dəyişməyən bir insan dünyəvi qanunlar, o cümlədən, "əzdad" qanun tabeliyinə məcburdur.*[1] *Elə buna görə də "meyxana" və "mey" ünvanlı mərtəbələr məcazi ilgilərdən boşalmaq və mənəvi sifətlər ilə dolmağın əsas şərti sayılmış, beləliklə də, vüsal nailiyyəti hicran arxasına söykənmişdir, bunun üçün də bir çox ariflər hicranı da vüsal kimi alqışlayıblar.*[2]

Anlam: Müşküllər qarşısında səbr və səbat göstərməklə qəribə bir səadətə nailiyyət tapmış insanlar kimi ( ikinci misra), qəbzlər önündə dözümlülük göstərən bir aşiqin bəst bayramına nailiyyət tapması qəti bir qanun tabeliyindədir.

Beyt 3: **Mehrindir iqtinayi-məqasid vəsiləsi,**
**Maşaə mən əradə bihil fovzə vən-nicat.**

Sözlük: Mehr = məhəbbət = dostluq = günəş; məqasid = məqsədlər;

iqtina = sərmayə hazırlamaq, cəm etmək

Nişanə 1: "Mehr " – A – mehr, ilahi məqsəd tanışlığından hasil olmuş mütəal məhbubun aşiq eybini örtən məhəbbətindən nişanədir.

B – ilahi məqsədə yol göstərən tovhid günəşindən, yaxud mərifət nurundan nişanədir.

---

[1] Qəzəl 3, beyt 2
[2] Qəzəl 37, beyt 3

Nişanə 2: "Fovz, nicat" – dünyəvi əngəllərdən azad edən mənəvi qələbələr nişanəsidir.

Anlam: Ey mütəal məhbub, bütün müşküllərə qalib gəlmək və hər bir təhlükədən nicat tapmaq sənin mehrindən asılıdır (ikinci misra). Beləliklə, insanı hər bir yüksək məqsədə nail edən yalnız sənin mehrindir.

Beyt 4: **Tökmüş riyazi-təbimə barani-şövqünü,**
**Mən ənzəlqəl-miyahə və əhya bihən-nəbat.**

Sözlük: Riyaz = bağlar = rövzələr; baran = yağış; niyah = sular; nəbat = bitki

Nişanə 1: "Riyaz" – bəst mərtəbəsində hasil olmuş ruhaniyyət halında yaşamaqdan nişanədir.

Nişanə 2: "Təb " – mənəvi səciyyə və dəruni maraqdan nişanədir.

Nişanə 3: "Şövq " – ötən beytdə qeyd etdiyimiz mehr meyvəsindən hasil olmuş ilahi cazibələrə adət etməkdən ibarətdir.[1]

Anlam: Öz nazil etdiyi sular səbəbilə ölmüş, tükənmiş bitkiləri yenidən dirildən yaradıcı məbud (ikinci misra) mənim də istedadsız qəlbimdə rəhmət yağışı ilə bəst bitkilərini çiçəkləndirmişdir. (Mənə yeni həyat bağışlayıbdır).

Beyt 5: **Həqq afərineşə səbəb etdi vücudini,**
**Əvcəbtə biz-zühuri, zühurəl-mükəvvənat.**

Sözlük: Həqq = mütəal məbud; afərineş = yaranış = yaradıcılıq; mükəvvinat = yaranmışlar = kainat

Nişanə 1: "Vücud" – A – zehni və xarici vücudları öz kölgəsindən yaratmış yeganə məbudun sonsuz rəhmətindən ibarətdir.[2]

B – Vücud həzrəti-mürşidin, yaxud digər ilahi vasitənin, xüsusilə islam peyğəmbərinin vücudundan ibarətdir.

Anlam – A – Bütün kainatın yeganə məbudun özəl rəhmətindən, yaxud vəhdət nöqtəsindən və ya "innailllah" mənşəyindən yaranmaları (birinci misra) məlum edir ki, onlar tovhid günəşinin qarşısında qeyri-müstəqil kölgələr kimi həqir və heç olmalıdırlar (ikinci misra).

**Qeyd**: *Yuxarıda xatırladığımız anlam kainatın həqirlənməyi ilə paralel onların əzizlənməyini də əzdad araşdırmaları izah etdiyi kimi eyham etmək istəyir. Beləliklə, müstəqillik iddiası insanı həqir etmək kimi nisbət təsəvvürü isə onun əzizləndirər. Elə buna görə də Sədi bütün*

[1] Qəzəl 24, beyt 6
[2] Fərhənge istelahate və təbiratə-ürfani.

*kainata aşiq olmaqla onların mütəal məbud ilə nisbətini alqışlamaq istəyir.*[1] *Burdaca fədsəfə eşq ilə uyğunlaşır və Spinoza kamallanmaq ləzzətinin özəllik və üstünlüyünü araşrıb tanıyarkən deyir: "..., mən insanların yeganə məbud ilə nisbətini düşünə bilsəm heç bir şəxsdən nifrət etmərəm və ..."*[2]

Anlam: B – Ey ulu peyğəmbər, yeganə məbud bütün kainatı sənin hörmətini bildirmək qəsdi ilə yaratdı (birinci misra), kainat tamamilə sənin qarşında həqir və heçdir.

**Qeyd**: *Bu anlam 6-cı beyt ilə müvafiq olduğuna görə münasib nəzərə gəlir.*

Beyt 6: **İzəd səriri-hüsnə səni qıldı padişah,**
**Əla kəmalə zatikə fi əhsənis-sifat.**

Sözlük: İzəd = Tanrı = Yaradan = Allah; sərir = səltənət təxti; sifat = sifətlər

Nişanə 1: "Sərir" – hidayət, yaxud peyğəmbərlik məqamından nişanədir.

Nişanə 2: "Hüsn" – bu beytdə ilahi gözəlliklərin bəşəri camalda əks etdirilməsindən, yaxud bütün kamalların vahid vücudda cəmləşmək şəraitindən nişanədir.[3]

Nişanə 3: "Padşah" – nəbz vurmağa və nəfəs çəkməyə ehtiyacı olmayan ilahi eşq və məhəbbətlə ayaq tutub həyat sürən "vəli" ünvanlı rəhbərdən, yaxud vücudunu bəşəri ilgilərdən boşaldıb ilahi sifətlər ilə doldurmuş islamın ulu peyğəmbərindən nişanədir.

Anlam: Ey mürşid, yaxud ey peyğəmbər, mütəal məbud özəl ilahi gözəllik və mənəvi həyat ilə səni dünyəvi ilgilər və sifətlərdən hacətsiz edərək (birinci misra), ən gözəl mənəvi sifətləri müqəddəs vücudunda əks etdirdi və ilahi üstün kamalları bəşəri vücudunda cəmləşdirdi (ikinci misra).

Beyt 7: **Qıldın ədayi-nət, Füzuli, təmam qıl,**
**Kəmmülhü bis-səlati və təmmimhü bis-səlat.**

Sözlük: Nət = vəsf, xüsusilə peyğəmbər sifətlərini vəsf etmək

---

[1] به جهان خرم از انم که جهان خرم از اوست آشیقم بر همه عالم که همه عالم ازوست
دیوان غزلیات سعدی

[2] "Spinuza, Fridrix Kapelston, tərcümə Seyyid Məhəmməd Həkkak intişaratı Hikmət, 1373".

[3] İmam Xomeyninin şerlər divanı (haşiyə).

Nişanə 1: "Səlam" – batini əmin-amanlıq ilə aşiqanə ibadət başlanışından ibarətdir.

Nişanə 2: "Səlat" – bu beytdə alovlu qəlbdən ucalmış dualar önündə ilahi təcəllilər nailiyyətindən nişanədir.

Anlam: Ey Füzuli, mütəal məbud və müqəddəs peyğəmbər vəsfini (birinci misra) səlam ilə başladığın kimi səlat ilə də başa çatdır.

## Q Ə Z Ə L 41

**(1) Yürü, yetər mənə, ey simi-əşk, bidad et,**
**Gər axçan ilə alınmış qul isəm, azad et.**

**(2) İtirmə itləri avazının, könül zövqün,**
**Yetər qara gecələr hərzə - hərzə fəryad et.**

**(3) Xərab olan könül, ey büt, sənin məqamındır,**
**Təgaful eyləmə, bir qaç daş ilə abad et.**

**(4) Eşitmədinmi, könül, eşq müşkül olduğunu,**
**Sana bu müşkül işi kim dedi ki, bünyad et?!**

**(5) Xilafi-adətə çox olma, ey pəri, mail,**
**Yetər füsun ilə təsxiri-adəmizad et.**

**(6) Səba, əsirlərin qəsdin eyləmiş ol gül,**
**Bizi həm onda əgər düşsə fürsətin yad et.**

**(7) Füzuli, istər isən izdiyadi-rütbeyi-fəzl,**
**Diyari-Rum gözət, tərki-xaki-Bəğdad et.**

Beyt 1: **Yürü, yetər mənə, ey simi əşk, bidad et,**
**Gər axçan ilə alınmış qul isəm, azad et.**

Sözlük: Sim = gümüş; əşk = göz yaşı

Nişanə 1: "Əşk" – dünyəvi əngəl mahiyyəti, yaxud məcazi mənliyi yuyub aradan qaldıran nişanədir.

Nişanə 2: "Simi əşk" – mənəvi bazara fədakarlıq sərmayəsi hazırlamaqdan nişanədir.

Nişanə 3: "Bidad" – əşk mərhələsində dünyəvi xarakter ilə rəhmsiz – amansız mübarizə etməkdən nişanədir.

Anlam: Ey gözümdən yağan xalis yaş, mənəvi ölməz mahiyyətimdən dünyəvi əngəl həyat ləkələrini yuyub təmizləyərək özümü öz qulluğumdan xilas edib mütəal məbud qulluğuna yetir.

**Qeyd** 1: *Beyt axça ilə, yaxud gümüş sikkələrlə alınmış qulu dübarə alıb azad etməyə gümüş göz yaşının münasib dəyər olduğunu göstərmək istəyir.*

**Qeyd** 2: *Sim, sazın telinə və bidad bir şöbə musiqi ahənginə eyham edərək, qəlbin nalələrini, yaxud, ahəngdar münacata eyham etmək istəyir.*

Beyt 2: **İtirmə itləri avazının, könül zövqün,**
**Yetər qara gecələr hərzə - hərzə fəryad et.**

Nişanə 1: "Hərzə və fəryad etmək" – həqirlik və məmlüklüyü etiraf etməkdən nişanədir.[1]

Nişanə 2: "İt" – mənəvi kamala mane olan xətakar həris nəfsi zəlil etməkdən nişanədir.

**Qeyd**: *Bu sətirlərin müəllifi, öz məmlüklüyündən xəbərdar olan bir arifin həris nəfsilə mübarizə aparmaq hekayəsini "Bustani-Sədi"dən belə tərcümə etmişdir[2]:*

*Biri arif idi vəfa zirvəsi,*
*Evindən gəlirdi, vəli, it səsi*
*Dönüb bir kəs ol mənzilə tab ilə*

---

[1] Qəzəl 1, beyt 6

[2] زویرانه عارفی ژنده پوش یکی را نباح سگ آمد به گوش
بدل گفت کوی سگ اینجا چراست در آمد که درویش صالح کجاست
نشان سگ از پیش و از پس ندید بجز عارف آنجا ، دگر کس ندید
خجل بازگردید آغاز کرد که شرم آمدش بحث این راز کرد
شنید از درون عارف آواز پای هلا گفت بردرچه پائی،در آی
مپنداری، دیده روشنم که اینجا سگ آواز کرد، این منم
چو دیدم که بیچارگی می خرد نهادم ز سر کبر و رای و خرد
چو سگ بردرش بانک کردم بسی که مسکین تر از سگ ندیدم کسی...

*Qalıb harda arif nədir məsələ?*
*Baxıb hər yana görmədi itdən iz,*
*Qayıtdı gedə, gəldi səs: Ey əziz,*
*Demə burda it səslənir, yox mənəm*
*Mənəm səslənən it kimi, ey sənəm,*
*Edir çün kərəm çarəsiz xəlqə yar*
*Odur çarəni başdan etdim kənar*
*Səbəbsiz qapısında mən hürmədim*
*Ki, itdən daha alçağın görmədim*
*Bu dərgahda onlar tapıblar məqam*
*Ki, nəfsi veriblər yerə, vəssəlam.*

*Bunun üçün də, aşiqə məlamət mərhələsini seyr etməklə zahiri əngəl xarakterini çoxaldan toplansal hörmətlər məğrurluğundan çəkinmək gərəkli bir mərhələ olmuşdur.*

Nişanə 3: " Hərzə - hərzə fəryad etmək" – əql və məntiq əhlinin sərki vurmaqlarına bais olmuş nalələrdən ibarətdir.

Anlam: Ey aşiq, mənəmlik və mənliyi çoxaldan əql və elm məğrurluğunu divanəvar nalə etməklə məğlub və məhv etməlisən.

Beyt 3: **Xərab olan könül, ey büt, sənin məqamındır,**
**Təgaful eyləmə, bir qaç daş ilə abad et.**

Sözlük: Təğaful = bilməməzlik = göz çəkmək

Nişanə 1: "Xərab" – insanları bəşəri səviyyə məhdudluğunda həbs etmiş şöhrətbaz və mənfəətpərəst doğal səciyyələr məğlubluğunda, həyatın mövzu və məzmununu təşkil edən eşq və ürfan hakimliyindən nişanədir, elə buna görə də Hafiz Şirazi maddədən üstün düzgün həqiqətilə tanış olmağı təbiət məhdudluğundan xilas olmağin şərti bilir.[1]

**Qeyd**: *"Əzdad" araşdırması aydın etdiyi kimi, abadlığın ilk müqəddiməsi xarablıq olduğuna görə, dünyaşünas əql evini yıxmaq, mənaşünas eşq evini abad etməyə əsas şərtdir, beləliklə mənəvi şirinlik yaşamaq dünyəvi acılıqları (bəlaları) alqışlamağa bağlıdır.*

Nişanə 2: "Büt" – büt əsasən daşdan yonulmuş ilahə olduğuna görə əqli-idraki daş kimi qurudubişdən salan ilahi hüsndən nişanədir.[2]

Nişanə 3: "Könül, məqam": Mövləvi, islam peyğəmbəri buyurduğu fərmayişin əsas – etibar ilə könülü (ürəyi) mütəal məbudun özəl evi

---

[1] توکز سرای طبیعت نمی روی بیرون　　　کجا به کوی حقیقت گدار توانی کرد
[2] Qəzəl 27, beyt 2

(məqamı) bilmişdir.[1] Belə bir baxımla bu sətirlərin müəllifi bir qəzəlində deyir:

Qəlbimi viran edibsən, öz evindir, eybi yox,
Gəlsənəm abad edək, ta özgə irad etməsin.

Nişanə 4: "Təğaful" – kamala çatdırmaq məqsədilə sınağa çəkilmiş aşiqin nalələrini qulaq ardına vurmaqdan nişanədir.

Nişanə 5: "Qaç daş" – A – Daşı daş üstə qoymaq bünövrə və binanı möhkəm və hündür edən kimi qaç daş da ürək ölkəsində bina qoymağı təlqin etmək istəyir..

**Qeyd**: *Qaç daş parçalanmış bir daş olduğuna görə ötən beytdə qeyd olunan nəfs itini daşlamağı, həm də aşiqin sərki və cəfa görmək rəğbətini eyham edir.*

Anlam: Ey mütəal məhbub, bədən məhdudluğunda giriftar olmuş qəlbimi müxtəlif cəfalar və cilalar ilə dünyəvi ilgilərdən ayırarkən onu öz evin kimi özəl ilahi cilalarla işıqlandır.

Beyt 4: **Eşitmədinmi, könül, eşq müşkül olduğunu,**
**Sana bu müşkül işi kim dedi ki, bünyad et?!**

Nişanə 1: "Eşq" – əqlə, idraka sığmayan intihasız məhəbbətdən nişanədir.

**Qeyd**: *Aşiq və məşuq kəlmələri başqa bitkilərə və yaşıl agaclara sarmaşıb, onların suyundan qidalanan, rəngini saraldan, yarpaqlarını tökən, və nəhayət onları qopardan "sarmaşiq" adlı bitgi sözündən düzəlmişdir. Beləliklə, mənəvi eşq isə aşiqin fiziki enerjilərini qurudub, onun əqlini, idrakını işdən salarkən, təbini yemək-içməkdən saxlayar və nəhayət onu sərkilərə giriftar edərək xalqdan ayırar, məşuqdan başqasından qaçıraraq onu xəstə, divanə, yaxud həlak edir.*

Nişanə 2: "Eşitmədin" – dünyaşünas əql və təcrübə nəsihətlərini qulaq ardına vurub eşq təhlükələrini sadə sanmaqdan nişanədir.

**Qeyd**: *Sadəcə bir baxışla yaranan məcazi eşqdən hasil olmuş hicran atəşi, həsrət çətinliyi, qohum-qonşu sərkisi, toplantılar el töhməti, əql və elm danlağı, hətta vüsal nailyyətindən sonra ortaya çıxan isə məişət qayğıları, ailə tərbiyəsi və bir çox başqa müşküllər davam etdiyi kimi, mənəvi eşq də sadəcə bir "Lailahəilllələllah" cümləsilə başlanarkən, ardı-*

[1] گفت پیغمبر که حق فرموده است    من نگنجم هیچ در بالا و پست
در زمین و آسمان و عرش نیز    من نگنجم این یقین دان ای عزیز
در دل مومن بگنجم، ای عجب    گرمرا جویی در آن دل ها طلب
مثنوی معنوی مولوی"، دفتر اول، بیت 2715 ، 2716 ، 2717"

*arası kəsilməz namaz, oruc, zəkat, cihad, maldan və candan keçmək, habelə digər təklifləriIə arifi sınaqlara çəkib sıxıntılara salır.*

Anlam: Ey biqərar ürək, sən özün ki nəsihətli əql sözünü eşitmədin demək, özun -özünü giriftar etdin, beləliklə “özü yıxılan ağlamaz” kimi gileylənməyin və fəryad etməyin yersizdir.

Beyt 5: **Xilafi-adətə çox olma, ey pəri, mail,**
**Yetər füsun ilə təsxiri-adəmizad et.**

Sözlük: Xilafi – adət = adətdən kənar; füsun = əfsun = ovsun, təsxir = məğlub etmək = qələbə = əlmuzdusuz işlətmək, adəmizad = adam oğlu

Nişanə1: "Pəri" – mənəvi vasitə, yaxud bəşəri camalda ilahi hüsnlər əxz etmiş bir gözəldən ibarətdir.

Nişanə 2: " Füsun" – bu beytdə, adətə təcrübəyə sığmaz qələbə və iqtidardan nişanədir.

Nişanə 3: "Təsxiri-adəmizad" – öz məmlüklüyündən xəbərdar aşiqi bəşəri doğal iradədən ayırarkən onu "mürid" ünvanlı yüksək bir mərtəbəyə qaldıran rəhmətə bağlı iqtidardan nişanədir.

**Qeyd**: *"Mürid" hidayət nurunda öz naqisliyini aydın görməklə daimi dərdü bəla tələb edən kamal dilənçisindən ibarətdir.*

Anlam: Ey həkimi-məhbub, aşiqi bəlalara giriftar etmək məşuqun tanınmış adəti olduğuna görə məni cövrü cəfadan məhrum etməklə adətdən kənara çıxmağı rəva bilmə.

**Qeyd**: *Aşiq cövr və cəfa tələb etməklə, öz kamalşünaslığını sübut edir.*

Beyt 6: **Səba, əsirlərin qəsdin eyləmiş ol gül,**
**Bizi həm onda əgər düşsə fürsətin yad et.**

Nişanə 1: "Səba" – Səba həzrət mürşüddən, yaxud mənəvi vasitədən, ya da peyğəmbərlərə vəhy gətirən Cəbrayıl adlı mələkdən nişanədir.

Nişanə 2: "Əsir" – mütəal məhbuba qovuşmaq həsrətilə biqərarlıq edən yarı yer, yarı göy sakini olan aşiqdən ibarətdir.

Nişanə 3: "Qəsd" – bu beytdə aşiqi dünyəvi həyatda öldürüb mənəvi həyat ilə dirildib"موتو قبل ان تموتو [1] məqamına nail edən, yaxud, mənlikdən ayıırıb təcrid yüksəkliyinə hazırlayan cövr və cəfa mərhələsindən nişanədir.

---

[1] Qəzəl 7, beyt 2

Nişanə 4: "Gül" – aşiqin qəlbinə bəst [1] bağışlayan mütəal məhbubdan nişanədir.

Anlam: Ey feyz vasitəsi yaxud ey mürşüd, aşiqlərə bəşəri səviyyədən nicat verib ilahi mərtəbəyə qaldırmaq məqsədilə ehsan etmiş mütəal məbud hüzurunda, mənimsə cəfalar sınağında dünyəvi həyat həlakətinə, yaxud qurbanlıq mərhələsinə hazırlanmaqmı mənə bildir.

Beyt 7: **Füzuli, istər isən izdiyadi-rütbeyi-fəzl,**
**Diyari-Rum gözət, tərki-xaki-Bəğdad et.**

Sözlük: İzdiyad = əlavə etmək = əlavə olmaq = çoxlatmaq;
fəzl = üstünlük = ehsan = kamal = mərifət,
xak = torpaq = yer = məmləkət

Nişanə 1: "Fəzl" – A – Fəzl, mütəal məbudun bağışlama sifətindən ibarətdir.

B – aşiqi sınaqlara çəkmiş kamal şövqündən ibarətdir.

P – dünyəvi üstünlüklərdən ibarətdir.

Nişanə 2: "Rum" – uzaqlığa eyham edən nişanədir.

Nişanə 3: "İkinci misra" – A – Qədirbilməz ölkədən din mənşəli "hicrət" fikrilə köçməkdən ibarətdir.

B – İlahi məqsədə yaxınlaşmağın ilk şərti maddi vücudu unutmaqdan nişanədir:

**Nicat ver özünə çah nəfsdən mah ol,**
**Vücud məmləkətindən kənarə çıx, şah ol.**[2]

Anlam: A –Ey Füzuli, kamal və mərifətini artırmaq məqsədin olsa qədr bilməz Bağdad ölkəsini tərk et.

B – Ey Füzuli, ürək bağladığın qədr bilən Bağdadı tərk etməklə həm də özün- özündən uzaq olub (hicran), mərifət və kamal məqsədinə yaxınlıq imkanını qazan.

**Qeyd**: *Qədrşünaslığın hicab törətməsi qədir bilməzlikdən əlavə həm də xətərli və xəsarət yetirəndir, çünki, qədir bilmək aşiqi dünyəvi məmnuniyyətlər önündə mənəvi məşğulluqdan qafil edər.*

---

[1] Qəzəl 2, beyt 5

[2] Müəllifin bir qəzəlindən mətlə.

## Q Ə Z Ə L 42

**(1) Əksi-rüxsarın ilə oldu müzəyyən mirat,**
**Bədəni – mürdəyə feyzi – nəzərin verdi həyat.**

**(2) Bənzədərdim qədi – mövzuninə fil – cümlə əgər,**
**Can içində əlif etsəydi qəbuli – hərəkat.**

**(3) Xət bu məzmun ilədir tərfi – zənəxdanında**
**Ki, bu zindanın əsirinə yox ümmidi – nicat.**

**(4) Kakilin qıldı müqərrər mənə sərgəştəliyi,**
**Deməsin kimsə ki, var gərdişi – gərdunə səbat.**

**(5) Qəmzə peykanın edər aşiqə çeşmin sədəqə,**
**Öylə kim, mərdümi – münim verə möhtacə zəkat.**

**(6) Afərin cövhəri – məqbulinə kim, aləmdə**
**Mümkün olmaz bu sifat ilə ki, sənsən, bir zat.**

**(7) Ey Füzuli, vərəvü zöhd ilə mötad oldun,**
**Bilmədin halını, bihudə keçirdin övqat.**

Beyt 1: **Əksi-rüxsarın ilə oldu müzəyyən mirat,**
**Bədəni – mürdəyə feyzi – nəzərin verdi həyat.**

Sözlük: Ruxsar = camal = surət; müzəyyən = bəzənmiş = zinətlənmiş;
mirat = güzgü; mürdə = ölü

Nişanə 1: "Əks-ruxsar" – A – Arifin qəlbində zühur etməklə o qəlbi heyrət atəşində yandıran mütəal məhbubun təcəlli ünvanlı mükaşifə yaxud şühud nurundan ibarətdir.

B – Bütün mövcudat yeganə məbudun kəsrət güzgüsündə təzahür olunan rəhmət sifətlərinə bağlı olduğuna görə əksi-rüxsardırlar[1]. Bunu üçün də bütün vücudların, hər an iqtidarlı məbuddan nur və həyat almağını təlqin etmək məqsədilə şərif ayə, "كل يوم هو فی شان"[2] ("O, hər gün bir işdədir") buyurulmuşdur. Deməк, bir an da ilahi nurun kəsilməsi bütün kainatın məhvliyinə bais olmalıdır.

Beləliklə, mütəal məbud hər an möminlərə həyat və ruzi ehsan etdiyi kimi kafirləri də hər an ilahi ehsanla bəhrələndirir. Elə buna görə də Sədi buyurmuşdur:

ای کریم که از خزانه غیب گبر و ترسا وظیفه خورداری
دوستان را کجا کنی محروم تو که با دشمن نظر داری[3]

Nişanə 2: "Mirat" – A – həzrət mürşüdün ilahi cəlalarla dolu qəlbindən nişanədir.

B – maddi kəsrətin mənəvi cilvələrlə vəhdət nöqtəsinə yönəldən güzgü mərtəbəsindən nişanədir.

**Qeyd**: *Dönə - dönə dediyimiz kimi:*

*A – Hər bir maddi yaranmış qara olduğuna görə vəhdət nurunun qarşısında əngəl və maneədir.*

*B – Hər bir maddi varlıq yaradıcı məbuddan iz və əsər gördüyünə görə xüsusilə güzgü durumunda əks etdirdiyi hidayət nuru ilə mənəvi bir rəhbərdir.*

Nişanə 3: "Bədəni-mürdə" – yer qürbətində yaşayış məcburluğu ilə fənayə məruz qalmış dünyəvi həyatdan ibarətdir.

**Qeyd**: *Ölü cism duyğusuz və idraksız olduğu kimi, mənəvi ilgi - əlaqədən bəhrəsiz bir insan da ariflər nəzərində ölü bəşərlə bərabərdir.*

Nişanə 4: "Feyzi-nəzər" – bu beytdə mütəal məbudun rəhmani baxış ünvanlı əvəzsiz ehsan – ilhamından, yaxud islam peyğəmbərinin,

---

[1] Fərhənge- istilahat və təbirate- ürfani.
[2] Quran, Ərrəhman surəsi ayə 29
[3] گلستان سعدی دیباچه

ya da mürşüdün ilahi ehsan – ilhama hidayət edən təlimat feyzindən ibarətdir.
Anlam:

A – Ey mütəal məhbub, təcəlla ehsanıyla bütün kaynatı yoxluqdan varlığa çatdıran yalnız sənsən.

B – Ey mütəal məhbub, ürəyimdə əks etdirdiyin təcəlla ziyaları ilə zahiri əngəl həyatımı yandırıb batin həyatımı azad edən, yaxud bəşəri vücudumu ilahi vücuda çevirən yalnız sənsən.

P – Ey peyğəmbər, yaxud ey mürşüd, yaxud ey bəşəri camalda ilahi hüsnlər əks etdirən dilbər, məni müqəddəs eşqlə tanış etməklə yeni bir həyata nail edən yalnız sənsən.

Beyt 2: **Bənzədərdim qədi-mövzuninə fil-cümlə əgər,**
**Can içində əlif etsəydi qəbuli-hərəkat.**

Sözlük: Movzun = mütənasib, fil cümlə = məsələn = o cümlədən, hərəkat = fonetik a, i, u kimi incə və qalın səslər = səs forması

Nişanə 1: "Qədi - mövzun" - önü - sonu olmayan ilahi feyzlərdən, yaxud əbədi davam etdirilmiş mənəvi lütflərdən nişanədir.

Nişanə 2: "Əlif" – A, "kamil saliklərin kinayəli sözlərində yaranışı məbdə və səbəbkarı "vahid" olan məbuddan nişanədir."[1]

**Qeyd**: *Əlifin ilahi nişanə olduğunun bir neçə səbəbi aşağıdakılardan ibarətdir:*

*1 – "Əlif, mütəal məbudun Allah ləfzli "cəlalə"[2] adının ilk yazısı olduğuna görə yaranış nöqtəsindən (məbdə) nişanədir.[3]*

*2 – Ərəb, fars və türk yazı qaydasında Ain "sədarəttələb" ünvanlı yazı məbdəi olduğu, bütün yazıların ondan sonra yazıldığı mütəal məbuddan əvvəl hər bir vücudun yoxluğuna eyham etmək istıyir.*

*3 – Əlif hərfi nöqtəsiz-dişsiz hərf olduğuna görə mütəal məbudun əzəl- əbədi vücuduna heç bir şeyin əlavə olmamağına eyham edir.*

*4 – Əlif yazı qaydasında hərəkət (səs forması) etməməyinə görə mütəal məbudun hərəkətə hacətsiz olduğunu da eyham edir (hərəkətin başlanış nöqtəsi və məqsədi yaxud önü-sonu var, lakin mütəal məbud əzəli və əbədidir)[4]*

---

[1] Gülşəni-məani, ustad Nəzmi Təbrizi, səh 155
[2] Əql və idrakdan üstün cəlal mənasını daşıyan bir kəlmə
[3] Gülşəni-məani, ustad Nəzmi Təbrizi, səh 155
[4] Qəzəl 2, beyt 1

Anlam: Ey gözəl məbud, sənin qamətini əlifə bənzətmək xətadır, çünki əlif hərəkət edə bilməz lakin sənin qamətin, yaxud yaranışa məbdə və səbəbkar hüsnün canıma nüfuz edərək qanımla dolanır.

Beyt 3: **Xət bu məzmun ilədir tərfi-zənəxdanında**
**Ki, bu zindanın əsirinə yox ümmidi-nicat.**

Sözlük: Tərf = tərəf; zənəxdan = çənədəki çökək

Nişanə 1: "Xət"

A –ruhi hüsnlərin cismdə zühur etməyindən nişanədir.

B – hicran törətmiş fasilənin yox dərəsinə çatmaq nişanəsidir.

P – bütün yaranmışların yaradıcı məbudla, yaxud kəsrətin vəhdət ilə nisbətini təlqin edən nişanədir.

T – vəhdəti və kəsrəti gündüz və gücə kimi bir mənəvi təbiətə bağlı təlqin edən nişanədir.[1]

Nişanə 2: "Zənəxdan" - aşiqi daimi həbsdən nicat vermək qəsdilə müvəqqəti həbsdə sınaqlara çəkib istiqamətləndirməkdən nişanədir.[2]

Nişanə 3: "İkinci misra" - mənəvi yaşayışın tamını dadmamış bir insanın dübarə dünyəvi ilgi - əlaqədən yad etməyini mümkünsüz təlqin edən nişanədir.

Anlam: Hicran həbsində qəmlərə müsibətlərə bağlı toy – bayramlar məlum edir ki, heç bir çətinlik eşq ilə tanış bir insanı əql dünyasına qaytara bilməz.

Beyt 4: **Kakilin qıldı müqərrər mənə sərgəştəliyi,**
**Deməsin kimsə ki, var gərdişi-gərdunə səbat.**

Sözlük: Kakil = kəkil; müqərrər = təyin olunmuş;
sərgəştəlik = sərgərdanlıq; gərdun = fələk = zamanə

Nişanə 1: "Kakil"- mütəal məhbubun camal cilvələrindən nişanədir.

Nişanə 2: "Sərgəştəlik" – mütəal məhbub camalını örtüksüz görmüş aşiqin heyranlığından nişanədir.

**Qeyd** 1: *Heyranlıq məqamında müşahidə olunmuş yerə - göyə sığmayan gözəllik, şıdırğı cilalar ilə aşiqi məğlub edər, sonra "istehlak" ünvanlı ürfanı mərhələdə onu həlak edər.*

**Qeyd** 2: *Huşu başından uçan aşiq həlakət mənzilində bəşəri yönünü fəda edərək, iki dünyanı bir məhbub xəyalında yaddan çıxarar.*

---

[1] Qəzəl 48, beyt 1

[2] Qəzəl 38, beyt 6

**Qeyd** 3: *Aşiq bəşəri vücuddan həlak olmaqla əzdad baxımı araşdıran kimi, vəhy və ilham istedadlı ilahi bir vücud tapmağa* nail olar, *bu yeni vücudu fəlsəfə də ürfan kimi alqışlayaraq demişdir: "..., heyrət insanın mütəal məbud qarşısında mütləq bilməzliyini (fəqirlik və məmlüklüyünü*[1]*) ona bildirən ikinci mərifət*[2] *nailyyətinin əsas şərtidir. Bunun üçün də heyrət çulğalamayan bir şəxsə ilahi ilhamın nazil olmaq imkanı yoxdur.*[3]

Anlam: Ey mütəal məhbub, mənlik – mənəmlik beləliklə iki dünyanı yaddan çıxaran şıdırğı ilahi cəlalar zəmanənin, yaxud, maddi dünyanın həqirliyini – etibarsızlığını sübut etdi.

**Qeyd**: *İkinci misra fəzada seyr edən ulduzların, planetlərin, eləcə də yer üzərindəki yaranmışların irili-xırdalı öz bütünlüklərində həm də tərkib hissələrində çevrilmək və yeniləşməklərini ( səbatsızlıqlarını) ilahi eşqə bağlı sərgərdanlığa eyham etmək istəyir.*

Beyt 5: **Qəmzə peykanın edər aşiqə çeşmin sədəqə,**
**Öylə kim, mərdümi-münim verə möhtacə zəkat.**

Sözlük: Peykan = ox ucu; çəşm = göz, sədəqə =sədəğə = sadağa; mənəm = ehsan edən = nemət bağışlayan.

Nişanə 1: "Qəmzə peykanı" – aşiqin qəlbini qəbz və bəst ilə, yaxud müşahidə nurunun doğu – batısıyla pərişanlığa qatqı məst edən mərhələdən nişanədir.

Nişanə 2: "Çəşm" – şühud nailiyyətindən nişanədir.

Anlam: Ey mütəal məhbub əli bağlı bir yoxsul zəkata mohtac olan kimi mən də qəbz sıxıntısıyla bəst məstliyinə möhtacam.

Beyt 6: **Afərin cövhəri-məqbulinə kim, aləmdə**
**Mümkün olmaz bu sifat ilə ki, sənsən bir zat.**

Sözlük: Cövhəri – məqbul = gözəl mahiyyət = bəyənilmiş mahiyyət = zavalsız vücud; sifat = sifətlər

Nişanə 1: "Cövhəri – məqbul", önü sonu olmayan ölməz həqiqi vücuddan niçanədir.

**Qeyd**: *Maddi dünya kəsrət meydanı olduğuna görə hər bir yaranmışın, hətta yay – yaz kimi təbii fəsillərin habelə məfkurələrin,*

---

[1] Qəzəl1, beyt 6

[2] Dünyaşünas əql-təhsil etdiyi səbatsız mərifəti boşlayaraq mənəvi üstün mərifət təhsil etməkdən ibarətdir.

[3] Dreyi-asari-Əflatun, tərcümə edəni: Məhəmməd Həsən Lütfi, cild 4, səh 1379

*elmlərin, təsəvvürlərin qoşa durumlu olmağı*[1]*qətidir.*[2] *Elə buna görə də beş əsr miladdan əvvəl Əflatun demişdir: "... dunyadakı cansız əşyalar, həm də canlı bitkilər və heyvanlar kimi maddi mövcudatlar, habelə ədalət və şücaət kimi mənəvi əmrlər, surət yoxsa misal adlı hissə sığmaz əqli zavalsız həqiqətlərin (cövhər) fənaya məruz qalmış məcazi bir yöndəm ilə(ərəz) qoşalaşmasından yaranmış mövcudluqdurlar*[3]*, beləliklə, hər bir şeyin ölməz batini vücuduna yanaşı zahiri və fani bir vücudu olduğuna görə, hər şeyin əbədiyyətdən bir hissəsi vardır, demək Tanrıya qovuşmaq istəyən yer adamının əsas işi öz mürəkkəb vücudunda ilahi ölməz hissəni, yaxud vücudunun cövhərini gücləndirmək və onu fani vücuduna qalib və hakim etməkdir.Beləliklə "cövhəri-məqbul" mütəal məbudun əbədi gözəl varlığından, yaxud cövhərini ərəzə ( batinini zahirinə) qalib etmiş peyğəmbərdən imamdan və mürşüddən nişanədir.*

Nişanə 2: "Sifat" – fəlsəfi misaldan, yaxud həqiqi ölməz vücudda təzahur etmiş cilvələrdən ibarətdir.

Nişanə 3: "Zat" – cövhərdən, yaxud mütəal məbudun əqlə – idraka sığmaz həqiqətindən ibarətdir.

Anlam: Ey mütəal məhbub, yaxud mürşüd, sənin sifətlərin də zatın kimi, yaxud kəsrətin də vəhdətin kimi, ya da dünyəvi yönün də mənəvi yönün kimi bəyənilmişdir.

Beyt 7: **Ey Füzuli, vərəvü zöhd ilə mötad oldun,**
**Bilmədin halını, bihudə keçirdin övqat.**

Sözlük: Vərə = pəhrizkarlıq = xətalardan qorunmaq; zöhd = vərə, mötad = adətkərdə; bihudə = yersiz = faydasız

Nişanə 1: "Vərə, zöhd" – bu beytdə dünyaşünas əql məlum etdiyi xətalar və səvablar qarşısında təklifini bilən insanın (zahid) mənaşünas (mənəviyyatşünas) eşqə hacətsizlik göstərməyindən nişanədir [4] .

**Qeyd** 1: *Arif eşq ilə əqli vahidləşdirməkdən aciz olduğuna görə əqldən kənara düşmək məcburiyyətində sərkilərə, danlaqlara giriftar olmalıdır, ancaq imam və peyğəmbər ilahi özəl iqtidarı ilə əqli eşqə qovuşdurub axirət ilə yanaşıq dünyada ömür sürməklə sərki məlaməti batil edən bir təzad durumlu və möcüzə obrazlı yaşayışa davam edir. Buna görə də imam və peyğəmbər həm zahid, həm də arifdirlər.*[5]

---

[1] Qoşalıq, kəsrətin ilk yöndəmidir.
[2] Qəzəl 3 beyt 2
[3] Məhəmməd Əli Foruği, Göst.əsər, s.28-29
[4] Qəzəl 9, beyt 2
[5] Qəzəl 3, beyt 3

**Qeyd** 2: *Şühud nurunda zahir olmuş gözəlliklər aşiqin ehtiyaclarını əlindən almaqla onu "rəqs" və "səma" ünvanlı divanəvar hərəkətlərə və "şəth" ünvanlı küfr danışıqlara məcbur edir, lakin imam və peyğəmbər kamil əql və üstün ixtiyar sahibi olduqlarına görə "şəth"və "rəqs" məcburiyyətinə qalib gəlmişlər.*

**Qeyd** 3: *Arif, xüsusilə şühud mərhələsində divanə olduğuna görə dəlidən sual olmaz kimi küframiz hərəkətlər, sözlər məsuliyyətində mühakimə olunmaqdan azaddır.*

**Qeyd** 4: *İmam və islam peyğəmbəri bir an şühudsuz ömür surmədiklərinə görə şühud onlara qəribə yox, bəlkə də təbii bir əhval – ruhiyyədir. Beləliklə təbii halda ixtiyarsız olmaq mümkünsüzdür.*

**Qeyd** 5: *Bayazid kimi ulu arif bir adam ilahi cilvə qarşısında "Lailahə illa Ənaha faibdun"*[1] *deməklə öz istedadsızlığını aydın nişan verir, lakin islam peyğəmbəri dünyaya sığmaz iqtidar və istedad sahibi olduğuna görə, ömrünü şühud cilaları ilə surə - surə* "ما عرفناک حق معرفتک"[2] *deyə - deyə özünün "əlavə cilalar almaq istedadını izhar edir".*

Nişanə 2: "Hal" – bu beytdə aşiq özü keçmiş və gələcəkdən, yaxud zamandan xəbərsiz və xilas edən əql və təcrübədən, ya da vərə və zöhddən üstün, ürək səmasında çaxmış şimşəklərdən ibarətdir.

**Qeyd**: *Hal zühur edən çağlarda aşiq göydə ulduzları arar, lakin hal dayanan zamanda yerdə olanı görə bilməz, elə buna görə Sədi Gülüstanda bir hekayədə belə buyurmuşdur:*

*"Həzrəti-Yaquba etiraz edərək dedilər: Ey ağıllı, necə olar ki, Yusifin köynəyinin ətrini Misirdən alasan, ancaq onun Kənanda öz qulaqının dibində quyuya düşməyindən xəbərsiz olasan. Həzrət buyurdu: Hal şimşəyi çaxan çağda insan əqlə, elmə sığmaz yüksək bir mövqe tutarkən göylərdən xəbərdar olar, ancaq o şimşək, yaxud hal dayananda öz ayağının altını da görə bilməz".*[3]

---

[1] Mən vahid məbudam, mənə ibadət edin

[2] Ey mütəal məbud, bir belə müşahidə cəlalları ilə Sənin yüksək əzəmətindən yaxud həqiqətindən mükəmməl halda xəbərdarlıq imkanını tapa bilməmişəm.(bu söz əlavə cilvə istəməklə Peyğəmbərin İlahi iqtidar və mükəmməl istedadını nişan verir)

[3] یکی پرسید از آنگم کرده فرزند — که ای روشن گهر پیر خردمند
ز مصرش بوی پیراهن شنیدی — چرا در چاه کنعانش ندیدی
بگفت احوال ما برق جهانست — دمی پیدا و دیگر دم نهانست
گهی بر طارم اعلی نشنیدیم — گهی بر پشت پای خودنبینیم
اگر درویش در حالی بماندی — سر دست از دو عالم برفشاندی
گلستان سعدی، باب 2

Anlam: Ey Füzuli, əqlin və cəmiyyətin alqışladığı pəhrizkarlığa qənaətbəxş olmağın səni bəşəri səviyyədə məhdud edərkən ilahi eşq mərtəbələrindən məhrum etdi.

## Q Ə Z Ə L 43

**(1) Ey əsiri-dami-qəm, bir guşeyi-meyxanə tut!**
**Tutma Zöhhadın muxalif pəndini, peymanə tut!**

**(2) Dişlədimsə ləlin, ey qanım tökən, qəhr eyləmə,**
**Tut ki, qan etdim, ədalət eylə, qanı qanə tut!**

**(3) Çizginirkən başına şəmi-rüxündən canımı,**
**Mən qılma ani həm ol şəmə bir pərvanə tut!**

**(4) Gər sənə əfğanimi bihudə dersə müddəi,**
**Ol sözə tutma qulaq, mən çəkdiyim əfğanə tut!**

**(5) Tutmazam zənciri-zülfü tərkin, ey naseh, məni,**
**Xah bir aqil xəyal et, xah bir divanə tut!**

**(6) Ey olub sultan, deyən dünyadə məndən qeyri yox,**
**Sən səni bir cüğd bil, dünyanı bir viranə tut.**

**(7) Ey Füzuli, dəhr Zalinin firibindən saqın,**
**Olma qafil, ər kimi tərpən, işin mərdanə tut!**

Beyt 1: **Ey əsiri-dami-qəm, bir guşeyi-meyxanə tut!**
**Tutma Zöhhadın muxalif pəndini, peymanə tut!**

Sözlük: Zöhhad = zahidlər; pənd = nəsihət = əhd; peymanə =cam = piyalə.

Nişanə 1: "Dami – qəm" – bu beytdə dünyəvi iztiraba düşməkdən, həm də qəbzlər törətmiş mənəvi müşküldən nişanədir.

Nişanə 2: "Meyxanə": A – meyxanə aşiqin bəşəri əngəl tifaqını dağıdıb, onun ilahi mahiyyətini üzə çıxaran yaxud onu "səfa" ünvanlı ürfani mərtəbədə büsbütün maddi küdurətlərdən yuyub-təmizləyən əhval – ruhiyyədən, yaxud mənəvi mərifətdən nişanədir.

B – Meyxanə, həzrət mürşüd məktəbinə eyham edən nişanədir.

Nişanə 3: "Zöhhad" – A – əqlə - məntiqə söykənməklə kamal mərtəbələrini izləyən eşqi inkar edənlərdən ibarətdir.

B – Əqli – imanı əldən verən və üzdə bir cür, arxada başqa cür zahidlik iddiasıyla məğrur olan bir dünyapərəstdən ibarətdir.[1]

**Qeyd** 1: *Əslinə baxsan, zohhad, dünya materialının fani surətini aydın görərək dünyəvi matahdan nifrət edib, axirət camalını iman və yəqin nurunda müşahidə etmiş behişt uyqularıyla maraqlanan düzgün zahidlərdirlər, ancaq üşşaq (aşiqlər) behişti də dünya kimi unudan və yalnız müşahidə nurunu izləyən mütəal məhbub xəyalıyla məst olan ariflərdən ibarətdir.*[2]

**Qeyd** 2: *Özəl bir mərtəbəyə nail olmuş ariflərin nəzərincə, behişt ilgiləri də kəsrət müqəddiməsinin qoşalıq (bir məbud birdə behişt) törətməsi ilə insanı vəhdət qarşısında hicab kimi həqiqi aydın müşahidədən məhrum edən maraqdan ibarətdir.*[3]

Nişanə 4: "Peymanə" – ilahi müşahidə nurunu əks etdirməklə mənəvi mərtəbələr idrakına imkan törədən vəziyyətdən nişanədir. Anlam: Dünyəvi və mənəvi müşküllərə qəti qələbə çalmaq yalnız meyxanə mövqeiyyətində mümkündür.

---

[1] Qəzəl 9, beyt 2

[2] Fərhənge- istilahat və təbirate ürfani.

[3] Fərhənge luğat və istilahat və təbirate ürfani.

Beyt 2: **Dişlədimsə ləlin, ey qanım tökən, qəhr eyləmə,**
**Tut ki, qan etdim, ədalət eylə, qanı qanə tut!**

Nişanə 1: "Ləl dişləmək" – bəşəri şəraitdə ilahi ləzzət aparmaqdan, yaxud mücərrədlikdən əvvəl mənəvi məzələri dadmaqdan nişanədir.

Nişanə 2: "Qanı qana tutmaq": Qnı qana tutmaq, bəlalar sınağında tənbih və tərbiyə məqsədilə mənlik tifaqını dağıdan qəbzlər və ətəşlərdən nişanədir.

Anlam: Ey mütəal məhbub, yaxud ey həzrəti-mürşüd, üryanlıq və qurbanlıq mərhələsindən əvvəl vüsal tamahıyla maraqlanmaq aşiqi hicaba giriftar edən bir günah olduğuna görə cəfalarla cəzalanmak istəyirəm.

Beyt 3: **Çizginirkən başına şəmi-ruxundən canımı,**
**Mən qılma ani həm ol şəmə bir pərvanə tut!**

Sözlük: Şəm = şam; rüx = camal = surət; mən = mane olmaq

Nişanə 1: "Şəmi-rüx ":

A – şühud mərtəbəsinə nailiyyət imkanı tapmış aşiq qəlbini işıqlandıran ürfan nurundan ibarətdir.

B –arifin qəlbinə alov saçan "nari-məhəbbət"[1] nurundan ibarətdir.

Nişanə 2: "Pərvanə" – qurbanlıq nailyyətinə çalışan aşiqdən nişanədir.

Anlam: Ey gözəl məbud, nola ki mənim də biqərar qəlbimi saya gəlməz şühud möhtaclarının biri hesab edəsən.

Beyt 4: **Gər sənə əfğanimi bihudə dersə müddəi,**
**Ol sözə tutma qulaq, mən çəkdiyim əfğanə tut!**

Sözlük: Əfğan = fəğan = nalə = fəryad; bihudə = yersiz = faydasız

Nişanə 1: "Əfğan":

A – içəri əhval-ruhiyyəni üzə çıxaran mərhələdən nişanədir.

B – aşiqin fəqirliyini – məmlüklüyünü [2] sübut edən ürək, münacatından ibarətdir.

Nişanə 2: "Müddəi" – əql və elm məğrurluğunda özünü eşq və ürfan yüksəkliyindən məhrum etmiş bir zahiddən nişanə olduğu kimi, öz iradə - istedadına güvənməklə özünü hicaba giriftar etmiş aşiqdən nişanədir.[3]

[1] Qəzəl 9, beyt 3
[2] Qəzəl 1, beyt 6
[3] Qəzəl 6, beyt 2

Anlam: Ey həzrəti-mürşüd, müddəinin irad – etirazınına görə mənim nalələrimi, yaxud özəl münacatımı qulaq ardına vurma.

**Qeyd**: *Aşiq müddəidən şikayətçi olmaq bəhanəsilə öz nalələrini həm də ixlas – iradətini mürşüdün qulağına çatdırmaq istəyir.*

Beyt 5: **Tutmazam zənciri-zülfü tərkin, ey naseh, məni**
**Xah bir aqil xəyal et, xah bir divanə tut!**

Sözlük: Naseh = nəsihətçi; xah = istər = istər bu – istər o = istərsən aqil = ağıllı

Nişanə 1: "Zənciri - zülf":

A – maddi yaranmışlarada əks etdirilmiş mənəvi nur təkrarından nişanədir.

B – Dalbadal yenilənən ətəş və tələbdən nişanədir.

Anlam: Əqlə, idraka güvənən nəsihətçilərin sərki – danlağı, yaxud alqış-afərini, mənəvi ilgi - əlaqələri qəlbimdən qopara bilməz. **Qeyd**: Görünməz zavalsız aləmlə tanış olmuş bir arif dünyəvi cazibələri həqir və eybəcər görərkən onlara nifrət edər.

Beyt 6: **Ey olub sultan, deyən dünyadə məndən qeyri yox,**
**Sən səni bir cüğd bil, dünyanı bir viranə tut.**

Sözlük: Cüğd = bayquş

Anlam: Dünyəvi dikəlməklər məğrurluğuna giriftar olmuş bir sultanın xarabaya güvənən bir bayquşla heç bir fərqi yoxdur. **Qeyd**: *A – Filosof demişkən dünya maddi olduğuna görə "kövn"dür və kövn olduğuna görə "fəsada" məhkumdur.*

*B – "Kövn", yaxud "hadis" – fəlsəfi özəl termində bir anda havaya çevrilmiş su kimi birdən – birə mövcud olmuş əmrdən ibarətdir.*

*P – Maddi mövcudatın parçalanması, çevrilməsi, hər an başqa bir surət tapması və nəhayət dalbadal əvvəlki surətindən məhv olması "fəsad" ünvanlı "kövndən" ayrılmaz bir sifətdir. Beləliklə fəsadsız kövn, yaxud məhv olmaz maddə – mümkünsüz bir sözdür. Buna görə də dünyəvi durumlar – mərtəbələr, dalbadal çevrilib xarab olmaqla aşiq dünyanı bir viranə kimi və onunla əlaqə saxlayanı isə bir bayquş kimi təlqin etmək istəyir.*

*T – Yuxarıda nəzərdən keçirdiyimiz nümunələr məlum edir ki, fəsada məruz qalmayan məqam – mərtəbə yalnız eşq və ürfan səviyyəsində yaranıbdır.*

Beyt 7: **Ey Füzuli, dəhr Zalinin firibindən saqın,**

**Olma qafil, ər kimi tərpən, işin mərdanə tut!**

Sözlük: Dəhr = zəmanə = fələk = dünya; Zal = qaşı – başı – kipriyi ağarmış bir qoca = dünya = Rüstəmin atası = Samın oğlu; fərib = hiylə = aldatma

Anlam: Şair ötən beyti davam etdirmək məqsədilə deyir: Ey Füzuli, hiyləbaz qoca dünyanın qarşısında sarsılmaz bir igid kimi qeyrət göstərərkən, ilahi zavalsız mərtəbələr və qazanclardan özünü müdafiə etməlisən.

## **Q Ə Z Ə L 44**

**(1) Bəhri-eşqə düşdün, ey dil, zövqi-dünyanı unut!**
**Baliğ oldun, gəl rəhimdən içdiyin qanı unut!**

**(2) Verdi rehlətdən xəbər muyi-səfidü ruyi-zərd,**
**Çöhreyi-gülgun ilə zülfi-pərişanı unut!**

**(3) Çək nədamətdən göyə dudi-dilin, tök qanlı yaş,**
**Sərvi-nazin tərkin et, gülbərgi-xəndanı unut!**

**(4) Gör qənimət fəqr mülkündə gədalıq şivəsin,**
**Etibari-mənsəbü dərgahi-sultani unut!**

**(5) Çəkmə aləm qeydini, ey sərbüləndi-fəqr olan,**
**Səltənət təxtinə irdin, bəndü zindani unut!**

**(6) Lövhi-xatir surəti-cananə qıl ayinədar,**
**Ani yad et, hər nə kim yadındadır, ani unut!**

**(7) Məsiyət dərsin yetər təkrar qıl, döndər vərəq,**
**Özgə hərfin məşqin et, ol dərs ünvani unut!**

**(8) Ey Füzuli, çək məlamət rəhgüzarından qədəm,**
**Ləhzə-ləhzə çəkdiyin bihudə əfğani unut!**

Beyt 1: **Bəhri-eşqə düşdün, ey dil, zövqi-dünyanı unut!**
**Baliğ oldun, gəl rəhimdən içdiyin qanı unut!**

Sözlük: Bəhr = dəniz = şer və musiqi vəzni; baliğ = yetkin, rəhm = rahim

Anlam: Ey aşiq səviyyəsində mövqe tutmuş ürək batin daxilini sovuşdurarkən, qandan qidalanmağı tərk etmiş bir uşaq kimi dünyəvi maraqları unutmağa əsaslı hazırlaşmalısan.

**Qeyd** 1: *Bəhr dənizdə boğulub ölməyi təlqin edərək bəşəri mahiyyətin, yaxud mənəmlik-mənəmliyin ölməsini, yaxud İslam Peyğəmbəri buyurduğu* "موتوا قبل ان تموتوا" *sözünə eyham etmək istəyir.*

**Qeyd** 2: *Bəhr musiqi ahəngini təlqin edərək ahəngə düşmək, yaxud nəyəsə qəsd və iradə etməyi eyham edir. Beləliklə:*

*A – Eşq ahənginə düşmüş bir insanın əql ahəngindən kənar olmasını təlqin edir.*

*B – Mənəvi ömür sürməyi qarşısına məqsəd qoymuş bir insanın dünyəvi həyatdan nifrət etməsini təlqin edir (əzdad).*

*P – Dünyəvi həyatı mənəvi mərtəbələrə sərmayə etməyi eyham edir.*

Beyt 2: **Verdi rehlətdən xəbər muyi-səfidü ruyi-zərd,**
**Çöhreyi-gülgun ilə zülfi-pərişanı unut!**

Sözlük: Rehlət = ölüm = dünyanı dəyişmək = dünyadan köçmək = səfər etmək = vəfat etmək; muyi-səfid = ağ tük; ruyi zərd = sarı üz, gülgun = gülə bənzər = gözəl

Nişanə: İkinci misra, dünyəvi və məcazi gözəlliklərdən nişanədir.

Anlam: Mətlə beytini davam etdirmək məqsədilə deyir:

Üzün sarışın olub qırışması ilə paralel başın ağarmağı (qocalıq) ölüm nişanələri olduğuna görə axirəti yada salarkən dünyanın vəfasız gözəlliklərindən əl çəkməyi təlqin edir.

**Qeyd**: *Beyt ömür fürsətinin xüsusilə qocalıq dövranının etibarsızlıq nişanələrini (muyi – səfid, ruyi-zərd) üzə çıxarmaqla insanın axirət səfərinə çıxmaq çağını onun yadına salarkən kiçik bir dünyəvi fürsətdə mənəvi ölməz həyata, ibadət – itaət sərmayəsini hazırlamağa çalışmağı təkid edir, ulu ariflər demişkən: Gənclikdə məstlik, qocalıqda süstlük, bəs haçan xudapərəstlik.*

Beyt 3: **Çək nədamətdən göyə dudi-dilin, tök qanlı yaş,**
**Sərvi-nazin tərkin et, gülbərgi-xəndanı unut!**

Sözlük: Dud = tüstü; gülbərg = gül yarpağı

Nişanə 1: "Dudi-dil" : Dudi dil və qanlı yaş dünyəvi ilgilər məşğuliyyətində mənəvi sərvət qazanmaqdan qəflət etmiş bir insanı cəzalandırmaq qəsdilə onun keçmiş maddipərəstlik günahlarını təmizləyən naləlerdən ibarətdir.

Nişanə 2: "Sərvinaz, gülbərgi-xəndan" – mənəvi mərtəbələr qarşısında dikəlmiş dünyəvi hüsnlərdən ibarətdir.

Anlam: Yuxarıda nəzərdə keçirdiymiz iki nişanə, anlam təlqini üçün qənaətbəxşdir.

Beyt 4: **Gör qənimət fəqr mülkündə gədalıq şivəsin,**
**Etibari-mənsəbü dərgahi-sultani unut!**

Sözlük: Fəqr = faqırlıq = yoxsulluq, gədalıq = dilənçilik

Nişanə 1: "Fəqr":

A – dünyəvi məqamlar – etibarların zavala məruz qalmasını açıq-aydın anmaqla onlardan kənar olmağı təlqin edən nişanədir.

B – dünyəvi məqamlar – etibarların əngəl yönünü görməklə onlardan saqınmağı təlqin edən nişanədir.

P – bütün dünyəvi etibarlara, xüsusilə içəri və çöl vücuduna yaxud batin və zahirinə, malına, canına, elminə, sənətinə mütəal məbudu həqiqi malik bilib, öz məmlüklüyünü düşünmüş eşqdən, yaxud həzrəti-məhbub qarşısında mütləq acizlik – fağırlığını etiraf etmək mərhələsindən nişanədir.[1]

Nişanə 2: "Gədalıq":

A – Möhtaclıq və məmlüklüyünü etiraf etməkdən nişanədir.

B – İlahi feyzləri – təcəllilləri tələb etməkdən nişanədir.

Nişanə 3: İkinci misra dünyəvi üstünlüklərdən nişanədir.

Anlam: Ötən beytləri təsdiq etmək qəsdilə deyir: Ey insan, zavalsız məqam və həqiqi yüksəklik dünyəvi və məcazi etibarları rədd etməkdən (istiğna) və mənəvi mərtəbələrə nailyyət tapmaqdan ibarətdir.

Beyt 5: **Çəkmə aləm qeydini, ey sərbüləndi-fəqr olan,**
**Səltənət təxtinə irdin, bəndü zindani unut!**

Sözlük: Sərbülənd = başı uca

Anlam: Şair ötən beytləri dönə - dönə təkid və təkrar etməklə dərin bir mənanı təlqin etmək istəyir, demək beyt öz məmlüklüyünü həm də mütəal məbudun mütləqliyini tanımış bir insanı dünyəvi məqam – malikiyyətindən ehtiyacsız göstərmək istəyir.

---

[1] Qəzəl, 2 beyt 1

**Qeyd** 1: *Ürfanı fəqr nailyyəti həqiqi səltənətdir.*

**Qeyd** 2: *Mənəvi səltənəti (fəqri) unudub, dünyəvi səltənətlə məşğul olmaq zindanda yaşamaqla fəxr etmək kimi həqirlik və nadanlıqdan ibarətdir.*

**Qeyd** 3: İslam peyğəmbəri buyurduğu kimi möminlər sonsuz ölməz həyatdan xəbərdar olduqlarına görə məhdudluğunu bir zindan kimi həqir və nifrətamiz bilmişlər.

Anlam: Ey Füzuli, batin və zahirini dünyəvi maraqlardan mükəmməl təmizləməklə bəşəri vücudunu ilahi surət təzahur etdirməyə tərbiyə qıl.

Beyt 6: **Lövhi-xatir surəti-canana qıl ayinədar,**
**Ani yad et, hər nə kim yadındadır, ani unut!**

Sözlük: Lövh = səhifə, ayinədar = aynaçı = aynalı

Nişanə 1: "Lövhi xatir" – bəşəri mövcudun ilahi surətləri əks etdirmiş içəri üzü, yaxud dünyəvi maraqlardan boşalmış ürəyindən ibarətdir.[1]

Nişanə 2: "Surəti canan" – mütəal məbudun surətindən ibarətdir.

**Qeyd**: *Yaradıcı məhbubun bəşəri idrak vəanlama sığmaz özəl nur saçan və güclü bərq vuran "vəch" ünvanlı surətini fəlsəfə, ürfan və din çoxdan araşdırıb izah etmişdir. Demək, ilahi surət və örtülü söz zühur etsə, yeri-göyü özəl bərq ilə parçalayıb, yandırıb külə döndərməklə bütün kaynatın məhvinə səbəb olaş.*[2]

Nişanə 3: "Ayinədar" – ilahi surətin batində, yaxud zahirdə əks etdirilmiş vücudundan nişanədir.

Beyt 7: **Məsiyət dərsin yetər təkrar qıl, döndər vərəq,**
**Özgə hərfin məşqin et, ol dərs ünvani unut!**

Anlam: Ey bəşər, bir belə dünyəvi məşğuliyyətlə ömür sürdün, heç olmasa bir neçə günlük son çağlarında mənəvi maraqlar məşğulluğunu imtahan et.

Beyt 8: **Ey Füzuli, çək məlamət rəhgüzarından qədəm,**
**Ləhzə-ləhzə çəkdiyin bihudə əfğani unut!**

Sözlük: Rəhgüzar = yol; bihudə = yersiz = faydasız; əfğan = fəğan = nalə

---

[1] Qəzəl 13, beyt 1

[2] Fərhəngi -trəbirat və təbiratı- istilahat ürfani.

Anlam: Ey Füzuli, özünü danlamaq və nalə etmək bir növ özünü yad etmək və mənlikdən xəbərdar olmaqdır. Demək, özünü həlak etmiş yaxud "istihlak" mərtəbəsində nailyyət tapmış bir aşiq qəbzdən, bəstdən, fəğandan, məlamətdən və digər iztirablardan həmişəlik xilas olmuş bir arifdir.

**Qeyd** 1: *Həlak etmək, vücudu intihar ilə aradan qaldırmaq deyil bəlkə də bütün yaranmışları mütəal məbudun məmlükü bilirkən, Allahdan başqa*[1] *müstəqilliyi mümkünsüz bilməkdən ibarətdir.*[2]

**Qeyd** 2: *İkinci və üçüncü beytlərdə çöhrəyi-gülgun, zülfi-pərişan, sərvinaz və gülbərg xəndanı ifadələrini oxuyub bu ürfani anlama tuş gəlməliyik: Ey aşiq, ömür fürsətin sona yaxınlaşdığı üçün cilvə, bəst, şühud və digər ürfani tələbləri tərk etməlisən, ona görə ki "fəna", yaxud "istehlak" istedadına nail olmuş, ya da özünü məşuq nurunda itirib batırmış bir aşiqin batini də zahiri kimi məhvlik məqamında nailyyət tapmaqla onu yetkinlik (baliğ) mərtəbəsində bütün xahiş və tələbdən xilas etmişdir.*

---

[1] Bütün məfkurələr anlamlar, mənalar, təsəvvürlər və bütün əqlə - zehnə bağlı mücərəd anlayışlar da maddi vücudlar kimi "başqa"dırlar.

[2] Qəzəl 2, beyt 4, qeyd 1 (İzahat)

## Q Ə Z Ə L 45

**(1) Tilismi-gənc üçün min ismi-əzəm yad tutdun, tut,**
**Tilismi sındırıb, gənci töküb, ismi unutdun, tut.**

**(2) Töküb mey, cami-mey tutmaq təmənnasın çıxar başdan,**
**Bu gün qanlar töküb aləmdə çox xunabə yutdun, tut.**

**(3) Şərabi-nab zövqündən nə hasil, çün degil baqi,**
**Riyazi-ömrə min gəz su verib, axir qurutdun, tut.**

**(4) Çü nə Cəmşid bulmuşdur bəqa keyfiyyətin, nə Cəm**
**Bu bəzm içrə Cəmü Cəmşid əlindən cam tutdun, tut.**

**(5) Füzuli, qıl qiyas halın əhli - dəhr halından,**
**Qumarü məkrü təzvirü hiyəl əhlindən utdun, tut.**

Beyt 1: **Tilismi-gənc üçün min ismi-əzəm yad tutdun, tut,**
**Tilismi sındırıb, gənci töküb, ismi unutdun, tut.**

Sözlük: Gənc = xəzinə; ismi - əzəm = mütəal məbudun ən əzəmətli adı = mütəal məbudun hər bir adı.

Nişanə 1: "Tilism":

A – adətdən kənar işlər səbəbi, əcayib-qəraib naxışlı – dualı bir yazıdan ibarətdir.

B – Qatma – qarışıq mübhəm yazılardan ibarətdir.

**Qeyd**: *"A" və "B", dünyəvi hədəflərə nail edən adətdən kənar qüvvələrdən ibarətdir.*

*P – Səmavi qüvvəyə əsaslanmaqla əl çatmaz mənəvi mərtəbələr nailiyyətindən ibarətdir.*

*T – Mütəal məbudun əqlə - idraka və dünya – axirətə sığmaz həqiqətindən ibarətdir.*

**Qeyd**: "P" və "T" yüksək mənəvi mərtəbələr tanışlığı bağışlayan səmavi qüvvələrdən ibarətdir.

Nişanə 2: "Gənc" – mütəal məbud qarşısında bəşəri iradə - ixtiyarı məhv edən "bəndəçilik" mərtəbəsindən, yaxud "fəqr" məqamından ibarətdir.[1]

Nişanə 3: "İsmi - əzəm":

A – Dini gizli qüvvələrlə dünyəvi hədəflərə nail olmaqdan nişanədir.

B – maddi küdurətlər əngəlindən xilas olmuş aşiqi, "səfa" ünvanlı ürfanı mərtəbədə[2] mənəvi əl çatmaz hədəflərə nail edən gizli qüvvədən ibarətdir.

Anlam: Ey vəfasız insan, dini qüvvələrlə dünyəvi hədəflərə nail olmaq və dünyanı tutub dinin daşını atmaqla öz cəhalətini sübut edirsən.

Beyt 2: **Töküb mey, cami-mey tutmaq təmənnasın çıxar başdan,**
**Bu gün qanlar töküb aləmdə çox xunabə yutdun, tut.**

Sözlük: Xunabə = qan-yaş, xunabə yutmaq = çox əzab çəkmək = çox əzaba söykənmək.

Nişanə 1: "Mey" – salik aşiqi dünyəvi fırtınalar, təhlükələr, qəddar yol kəsənlər, yırtıcı heyvanlar və yüzlərcə belə - belə cismani həvəslərdən amanda saxlayan ilahi feyzlərdən ibarətdir.[1]

[1] Qəzəl 44, beyt 4
[2] Qəzəl 2, beyt 7, nişanə 4

Nişanə 2: "Cami-mey " – həzrəti-mürşüdün ilahi cilalarla dolu qəlbindən və onun mənəvi təlimatından nişanədir.

Anlam: Ey bir çox məzlumluqlara, qan ağlamaqlara söykənməklə dünyəvi iqtidara çatmış vəfasız insan, özün özünü mənəvi tükənməz sərvətdən həmişəlik məhrumluğa giriftar etdin.

Beyt 3: **Şərabi-nab zövqündən nə hasil, çün degil baqi,**
**Riyazi-ömrə min gəz su verib, axər qurutdun, tut.**

Sözlük: Nab = xalis = qarışıqsız; baqi = diri = sabit = zavalsız; riyaz = bağlar = gülüstanlar

Nişanə 1: "Şərabi-nab" – ötən beytdə qeyd olunmuş "mey" və "cami-mey" mərtəbələrindən nişanədir.

Nişanə 2: "Riyazi - ömr" – ürəyə bəst bağışlayan ruhani şəraitdən nişanədir.

Anlam: Ötən beytləri təkid etmək məqsədilə buyurur: Ey cəhalətdən əl çəkməz insan, dönə - dönə həzrəti-mürşüd, ilahi sənin yolunu sənə göstərdi və şühud bərqi səni silkələdi, ancaq sən oyanmaq əvəzinə yatdın.

Beyt 4: **Çü nə Cəmşid bulmuşdur bəqa keyfiyyətin, nə Cəm**
**Bu bəzm içrə Cəmü Cəmşid əlindən cam tutdun, tut.**

Sözlük: Bəqa = dirilik = əbədiləşmək; bəzm = ziyafət məclisi = əncümən = xeymə

Nişanə 1: "Cəmşid və Cəm": Cəmşid və Cəm bu beytdə dünyəvi etibar və iqtidardan nişanədir.

**Qeyd** 1: *"Cəm və şeyd": "Cəmşid" sözünü – nurlu mənalar ifadəsini verən "Cəm" və "şeyd" sözlərdən düzəldilmişdir.*

**Qeyd** 2: *Cəmşid, yaxud Cəm, cəhənnəmə hakimlik edən ilk bəşərdir ki, ölüm onun da yaxasını tutdu, O, İranın milli hekayələrində, "pişdadi" ünvanlı əfsanəvi silsilə şahlarından biridir. Cəmşid "Avesta"[2] qeyd etdiyi kimi ilk bəşərdir ki "Ahurəməzda"[3] öz dinini ona tapşırdı. Beləliklə, hakimliyinin üç yüz ili müddətində onun ölüm və xəstəlikdən ölməməzliyi İran rəvayətlərində qeyd olunmuşdur, o, ancaq yolunu çaşarkən dünya qarışdı və xəstəlik və ölüm yenə peyda oldu. Həkim Firdovsi "Şahnamə"də novruz bayramını onun yaratdığı bayram bilmişdir, Cəmşidi Zöhhak taxtından salmışdır.*[4]

---

[1] Qəzəl 1, beyt 2
[2] Qədim əsrlərdə (islamdan əvvəl) iranlıların, yaxud zərdüştilərin müqəddəs kitabı
[3] Qədim iranlıların yaxud zərdüştilərin sitayiş etdikləri ulu Tanrı
[4] Fərhəngi-Moin, Elam

**Qeyd**:  "Cəm" elə haman "Cəmşid"dir, ancaq nəzərə gəlir ki təkid qəsdilə ayrı adamlara da aid olmuşdur. Bu Cəmşiddən başqa Qiyasəddin Cəmşid adlı ikinci Cəmşid də məlumdur.

Nişanə 2:  "Bəqa keyfiyyəti"  – əbədiyyətə nail edən ilahi əhval – ruhiyyədə ibarətdir.

Anlam:  Cəmşid və Cəm uzun ömür və üstün iqtidarla həqir və aciz bir insan kimi ilahi mərtəbələr nailyyətindən məhrum oldular, sən isə bu az ömür və yox iqtidarınla onların yolunu davam etdirməklə qəribə bir nadanlığa boyun olmusan.

Beyt 5:    **Füzuli,  qıl qiyas halın əhli  - dəhr halından,**
**Qumarü məkrü təzvirü hiyəl əhlindən utdun, tut.**

Sözlük:  Dəhr = zəmanə = ruzgar;    təzvir = yalan satmaq = hiyləbazlıq = üzdə bir cür arxada başqa cür olmaq;   hiyəl = hiylə

Anlam:  Ey Füzuli, dünyəvi məqamlarla maraqlanmış insanların aqibətsizliyini nəzərdə tutmaqla onlardan ibrət götürüb öz dünyapərəst nəfsinə qalib gəlməlisən.

## **Q Ə Z Ə L 46**

**(1) Mürdə cismim iltifatından bulur hərdəm həyat,**
**Ölərəm gər qılmasan hərdəm mənə bir iltifat.**

**(2) Yazə biməz ləblərin vəsfin təmami-ömrdə,**
**Abi – heyvan versə kilki-Xizrə zülmətdən dəvat.**

**(3) Mən fəqirəm, sən qəni, vergil zəkati-hüsn kim,**
**Şər içində həm mənədir, həm sənə vacib zəkat.**

**(4) Görməyincə hüsnünü imanə gəlməz aşiqin,**
**Yüz peyəmbər cəm olub, göstərsələr min möcüzat.**

**(5) Məzhəri-asari-qüdrətdir vücudi-kamilin,**
**Feyzi-fitrətdən qərəz sənsən, tüfeylin kainat.**

**(6) Cövhəri-zatindədir məcmui-övsafi-kamal,**
**Bu sifat ilə ki, sənsən, qanda var bir pak zat?**

**(7) Eşqə ta düşdüm, Füzuli, çəkmədim dünya qəmin,**
**Bil ki, dami-eşq imiş qeydi-təəllüqdən nicat.**

Beyt 1: **Mürdə cismim iltifatından bulur hərdəm həyat,**
**Ölərəm gər qılmasan hərdəm mənə bir iltifat.**

Sözlük: Mürdə = ölü = cansız

Nişanə 1: "Mürdə" – mənlik – mənəmliyi yaddan çıxaran, dünyəvi fanilik məqamına (dünyanı təmamilə unutmaq) nail olmuş aşiqdən ibarətdir.

Nişanə 2: "İltifat" – aşiqi əngəllər sədəməsindən qorumaqdan və onu müşahidə cilaları ilə tərbiyə etməkdən nişanədir.

Nişanə 3: "Həyat":

A – iç aləmi işıqlandıran ilahi parlamalardan ibarətdir.

B – aşiqi təbiətdən ayırıb Tanrıya qovuşduran mərifətdən nişanədir.[1]

Nişanə 4: "Ölürəm" – Nəfsin, qəlbin və canın ayrı özəl ölümü oldüğuna görə:

A – nəfsini öldürmüş bir şəxs dünya məhrumluğuna dözməlidir.

B – qəlbini öldürmüş bir şəxs axirət ilgisini unutmalıdır.

P – canını öldürmüş bir şəxs mütəal məhbub hicranına həmişəlik giriftar olmalıdır.

T – sadaladığımız ölümlər məlum edir ki ikinci misrada qeyd olunmuş "ölüm" üç ölümdən ibarətdir.

Anlam: Ey mütəal yaradıcı məhbub, bir an müşahidə nurundan, yaxud sənin astanın ətrindən məhrum olmaq can həyatından (üçüncü həyat) ayrılmağa bərabərdir.

**Qeyd**: *Üçüncü həyatdan bəhrələnməyən bir insanın iki digər həyatı da ölüm ilə bərabərdir.*

Beyt 2: **Yazə biməz ləblərin vəsfin təmami-ömrdə,**
**Abi – heyvan versə kilki-Xizrə zülmətdən dəvat.**

Sözlük: Abi – heyvan = dirilik suyu = (rəvayətlər demişkən abi – heyvan, yaxud abi – Xizr, ya abi – bəqa şimalda "zülmət" adlı qaranlıq bir məntəqədə özəl bir çeşmədən ibarətdir ki, guya İsgəndər onu çox axtardı, ancaq tapa bilmədi, lakin Xizr peyğəmbər ona çatarkən suyundan içib əbədi bir həyata nail oldu.[2])

Kilk = qələm

Nişanə 1: "Ləb" – bütün yaranmışlara hətta "cövhər" adlı iç aləmə həyat, yaxud varlıq bağışlayan "rəhmani nəfs" ünvanlı ilahi feyzdən ibarətdir.

---

[1] Qəzəl 40 beyt 1

[2] Fərhəngi, Moin, Əlam

Nişanə 2: "Zülmət" – yuxarıda xatırladığımız "zülmət" məntəqəsindən ibarətdir, ancaq maddənin qara olduğunu və nəhayət dünyanın mənəvi aləm qarşısında hicab törətməsinə də eyham edir.

Anlam: A – Ey iqtidarlı mehriban məhbub, Xizrin ömrü nə qədər uzun, yaxud əbədi olsa da yenə sənin aləmə varlıq bağışlayan rəhmani nəfəslərini vəsf etməyə kifayət etməz.

B – Zülmət təmamilə mürəkkəbqabı olsa da sənin vəsfini yazmağa kifayət etməz.

Beyt 3: **Mən fəqirəm, sən qəni, vergil zəkati-hüsn kim,**
**Şər içində həm mənədir, həm sənə vacib zəkat.**

Sözlük: Fəqir = fağır, yoxsul; qəni = varlı = iqtidarlı

Nişanə 1: "Fəqir" – öz malına, canına, elminə, əqlinə çöl dünyasına, və iç aləminə, yalnız mütəal məbudu mütləq və həqiqi bir malik tanımağıyla öz məmlüklük və yoxsulluğunu etiraf etmiş aşiqdən ibarətdir.[1]

Nişanə 2: "Qəni" – bu beytdə mütəal məbudun "istiğna" mərtəbəsində "səmədiyyət" ünvanlı sifətlərilə aşiqi heyran edən təcəllilərindən ibarətdir.[2]

**Qeyd** 1: *"Təcəlli" – A – aşiqin qəlbinə alov saçıb onu heyran etmiş mükaşifə nurundan ibarətdir.*

*B – Mükaşifə, mükəmməl bir müşahidə olduğuna görə aşiqi təcrid məqamına qaldırıb onun mücərrəd ruhuna ( bədənsiz ruh) görünməz aləmi göstərən mərtəbədən ibarətdir.*

*P – Təcəlli – "rəhmani" mərtəbədə, ilahi feyzi umumiləşdirən, yaxud bütün yaranmışlara ehsan olunmuş "imtinanı" ünvanlı rəhmətdən ibarətdir.*

*T – Təcəlli – "rəhimi" mərtəbədə, təcrid məqamına nail olmuş aşiqə mənəvi kamal bağışlayan özəl feyzdən ibarətdir.*[3]

*S – Rəhimi təcəlli məqamına nail olmağın ilk şərti aşiqin öz fəqirlik və məmlüklüyünü etiraf etməsindən ibarətdir.*

Anlam: Ey mütəal məhbub, yoxsa ey feyz vasitəsi, ya ey mürşüd, dünyəvi mal – dövlətin zəkatını vermək vacib olduğu kimi, tükənməz ürfan sərvətinin, yaxud hüsn dövlətinin də zəkatını vermək (camal göstərmək) gərəklidir.

---

[1] Qəzəl 44,beyt 4
[2] Qəzəl 30, beyt 3, nişanə "Məst"
[3] Fərhəngi luğat və təbirat və istilahat ürfani, doktor seyyid Cəfər Səccadi

**Qeyd**: *Mehriban məbud bütün yaranmışlara ruzi verməyi özünə vacib bildiyi kimi, ilahi cəlallarla aşiqlərə özəl ruzi yetirməyi də özünə gərəkli bilmişdir.*

Beyt 4: **Görməyincə hüsnünü imanə gəlməz aşiqin,**
**Yüz peyəmbər cəm olub, göstərsələr min möcüzat.**

Sözlük: Möcüzat = möcüzələr

Nişanə 1: "Hüsn" – ilahi camal parlamalarından ibarətdir.

Nişanə 2: "İman" – A – hicab arxasından saçan ilahi nurdan ibarətdir.

B – İlahi hökmləri əql ilə təsdiq etmək umumxalqın imanından ibarətdir.

P – İlahi hökmləri qəlb ilə təsdiq etmək yalnız aşiqlər imanından ibarətdir.

**Qeyd**: *İmam və peyğəmbərin imanı həm əqlidir həm də qəlbi.*

T – Rəvayət edildiyi kimi imanın yetmiş neçə qapısından ən aşağı qapısını açmaq, aşiqin kökündən qopmuş dünya və axirəti yandıran özəl bir himmətə bağlıdır.Belə bir himmətlə iki dünya ilgilərini qırıntı çör-çöp kimi həqir edib ayaq altına salan bir insanın qəlbinə iman nuru saçmalıdır.

Nişanə 3: "Möcüzə": Möcüzə, adətdən kənar işlər önündə əqli qəbulçuluğa vadar edən nişanədir, lakin eşq əqldən başqa müstəqil bir aləm olduğuna görə möcüzə təsirindən kənardır.

Anlam: Ey gözəl məbud, aşiqin imanı – dini yalnız sənin cilvələrinə bağlıdır.

**Qeyd** 1: *Aşiq ağılsız olduğuna görə möcüzəni dəlilləşdirməkdən acizdir.*

**Qeyd** 2: *Axirət, yaxud behişt aşiq ilə məşuq arasında dikəlmiş bir maneədir, ona görə ki, həm behişti həm də mütəal məbudu istəyən aşiq qoşa istəyə boyun qoymaqla qoşalığı, yaxud kəsrətin müqəddiməsini, ya vəhdətin muxalifini təsdiq etmişdir.*

Beyt 5: **Məzhəri-asari-qüdrətdir vücudi-kamilin,**
**Feyzi-fitrətdən qərəz sənsən, tüfeylin kainat.**

Sözlük: Məzhər = zuhura gəlmək mənşəyi = cilvələnmək mərkəzi = təcəlli məbdəi

Nişanə 1: "Məzhər" – Hər bir şeyin duyğu, yaxud əql ilə idrak olunmuş surəti onun məzhərindən ibarətdir. Beləliklə, insan mütəal məbudun adlarını – sifətlərini, həm əql məhdudluğunda həm də eşq sonsuzluğunda əks etdirmiş mövcuddur.

**Qeyd**: *Bir incəlik, yaxud bir elmdən payı olmayan bir insan, başqa bir insanda o incəliyini elmin olduğunu idrak edə bilməz, demək hər incəlikdən maraqlanmayan bir şəxsdən o incəlik mütləq gizlidir ... buna görə də mərifət zirvəsinə yüksəlmiş bir insan, xüsusilə peyğəmbər və imam, mütəal məbudun bütün adlarlna – sifətlərinə məzhərdir.*[1]

Nişanə 2: "Asari – qüdrət" – müxtəlif dərəcələrdə zühur etmiş kamaldan ibarətdir.

Nişanə 3: "Fitrət" – insanı ilahi əslinə və vəhdət mənşəyinə müraciət etdirən batini tələb və istedadından ibarətdir.

Nişanə 4: "Tüfeyl" – başqa bir vücuddan həyat almaqla mövcud olduğuna görə bütün kainatın hər an mütəal məbuddan yeni nur almaqla mövcud olmasını təlqin etmək istəyir.

Anlam: Ey iqtidarlı ulu məbud, idrak, eşq və ürfanın tanış olduğu kamallar təmamilə sənin məzhərindir. Demək bütün kainata nurani gözəl sifətlərlə hər an varlıq bağışlayan yalnız sənsən.

Beyt 6: **Cövhəri-zatindədir məcmui-övsafi-kamal,**
**Bu sifat ilə ki, sənsən, qanda var bir pak zat?**

Sözlük: Sifat = sifətlər

Nişanə 1: "Cövhəri – zat" – mütəal məbudun əqlə - idraka sığmaz həqiqətindən ibarətdir.

**Qeyd**: *İslamın ulu peyğəmbəri, cövhəri zata tanışlıq istedadı olmadığını etiraf etmək qəsdilə "* "الهی ما عرفناک حق معرفتک *buyurmuşdur.*[2]

Anlam: Ey mütəal canan, bəşərin tanış olduğu mərtəbələr, həm də onun ağlına sığmaz kamallar bütünlüklə sənin zatındadır.

Beyt 7: **Eşqə ta düşdüm, Füzuli, çəkmədin dünya qəmin,**
**Bil ki, dami-eşq imiş qeydi-təəllüqdən nicat.**

Sözlük: Qeyd = həbs, zəncir, şərt, və...; təəllüq = aid olmaq = ürək bağlamaq

Anlam: Ey Füzuli, eşq ilə tanış olduğun çağdan sən dünyəvi bağlantılar – iztirablardan xilas oldun.

---

[1] Fərhəngi-istilahatn və təbiratı ürfani.

[2] Bəharül-ənvar, cild 67, səh 338, bab 59, Əlxovf və rica

## Q Ə Z Ə L 47

(1) Səba, əğyardan pünhan qəmim dildarə izhar et!
Xəbərsiz yarımı hali-xərabimdən xəbardar et!

(2) Gətir yadım onun yanında vər görsən ki, qəhr eylər,
Xəmuş olma, yenə düşnam təqribilə təkrar et!

(3) Könül, qəm günlərin tənha keçirmə, istə bir həmdəm,
Əcəl xabından, əfğanlar çəkib, Məcnunu bidar et!

(4) Çü yox, eşq atəşi bir şölə çəksə, taqətin, ey ney,
Baş ağrıtma, dəmi-eşq urma, ancaq naleyi-zar et!

(5) Məni rəşk oduna pərvanətək, ey şəm, yandırma,
Yetər, xurşidi-rüxsarın çırağı-bəzmi-əğyar et!

(6) Giriftari-qəmi-eşq olalı azadeyi-dəhrəm,
Qəmi-eşqə məni bundan betər, ya rəb, giriftar et!

(7) Füzuli, baxmaq olur ol günəş yadilə xurşidə,
Nə vəch ilən kim, olsa gün keçər, fikri-şəbi-tar et.

Beyt 1: **Səba, əğyardan pünhan qəmim dildarə izhar et!**
**Xəbərsiz yarımı hali-xərabimdən xəbardar et!**

Nişanə 1: "Səba" – həzrəti-Cəbrayildən, yaxud digər ilahi vasitədən, ya da həzrəti-mürşüddən nişanədir.

Nişanə 2: "Əğyar" – dünyaşünas ağılı mərifət və kamal nailiyyətinə kafi bilmiş eşq səviyyəsini yerli – dibli inkar edən camaatdan ibarətdir.

Nişanə 3: "Qəm" – yeganə məşuq tələbində çalışmaqdan nişanədir.

Nişanə 4: "Xəbərsiz" – şühud nuru kəsilmiş mərhələdə, yaxud qəbz və ətəş həbsində aşiqdən xəbər tutmaq nişanəsidir.

**Qeyd**: *Dönə - dönə dediyimiz kimi, xəbər tutmaq aşiqin tərbiyə görməsinə gərəkli bir mərhələdir.*

Nişanə 5: "Xərab" – A – aşiqin taqətsizliyini təlqin edən nişanədir.

B – cismani vücuddan yoxsa bəşəri sifətlərdən ayrılmaqla ilahi mərtəbələr tanışlığına, yaxud vəhdət ərəfəsinə daxil olmağa qazanılmış istedad nişanəsidir

Anlam: Ey ilahi vasitə, yaxud ey həzrəti-mürşüd, mənim də qəbz atəşində yanarkən bəst ehsanına möhtaclığımı mütəal məhbub hüzurunda bəyan et.

**Qeyd**: *Bəyan yaxud xəbərdar etmək, din və ürfan baxımında "şəfaət" ünvanlı yardımçılıq, yaxud vəsatətdən ibarətdir.*

Beyt 2: **Gətir yadım onun yanında vər görsən ki, qəhr eylər,**
**Xəmuş olma, yenə düşnam təqribilə təkrar et!**

Sözlük: Xəmuş = xamuş = sakit; düşnam = yaman, söyüş; təqrib = zəminə yaratmaq = zəminə qoymaq = yaxınlatmaq

Nişanə 1: "Qəhr" – bu beytdə ilahi lütfün kəsilməsindən nişanədir.

**Qeyd**: *Aşiqi dünyəvi bağlantılar və bəşəri ilgilərdən ayrılmağa gərəkli mərhələdən ibarətdir.*

Nişanə 2: "Düşnam" – mənliyindən mükəmməl ayrılmayan aşiqin yararsızlığını təsdiq edərkən ona qəbz və qəhr ilə islah təmənna etməkdən ibarətdir.

Nişanə 3: "Təqrib" – aşiqi tənqid etmək bəhanəsilə vəsatət və yardımçılığa zəminə yaratmaqdan ibarətdir.

**Qeyd**: *Təqrib "qürb" sözündən düzəlmiş bir kəlmə olduğuna görə həzrət məhbub ərəfəsinə yaxınlaşmağa eyham etmək istəyir.*

Anlam: Ey həzrət Cəbrayıl, yaxud ey feyz vasitəsi, ya da ey mürşüd, mütəal məhbub hüzurunda məndən irad – etiraz ilə ad gətirmək bəhanəsilə vəsatət zəminəsi yaratmaqdan müzayiqə etmə.

Beyt 3: **Könül, qəm günlərin tənha keçirmə, istə bir həmdəm,**
**Əcəl xabından, əfğanlar çəkib, Məcnunu bidar et!**

Sözlük: Əcəl xabı = ölüm yuxusu; əfğan = fəğan = nalə; bidar = oyaq

Anlam: Ey qəbzlər – həsrətlər həbsində sınaqlara çəkilmiş alovlu qəlbim, bu ağır təklifə təkbaşına boyun qoymağın mümkünsüz olduğuna görə, hicran hay – həşirilə Məcnunu ölüm yuxusundan oyadıb onunla ortaqlaşmağın gərəklidir.

**Qeyd**: *İkinci misra aşağıdakı mənaları eyham etmək istəyir:*

*A – Həqiqi eşq atəşi, ölmək ilə xamuş olmaz (sönməz).*

*B – Aşiqin qəbr mənzilində sakit yatması onun naqis eşqindən nişanədir.*

Beyt 4: **Çü yox, eşq atəşi bir şölə çəksə, taqətin, ey ney,**
**Baş ağrıtma, dəmi-eşq urma, ancaq naleyi-zar et!**

Sözlük: Çu = çün, çünki

Nişanə: "Ney" – aşiqin istiqamətdən boş səbrsiz vücudundan nişanədir. Amma, burada ürfanı "boşluq", yaxud "ney" mərtəbəsində mənlikdən boşalmağa eyham edir.[1]

Anlam: Ey bir qəbz atəşilə içi boş qamış kimi yanıb kül olmuş aşiq, belə bir istiqamətsiz vücud ilə eşqdən danışmağın boşboğazlıq və nəhayət müddəilik[2] nişanəsidir, buna görə də aşiqlik iddiasını tərk etməlisən, amma tərbiyə görmək ümidi ilə nalələrini davam etdirməkdən çəkinmə.

**Qeyd**: *Nalə aşiqin özəl münacatı olduğuna görə, onun kəsilməsi yararlı deyil.*

Beyt 5: **Məni rəşk oduna pərvanətək, ey şəm, yandırma,**
**Yetər xurşidi-ruxsarın çırağı-bəzmi-əğyar et!**

Sözlük: Rəşk = qısqanma = paxıllıq; şəm = şam; xurşid = günəş; ruxsar = camal = surət; bəzm = ziyafət məclisi = əncümən = xeymə

Nişanə 1: "Rəşk" – bu beytdə başqa bir şəxsin xeyrxahlıqla yararlı halını arzulayan "qibtə" ünvanlı ilgidən ibarətdir.

Nişanə 2: "Şəm" – aşiqin qəlbini yandıran ilahi nurdan nişanədir.

Nişanə 3: "Xurşidi-rüxsar" – tovhid günəşindən[3] parlayan cəlalardan ibarətdir.

---

[1] Qəzəl 1, beyt 2
[2] Qəzəl 6, beyt 2
[3] Qəzəl 1, beyt 1

Anlam: Ey başqa aşiqləri, yaxud rəqibləri camal cilalərindən bəhrələndirmiş mütəal məhbub, tək mənim məhrumluğum, yaxud bir belə arzu atəşində yanmağım bəs deyilmi?

Beyt 6: **Giriftari – qəmi – eşq olalı azadeyi – dəhrəm,**
**Qəmi – eşqə məni bundan betər, ya rəb, giriftar et!**

Sözlük: Dəhr = zəmanə = rüzgar

Nişanə 1: "Qəm" – bu beytdə mütəal məşuq tələbində bütün dünyanı bir həbsxana kimi aşiqin gözündən salıb yadından çıxaran sıxıntılar və müşküllərdən nişanədir.

Nişanə 2: "Azadə dəhr" – bəşəri ilgi - əlaqədən xilas olmaqla ilahi mərtəbəyə yüksəlmək istedadı tapmış aşiqdən ibarətdir.

Nişanə 3: İkinci misra, dönə - dönə dediyimiz kimi, "əzdad" baxımını yada salarkən qəmi şadlığa, giriftarlığı azadlığa və hicranı vüsala müqəddimə bilərkən bəlaları alqışlamaqdan əlamətdir.

Anlam: Ey mütəal məbud, cövrü cəfa aşiqi dünyəvi bağlantılardan və nəhayət mənlik – mənəmlikdən nicat verməyə güclü – gərəkli səbəblər olduğuna görə bəlaların əlavə olmasını xahiş edirəm.

**Qeyd**: *Əlavə bəla istəmək üstün mərifət nailyyətindən nişanədir.*

Beyt 7: **Füzuli, baxmaq olur ol günəş yadilə xurşidə,**
**Nə vəch ilən kim, olsa gün keçər, fikri-şəbi-tar et.**

Sözlük: Xurşid = günəş; vəch = yol; şəbi-tar = qaranlıq gecə

Nişanə 1: Birinci misra, ilahi mərifətə nail olmuş aşiq nəzərində dünyəvi maraqlar həqirliyini təlqin edərək dünyanın həbsxana olduğuna yaxud dünyəvi yaşayışın çətinliyinə eyham etmək istəyir.

Nişanə 2: "Şəbi – tar " – mənəvi çətinlikləri yaxud ilahi yaşayışdan məhrum olmağı təlqin edən nişanədir.

Anlam: A – Ey Füzuli, dünyəvi çətinliklərə dözmək mümkündür, çalış ki, dözümdə - istiqamətdə sığmaz mənəvi çətinliklərə giriftar olma.

B – Ey Füzuli, dünyəvi ömür fürsətində hicran müşkülünə dözmək mümkündür, çalış ki, mənəvi həyat hissəsində, yaxud əbədi dünyada hicran dərdinə giriftar olmayasan.

## Q Ə Z Ə L 48

(1) Xətti-rüxsarın edər lütfdə reyhan ilə bəhs,
Hüsni-surətdə cəmalın güli-xəndan ilə bəhs.

(2) Cənnəti-kuyinə zöhd əhli münasib desələr,
Nə münasıb ki, qılam bir neçə nadan ilə bəhs.

(3) Üzünə durmasın ayinə urub lafi-səfa,
Nə rəva məh qıla xurşidi-dirəxşan ilə bəhs.

(4) Gərçi şümşaddə çox lafi-lətafət vardır,
Yorulur eyləsə ol sərvi-xuraman ilə bəhs.

(5) Qılsa canləlin ilən feyz yetirmək bəhsin,
Canibi-ləlini tut, ey könül, et can ilə bəhs.

(6) Düşər od şəm dilinə bu səbəbdən ki, qılır,
Dil uzadıb gecələr ol məhi-taban ilə bəhs.

(7) Sifəti-hüsnün edər, xəstə Füzuli, nə əcəb,
Hüsnü- güftardə gər eyləsə Həssan ilə bəhs.

Beyt 1: **Xətti-rüxsarın edər lütfdə reyhan ilə bəhs,**
**Hüsni-surətdə cəmalın güli-xəndan ilə bəhs.**

Sözlük: Xətti-ruxsar = gənclər üzündə təzəcə göyərmiş tük;
reyhan = hər bir ətirli bitki

Nişanə 1: "Xətt":

A – çıxdığı vaxtdan etibarən fasiləsiz bitdiyinə görə nəhayətə çatmış "əqrəb" ünvanlı qürb mərtəbəsindən, yaxud vüsal məqamından ibarətdir.

B – surətin içərisindəki gizli kökdən çıxdığına görə insanın "ənəllah" yaxud vəhdət mərkəzində görünməz olan həqiqi həyat mənşəyindən nişanədir.

P – Göyərmək, yaxud, yaşıllıq, həyat əlaməti olduğuna görə xətt mənəvi həyatdan nişanədir.

T – Yaşıllıq islam məktəbində xilafət əlaməti olduğuna görə, xətt insanın yer kürəsində ilahi xəlifə olduğunu təlqin edən nişanədir.

Nişanə 2: "Ruxsar" – ilahi camal cilalarından, yaxud bəşəri camalda əks etdirilmiş mənəvi nurundan nişanədir.

Nişanə3: "Lütf" – bu beytdə maddi maneələri yarıb iç aləmə nüfuz edən mənəvi hüsndən ibarətdir.

Nişanə 4: "Reyhan" – bu beytdə bəşəri və dünyəvi hüsnlərdən nişanədir. Ancaq səfa mərtəbəsinə nail olmuş ürək nuruna da eyham edilir.

Nişanə 5: "Bəhs etmək" – öz üstünlüyünü sübut etməkdən nişanədir.

Nişanə 6: "Hüsni-surət" – yaradıcı məbudun bəşəri idraka sığmaz "vəch" ünvanlı bərk bərq vuran camalından ibarətdir.[1]

Nişanə 7: "Güli-xəndan" – bu beytdə dünyəvi ürək açan hüsnlərdən nişanədir.

Anlam: Ey gözəl məbud, yaxud ey həzrəti-mürşüd, sənin mənəvi həyat bağışlayan hüsnün, bütün dünyəvi gözəlliklərin etibarsızlıq və həqirliyini açıq şəkildə sübut edir.

Beyt 2: **Cənnəti-kuyinə zöhd əhli münasib desələr,**
**Nə münasıb ki, qılam bir neçə nadan ilə bəhs.**

Sözlük: münasib = eyni = oxşar = bənzər = rəva bilmək = yararlı

Nişanə 1: "Kuy" – mütəal məhbubun ərəfəsində iç aləmi maraqlandıran bəndəlik və məmlüklükdən ibarətdir.

[1] Qəzəl 44, beyt 7

Nişanə 2: "Zöhd əhli" – dünyaşünas əqli, əbədi səadət nailyyətinə kamil bir rəhbər təsdiq edərkən, eşq hidayətini inkar etmiş camaatdan ibarətdir.

Anlam: Zöhd əhli behişti canan ərəfəsinə bənzətməklə öz nadanlıqlarını sübut etmişlər, bunun üçün də onlar ilə bəhs etməyi münasib bilmirəm.

**Qeyd** 1: *Qoşalıq kəsrətin müqəddiməsi olduğuna görə, behişti, həm özünü həm də mütəal məhbubu yad etmiş bir şəxs ikilikdən keçərək üçlüyə giriftar olmaqla kəsrətdə boğulmağını, yaxud vəhdətdən geri çəkilməyini subut etmişdir.*

**Qeyd** 2: *Göl, ağac, su və digər dünyəvi nemətlər ilə behişt təsəvvürü mümkündür, lakin mütəal məbud ərəfəsini, dünyəvi və əqli müqayisələrə sığışdırmaq mütləq imkansızdır.*

**Qeyd** 3: *"... insan bədən ilə ruhun birləşməsindən törənmiş bir vücud olduğuna görə, bir tərəfdən onun ruhuna bədən ilə ortaq bir behişt, yaxud cəhənnəm var, başqa tərəfdənsə bədənsiz müstəqil ruhun "ruhani behişt" ünvanlı özəl bir məqamı vardır, ... demək ürək içindən məlaikə aləminə bir baca var ki xatırladığımız mənaları müşahidə etmək o bacadan mümkün olur.*[1]

Beyt 3: **Üzünə durmasın ayinə urub lafi-səfa,**
**Nə rəva məh qıla xurşidi-dirəxşan ilə bəhs.**

Sözlük: Ayinə = ayna; məh = ay; xurşidi-dirəxşan = parlaq günəş

Nişanə 1: "Ayinə" – bu beytdə dünyəvi səfaları əks etdirmiş mərtəbədən nişanədir.

Nişanə 2: "Səfa" – bu beytdə dünyəvi küdurətləri ürəkdən təmizləyən mərtəbədən nişanədir.

Nişanə 3: "Məh" – bu beytdə dünyəvi ayinə mərtəbəsindən nişanədir.

Nişanə 4: "Xurşidi-dirəxşan" – tovhid günəşindən[2] yaxud mütəal məhbubun gizli həqiqətindən parlayan cilalardan ibarətdir.

Anlam: Ay günəşdən nur alan kimi ayinə də səfasını mütəal canan camalından almış buna görə də, aynanın ( dünyəvi etibar sahibləri) məğrurluğu onun nadanlığını sübut edir.

Beyt 4: **Gərçi şümşaddə çox lafi-lətafət vardır,**

---

[1] Kimyayi-səadət, Məhəmməd Qəzzali, səh.79
[2] Qəzəl 1, beyt 1

**Yorulur eyləsə ol sərvi-xuraman ilə bəhs.**

Sözlük: Xuraman = nazlana – nazlana addımlamaq

Nişanə 1: "Şümşad" – bu beytdə davam etdirilmiş dünyəvi hüsnlərdən nişanədir.

Nişanə 2: "Sərvi-xuraman" - İlahi cəlaları dalbadal təzahur etdirmiş ulu canan camalından nişanədir.

Anlam: Dünyəvi hüsn nə qədər gözəl olsada bir o qədər də gözəl məbud camalına möhtacdır.

**Qeyd**: *İlahi hüsnlər cilvə edən çağda, bəşəri hüsnlər öz həqirliyindən utanıb özünü aradan qaldırmalıdır, elə buna görə* او جيت "بالظهور ظهور المكويات"[1] *buyurulmuş:*

Beyt 5: **Qılsa can ləlin ilən feyz yetirmək bəhsin,**
**Canibi-ləlini tut, ey könül, et can ilə bəhs.**

Sözlük: Canib tutmaq = tərəfdarlıq = tərəf tutmaq

Nişanə 1: "Ləl":

A – dünyəvi həyat məhvliyində yaxud " موتوا قبل ان تموتوا"[2] mərtəbəsində, yoxu var edən "rəhmani feyz" ünvanlı ilahi rəhmətdən nişanədir.

B – həzrəti-mürşüdün ilahi cilalar ilə dolu olan ürəyindən nişanədir.

Nişanə 2: "Feyz" –bu beytdə "mənəvi feyz" ünvanlı ilahi ilham ehsanına eyham edərkən dünyəvi əvəzsiz ehsandan nişanədir.

Anlam: Ey aşiq, məhbub ərəfəsində məhvlik,dünya üzərindəki həyatverici mərtəbədən çox üstündür.

Beyt 6: **Düşər od şəm dilinə bu səbəbdən ki, qılır,**
**Dil uzadıb gecələr ol məhi-taban ilə bəhs.**

Sözlük: Məh taban = parlaq ay

Nişanə 1: "Şəm" – bu beytdə dünyəvi parlaqlıqdan nişanədir.

Nişanə 2: "Məhi-taban" – kəsrət güzgüsündə təzahur etmiş vəhdət cilalarından, yaxud qara maddədə ağ nurunu əks etdirmiş mütəal məhbub cəmalından nişanədir.

Anlam: Şəm, özünü ziya və nurun maliki bilərkən məmlüklük və möhtaclığını unutduğuna görə yanıb yox olmağıyla cəzalanmışdır.

Beyt 7: **Sifəti-hüsnün edər, xəstə Füzuli, nə əcəb,**

---

[1] Qəzəl 40, beyt 5

[2] Qəzəl 7, beyt 2

**Hüsnü- göftardə gər eyləsə Həssan ilə bəhs.**

Sözlük: Sifət = vəsf etmək; göftar = söz, Həssan = islam peyğəmbərinin tanınmış şairi ibn Sabit Xəzrəci Ənsari (54 h.q), Həssan Əl-Əcəm = Xaqani Şirvaninin ləqəbi

Anlam: Ey mütəal məhbub, Füzulini Həssan ilə bərabər edən yalnız sənin lütfündür.

## Q Ə Z Ə L 49

**(1) Cahan içrə hər fitnə kim olsa hadis,**
**Ona sərvi-qəddindir, əlbəttə, bais.**

**(2) Mədarisdə təhqiqi-muyi-miyanın**
**Dəqayiqdən ortayə salmış məbahis.**

**(3) Müvəhhidlərə qılma inkar, zahid,**
**Meyi-vəhdəti sanma ümmül-xəbais.**

**(4) İki didəsiz aləmə Yusifü sən**
**Sizə yox cahan içrə imkani-salis.**

**(5) Mənə cəm olur qanda kim, var bir qəm,**
**Mənəm mülki-esq içrə Məcnunə varis.**

**(6) Töküb əşk kuyində vəslin dilər dil**
**Saçar nəf üçün danə toprağə haris.**

**(7) Üzarü ləbin vəsfin eylər Füzuli,**
**Ona həm müfəssir derəm, həm mühəddis.**

Beyt 1: **Cahan içrə hər fitnə kim olsa hadis,**
**Ona sərvi-qəddindir, əlbəttə, bais.**

Sözlük: Hadis = təzəcə tapılmış = yenicə icad olmuş

Nişanə 1: "Fitnə" – bu beytdə dünyəvi və mənəvi sıxma - boğmalar, hay - küylər, coşğunluqlar və əsirliklərdən nişanədir.

Nişanə 2: "Sərvqədd" – İlahi camaldan axan hüsn cilalarının uzantısından ibarətdir.

Anlam 1: Ey gözəl məbud, yaxud ey islam peyğəmbəri, bu maddi dünyada əql və eşqin qopardığı hay – küylər umumən sənin hüsnünlə əlaqədardır.

**Qeyd** 1: *Eşq qoparan fitnələrin mütəal məbud ilə, yaxud ulu peyğəmbərlə əlaqədar olmağı aydın və adidir.*

**Qeyd** 2: *Kamala çatmaq hər insanın təbii meyli olduğuna görə insanlar umumən kamilləşmək məqsədiylə çalışmaqdadırlar, amma onların əqli, xüsusilə mənəvi kamal tanışlığında aciz qalaraq, kamalı hərdən əks təsəvvür etməklə gümana düşüb, günaha batmağa giriftar olurlar, beləliklə yolkəsən bir oğru – başı da çapqınçılığı kamal təsəvvür edir. Buna görə də cahanda içrə baş verən fitnələr, yaxud günahlar və savablar umumən kamal arzusu, ya da kamal təsəvvürü ilə baş verərkən ilahi hüsnlə əlaqədar olurlar.*

Anlam 2: Ey mütəal məbud, yaxud ey ulu peyğəmbər, bütün vücudların varlığı sənin "rəhmani feyz" ünvanlı umumi rəhmətinə bağlıdır, beləliklə sənin rəhmətin olmasaydı, dünyada heç bir vücud olmazdı, demək, aydındır ki, vücud olmayan yerdə inkar, ixtilaf, günah və savab da olmaz, buna görə də, cahan içrə hadis olmuş fitnələr səninlə əlaqədardır.

Anlam 3: Ey mehriban məbud, yaxud ey həzrət məbudun birinci xəlifəsi, sən hər bir günahkarları cəzalandırsan daha dünyada günah və nəhayət ixtilaf qalmaz, buna görə də cahan içrə hadis olmuş fitnələr səninlə əlaqədardır.

Beyt 2: **Mədarisdə təhqiqi-muyi-miyanın**
**Dəqayiqdən ortayə salmış məbahis.**

Sözlük: Mədaris = mədrəsələr = məktəblər; muy = tük; miyan = bel; muyi miyan = incəbel; dəqayiq = dəqiqələr =incə mətləblər = çətin işlər; məbahis = bəhslər = mübahisə məclisləri

Nişanə 1: "Mədaris" – əql həqiqətşünaslığını təsdiq edən nişanədir.

Nişanə 2: "Muyi-miyan":

A – aşiqin bütün dünyəvi bağlantılarını, ailə - övlad, mənlik və mənəmlik ilgilərini qat – qat soyub-tökən mərtəbədən nişanədir, aşiq belə

bir mərtəbədə qatsız – qatqısız vücud ilə təcrid aləminə, yaxud əqldən, elmdən üstün qeyri-maddi mücərrəd mövcudlara qoşulmaq imkanına ya da "dəqiqə" ünvanlı ürfanı mərtəbəyə yüksəlməyə nail olar.[1]

**Qeyd**: *İnsanı dəqiqə məqamına yüksəltmək bütün incə sənətlərin ilk hədəfidir*

*B – mütəal məbud qarşısında bütün yaranmışları hətta salikin özünü də özünə həqir və heç göstərən nəzərdən ibarətdir.*[2]

Nişanə 3: "Dəqayiq":

A – dəqiqələr deməkdir və yuxarıda nəzərdən keçirdiyimiz qatsız vücudlardan ibarətdir.

B – incə elmi, fəlsəfi, ürfani mətləblərdən nişanədir.

Anlam:

A – Ey mütəal məbud, yaxud ey ulu peyğəmbər, incə mətləblər və gizli həqiqətlər qarşısında elm və fəldəfəni də heyrətlə çalışmağa giriftar edən yalnız sənin camal və kamalındır.

B – Ey gözəl məhbub, əql də eşq kimi səni tələb etmək hissinə giriftardır.

Beyt 3: **Müvəhhidlərə qılma inkar zahid,**
**Meyi-vəhdəti sanma ümmül-xəbais.**

Sözlük: Müvəhhid = mütəal məbudun vahidliyinə iman gətirmiş insan, ümmül xəbais = xəbis adamların anası = xəbisliklər becərən adamlar

Nişanə 1: "Müvəhhid": bu beytdə vahid məhbub qarşısında iki dünyanı həqir görüb ondan arifdən, yaxud kəsrəti boşlayıb vəhdəti xoşlayan aşiqdən ibarətdir.

Nişanə 2: "Zahid" – əql hidayətini kamil bilib eşq hidayətini inkar etmiş insandan ibarətdir.[3]

Nişanə 3: "Meyi-vəhdət" – yeganə məbuddan başqasını qeyri-müstəqil kölgə kimi həqir və fani tanıtdıran ilahi cazibələr və mənəvi qələbələrdən nişanədir.

Nişanə 4: "Ümmül xəbais" – dünyəvi qanun-qaydaları, yaxud elmi-təcrübi tanışlıqları aşiq nəzərində batil cilvələndirən meydən istiarədir.

**Qeyd**: *Lisani-qeyb Hafiz Şirazi də sufini tənqid etmiş, acı ümmül xəbaisi şirin busədən ( vüsaldan) üstün bilərək demişdir:*

---

[1] Qəzəl 12,beyt 1

[2] Fərhəngi və istilahat və təbirati-ürfani.

[3] Qəzəl 9, beyt 2

آن تلخوش که صوفی امّ الخبائسش خواند
اشهی لنا واحلی من قبله العذارا

*Hafiz qəzəllərini araşdıran şərhçilər, ümmül-xəbais istiarəsini izah etməkdə bir çox təzadlı sözlər demişlər, o cümlədən R. Zünnur Hafizin ümmül-xəbais istiarəsindən istifadə etməyini, onun petğəmbərin buyurduğu "əlxəmru ummul xəbais"*[1] *hədisindən xəbərsiz bilmişdir*.

Biz elə bir mübhəmlikləri açıb – aydınlatmaq qəsdilə dörd cildli "Ta Qafi-əndişe" kitabında bir çox faktik fəlsəfi və ürfani izahlar aparmışıq. O cümlədən haman kitabın birinci cildində Hafiz və Füzulinin qeyd etdiyi ümmül-xəbais istiarəsinin aşağıdakı icmalları vardır:

1 – Ümmül-xəbais, yaxud mey tifaq dağıdan hicran dərdinə təskinlik vermək vasitəsidir, halbuki qiblətul əlüzzar (şirin busə) vüsaldan nişanədir. Beləliklə, ümmül-xəbaisi vüsaldan, yaxud vasitəni hədəfdən üstün bilmək batildir. Buna görə də Hafiz və Füzulinin qeyd etdikləri ümmül-xəbais ifadəsi məcazi mənfi mənadan kənardır.

2 – Hafiz və Füzuli həzrət peyğmbərin hədisini inkar etməyiblər, onlar bəlkə də riyakar sufi və xəbərsiz zahidin sözünü batil bilmişlər.

3 – Həzrət peyğəmbər, üzüm suyunu ümmül-xəbais buyurmuşdur, halbuki Hafiz və Füzulinin vəsf etdiyi mey ilahi qələbələr ünvanlı həyat suyudur:

Ürək qanın şərab elə, üzüm suyun dağıt çölə
Qəsəm səba sevən telə, o nurdur, bu nardır.[2]

4 – Mövləvi dünyəvi badəni üzüm suyu, lakin mənəvi badəni "nüsrət suyu" yəni qələbə suyu bilərkən demişdir:

آن باده انگوری، مر امت عیسی را
این باده منصوری مرا امت یاسین زا
خم هاست از ان باده خم هاست از این باده
تانشکنی آن خمرا هرگز نچشی این را[3]

5 – Ariflər deyən mey və badə ümmül-xəbais olsaydı, mərhum şeyx Bəhayi, mərhum əllamə Təbatəbayi və mərhum imam Xomeyni kimi məşhur din alimlərinin və müctəhidlərin şerlərində qeyd və təkrar olmazdı.

6 – Mey və cam kimin ürfani istiarələrin tarixi, ictimai, siyasi, ədəbi və ürfani xüsusiyyətləi haqda dəlil və izahlar vardır.[4]

---

[1] Şərab bütün günahların mənşəyidir.
[2] Müəllifin bir qəzəlindən beyt
[3] Divani-Şəms, Mövləvi
[4] Ta Qafi-əndişə, cild 1,səh 43

Anlam: Ey eşq və ürfan aləmindən xəbərsiz zahid, ilahi cazibələr ilə dünyanı unutmaq və mənliyi yaddan çıxarmaq heç də xəbislik deyil, bəlkə də paklığın cövhəridir.

Beyt 4: **İki didəsiz alimə Yusifü sən**
**Sizə yox cahan içrə imkani-salis.**

Sözlük: Dide = göz; salis = üçüncü

Nişanə: "Dide" – ilahi elm ilə bütün xeyr və şər əhvaldan, həm də birinci beytdə qeyd olunmuş fitnələrdən xəbərdar olmaq nişanəsidir.

Anlam: Ey islamın ulu peyğəmbəri, sənilə həzrət Yusif peyğmbər bütün aləmə ilahi camal – kamaldan nəsib ehsan edən rəhbərsiniz.

**Qeyd** 1: *Qurani-kərim həzrət Yusifin camalını – kamalını vəsf etmişdir.*

**Qeyd** 2: *Bu beyt, "iltifat" ünvanlı ədəbi sənət ilə, xitabını mütəal məbuddan ulu peyğəmbərə tərəf döndərmişdir.*

**Qeyd** 3: *İslam peyğəmbəri "əqrəb" məqamlı ilahi xəlifə olduğuna görə, bu qəzəlin bütün beytləri mütəal məbuda xitab olduğu kimi o peyğəmbərə də xitab sayıla bilər.*

Beyt 5: **Mənə cəm olur qanda kim, var bir qəm,**
**Mənəm mülki-esq içrə Məcnunə varis.**

Nişanə 1: "Qəm":

A – Qəm bu beytdə mənəvi ətəş, həsrət və tələb atəşinin dalbadal şölələnməyindən ibarətdir.

B – bu beytdə "tələb qürbəti" ünvanlı üçüncü qürbətzədəlikdən, yaxud vəhdət mülkünə müraciət etmək arzusundan hasil olmuş həsrət və biqərarlıqdan nişanədir.[1]

Nişanə 2: "Məcnun" – cünun sözündən düzəlmiş bir kəlmə olduğuna görə, divanəliyi, yaxud əql seyrini sona çatdırarkən eşq ünvanlı mənəvi əql səmasına yüksəlməyə eyham edən nişanədir.

**Qeyd**: *İnsan əql nərdivanını pillə - pillə qalxıb axır pilləyə çatarkən, nərdivanı boşlayıb, eşq səmasına addımlamalıdır, beləliklə eşq səmasına yüksəlmiş bir insan yer hidayətçisi olan əqli boşlamaqla zahirən Məcnun və divanə nəzərə gəlir.*[2]

[1] Qəzəl 34,beyt 3
[2] Qəzəl 9, beyt 2

Anlam: Mənim vücudumu çulğalamış qəmlər mənim Məcnuna vərəsə olduğumu, yaxud eşq ünvanlı ikinci əql mərtəbəsinə yüksəlməyimi sübut edir.

Beyt 6: **Töküb əşk kuyində vəslin dilər dil**
**Saçar nəf üçün danə torpağə haris.**

Sözlük: Əşk = göz yaşı: vəsl = vəslət = vüsal: haris = əkinçi

Nişanə 1: "Əşk" – bu beytdə aşiqin "qürb" (yaxınlıq) məqamına hazırladığı sərmayədən ibarətdir.

Nişanə 2: "Vəsl" – "xətt" ünvanlı nəhayətə çatmış qürb nişanəsidir.[1]

Anlam: Ey həkim və mütəal məbud, əkinçi torpağa səpdiyi hər toxumdan bir çox toxum bəhrə aparan kimi mən isə dənə - dənə yağdırdığım göz yaşının əmək məhsuluna səndən çox ehsanlar xahiş edirəm.

Beyt 7: **Üzarü ləbin vəsfin eylər Füzuli,**
**Ona həm müfəssir derəm, həm mühəddis.**

Sözlük: Üzar = camal = surət = xətt; mühəddis = dini xəbər-rəvayət bəyan edən şəxs.

Nişanə 1: "Üzar" – zövq törətmiş təcəlla nurundan, həm də nəhayətə çatmış qürbdən nişanədir.

Nişanə 2: "Ləb" – bu beytdə mütəal məbudun, yaxud ulu peyğəmbərin yoxu var edən hikmətamiz kəlamından ibarətdir (vəhy, ilham).

Anlam: Ey mütəal məbud, yaxud ey peyğəmbər, Füzuli həm sənin hüsnlərinin müfəssiri, həm də vəhy və ilham köklü kəlamlar və hökmlərinin izahçısıdır.

---

[1] Qəzəl 48, beyt 1

## Q Ə Z Ə L 50

(1) Ey qubari-qədəmin ərşi-bərin başinə tac,
Şərəfi-zatinə ədnayi-məratib merac.

(2) Müntəha şərinə ədyani-təmamiyyi-rüsul,
Bəhrsən, sairi-ərbabi-risalət əmvac.

(3) Xazini-gənci-şəfaət səni qılmış İzəd,
Hiç kim yox ki, sana olmaya axir möhtac.

(4) Sünnətin məğfirət əsbabinə minhaci-hüsul,
Taətin məsiyət əmrazinə tədbiri-əlac.

(5) Xəlqə tədbiri-sülukin səbəbi-hüsni-məaş,
Mülkə təğyiri-təriqin əsəri sui-məzac.

(6) Qaim olmazdı nizamü nəsəqi-əsli-vücud
Verməsəydin əsəri-ədl ilə dünyayə rəvac.

(7) Şükr lillah ki, Füzulini edib daxili-feyz
Rəğbətin dayireyi-xovfdən etmiş ixrac.

Beyt 1: **Ey qubari-qədəmin ərşi-bərin başinə tac,**
**Şərəfi-zatinə ədnayi-məratib merac.**

Sözlük: Ərşi – bərin = yüksək ərş = yüksək səma;
ərş = səltənət təxti = doqquz payəli minbər

Ədna = yaxın = ən aşağı = az ; mərateb = mərtəbələr; merac = nərdivan = yüksəlmək vəsiləsi = İslam peyğəmbərinin göylərə yüksəlmək möcüzəsi.

Nişanə 1: "Ərşi-bərin" – nəhayətə çatmış yüksəklik mərtəbəsindən nişanədir.

**Qeyd**: *Ərşi bərin insanlar, xüsusilə hacılar yer üzündə Allah evini hörmətlə yad etdiyi kimi, mələklər də yeddinci göydə alqış – ehtiram göstərən "ərş", yaxud "fələkül-əflak" ünvanlı mərtəbədən ibarətdir.*[1] *Qurani-Kərim "Nəml" surəsinin 23, 38, 41 və 42 ci ayələrində ərşi, səltənət taxtı kim mənalandırmış, həm də "Hud" surəsinin 8-ci ayəsində və "taha" surəsində 4 – cü ayədə onu (ərşi) su üzünə qoyulmuş ilahi mərtəbə kimi bəyan etmişdir.*

Nişanə 2: "Merac" – Meracın zahir yönü göylərə yüksəlmiş olsa da, gizli yönü əqlə - idraka sığmaz bir mərtəbədən ibarətdir, deməк merac peyğəmbərin qarşısında səmaları həqir və alçaq göstərən möcüzədən nişanədir, elə buna görə də Füzuli meracı peyğəmbərin özəl məqamı ilə müqayisədə ədnayi-məratib yəni ən aşağı bir mərtəbə bilmişdir.[2]

Anlam 1: Ey islamın ulu peyğəmbəri, sənin acifanının torpağı yeddinci göydə səltənət etmək tacından qiymətlidir.

**Qeyd** 1: *İnsan özünü göylərə qaldırsa da, həzrət peyğəmbərdən bir ləhzə qəflət etməklə başını aşağı dikməlidir.*

**Qeyd** 2: *Peyğəmbər qapısında qul olmaq yeddinci göyə səltənət etməkdən üstündür.*

Anlam 2: Ey islamın ulu peyğəmbəri, sən merac möcüzəsilə əqlə - idraka sığmaz dərəcədə mütəal məbuda yaxınlaşdın.

Beyt 2: **Müntəha şərinə ədyani-təmamiyyi-rüsul,**
**Bəhrsən, sairi-ərbabi-risalət əmvac.**

Sözlük: Müntəhi = axıra çatmış = nəhayətə yetişmiş = qurtarmış; ədyan = dinlər; təmami = təmamən; rüsul = rəsullar = peyğəmbərlər; ərbabi risalət = din gətirənlər = rəsullar, əmvac = mövclər = dalğalar

---

[1] Fərhəngi Moin, Əlam

[2] Qəzəl 5, beyt 4

Anlam: Ey islamın ulu peyğəmbəri, səni bir ucu – bucağı olmayan dəniz kimi bəşəri təsəvvürə sığışdırmaq olarsa, başqa peyğəmbərlər o dənizdən bir dalğadırlar. Bunun üçün də sən peyğəmbərlərin dininə son qoydun.

Beyt 3: **Xazini-gənci-şəfaət səni qılmış İzəd,**
**Hiç kim yox ki, sana olmaya axir möhtac.**

Sözlük: Xazin = xəzinə sahibi; gənc = xəzinə = özəl örtükdə gizlənilmiş qiymətli qızıl – gümüş = sikkə = mal – dövlət = hədəf = məhbub; şəfaət = bağışlatdırmaq = ilahi vəsatət; İzəd = tanrı = yaradıcı məbud.

Nişanə 1: "Xazin" – ulu peyğəmbərin ilahi feyz xəzanəsi olmuş mövcudundan ibarətdir.

Nişanə 2: "Gənci şəfaət" – ilahi etibarlı bəşəri mövcuddan nişanədir.

Anlam: Ey islamın ulu peyğəmbəri, bütün insanlar sənin həm hidayətinə həm də şəfaətinə möhtacdırlar.

**Qeyd**1: *Xətakar insanlar, bağışlanmaq məqsədilə həm də behişt həvəsiylə peyğəmbərin şəfaətinə möhtacdırlar.*

**Qeyd** 2: *Behişt mərtəbələrinə nailyyət tapmış möminlər isə mütəal məhbubun vüsalına çatmaq ilgiləri ilə peyğəmbərin şəfaətinə möhtacdırlar.*

Beyt 4: **Sünnətin məğfirət əsbabinə minhaci-hüsul,**
**Taətin məsiyət əmrazinə tədbiri-əlac.**

Sözlük: Sünnət = yol = adət = təriqət = əxlaq = məsumların, yaxud peyğəmbər və imamların əməlləri və sözləri; məğfirət = günahı bağışlamaq; əsbab = səbəblər = vəsilələr; minhac = aydın yol = açıq yol; hüsul = hasil olmaq = yetişmək; minhaci – hüsul = hədəfə çatdıran yol; taət = itaət, əmraz = mərəzlər = xəstəliklər.

Anlam: Ey islamın ulu peyğəmbəri, sən nişan verdiyin açıq yolda addımlamaq, bağışlanmağın əsas səbəbi olduğu kimi, buyurduğun sözlərə əməl etmək isə günahların məhvlik səbəbidir.

**Qeyd**: *İkinci misra iki mənanı təlqin etmək istəyir:*

*A – İslam peyğəmbərinin hökmünə itaət etmək günahların məhvliyinə baisdir.*

*B – Mütəal məbud peyğəmbərin özəl itaət – ibadətinə görə bir çox xətakarı bağışlayar.*

Beyt 5: **Xəlqə təqlidi-sülukin səbəbi-hüsni-məaş,**
**Mülkə təğyiri-təriqin əsəri sui-məzac.**

Sözlük: Xəlq = xaliq; süluk = rəftar; sui-məzac = təbiət bulaşmağı

Anlam: Ey ulu peyğəmbər, sən nişan verdiyin yolda addımlamaq, yaxud sənin rəftarını təqlid etmək yaşayışı gözəlləndirən amil kimi, buyurduğun yolu çaşmaqsa yaşayışın təbiətini dəyişməklə xətakarlığa və aqibətsizliyə bais olar.

Beyt 6: **Qaim olmazdı nizamü nəsəqi-əsli-vücud**
**Verməsəydin əsəri-ədl ilə dünyayə rəvac.**

Sözlük: Qayim = sabit = möhkəm; nəsəq = vahid bir nizam möhkəmliyi = nəzm = tərtib; ədl = ədalət.

Anlam: Ey islamın ulu peyğəmbəri, sən ədalətlə dünyanı rövnəqləndirməsəydin bütün dünyanın, demək bütün vücudların tifağı dağılardı.

Beyt 7: **Şükr lillah ki , Füzulini edib daxili-feyz**
**Rəğbətin dayireyi-xovfdən etmiş ixrac.**

Nişanə: "Feyz" – bu beytdə ürək işıqlandıran ilhamlara da eyham edir.

Anlam: Ey ulu peyğəmbər, Allaha şükr ki, sənin eşqin ilə maraqlanmaq Füzulini ilahi ehsan - ilhamdan bəhrələndirərkən, onu dünyəvi əngəllər qınağından da xilas etmişdir.

## Q Ə Z Ə L 51

**(1) Can çıxar təndən könül zikri-ləbi-yar eyləgəc,**
**Tən bulur can yenlədən ol ləfzi təkrar eyləgəc.**

**(2) Qılma ey əfğan, gözün bidar, məsti-xab ikən,**
**Olmaya bir fitnə peyda ola, bidar eyləgəc.**

**(3) Söhbətimdən ar edib, ey gül, məni tərk etmə kim,**
**Gül olur əfsürdə tərki-söhbəti-xar eyləgəc.**

**(4) Varımı fikri-dəhanınla yox etdim, kim qəza**
**Böylə əmr etmiş mana, yoxdan məni var eyləgəc.**

**(5) Ərzi-ruxsar et bu gün, ey məh, kim olsun göydə gün**
**Öylə kim əncüm olur, gün ərzi-ruxsar eyləgəc.**

**(6) Hər zəban bir tiğdir guya Züleyxa qətlinə,**
**Yusifi almaqda əhli-eşq bazar eyləgəc.**

**(7) Naleyi-zarım, Füzuli,xoş gəlir ol gülrüxə,**
**Açılır gül könlü bülbül naleyi-zar eyləgəc.**

Beyt 1: **Can çıxar təndən könül zikri-ləbi-yar eyləgəc,**
**Tən bulur can yenlədən ol ləfzi təkrar eyləgəc.**

**Qeyd**: Bu qəzəl təmamilə mütəal məbuda, yaxud həzrəti-mürşüdə, yaxud bəşəri camalda ilahi hüsnü əks etdirmiş dilbərə xitabdır. Nişanə 1: "Zikr":

A – Müşahidə cilaları ilə mənliyi yaddan çıxaran mərtəbədən nişanədir.

B – mütəal məhbub camalını aşiq ürəyində bərqərar etmiş haldan ibarətdir.

Nişanə 2: "Ləb" – yoxu var edən "rəhmani feyz" nişanəsidir.

Nişanə 3: "Zikri-ləb" – mütəal məbudun batini həyat bağışlayan sifətinə məğlub olmaqdan nişanədir.

Anlam: Mütəal məbudun can bağışlayan adını zikr etməyklə daim ölüb-dirilirəm (zahirim ölür, batinim dirilir).

Beyt 2: **Qılma ey əfğan, gözün bidar, məsti-xab ikən,**
**Olmaya bir fitnə peyda ola, bidar eyləgəc.**

Sözlük: Əfğan = fəğan = nalə; bidar = oyaq; xab = yuxu.

Nişanə 1: "Əfğan" – bu beytdə aşiqin ilahi cazibələri əlavə istəmək qəsdilə ürək naləsindən, yaxud cazibələrə qənaətbəxş olmayıb dönə - dönə şühud tələb etmiş əhval – ruhiyyəsindən ibarətdir.

Nişanə 2: "Məsti - xab" – yuxuya dalmış göz gizli mənşəli ilahi hikmətamiz cazibələrdən nişanədir.

Nişanə 3: "Bidar göz" – müşahidə məhrumluğunda aşiqi qəbzlərə giriftar edən ilahi sifətdən nişanədir.

Nişanə 4: "Fitnə" – bu beytdə sınanmaq müşküllərindən nişanədir. Anlam: Ey aşiq, əlavə cazibələr tələb etməklə özünü çətin sınaqlara salma.

Beyt 3: **Söhbətimdən ar edib, ey gül, məni tərk etmə kim,**
**Gül olur əfsürdə tərki-söhbəti-xar eyləgəc.**

Sözlük: Söhbət = həmdəmlik = oturuşmaq; əfsurdə = rövnəqdən düşmüş = qurumuş = solğun.

Anlam: Ey gözəl məhbub, hüsn təbliğçisi olan aşiqi tərk etməklə məşuq bazarının rövnəqdən düşməsini rəva bilmə.

**Qeyd**: *Beyt mütəal məbuda, yaxud həzrəti-mürşüdə xitab olmuş halda "camali-vilayət" mərtəbəsinə*[1]*, ya da "şəth" mərhələsinə*[1] *mərbut*

[1] Qəzəl 21, beyt 3

*olur.*

Beyt 4: **Varımı fikri-dəhanınla yox etdim, kim qəza**
**Böylə əmr etmiş mana, yoxdan məni var eyləgəc.**

Sözlük: Dəhan = ağız.

Nişanə 1: "Var" – zahiri həyat və dünyəvi maraqdan ibarətdir.

Nişanə 2: "Dəhan" – ilahi işarə-intibahdan, yaxud qəlbi dirçəldən ilham – ehsandan ibarətdir.

**Qeyd**: *Bəşəri camalda əks etdirilmiş ilahi hüsndən intibah tapmaqsa dəhan mərtəbəsilə əlaqədardır.*

Nişanə 3: "Qəza" – "Ələst" aləmində bağlanmış əhdlərdən[2], yaxud eşq mülkünün özəl qanunlarından ibarətdir.

Anlam: Ey gözəl dilbər, fəlsəfi əzdad baxımı demişkən[3] hər şeyin törənməsi öz əksinə bağlı olduğu kimi, mənim də həqiqi həyatım sənin can alıcı işarələrinə bağlıdır.

Beyt 5: **Ərzi-rüxsar et bu gün, ey məh, kim olsun göydə gün**
**Öylə kim əncüm olur, gün ərzi-ruxsar eyləgəc.**

Sözlük: Ərz = nişan vermək = aşkar etmək; ruxsar = camal = surət; məh = mah = ay; əncüm = ulduzlar .

Nişanə 1: "Ruxsar" – ürəyi işıqlandırıb, iç aləmi nurani edən ilahi camal təcəllilərindən, yaxud mürşüd təlimatından nişanədir.

Nişanə 2: "Məh" – qara maddədə təzahür etdirilmiş Allah – təala nurundan, yaxud təbiət də həqiqəti nişan verən rəhmani feyzdən ibarətdir.

Nişanə 3: "Gün" – dünyəvi yüksəkliklərdən nişanədir.

Anlam: Dünya səmasında günəşin çıxması ilə ulduzlar itıb – batan kimi, mənəvi cəlalar qarşısında da günəş özü həqirlik həyasından itib – batmalıdır.

**Qeyd**: *Beyt dünyəvi yüksəkliklərə məğrur olmağı nadanlıq əlaməti bilərkən, məcazi etibar – iqtidarların həqirliyini və nəhayət insanın məmlüklüyünü onun yadına salmaq qəsdilə Füzulinin* "او جيت بالظهور، ظهور المكوينات" *dediyini təkrar etmişdir*[4] .

Beyt 6: **Hər zəban bir tiğdir guya Züleyxa qətlinə,**
**Yusifi almaqda əhli-eşq bazar eyləgəc.**

---

[1] Qəzəl 11, beyt 1
[2] Qəzəl 19, beyt 4
[3] Qəzəl 3, beyt 2
[4] Qəzəl 40, beyt 5

Anlam: Ey gözəl məbud, Yusifə müştəri çıxmağın, Züleyxa qətlinə qol çəkməyə bərabər olduğu kimi rəqibləri görməksə mənim qətlim ilə bərabərdir.

**Qeyd**: *"Hal qürbətini", yaxud üçüncü qürbəti dərk etmiş bir aşiq*[1] *başqa aşiqləri hətta mütəal məhbub ərəfəsində keşikçi olan mələkləri vəhdət mərkəzinə mane törətmiş rəqiblərin olduğunu düşünmüşdür.*

Beyt 7: **Naleyi-zarım, Füzuli,xoş gəlir ol gülrüxə,**
**Açılır gül könlü bülbül naleyi-zar eyləgəc.**

Sözlük: Gülrux = gül üzlü.

Nişanə 1: "Naleyi-zar" – mənəvi ilgilər ilə aşiq qəlbindən baş qaldırmış özəl münacat ünvanlı hay – həşirdən ibarətdir.

**Qeyd**: *Nalə, yaxud ürək münacatı arifin həmişəlik qisməti olduğuna görə, vüsal mərtəbəsində də vardır, qət olmazdır, çünki aşiq məşuqun hüzurunda öz həqirliyini aydın düşünərkən, heç bir qulluğu məşuqa layiq görməyib, xidmətçilik acizliyindən, beləliklə mümkünsüz vəzifə daşımaqdan nalə etməlidir.*

Lisanül – qeyb Hafiz Şirazi də vəzifə daşımaq acizliyini gül vüsalına nail olmuş bülbülün nalələri ilə təsdiq edərkən buyurmuşdur:

بلبلی برگ گلی خوش رنگ در منقار داشت     و ندر آن برگ و نوا خوش ناله های زار داشت
گفتمش در عین وصل این ناله و فریاد چیست     گفت ما را جلوه معشوقه در این کار داشت [2]

Sədi Şirazi isə məşuq ərəfəsində candan-başdan keçməyi ən həqir xidmətkarlıq bilərkən vüsal qəmini hicran qəmindən çətin bilib – buyurmuşdur:

من چه در پای تو ریزم که پسند تو بود     سروجان را نتوان گفت که مقداری هست

Nişanə 2: "Gülrux" – şühud nurunda ürəyə bəst bağışlayan mütəal məhbub camalından nişanədir.

Nişanə 3: "Açılır gül könlü": Gül könlü açılmaq, mütəal məbud razılığını təbii təmsil ilə bəşəriləşdirib – başa salan nişanədir.

Anlam: Ey Füzuli, bülbülün nalələri gülə xoş gələn kimi sənin də nalələrin, yaxud özəl münacatın mütəal məbudun razılıq vasitəsidir.

---

[1] Qəzəl 34, beyt 3
[2] Ta Qafi-əndişe, cild 1, səh 180

## Q Ə Z Ə L 52

(1) Ey könül, yarı istə, candan keç,
Səri-kuyin gözət, cəhandan keç.

(2) Ya təmə kəs həyat zövqindən,
Ya ləbi-ləli-dilsitandan keç.

(3) Mülki-təcriddir fərağət evi,
Tərki-mal eylə, xanimandan keç!

(4) Laməkan seyrinin əzimətin et,
Bu xərab olacaq məkandan keç!

(5) Etibar etmə mülki-dünyayə,
Etibari-ülivvi-şandan keç!

(6) Əhli-dünyanın olmaz axirəti,
Gər bunu istər isən, ondan keç!

(7) Məskənin bəzmgahi-vəhdətdir,
Ey Füzuli, bu xakdandan keç.

Beyt 1: **Ey könül, yarı istə, candan keç,**
**Səri-kuyin gözət, cəhandan keç.**

Nişanə 1: "Könül" – mənəvi məzələrdən dad alan batini özəl bir qüvvə nişanəsidir.

Nişanə 2: "Can" – dünyəvi həyatdan nişanədir.

Nişanə 3: "Səri – kuy" – mütəal məbudun hürriyyətpərvər ərəfəsində fiziki iradə - ixtiyarı aşiqin qəlbindən qoparmaqla onu dünyəvi bağlantılardan xilas edən"bəndəlik" məqamından nişanədir.

Anlam: Ey aşiq, dünyəvi ilgi - əlaqələri unutmaqla fiziki cismdən, yaxud mənlik qəfəsindən xilas olaraq, mücərrəd vücudunu canan ərəfəsinə çatdırıb, özünü qeyri fiziki ölməz həyata nail etməlisən.

Beyt 2: **Ya təmə kəs həyat zövqindən,**
**Ya ləbi-ləli-dilsitandan keç.**

Sözlük: Dilsitan = dilbər = məşuq = gözəl = dilrüba.

Nişanə: "Ləbi – ləl" – A – ilahi ilham – ehsandan nişanədir.

B – yoxu var edən "rəhmani feyz"dən nişanədir.

Anlam: Ey aşiq, ilahi səmaya yüksəlmək istəsən bəşəri ilgiləri qurban etməlisən.

**Qeyd** 1: *"Əzdad" baxımı demişkən*[1] *çöl həyatını silib atmayan bir şəxsin iç həyatından xəbərsiz qalmağı təbii bir dərddir.*

**Qeyd** 2: *"Ney" mərtəbəsi*[2]*, izah olunduğu kimi, maddi varlıqdan boşalmış bir vücud özünü mənəvi həyat ilə dolmağa hazırlamışdır.*

**Qeyd** 3: *"Müamilə" ünvanlı alqı – satqı qanunu sübut etmişkən can, yaxud cismi həyat həm də dünyəvi etibar – iqtidar mənəvi həyat hasil etdiyinə görə küllü miqdar sərmayədan ibarətdir.*[3]

Beyt 3: **Mülki-təcriddir fərağət evi,**
**Tərki-mal eylə, xanimandan keç!**

Nişanə 1: "Təcrid" – iç vücudu da çöl vücud ilə vahid paraleldə üryan edərkən mücərrədlik məqamına nail olmaq nişanəsidir.

**Qeyd** 1: *Çöl vücud üryanlığı dünyəvi istəkləri qat-qat soyub –atmaqdan ibarətdir.*[4]

**Qeyd** 2: *İç vücud üryanlığı dünyanı muzdsuz-mükafatsız, yaxud əvəz-bədəlsiz tərk etməkdən ibarətdir.*

---

[1] Qəzəl 3 beyt 2
[2] Qəzəl 1, beyt 2
[3] Qəzəl 3, beyt 3
[4] Qəzəl 12, beyt 1

**Qeyd** 3: *Mütəal məbud ilgisindən başqa ilgiləri tamamilə qəlbdən – başdan boşaltmaq ən əla təcrid mərtəbəsidir, elə buna görə də şərif ayə Həzrəti-Musaya " "فاخلع نعلیک buyurulmaqla məşuq ilə aşiq arasında hər cür fasiləni ayaqqabı (nəleyn) kimi kənara qoymağı eyham etmiş.*[1]

**Qeyd** 4: *Təcrid – "xətt" ünvanlı*[2] *nəhayətə çatmış ilahi qürb müqəddiməsidir.*

Nişanə 2: "Fərağət" – dünyəvi əngəllər məhviliyində ürəyin yerinə gəlməsindən nişanədir.

Nişanə 3: "Xaniman" – Övlad – ailə məhəbbəti kimi iç vücuda kök salmış dünyəvi ilgilərdən ibarətdir.

Anlam: Ey aşiq, özünü mücərrədlik məqamına hazırlamaqla iç aləmə kök salmış dünyəvi xətərnak ilgiləri məğlub etməlisən.

Beyt 4: **Laməkan seyrinin əzimətin et,**
**Bu xərab olacaq məkandan keç!**

Sözlük: Laməkan = qeyri-maddi aləm = mənəvi aləm; əzimət = səfər etmək = hərəkət etmək = köçmək =qəsd etmək

**Qeyd** 1: *Məkan kəlməsi zərrəciklərin, yaxudcüzlərin cəmləşmək və mürəkkəbləşməyini təlqin edən "Kövn" ünvanlı fəlsəfi termindən ibarətdir. Beləliklə, mürəkkəb bir şeyin zərrə-zərrə parçalanıb aradan getməyi isə "fəsad" ünvanlı İkinci fəlsəfi termin ilə sıx bağlıdır, buna görə də "kövn"dən düzəlmiş məkan, yaxud maddi dünya daima dövr etməkdədir və fasidlikdə heç bir etibara malik ola biməz.*

Nişanə 1: "Seyr" – bu beytdə aşiqi kəsrət mənzillərini sovuşdurmaqla onu vəhdət mərkəzinə qaytaran "üruci-seyr" adlı mərtəbədən nişanədir.

Anlam: Ey aşiq, fəsada uğramaq maddi dünyanın təbii qisməti olduğuna görə fasidlik məthələsindən sovuşmaq, yaxud dünyanı unutmaq laməkan ünvanlı əbədiyyətə qoşulmağın əsas şərtidir. Beləliklə, mənəvi seyrə mail olmuş bir aşiq dünyəvi bağlantıları qırıb – tökməlidir.

Beyt 5: **Etibar etmə mülki-dünyayə,**
**Etibari-ülivvi-şandan keç!**

Sözlük: Ülüvv = qələbə etmək = yüksəltmək; şan = şöhrət, ülüvvi-şan = yüksək şan-şöhrətli.

---

[1] انی ربکَ فاخلع نعلیک انّکَ بالواد المقدس طویً: "Ey Musa, mən sənin Rəbbinəm. Ayyaqqabını çıxart ki,artıq müqəddəs Tuva torpağındasan". (Quran, Taha surəsi, ayə 12)

[2] Mütləqin, müqəyyəddə seyr etmək, dünyəvi seyr, həm də üruci-seyr, seyrin müxtəlif çeşidləridir.

Anlam: Ötən beytləri davam etdirmək məqsədilə buyurur: – Ey insan, dünyəvi dikəlmələrin "kövn" və "fəsad" bağlılığında zavala məruz qalacağı qəti olduğuna görə onlarla məşğul olmaq özünü mənəvi yüksəklikdən məhrum etməkdir.

**Beyt 6:** **Əhli-dünyanın olmaz axirəti,**
**Gər bunu istər isən, ondan keç!**

Anlam: Özünü dünya ilgilərinə məşğul etmişlər axirət ilgilərindən məhrumdurlar.

**Qeyd**: *Dünyəvi etibarlar, axirət mərtəbələrini qazanmağa sərmayədir. Demək xərc çəkmək alqı-satqının əsas şərti olduğuna görə dünya etibarlarını xərc etməyən insanın mənəvi qazanc əldə etməsi mümkünsüzdür.*

Beyt 7: **Məskənin bəzmgahi- vəhdətdir,**
**Ey Füzuli, bu xakdandan keç.**

Sözlük: Bəzmgah = ziyafət məclisi = sərxoşluq məclisi = əncümən = xeymə; xakdan = zibillik ( dünyadan kinayə)

Nişanə: "Vəhdət" - A – bu beytdə hamı ilə vahid eşq, vahid hədəf, vahid həyatla yaşamaq imkanı ehsan etmiş ixtilafsız, əzdadsız və əngəlsiz ülüvvi aləmdən nişanədir.

B – mütəal məbudun ərəfəsində yaşamaqdan nişanədir.

P – özünü ucsuz – bucaqsız ilahi dəniz dalğası düşünən bir insanın həmin dənizdə batıb – boğulmasından nişanədir. Füzuli bu mənanı başa salmaq qəsdilə buyurmuşdur:

**"Zəhi zatın nəhanü ol nəhandan masəva peyda,**
**Bihari sününə əmvac peyda, qər napeyda."**

**Qeyd** 1: *Vəhdət qoşalıq və neçəlik ilə müxalif olduğuna görə neçə bəhr mənasını təlqin edən "bihar" kəlməsi bu beytdə münasib nəzərə gəlməyir.*

**Qeyd** 2: *Əmvac mütləq və vahid vücudun təcəllilləri olduğuna görə "bəhar" kəlməsi ilə uygun deyildir.*

**Qeyd** 3: *Bəhar termini "xətt" ünvanlı mərtəbədə dediyimiz həyat bağışlayan vahid mənşə olduğuna görə uygun nəzərə gəlir.[1]*

Anlam: Ey Füzuli, bu maddi dünyaya süqut etmədən əvvəl, ülüvvi-təcrid aləmində mənəvi yaşayışı təcrübə etməyinə görə bu zavala məruz

---

[1] Qəzəl 48, beyt 1

qalmış mürəkkəblik aləmini boşlayıb, əvvəl-axır ölməz aləmə müraciət etməlisən.

**Qeyd**: *Məşhur ariflər və şairlər xatırladığımız ülüvi-aləmi, yaxud insanın mənəvi sabiqəsini onun yadına salmaq qəsdilə cürbəcür ürək silkələyən dərin mənalı sözlər demişlər, o cümlədən Hafiz Şirazi buyurmuşdur:*

من ملک بودم فردوس برین جایم بود        آدم آورد درین خراب آبادم

## Q Ə Z Ə L 53

(1) Könlüm açılır zülfi-pərişanını görgəc,
Nitqim tutulur qönçeyi-xəndanını görgəc.

(2) Baxdıqca sənə qan saçılır didələrimdən,
Bağrım dəlinir navəki-müjganını görgəc.

(3) Rənalıq ilə qaməti-şümşadı qılan yad,
Olmazmı xəcil sərvi-xuramanını görgəc.

(4) Çox eşqə həvəs edəni gördüm ki, həvasın
Tərk etdi, sənin aşiqi-nalanını görgəc.

(5) Kafər ki, degil mötərifi-nari-cəhənnəm,
İmanə gələr atəşi-hicranını görgəc.

(6) Naziklik ilə qönçeyi-xəndanı edən yad,
Etməzmi həya ləli-dürəfşanını görgəc.

(7) Sən hali-dilin söyləməsən nola, Füzuli,
El fəhm qılır çaki-giribanını görgəc.

Beyt 1: **Könlüm açılır zülfi-pərişanını görgəc,**
**Nitqim tutulur qönçeyi-xəndanını görgəc**

Nişanə 1: "Könül"– bu beytdə bir mələk vasitəsilə, ya da bilavasitə özü mənəvi nailiyyət tapmış ürəkdən nişanədir.

**Qeyd**: *Könül açan nailiyyət elmə, fikrə dəxli olmaz ilahi bir sirrdən ibarətdir.*

Nişanə 2: "Zülf" – bu beytdə vəhdətin kəsrətdə təzahur etməsindən, yaxud maddi vücudlarda əks etdirilmiş mənəvi hüsnlərdən nişanədir. Nişanə 3: "Pərişan" – bu beytdə "təfriqə" ünvanlı ürfani bir şəraiti, "cəm" adlı başqa bir mənəvi şərait ilə birləşdirməkdən nişanədir.

**Qeyd** 1: *Təfriqə, yaranmış insanın fərqini yaradıcı məbud ilə müqayisə edərkən onu bəndəlik məqamına təhrik edən mərhələdən nişanədir.*

**Qeyd** *2: Özünü dini istedad maliki bilmiş bir ibadətçi, mənfi təfriqə mərhələsinə giriftar olmuşdur.*

**Qeyd** 3: *Bütün ibadətlərini, ilahi ehsana bağlı bilmiş insan ürfani "cəm" məqamında nailiyyət tapmışdır.*

**Qeyd** 4: *Həm xeyr əməllərindən həm də özündən xəbərsiz, yaxud maddi varlıq həbsindən xilas olmuş bir insan "cəmül cəm" ünvanlı ürfani yüksək bir məqama nail olmuşdur.*

**Qeyd** 5: *Kəsrəti vəhdət güzgüsü bilmək təfriqəni cəmilə vahidləşdirib mənfi mərhələni müsbət etməkdən nişanədir.*

Nişanə 4: "Nitqim tutulur" – əqli, fikri aciz və batil edən "heyrət" ünvanlı özəl mərtəbədən nişanədir.

**Qeyd** 1: *Əql və fikir, müxtəlif bəlalar və təhlükələr önündə insanı qoruyub, həm də onu ictimai sərkilər yaradan səciyyələrdən mühafizə etdiyinə görə, qəlbə daxil olmuşdur. Məcazi, yaxud mənəvi eşqin birinci işi əqli – fikri quru bir ağac kimi fəaliyyətsiz etməkdən ibarətdir.*

**Qeyd** 2: *Əqli – idrakı qurudan qüvvə "heyrət" ünvanlı ürfani mərtəbədə aparılmış ucsuz – bucaqsız izahlarla yanaşı, müasir fəlsəfi ölçülərdə isə yeni mənalar, həm də ətraflı məlumatlar verməklə, dərin hissli mütəfəkkirlər məktəbində yüksək bir mövqe tutmuşdur. Beləliklə, "dini dil necəliyi həm də bu dilin vaqeələr ilə nisbəti, bir də dini dil müddəalarının necə imtahan olması dini fəlsəfədə yeni məsələlər və təzə sualllar yaratmışdır ki, bu sualların bir çoxu qədim "kəlam" elmində xüsusi bir mənada qeyd olunmuşdur, lakin müasir əsrdə belə sualların qeyd olunma səbəbi və onlara cavab söyləmək tərzi də bildirilmişdir. Müasir dünyada, dərin araşdırma, tənqid fəlsəfəsi və "mərifətşünaslıq", yaxud "tanınmışları yenidən tanımaq" məktəbləri yaranan vaxtdan*

*etibarən insanın dərk və düşünüş hüdudu, ciddi mübahisələrə girişərək, zaman məsafəsində elə inkişaf etmişdir ki, filosoflar insanın anlam və idrakından sual etməyi onun nitq və bəyanı suala tutmaqla əvəz etmişlər. Beləliklə, düşüncə ilə bağlı olan suallar dil, yaxud nitq ilə əlaqədar olaraq, "insan nəyi düşünür, nəyi düşünmür" yerinə, "insan nə deyə bilir, nə deyə bilmir" sualını ortaya qoymuşlar, demək zehndən sual etmək, yaxud "Kant"məsələsi, dildən sual etmək, yaxud "Vigtinştayn" məsələsi ilə əvəz olmuşdur. Beləliklə, din və mərifət tanışlığı iki dəstə dərin dini sual yaratmaqla dinşünasları fikirləşməyə və cavab hazırlamağa dəvət etmişlər.*[1]"

**Qeyd** 3: *Biz yuxarıda xatırladığımız nəzəriyyənin dərin, yaxud dayaz olmaq bəhsinə daxil olmağı bu şərhə münasib görməyib, yalnız bunu demək istəyirik ki, dil və nitq əql və fikir ilə, əql və fikir isə fəlsəfə ilə bağlı olduqlarına görə eşqə biganə və bir çox yol müxalifdir, başqa yollar bir-birlərinə bunun üçün də nitqin tutulması fiziki və fəlsəfi qüvvələrin acizliyini eyham etmək ilə, Mövləvi demişkən, suyun, torpağın dilini düşünməyib zikrini eşitməyən əql və fəlsəfə əhlini məlamət etmək istəyindədir.*[2]

Nişanə 5: "Qönçeyi – xəndan" – ürək açan ilahi ilhamlardan nişanədir.

**Qeyd**: *Qönçə, nöqtə ağızdan istiarə olduğuna görə açılmaz nöqtəni, yaxud vəhdət nöqtəsini, ya da ilahi hüsnün bəyana sığmaz vəsfini təlqin etmək istəyir, elə buna görə də bu mərtəbədə Sərraf buyurmuşdur:*

*Ey dil, demə dildarə dəhanın səri-mudur,*
*Ağzın sina, kəşf etmə bu bir sirri-məgudur.*

Anlam: Ey gözəl məbud, sənin kainatda təzahür etdirilmiş camal nurun mənim qəlbimə bəst bağışlayaraq, vücudumu heyrətləndirən əql məhdudluğundan azad edir.

**Qeyd**: *Maddi vücudun özünü və imtiyazlarını, o cümlədən, ağılı – fikri unutmayan bir aşiq mənəvi məlumat idrakına nail ola bilməz.*

Beyt 2: **Baxdıqca sənə qan saçılır didələrimdən,**

---

[1] Doktor Əbdülkərim Süruş, Fərbehtər əz ideoloji, Doktor Əbdülkərim Süruş, Müəssieyi fərhəngiyi-Mehr, 1373, səh 172

[2] فلسفی منکر شود در فکر و ظن      گوبر وسررا به این دیوار زن
نطق آب و نطق خاک و نطق گل      هست محسوس حواس اهل دل
مثنوی معنوی مولوی ، دفتر 1 ، بیت 3348

**Bağrım dəlinir navəki-müjganını görgəc**

Sözlük: Didələr = gözlər; navək = uc, müjgan = kiprik

Nişanə 1: "Qan saçılmaq " – A – Qan eşq mədəniyyətində yuyucu bir maddə olduğuna görə, qan saçılmaq mənəm-mənəmliyi yumaqdan ibarətdir.

B – Qan batil etmək əlaməti olduğuna görə qan axıtmaq dünyəvi əngəl varlığı batil edən nişanədir.

**Qeyd** 1: *Qan şəhid olmağa eyham edərək, birinci beytdə qeyd olunmuş mənəvi parlamalar nailiyyətini, maddi vücud örtüyündən xilas olmaqda bilir.*

**Qeyd** 2: *Şəhid kəlməsinin bir mənası da "görən" olduğuna görə qan saçılmaq mütəal məhbub ilə görüşə eyham etmək istəyir.*

Nişanə 2: "Bağrım dəlinir": Bağrın dəlinməyi, yaxud ürək yarası şühud nailiyyətini, yaxud mənəvi görüşləri mümkün edən səbəbdən ibarətdir, elə buna görə də Mövləvi ilahi görüşü ürəkdən açılmış qapıya bənzətmişdir.[1]

Nişanə 3: "Navəki-müjgan" – aşiq bağrını yarıb onun ürək münacatını davam etdirən ilahi qəmzələrdən nişanədir.

**Qeyd**: *Ürək münacatı, yaxud nalə və fəryad şühud nailiyyətinə səbəb müqəddimədir.*

Anlam: Ey gözəl məbud, məni dəmbədəm özümdən ayırarkən sənə yaxınlaşdıran, ilahi parlamaların yaranma və yox olmasından, yaxud sənin hikmətamiz qəmzə satmağından ibarətdir.

Beyt 3: **Rənalıq ilə qaməti-şümşadı qılan yad,**
**Olmazmı xəcil sərvi-xuramanını görgəc.**

Sözlük: Xuraman = nazlana – nazlana addımlamaq

Nişanə 1: "Şümşad" – bu beytdə dünyəvi hüsnlər nailiyyətini davam etdirmiş mərhələdən nişanədir.

Nişanə 2: "Sərvi - xuraman" – mənəvi hüsnlər təzahürünü davam etdirmiş mərhələdən nişanədir.

Anlam: İlahi hüsnlərlə tanış olmuş bir insan, bəşəri hüsnlərə rəğbət göstərməkdən xəcalət çəkər.

Beyt 4: **Çox eşqə həvəs edəni gördüm ki, həvasın**
**Tərk etdi, sənin aşiqi-nalanını görgəc.**

---

[1] هرکه را باشد فتح باب      اوز هر شهری ببیند آفتاب
مثنوی معنوی مولوی، دفتر اول، بیت 1435

Sözlük: Nalan = fəryad çəkən

Anlam: Bir çox eşq ilə ürfandan dəm vuran şəxslər, mənim ətəşlər – arzular sınağında göylərə qalxmış nalələrimdən qorxuya düşüb öz iddialarından əl çəkməyə məcbur oldular.

Beyt 5: **Kafər ki, degil mötərifi-nari-cəhənnəm,**
**İmanə gələr atəşi-hicranını görgəc.**

Sözlük: Mötərif = etiraf etmiş; nar = atəş.

Nişanə 1: "İman" – A – bu beytdə həqiqət nurunu hicab arxasında dərk etməkdən nişanədir.

B – mütəal məbudun görünməz aləmdən verdiyi xəbərləri qəlb ilə təsdiq etməkdən ibarətdir.

Nişanə 2: "Atəşi-hicran" – ürəyi yaxud büsbütün iç aləmi şöləlləndirmiş ətəşlə tələb alovlarından ibarətdir.

Anlam: Ey həkimi-məhbub, cəhənnəm atəşini inkar edən kafir, əgər mənim eşq atəşində yanmağımı görsə, öz inkarından peşimançılıq çəkib, cəhənnəmə iman göstərər.

**Qeyd**: *Cəhənnəm atəşinə iqrar etmiş bir şəxsin behiştə və qiyamətə iman gətirməsi, nəhayət müsəlman olması aydın bir məsələdir, beləliklə, bu beyt mənəvi eşqin dini göndərilməsinə iyham etmək istəyir.*

Beyt 6: **Naziklik ilə qönçeyi-xəndanı edən yad,**
**Etməzmi həya ləli-dürəfşanını görgəc.**

Sözlük: ləli – dürəfşan = dürr yağdıran ləl (dodaq kinayəsi)

Nişanə 1: "Naziklik" – maddi küdurətdən, yaxud dünyəvi qatılaşmaqdan paka çıxmış təcrid şəraitli gözəllikdən nişanədir.

Nişanə 2: "Qönçeyi-xəndan" – bu beytdə mənəvi yöndəmli dünyəvi hüsndən nişanədir.

Nişanə 3: "Ləli-dürəfşan" – ilahi ölməz həyat bağışlayan ilham feyzlərindən ibarətdir.

Anlam: A – Mənəvi hüsnlər qarşısında, dünyəvi hüsnlərdən dəm vuran bir insanın həyasızlığı, yoxsa günahkarlığını bildirir.

B – Dünyəvi hüsnləri alqışlayan bir şəxs mənəvi hüsnlərdən xəbərdar olsa xəcalətdən başını ucalda bilməz.

**Qeyd** : *Dünyəvi dikəlməklər mənəvi yüksəklik qarşısında həqiranə tərzdə batil olmalıdır.*

Beyt 7: **Sən hali-dilin söyləməsən nola, Füzuli,**
**El fəhm qılır çaki-giribanını görgəc.**

Sözlük: Çaki – giriban = yxa açmaq = biqərarlıq etmək.

Nişanə 1: "Çaki - giriban" – ikinci beytdə qeyd olunmuş ürək yarasına yaxud şühud nailiyyətinə müqəddimə yaradan mərhələdən nişanədir.

Anlam: Ey Füzuli, sərkilər qorxusundan eşqi gizli saxlamağa çalışsan da özündən xəbərsizliyin onu xəlqə aşkar etməlidir.

**Qeyd**: *Atəş çöl aləmdə paka çıxaran bir maddə olduğu kimi, iç aləmdə isə yuyucu və təmizləyəndir, buna görə də alovlanmaq aşiq qəlbinin gərəkli şərti sayılmışdır, ancaq alovun yandırıcı olmasına görə onu gizli saxlamaq imkansız olduğu kimi, eşqi də ört-basdır etmək mümkünsüzdür. Elə buna görə də Sədi buyurmuşdur:*

در سوخته پنهان نتوان داشتن آتش        ما هیچ نگفتیم و حکایت بدر افتاد

## Q Ə Z Ə L 54

( 1 ) Münhərifdir, saqiya, ənduhi-dünyadən mizac.
Badə tut kim, illəti-ənduhə qəflətdir ilac.

( 2 ) Fəqr mülkün tut gər istiğnadə istərsən kəmal,
Səltənətdən keç kim, ol vadidə çoxdur ehtiyac.

( 3 ) Çəkmə təxtü tac qeydin, bisərü palıq gözət
Kim, əyağə bənddir təxtü bəladır başə tac.

( 4 ) Bir pəri zülfün tutub xalından alsan kami-dil,
Tut ki, Çin mülkini tutdun, Hinddən aldın xərac.

( 5 ) Tərkü təcrid ixtiyar et kim, diyari-eşqdə
Fəqr bazarinə əsbabi-fənadəndir rəvac.

( 6 ) Nəqşi-zayildir, ümuri-dəhrə qılma etibar,
Olsa hasil fəqrdən hüznü ğinadən ibtihac.

( 7 ) Ey Füzuli, mən məlamət mülkünün sultaniyəm,
Bərqi-ahim taci-zər, simi-sirişkim təxti-ac.

Beyt 1: **Münhərifdir, saqiya, ənduhi-dünyadən mizac.**
**Badə tut kim, illəti-ənduhə qəflətdir ilac.**

Sözlük: Münhərif = yolundan çıxan = yolun azan, ənduh = qəm = qüssə; illət = dərd = xəstəlik.

Nişanə 1: "Saqi":

A – ilahi feyz gətirmək ilə dünyadan üstün həqiqətlərin bəzisini aşkar edən həzrəti-Cəbraildən, yaxud digər ilahi vasitədən nişanədir.

B – özünü kamal zərrəsinə qaldırmış rəhbərdən, yaxud ürəyi ilahi sirrlər ilə daşqın mürşüddən nişanədir.

**Qeyd**: *Saqi hüzurundan feyz almış aşiqin ilk əlaməti özünü – özlüyünü unutmaqdan ibarətdir.*

Nişanə 2: "Ənduhe-dünya" – bu beytdə küdurətlərin mənəvi cilalar qarşısında maneə törətməsindən ibarətdir.

Nişanə 3: "Badə" – ilahi parlamalar önündə qəlbi silkələyən eşq bolluğundan ibarətdir.[1]

Anlam: Ey saqi, mütəal məhbub ərəfəsindən yaxud vəhdət aləmindən feyz gətirməklə, maddi qara dünyaya düşmək dərdini unutmağıma yardım et.

**Qeyd**: *Hafiz isə "hübut" ünvanlı süqut təhlükəsindən can qurtarmağı, yaxud vəhdət mərkəzinə, yaxud mütəal məbud ərəfəsinə sağ – salamat müraciət etməyi badə yardımına məşrut bilərkən buyurmuşdur:*

اگر نه باده غم دل زیاد ما ببرد     نهیب حادثه بنیاد ما زجا ببرد

Beyt 2: **Fəqr mülkün tut gər istiğnadə istərsən kəmal,**
**Səltənətdən keç kim, ol vadidə çoxdur ehtiyac.**

Sözlük: Fəqr = fağırlıq = yoxsulluq; istiğna = dövlətlənmək = qaliblik.

Nişanə 1: "Fəqr" – mütəal məbudu bütün varlığa hətta iradə - ixtiyara belə həqiqi malik bilməklə məmlüklüyü etiraf etməkdən ibarətdir.[2]

Nişanə 2: "İstiğna" – bu beytdə mütəal məbudun mütləq malikiyyətini idrak etmiş aşiqin dünya mal – dövlətini həqir görməsindən, həm də hökmranlar, şahlar qarşısında boyun əyməyən mərtəbəsindən nişanədir.[3]

---

[1] İmam Xomeyninin şerlər divanına bax.
[2] Qəzəl 44, beyt 4
[3] Qəzəl 30, beyt 3

**Qeyd**: *"Əzdad" bəhsində dediyimiz kimi hər şeyin varlığı onun əksinə bağlı olan kimi istiğna, yaxud dövlətlənmək məqamı isə fağırlığı, ya da məmlüklüyü etiraf ettməyə məcburdur.*

Nişanə 3: "Kəmal" – maddi küdurətlərdən paklanmış vücudun, ilahi cəlalara güzgü olmağından ibarətdir.

Nişanə 4: "Səltənət" – bu beytdə ilahi tanışlıqlara mane olmuş bəşəri etibar – iqtidardan nişanədir.

**Qeyd**: *Sultan özünü müxtəlif ölkələrə malik bilməklə, müxtəlif malikiyyətləri qorumağa möhtacdır, beləliklə sultanın nə qədər iqtidarı olsa bir o qədər də ehtiyacı vardır, demək ehtiyac dilənçiliyin ilk əlaməti olduğuna görə, sultan birinci dilənçidir, bunun üçün də Xaqani dünyəvi şahlığı dilənçilik və mənəvi dilənçiliyi şahlıq bilməklə "baş – ayaq" ünvanlı ürfanı özəl mərtəbəyə eyham etmək qəsdilə buyurmuşdur:*

پس از سی سال روشن گشت بر خاقانی این مطلب
که سلطانیست درویشی و درویشیست ساطانی

**Qeyd**: *Öz nəfsinə qələbə etmiş bir hökmran ilahi əmrlər icraçısı, yaxud mütəal məbud xəlifəsi olduğuna görə, bu beytdə təhqir olmuş nəfsiiti dünyapərəst hökmrandan, yaxud dilənçi kimi möhtac olan sultandan fərqlənir.*

Anlam: Ey aşiq, həqiqi dövlətlənmək istəsən, mənəvi mərtəbələr qarşısında əngəl törətmiş məcazi iqtidar – etibardan çəkinməlisən.

Beyt 3: **Çəkmə təxtü tac qeydin, bisərüpalıq gözət**
**Kim, əyağə bənddir təxtü bəladır başə tac.**

Sözlük: Bisərüpa = əlsiz – ayaqsız = həqir = aciz.

Nişanə 1: "Təxtü tac" – mənəvi yüksəkliklərə mane olmuş dünyəvi iqtidar – etibardan nişanədir.

Nişanə 2: "Bisərüpalıq" – öz məmlüklüyünü düşünmüş aşiq mövqeyindən ibarətdir.

Anlam: Ey aşiq:

A – dünyəvi dikəlməklər məhdudluğunda mənəvi yüksəkliklərdən məhrum olma.

B – Öz məmlüklük və həqirliyini yada salmaqla məğrurluq törədən iti nəfsə qələbə edərək özünü dünyəvi üstünlüklər möhtaclığından xilas et.

**Qeyd** 1: *Beyt aşiqə mütəal məbuddan başqasını möhtac və həqir tanımağı, ya da bəndəlik məqamını təlqin etmək istəyir.*

**Qeyd** 2: *Özünü mərifət zirvəsinə qaldırmış bir aşiq dünyaya yüksəkdən baxmaqla onun zavala məruz qalmış nemətlərini parlaq günəş qarşısında bir nursuz şam kimi həqir görüb öz nəfsinə xitab edər ki:*

شمع جویی و آفتاب بلند          روزبس روشن و تو در شب تار [1]

**Qeyd** 3: *Ürfan dünyəvi nemətləri mütləq həqir və dəyərsiz bildirmək istəməyir, bəlkə onların məhdudluğunda özünü mənəvi zavalsız mərtəbələrdən məhrum etmiş insanları gah təhqir, gah da təşviqlə ayıq salmaq istəyir.*

Beyt 4: **Bir pəri zülfün tutub xalından alsan kami-dil,**
**Tut ki, Çin mülkini tutdun, Hinddən aldın xərac.**
Sözlük: Xərac = bac.

Nişanə 1: "Pəri" – ilahi gözəl vasitələrdən, yaxud maddi dünyanı, eləcə də mənlik – mənəmliyi aşiqin yadından çıxaran bəşəri camal hüsnündən ibarətdir, elə buna görə də bəşəri pak eşqi ilahi eşq müqəddiməsi olduğunu düşünüb onu müqəddəs bilmişlər.

Nişanə 2: "Zülf" – bu beytdə "gisu" ünvanlı ilahi tələb yolundan ibarətdir.

Nişanə 3: "Xal" – bütün yaranmış insanların, yaxud kəsrətin başlanış, həm də qayıdış nöqtəsindən (vəhdət nöqtəsi) nişanədir.

**Qeyd** 1: *Vəhdət mərkəzi bir nöqtə kimi açılmaz və şərh olunmaz olduğuna görə xal nöqtəsi adlanmışdır.*

**Qeyd** 2: *Vəhdət nöqtəsi əqli – elmi, idrak qaranlığında aciz etdiyinə görə qara xala bənzədilmişdır.*

**Qeyd** 3: *Bəzi ürfani baxımlar xal nöqtəsini əks etdirilmiş ürək mənasında vermişlər. Beləliklə, xal ilgilərini əks etmiş ürəkdən, yaxud rahatlığı boşlayıb bəlaları xoşlamağı ilə sınaqlara çəkilib tərbiyə görmüş qəlbdən nişanədir.*

Nişanə 4: "Kami-dil" – dünyəvi ilgiləri ürəkdən qoparmaqla mənəvi tanışlıqlara nail olmaqdan ibarətdir.

Nişanə 5: "Çin və Hind" – ötən beytdə qeyd olunmuş təxt və tac mövqeyindən nişanədir.

**Qeyd**: *Zülf ilə çin və xal ilə hind arasındakı bənzəyiş özəl ədəbi sənət nişanəsidir, ancaq bizim bu şərhdə ədəbi incəliklər izahına imkanımız yoxdur.*

Anlam: Ötən beytləri davam etdirmək məqsədilə buyurur: Ey insan, gözəlliklərin ilahi mənşəyilə tanış olmaq sultanları hökumət etmək mərtəbəsinə qaldıran etibardan ibarətdir.

---

[1] Divani-əşari Hatif İsfəhani

Beyt 5: **Tərkü təcrid ixtiyar et kim, diyari eşqdə**
**Fəqr bazarinə əsbabi-fənadəndir rəvac.**

Sözlük: Fəqr = fağırlıq = yoxsulluq; əsbab = səbəblər = vasitələr .

Nişanə 1: "Tərk" – aşiqi vəhdət yuxusundan oyandırmaqla onu ikilik, yaxud kəsrət həbsindən xilas edərkən qəlbini vəhdət ilgisilə çaxnaşdıran ilahi cazibədən ibarətdir.[1]

Nişanə 2: "Təcrid " – dünyəvi maraqları qat – qat soyub – tökmüş, yaxud varlığını təmamilə verib əvəz istəməyən aşiq halından ibarətdir.[2]

Nişanə 3: "Fəqr " – öz məmlüklüyünü etiraf etmiş aşiqin bəndəlik məqamına yüksəlməyindən ibarətdir.

Nişanə 4: "Fəna " – bu beytdə dünyəvi ilgilərdən yaxud bəşəri sifətlərdən ayrılmaq nişanəsidir.

Anlam: Ey aşiq, "Əşhədu ənnə Muhəmmədən əbduhu və rəsuluh "deyib ulu peyğəmbərin bəndəlik məqamına şəhadət verdiyin kimi özünü o mərtəbəyə yaxınlatmaq üçün tərk və təcrid ixtiyar etməlisən.

Beyt 6: **Nəqşi-zayildir, ümuri-dəhrə qılma etibar,**
**Olsa hasil fəqrdən hüznü ğinadən ibtihac.**

Sözlük: Zail = zay = zavala məruz qalmış; ümur = əmrlər = işlər = hadisələr; dəhr = zəmanə = ruzgar; qina = varlılıq = dövlətlənmək; ibtihac = şadlıq = sevinc.

Nişanə: "Fəqr ", "hüzn", "qina " və "ibtihac " ağır məna daşıyan ürfani mərtəbələrdirlər, ancaq bu beytdə məcazi mənalar təlqin edirlər.

**Qeyd**: *"Hüzn", vəhdət mülkünün həsrətində qüssələnmək ləzzətinə də eyham edir* .

Anlam: Maddi dünya bütövlüyündə həm də təfərrüatında dəmbədəm çevrilib dəyişilən kimi, dünyəvi qüssələnməklər və şadlıqlar isə səbatsızlıqda və dəyişməkdədirlər, buna görə də beyt dünyəvi məhrumluqlar və nailiyyətlər şətaitində batini gülmək və içi qan ağlamağı faydasız bilirkən tənqid edir.

Beyt 7: **Ey Füzuli, mən məlamət mülkünün sultaniyəm,**
**Bərqi-ahim taci-zər, simi-sirişkim təxti-ac**

Sözlük: Simi-sirişk = gümüşə bənzər göz yaşı; təxti ac = fil dişindən düzəlmiş təxt.

---

[1] Fərhəngi- istilahat və təbirati-ürfani.

[2] Qəzəl 12 , beyt 1

Nişanə 1:  "Məlamət": hər insan öz ictimai varlığında bir mənsəbə çatıb mənfəət götürmək qəsdilə çalışqanlıq edir, əksinə, arif mənsəb – mənfəətdən kənara çəkilməklə dünyəvi dikəlməkdən özünü qorumaq istəyir, çünki o, məcazi məşğuliyyətləri, mənəvi nailiyyətlərdən qafil edən səbəbləri bilir Beləliklə, mənfəətdən  kənara  çəkilmək dünmyaşünas insanların zənnincə sərki və danlağa layiq bir divanəlikdir.[1]

Nişanə 2:  "Ah": Atəş su kimi paklayan bir maddə olduğuna görə, ah atəşi "nari məhəbbət" ünvanlı mərhələdə qəlbin müxtəlif qatmacalarını (dünyəvi həvəsləri) yandırıb, onu xalis və pak etməklə "Nuri-məhəbbət" adlı mərtəbədə cilalanmaq rütbəsinə nail edir.

Nişanə 3:  "Sirişk ":

A –  Sirişk, yaxud göz yaşı acizlik əlaməti olduğuna görə mütəal məbud qarşısında  öz həqirlik və məmlüklüyünü etiraf etmiş aşiqin özəl halından nişanədir.

B –  Sereşk, yuyucu bir maddə kimi mənlik – mənəmlik ləkələrini təmizləyən mərtəbədən nişanədir.

Nişanə 4:  "Simü-zər " – mənəvi ölməz etibarları başa salmaq məqsədilə dünyəviləşdirən nişanədən ibarətdir.

Anlam:  Ey Füzuli, ah və göz yaşı tükənməz bir sərmayə kimi məni dünyəvi mənsəb – mənfəətdən hacətsiz etmişdir. Beləliklə, mənə nə qədər sərkilər əlavə olursa,  bir o qədər də dünyanın həqirliyini aydın görürəm.

**Qeyd**:  *Həqirliyə, yaxud dünyaya  həsrət çəkməmək təbii əxlaq  və həqiqi səltənətdir.*

---

[1] Qəzəl 8, beyt 2

## Q Ə Z Ə L 55

( 1 ) Olur qəddim düta eşqin yolunda bir bəla görgəc
Təriq əhlinə adətdir təvazö aşina görgəc.

( 2 ) Nihani-eşqi məlum etsə aləm dudi-ahimdən,
Əcəb yox kim, gümani-gənc edər xəlq əjdaha görgəc.

( 3 ) Füzun olduqca eşqim gərm olur əşkim bu gözlərdən,
Əgərçi su bürudət kəsbini eylər həva görgəc.

( 4 ) Gözün hər ləhzə kim, canım dələr könlüm qılar əfqan,
Be eyni öylə kim, fəryad edər itlər gəda görgəc.

( 5 ) Rəvaci-nəqd nəqşi-sikkədəndir nola qədr etsə
Mənə el, cismi-üryanımda nəqşi-buriya görgəc.

( 6 ) Məni-dərvişə el həm cövr edər sən cövr qıldıqca ,
Kim eylər zülm mənin, padişahım, sən rəva görgəc.

( 7 ) Füzulini yaşir, ey zəf, məhvəşlər cəfasından
Ki, məhvəşlər qılırlar min cəfa bir mübtəla görgəc.

Beyt 1: **Olur qəddim düta eşqin yolunda bir bəla görgəc**
**Təriq əhlinə adətdir təvazö aşina görgəc.**

Sözlük: Düta = bükülmüş = ikiqat; təriq = yol = hal məzhəb = ürfan yolu.

Nişanə 1: "Duta " – hörmət göstərməkdən, həm də dünyəvi əngəl həyatı aradan qaldırmaq müqəddiməsindən nişanədir.

Nişanə 2: "Bəla " – bəndəlik məqamına hazırlaşmış aşiqi müxtəlif əzabverici bəlalarla sınamaqdan ibarətdir.[1]

Nişanə 3: "Təriq" – yuxarıda qeyd olunmuş mənanı daşımaqla bərabər, iç aləm seyrinə də eyham etmək istəyir.

Nişanə 4: "Aşina" – mənəmliyə biganə olmağı, yaxud ilahi bağlılığı təlqin edən nişanədir.

Anlam: Aşinalıq hörmətini gərəkli bilərkən eşqə bağlı bəlaları ehtiramla alqışlayıram.

**Qeyd**: *Bəla – aşiq yetkinliyinə gərəkli bir səbəb olduğuna görə hörmətlidir.*

Beyt 2: **Nihani-eşqi məlum etsə aləm dudi-ahimdən,**
**Əcəb yox kim, gümani-gənc edər xəlq əjdaha görgəc.**

Sözlük: Nihan = gizli = pünhan; dud = tüstü; gənc = xəzinə = yerin altındakı qızıl –gümüş .

Anlam: Əjdaha dünyəvi xəzinəni qoruyan kimi ahim da ürək xəzinəsi qoruyan bir nişanədir.

**Qeyd** 1: *Əjdaha ağzından atəş səpməklə xəzinəni qoruyan kimi ah da özəl atəş ilə dünyapərəst xəlqdən, həm də məcazi ilgilərdən aşiqi qorumaq istəyir.*

Beyt 3: **Füzun olduqca eşqim gərm olur əşkim bu gözlərdən,**
**Əgərçi su bürudət kəsbini eylər həva görgəc.**

Sözlük: Füzun = əlavə = artıq = çox; gərm = isti = hərarətli; əşk = göz yaşı; bürudət = sərinlik = soyuq.

Anlam: Su havadan sərinlik kəsb edir, əksinə mənim göz yaşım isə qəlbimin havasında hərarət qazanır.

**Qeyd**: *Hava həyatın əsas şərti olduğu kimi eşq də iç həyatın ilk şərtindən ibarətdir, buna görə də beyt eşq ilə havanı tənləşdirmək istəyir.*

Beyt 4: **Gözün hər ləhzə kim, canım dələr könlüm qılar əfqan,**

[1] Qəzəl 23, beyt 1

**Be eyni öylə kim, fəryad edər itlər gəda görgəc.**

Sözlük: Əfqan = fəğan = nalə = fəryad;   be eyni = eynən = eyni ilə; gəda = dilənçi.

Nişanə 1: "Göz " – bu beytdə məyusluqla əlaqədar ümidlənmək törədən özəl ilahi  cazibələr feyzindən nişanədir.

Nişanə 2: "Can " – cism candan ibarətdir. Bu beytdə isə mənəvi cana eyham edilir.

Nişanə 3: "Könül " – zahirə bağlı batindən, yaxud kamil təcrid edilməyən ürəkdən nişanədir.

Anlam: Cismdəki canımın yaralanması, həm də bəlalar tələb etmiş mənəvi canımın ətəşi könlümü dilənçi görmüş itlər kimi fəryad qopartmağa vadar edir.

**Qeyd**: Beyt fiziki can məhvliyini, həm də mənəvi can ətəşinin çətinliyini təlqin etmək istəyir.

Beyt 5: **Rəvaci-nəqd nəqşi-sikkədəndir nola qədr etsə**
**Mənə el, cismi-üryanımda nəqşi-buriya görgəc.**

Sözlük:   Burya = həsir.

Nişanə 1:  "Nəqd " – sikkələrin xalisini onların qarışığından ayırmaq mənasını daşıyan bir kəlmə olduğuna görə ikinci misrada qeyd olunmuş üryanlıq məqamını təsdiq etməkdən, yaxud təcrid məqsədilə fiziki və dünyəvi ilgiləri soyub – töküb iç həyatı xalisləşdirməkdən nişanədir.[1]

Nişanə 2:  "Rəvaci-nəqd " – özünü dünyəvi maraqlar bağlantısından xilas etmiş üryan vücuddan, yaxud mücərrədlik mərtəbəsinə hazırlaşma şəraitindən nişanədir.

Nişanə 3:  "Nəqşi-sikkə " – üryanlıq görkəmindən ibarətdir.

Nişanə 4:  "Burya " – yoxsulluq və dilənçilik nişanəsidir.

Anlam: Naxış sikkənin əyarını bildirdiyi kimi yoxsulluq və üryanlıq da mənim aşiqlik istedadımı bəlli edir.

Beyt 6: **Məni-dərvişə el həm cövr edər sən  cövr qıldıqca ,**
**Kim eylər zülm mənin, padişahım, sən rəva görgəc.**

Sözlük:   Mən = mane olmaq = maneə törətmək .

Nişanə 1: "Dərviş" – bu beytdə yoxsulluq və natamamlıq nişanəsidir.

Nişanə 2:  "El cövr etməsi " – adamların irad-etiraz etməklərindən, yaxud sərki – danlaq vurmaqlarından ibarətdir.

---

[1] Qəzəl 12, beyt 1

Nişanə 3: "Yar cövr etməsi" – "süluk" ünvanlı ürfani seyr yolunda dikəlmiş maneələrdən ibarətdir. [1]

**Qeyd**: *Süluk iki yönlü bir seyrdən ibarətdir:*

*A – Varlıqdan yoxluğa səfər etmək.*

*B – Mütəal məbud eşqində, yaxud vəhdət halında sonu-nəhayəti olmayan seyr.*

Nişanə 4: "Padşah " – mütləq malikiyyət sahibi mütəal məbuddan nişanədir.

Anlam: Ey həkim məhbub, sən mənə qəbzlər həbsindən nicat verməsən, yaxud məni şühud nurunda dünyadan xəbərsiz qılmasan, mənim dünyapərəstlər sərki – danlağından qurtarmağım mümkünsüz olar.

Beyt 7: **Füzulini yaşir, ey zəf, məhvəşlər cəfasından**
**Ki, məhvəşlər qılırlar min cəfa bir mübtəla görgəc.**

Sözlük: Zəf = zəiflik; məhvəş = mahparə = gözəl.

Nişanə 1: "Zəf " – beşinci beytdə qeyd olunmuş üryanlıq mərhələsində, yaxud qeyri – maddi təcrid şəraitində çöl aləmdən, ya da maddəni görən gözlərdən daimilik nişanəsidir.

Nişanə 2: "Məhvəşlər " – bəşəri camalda ilahi hüsnlər əks etdirmiş gözəllərdən, yaxud ilahi vasitələrdən nişanədir.[2]

Anlam: Ey Füzuli, öz vücudunu qat – qat soyub mücərrədlik məqamına yetirməklə özünü məhvəşlər cəfasından xilas et.

**Qeyd** 1: *Mücərrədlik məqamına nail olmuş vücud dünyəvi məhvəşlər gözünə görsənməyib onların cəfasından xilas olar (dünyəvi göz mücərrəd vücudu görə bilməz).*

**Qeyd** 2: *Mücərrədlik məqamına nail olmuş vücud ilahi vasitələrlə həmcins olaraq onların həmdəmliyindən və nəhayət ilahi feyzlərdən bəhrələnərkən dünyadan, yaxud dünya məhvəşlərindən xəbərsiz olar.*

---

[1] Fərhənge-istilahat və təbirate-ürfani.
[2] Qəzəl 23, beyt 1.

## Q Ə Z Ə L 56

**( 1 ) Gər degil bir mah mehrilə mənim tək zar sübh**
**Başin açib nişə hər gün yaxasın yırtar sübh.**

**( 2 ) Gün degil, hər gün bir ay mehrilə köksün çak edib,**
**Tazə - tazə dağlərdir kim, qılır izhar sübh.**

**( 3 ) Tıği-xurşid ilə rəf olsa yeridir kim, müdam**
**Yandırıb pərvanəni, şəmə verir azar sübh.**

**( 4 ) Sübhi şamü şami sübh olmuş mənəm aləmdə kim,**
**Şam şəmi-bəzm olub, ayrıldı məndən yar sübh.**

**( 5 ) Gör nə aşiqdir ki, bir xurşid vəslin bulmağa**
**Sərf edər hər ləhzə min-min lölli-şəhvar sübh.**

**( 6 ) Eşqdə sadiqlik izhar etdi dağın göstərib,**
**Qaliba derlərdi kazib, qıldı ondan ar sübh.**

**( 7 ) Hicr şamında qəm etmişdi Füzuli qəsdi-can,**
**Olmasaydı mərhəmətdən dəm vurub qəmxar sübh.**

Beyt 1: **Gər degil bir mah mehrilə mənim tək zar sübh,**
**Başin açib nişə hər gün yaxasın yırtar sübh.**

Sözlük: Mah = ay; mehr = məhəbbət = günəş.

Nişanə 1: "Mah":

A – Qara maddədə ağ nuru əks etdirmiş ilahi camaldan nişanədir.

B – aşiqin maddi vücuduna mənəvi hal bağışlayan bəşəri hüsndən nişanədir.

Nişanə 2: "Zar olmaq" – aşiqi üryanlıq, yaxud mücərrədlik mərtəbəsinə hazırlayan müqəddimədən ibarətdir.

Nişanə 3: "Sübh" – üryanlığa, yaxud mücərrədliyə şərait yaradan mövqedən nişanədir.

**Qeyd** 1: *Sübh – zamanın başlanğıcı, yaxud doğum çağı olduğuna görə məsumluq və mücərrədlik nişanəsidir, çünki hər bir insan doğum ləhzəsində hələ mənfi, yaxud müsbət əlaqələrə bükülüb – bağlanmayıbdır, buna görə də doğum ləhzəsi mücərrədliklə yanaşı məsumluq ləhzəsidir.*[1]

**Qeyd** 2: *Mücərrədlik və bəsitlik çağı olduğuna görə duaların qəbula keçmək çağıdır.*[2]

**Qeyd** 3: *Sübh rədifi bu qəzəldə məcazi mənalar daşısa da onun ürfani mənalarına xüsusilə 2, 4, 5 və 7 – i beytlərdə eyham edilir.*

Nişanə 4: "Baş açmaq" – möhtaclıq və məmlüklük nişanəsidir.

Nişanə 5: "Yaxa yırtmaq" – üryanlıq tabsızlığından, həm də fədakarlıq və qurbanlıq müqəddiməsindən nişanədir.

Anlam: Sübh də mütəal məhbub ərəfəsinə qovuşmaq məqsədilə özünü mənim tək bəsitləşdirməyə çalışır.

Beyt 2: **Gün degil, hər gün bir ay mehrilə köksün çak edib,**
**Tazə - tazə dağlərdir kim, qılır izhar sübh.**

Sözlük: Tazə = təzə; çak = yarnaq.

Nişanə 1: "Köksünü çak etmək" – ötən beytdə qeyd olunmuş "yaxa yırtmaq" halını təkrar edən nişanədir.

Nişanə 2: "Dağ":

A – Bəstlik məqamına hazırlayan səbəbdən ibarətdir.

B – aşiqi bəndəlik məqamına nişanlayan səbəblərdən ibarətdir.

Anlam: Ötən beyti davam etdirmək məqsədilə buyurur: Sübh, maddi dünya səmasında parlayan günəş güzgüsündə "tovhid günəşinin" təzahür

[1] Qəzəl 25, beyt 1

[2] Sübh nişanəsinin "tofiq", "tətil", "əzəl", "lütf", "rəhmət" və "vəhdət nuru" "ünvanlı ürfani mərtəbələrdə, həm də "hüzur", "işraq" və "mükaşifə" adlı başqa mərtəbələrdə geniş izahı vardır.

etmiş mənəvi nurunu görə - görə öz minnətdarlıq və fədakarlığını nişan vermək istəyir.[1]

Beyt 3: **Tıği-xurşid ilə rəf olsa yeridir kim, müdam**
**Yandırıb pərvanəni, şəmə verir azar sübh.**

Sözlük: Tiğ = nur = ziya = şəmşir; xurşid = günəş; müdam = dalbadal.

Anlam: Sübh pərvanəni şəmdən, yaxud aşiqi məşuqdan ayırmaqla böyük bir günahı boynuna alır, buna görə də onun boynunu nur şəmşirlə vurmaq rəvadır.

**Qeyd** 1: *Gün doğduqdan əvvəl zahir olmuş sübh "oğru sübh" – yalançı sübh olduğuna görə isə günəş tiğilə cəzalanmalıdır.*

**Qeyd** 2: *Oğru sübh, təcrid qəsdilə qat – qat soyulmuş vücudun axır qatlarından nişanədir.*

Beyt 4: **Sübhi şamü şami sübh olmuş mənəm aləmdə kim,**
**Şam şəmi-bəzm olub, ayrıldı məndən yar sübh.**

Sözlük: Bəzm = ziyafət = əncümən = xeymə

Nişanə 1: "Şam": İkinci misradakı şam dünyəvi məşğələləri saxlamaqla mənəvi məşğuliyyətlərə, yaxud təcrid ərəfəsinə daxil olmaq şəraitindən nişanədir.[2]

**Qeyd**: *Sübh və şam mücərrədlik və bəsitlik şəraiti olduğuna görə günorta yaranan təcrid və tətil vəziyyətinə sübh, yaxud şam demək olar.*

Anlam: Gecəmi gündüz kimi işıqlandıran ilahi parlamaların kəsilməsi gündüzümü də gücə kimi qaranlıqlaşdırdı.

**Qeyd**: *Beyt bəstlər arxasındakı qəbzlərə işarə etmək istəyir.*

Beyt 5: **Gör nə aşiqdir ki, bir xurşid vəslin bulmağa**
**Sərf edər hər ləhzə min-min lölöi-şəhvar sübh.**

Sözlük: Vəsl = vüsal = vəslət; lölöi-şəhvar = layiqli cövhər

Nişanə 1: "Lölöi-şəhvar" – dünyəvi etibarları, yaxud fiziki həyat sərmayəsini eyham edən parlaq ulduzlardan istiarədir.

Anlam: Sadiq aşiq sübhdür ki, günəş vüsalına nail olmaq qəsdilə səma dolusu ulduzları, yaxud bütün sərmayəsini xərc edir.

**Qeyd**: *Beyt, gümüşlü ulduzlardan keçən aşiqin qızıl günəş cilalarına nail olmağından söz açmaqla, mütəal məbudun bir ibadət,*

---

[1] Qəzəl 1, beyt 1

[2] Qəzəl 25, beyt 1

*yaxud bir fədakarlıq qarşısında şərif ayədə buyurulduğu kimi neçə bərabər əvəz verməsinə eyham etmək istəyir.*[1]

Beyt 6: **Eşqdə sadiqlik izhar etdi dağın göstərib,**
**Qaliba derlərdi kazib, qıldı ondan ar sübh.**

Sözlük: Kazib = yalançı

**Qeyd** 1: *Neçə ləhzə öz-özünü göstərib sonra qaib olan alatoranlıq sübhü kazib (aldadıcı) sübhdür.*

**Qeyd** 2: *Günəş işığı qarasayaq havada kamil halda görünən ləhzə-si isə ikinci sübh, yaxud sadiq sübh adlanır.*

Anlam: Üçüncü beyti davam etdirmək məqsədilə, ilk sübhün günəş nurundan məhrum olmasının əsas səbəbini öz kaziblik, yaxud layiqsizliyində göstərmək istəyir.

**Qeyd** : *Hətta zərəcə maddi əlaqə təcrid nailiyyətinə, yaxud tovhid günəşindən bəhrələnməyə maneədir.*

Beyt 7: **Hicr şamında qəm etmişdi Füzuli qəsdi-can,**
**Olmasaydı mərhəmətdən dəm vurub qəmxar sübh.**

Sözlük: Hicr = hicran; qəmxar = qəminə ortaq olmaq.

Nişanə 1: "Hicr şamı" – ilahi parlamalardan məhrum edən maddi küdurətlərdən nişanədir.

Nişanə 2: "Can " – bu beytdə həqiqi ölməz həyatdan, yaxud iç aləmdən ibarətdir.

Nişanə 3: "Mərhəmət " və "qəmxar" – mütəal məbudun salik həqqində "rəhimi-sifət" ünvanlı özəl lütfündən ibarətdir.[2]

Nişanə 4: "Sübh" – sübh bu beytdə aşiqi dünyəvi mənaların axıra qalmışından nicat verən İlahi ehsandan nişanədir.

Anlam: Ey Füzuli, sübh mərtəbəsinin ehsanı, yaxud mehriban məbudun lütfkarlığı olmasaydı maddi təhlükələr qınağında mənəvi həyatdan həmişəlik məhrum olardın.

---

[1] مثل الذین یونفیقون آموالهم فی سبیل الله کمثل حبه آنبتّت سبع سنابل فی کلّ سنبله مائهُ و حبَّه و الله یضاعفُ لمن یشائُ و الله واسع علیم:
Allah yolunda mallarını bağışlayan şəxslər, bir dənənin yeddi sündüldə yeddi yüz dənəyə təbdil olmasına bənzər (bir dənə yeddi yüz dənə olar) və Allah istədiyi şəxsə bu miqdardan bağışlar, çünki Allahın rəhməti nəhayətsiz və əhatəsi kamildir" (Quran, Bəqərə surəsi, ayə 261).

[2] Fərhənge- istilahat və təbirate-ürfani.

## Q Ə Z Ə L 57

( 1 ) **Əgər murad isə vermək səfayi-cövhəri ruh,**
**Fələk misal yürüt sağəri-şərabi-səbuh.**

( 2 ) **Buyurma tövbə mana ol şərabdən naseh**
**Ki, görsə onu tutar cəzm tərki-tövbə nəsuh.**

( 3 ) **Hücumi-qəmdə mənə onu etdi zövrəqi-mey**
**Ki, etmədi onu tufan dəmində kəştiyi-Nuh.**

( 4 ) **Müdam çeşmimə qan doldurur xədəngi-qəmin,**
**Yuva başımda tutan quşları edib məcruh.**

( 5 ) **Dil oldu daği-fərağınla şərhə-şərhə vəli,**
**Nə sud çün sənə olmadı hali-dil məşruh.**

( 6 ) **Tənimdə sancılı navəklərinə şadəm kim,**
**Dəri-bəla bu kilid ilədir mana məftuh.**

( 7 ) **Füzuli oldu belin fikri ilə muy misal,**
**Hənuz bulmadı ol sirrə ehtimali-vüzuh.**

Beyt 1: **Əgər murad isə vermək səfayi-cövhəri ruh,**
**Fələk misal yürüt sağəri-şərabi-səbuh.**

Sözlük: Sağər = cam = piyalə; səbuh = səhər çağı içilən sud, yaxud şərab = səhər yeyintisi.

Nişanə 1: "Səfa " – qəddar dünyadan ayrılmaqla ürəyin əğyardan ayırmasından və onu bəsitlik məqamına qaldırmaqdan ibarətdir. [1]

Nişanə 2: "Cövhəri-ruh" – özünü maddi küdurətlər ləkəsindən mühafizə etmiş ruhdan ibarətdir.

Nişanə 3: "Ruh" – görünməz aləmdən ürəyə daxil olmuş özəl bəsit sirrdən ibarətdir.

**Qeyd**: *İslamın ulu peyğəmbəri* " "خلق الارواح قبل الاجساد *buyurmağıy-la ruhun yaranışını cəsədlərdən əvvəl bilmiş beləliklə dirilik ruh ilə peyda olmuşdur.*[2]

Nişanə 4: "Fələk" – "hal-məhəl əlaqəsi" ünvanlı ədəbi "məcaz" sənətini bir baxışla mələklərdən, yaxud digər səmavi sakinlərdən, ya da ülvi aləmə yüksəlmiş ruhlardan ibarətdir.

Nişanə 5: "Sağər" – həzrəti-mürşüdün qəlbindən, yaxud mənəvi gö-rünməz aləmin nurunu əks etdirən şəraitdən nişanədir.

Nişanə 6: "Şərab":

A – Cismi və dünyəvi əxlaq – rəftarı məğlub edərkən mənəvi səciyyələri fəallaşdıran eşq qələbələrindən nişanədir.

B – dünyəvi etibarları yüngül və həqir tutmaqla dünyapərəstlər sərkisini əlavə etdirən nişanədən ibarətdir.

Nişanə 7: "Səbuh":

A – Səfa mərtəbəsinə yüksəlmiş ürəyin "sübh" şəraitində[3] mütəal məbud ilə deyib – danışmasından, yaxud dərdləşməsindən nişanədir.

B – ülvi vüsal aləmində ilahi hüzur şərabından məst olmuş insanın maddi hicran dünyasında, xumarlığını sındıran özəl münacatlar mərtəbəsindən ibarətdir.

**Qeyd** 1: *Deyib-danışmaq şühud nurlu hüzurdan ayrılmaz olduğuna görə, səbuh vəhdət nurunu əks etdirmiş "sübh" mərtəbəsinə bağlıdır. Deməк, səbuh məqamı həm hüzur həm də şühud məqamıdır.*

**Qeyd** 2: *Hicab arxasında müşahidə etmək mümkünsüz olduğuna görə örtücü mənlikdən ayrılmayan bir insan şühud nailyyətindən məhrum olmalıdır.*

---

[1] Qəzəl 2, beyt 7, nişanə 4
[2] Fərhənge-istuilahat və təbirate-ürfani.
[3] Qəzəl 56, beyt 1

Anlam: Ey aşiq, öz ruhunu səfa zirvəsinə qaldırmaq istəsən özünü ülvi aləm sakinləri kimi səbuh şəraitinə layiq etməlisən.

Beyt 2: **Buyurma tövbə mana ol şərabdən naseh**
**Ki, görsə onu tutar cəzm tərki-tövbə nəsuh.**

Sözlük: Naseh = nəsihətçi; cəzm = qəti = şübhəsiz;
nəsuh = nəsihət ifratçısı = xalis tövdə = bir dəfəlik tövbə

Anlam: Ey nəsihətçi, bir dəfəlik tövbə etmiş adam əgər nəsuh özü isə, o, mənəvi eşq cazibələrindən xəbərdar olsa tövbəsini tərk edər.

**Qeyd** 1: *Beyt rüsvalıq xovfundan tövbə etməyi təlqin etmək istəyir.*

**Qeyd** 2: *Aşiq tövbə etməklə öz əngəl vücudunu, yaxud ikilik törətmiş mənliyini sübut edərkən özü – özünə maneə yaradır.*

**Qeyd** 3: *Xalq keçmişdən, zahid dünyadan və aşiq həm dünya, həm də axirətdən tövbə etməklə xalq gələcəyi, zahid behişti və aşiq yalnız mütəal məbudu qəsd edir.*[1]

**Qeyd** 4: *Xalq özünə nicat vermək məqsədilə tövbə edərkən aşiq özündən nicat tapmaq məqsədilə tövbə edir, çünki özlüyü də, yaxud mənliyini də xudpəsəndlik əlaməti bulur, elə ulu Peyğəmbərin də "*وجودک ذنب لا يقاس به ذنب*"*[2] *buyurduğunun mənası budur.*[3]

Beyt 3: **Hücumi-qəmdə mənə onu etdi zövrəqi-mey**
**Ki, etmədi onu tufan dəmində kəştyi-Nuh.**

Sözlük: Zövrəq = qayıq; zövrəqi-mey = qədəh = şərab piyaləsi = şəkilcə qayığa bənzər cam.

Nişanə 1: "Hücumi qəm" – saliki seyr yolundan saxlayan[4], yaxud geri oturdan dünyəvi uçurumlardan, həm də mənəvi sınamalardan nişanədir.

Nişanə 2: "Zövrəqi-mey" – birinci beytdə qeyd olunmuş şərab sağərindən, yaxud mürşüd təlimatından, ya da ilahi cilalir əks etdirmiş aşiq ürəyindən ibarətdir.

Anlam: Zövrəqi-mey, yaxud ilahi məstliklərə məğlub olmuş ürək, Nuh gəmisini qərq edən eşq tufanından mənə nicat verdi.

**Qeyd**: *Beyt, səfa mərtəbəsinə nail olmuş qəlbin Nuh gəmisindən üstün olduğunu demək istəyir.*

---

[1] Doktor Cəvad Nurbəxş, Sufi kist, Sufi kist, s.9.
[2] Heç bir günah ilə müqayisə olmaz günah sənin öz vücudun, yaxud mənliyindir.
[3],Doktor Cəvad Nurbəxş, Sufi kist, s.9.
[4] Qəzəl 1, beyt 1, nişanə 4 (səlik)

Beyt 4: **Müdam çeşmimə qan doldurur xədəngi-qəmin,**
**Yuva başımda tutan quşları edib məcruh.**

Sözlük: Müdam = həmişə = həmişə yağan yağış; çeşm = göz, xədəng = xədəng adlı bərk ağacdan yonulmuş ox; məcruh = yaralanmış = yaralı.

Nişanə 1: "Qan":

A – Mənəm-mənəmliyi batil etməkdən nişanədir.

B – göz yaşından istiarə olduğuna görə yuyuculuqdan, yaxud maddi ləkələri təmizləməkdən nişanədir.

Nişanə 2: "Xədəngi-qəm " – aşiqin qəlbini biqərar etmək ilə onu yavaş – yavaş özlüyündən ayırıb ilahi qəmzə satmaqlardan nişanədir.

Nişanə 3: "Başda yuva tutmuş quşlar " – dünyəvi vücudun əlaqələrini, həm də özünü unutmaq əlamətidir, ancaq başdakı fikir xəyal, əql və idrakın həqirliyinə də eyham etmək istəyir.

Nişanə 4: "Məcruh " – məcazi əngəldənvə həyatın məhvliyinə müqəddimə olmuş şəraitdən nişanədir.

Anlam:

A – Ey gözəl canan, xədəngi-qəm mərtəbəsində gözümün qanlı yaşıyla çöl vücudumu yuyub batil etmək ilə dünyəvi fikir – xəyaldan, yaxud maddi əlaqələrdən xilas olmağa hazırlaşıram .

B – dünyəvi etibarlar fikrini başdan atmaqla mənəvi nailiyyətlərə hazırlaşmışam .

Beyt 5: **Dil oldu daği-fərağınla şərhə-şərhə vəli,**
**Nə sud çün sənə olmadı hali-dil məşruh.**

Sözlük: Şərhə - şərhə = parça – parça = tikə - tikə; sud = fayda; məşruh = şərh olunmuş = izah olmuş .

Nişanə 1: "Şərhə - şərhə ":

A – mənəvi ilgilər nailiyyətinə müqəddimə yaratmaqdan nişanədir.[1] Elə buna görə də Mövləvi buyurmuşdur:

سینه خواهم شرحه شرحه از فراق　　تا بگویم شرح درد اشتیاق [2]

B – Ürfan nurunun ürəkdə saçılması həm də bəzi görünməz mərtəbələrin görünməsi beləliklə bir çox eşq müşküllərinin həll olması, qəlbin parça-parça olmağından asılıdır.

Nişanə 2: "Məşruh" – tətil olmuş bəstlərdən nişanədir.

---

[1] Qəzəl 24, beyt 6 .

[2] Məsnəviyi mənəvi Mövləviyi, dəftər əvvəl, beyt 3

Anlam: Ürək qəbzlər sınağında parça-parça oldu, ancaq bəst nailyyətinə layiq olmadı.

**Qeyd**: *Bəzi həkimi-məbudun özəl lütfü hicranın, yaxud qəbzlərin davam etdirilməsinə bais olur, çünki fəraq nə qədər əzab verici olsa bir o qədər də bəlkə bir çox o qədər də aşiq istedadlı və ləyaqətli olur.*

Beyt 6: **Tənimdə sancılı navəklərinə şadəm kim,**
**Dəri-bəla bu kilid ilədir mana məqtuh.**

Sözlük: Navək = sürətli kiçik ox; dər = qapı = darvaza;
kilid = açar; məftuh = fəth edilmiş = açıq = açılmış

Nişanə 1: "Navək" – aşiqin fəryadını, yaxud məşuq bəyənən özəl münacatını əlavə edən mənəvi qəmzə satmaqlardan nişanədir.

Nişanə 2: "Bəla" – aşiqi məşuqa yaxınladan istiqamətləndirici sınaqlarından nişanədir.[1]

Anlam: Qəlbimi canan ərəfəsinə hazırlamaq qəsdilə parça-parça edən qəmzələrə minnətdaram.

Beyt 7: **Füzuli oldu belin fikri ilə muy misal,**
**Hənuz bulmadı ol sirrə ehtimali-vüzuh.**

Sözlük: Muy = tük; muy misal = tükə bənzər = bir tükdən asılı = arıq;
hənuz = hələ, vüzuh = bəllənmək = bəlli olmaq

Nişanə 1: "Bel" – bu beytdə əqlin və elmin gözünə görünməyən nazik hüsnlər həm də gizli sirrlərdən nişanədir.

Nişanə 2: "Muy misal" – təcrid şəraitində qat – qat soyulub bəsitləşmiş bir vücudun "dəqiqə" ünvanlı ürfani mərtəbəyə nail olmağından nişanədir.[2]

Anlam: Füzuli qəbzlər-qəmzələr sınağında bir tükdən asılı vücud kimi üryanlıq məqamına nail ola-ola, mütəal məhbubun həqiqi hüsləri ilə tanışlıq imkanını tapa bilmədi.

**Qeyd**: *Beyt mütəal məbud həqiqəti ilə tanışlığı mümkünsüz bilməklə islam peyğəmbərinin "الهی ما عرفناک حق معرفتک " dediyini[3] təsdiq etmək istəyir.[4]*

---

[1] Qəzəl 23, beyt 1
[2] Qəzəl 12, beyt 1
[3] Ey mənim ulu Tanrım sənin həqiqətini tanımaqdan aciz oldum.
[4] Bəharul-ənvar, cild 67, səh.338, bab 59, əl-xovf və ər – rica

## Q Ə Z Ə L 58

( 1 ) **Qansı mahın, bilməzəm, mehrilə olmuş zar sübh,**
**Hər gün eylər xəlqə bir daği-nihan izhar sübh.**

( 2 ) **Batdı əncüm, çıxdı gün, ya bir əsiri-eşqdir,**
**Tökdü dürri-əşki, çəkdi ahi-atəşbar sübh.**

( 3 ) **Nola gər əmvatə ehya versə sübhün dəmləri,**
**Zikri-ləlindir kim, eylər dəmbədəm təkrar sübh.**

( 4 ) **Bir müsəvvirdir ki, zərrin kilk ilə hər gün çəkər**
**Səfheyi-gərdunə nəqşi-arizi-dildar sübh.**

( 5 ) **Müjdə bir xurşiddən vermiş məgər badi-səhər**
**Kim, nisar eylər ona, yüz min düri-şəhvar sübh.**

( 6 ) **Aşiqi-sadiqdir izhari-qəm eylir hər səhər,**
**Ah ilə xəlqi yuxusundan qılır bidar sübh.**

( 7 ) **Ey Füzuli, şami-qəm əncamına yoxdur ümid,**
**Bir təsəllidir sənə ol söz ki, derlər var sübh.**

Beyt 1: **Qansı mahın, bilməzəm, mehrilə olmuş zar sübh,**
**Hər gün eylər xəlqə bir daği-nihan izhar sübh.**

Sözlük: Mah = ay; mehr = məhəbbət = günəş; nihan = gizli = pünhan.ğ

Nişanə 1: "Mah ":

A – Vəhdət nurunu kəsrət güzgüsündə əks etdirmiş ilahi calamdan nişanədir.

B – Həzrəti-Cəbrayıldan, yaxud dügər ilahi vasitələrdən nişanədir.

P – maddi dünyanı, bəlkə də mənliyi yaddan çıxaran bəşəri camaldan əks etdirilmiş ilahi hüsndən nişanədir.

Nişanə 2: "Mehr " – mənəvi məqsədlə tanış olmuş aşiqin öz ilahi əslinə maraq göstərməyindən ibarətdir.

Nişanə 3: "Zar " – dünyəvi və cismi mahiyyətdən ayrılmaq müqəddiməsindən ibarətdir.

Nişanə 4: "Sübh " – batini seyr, yaxud mənəvi hərəkət yaradan "nari məhəbbət"dən nişanədir.[1]

Nişanə 5: "Dağ " – bu beytdə dünyəvi bağlantılar məhəbbətini silib – aparmış ilahi ilgilərin təsirindən ibarətdir.

Anlam: Hansısa ilahi cilvə, yaxud hansısa ilahi vasitə, ya da hansısa ilahi hüsnü əks etdirmiş bəşəri camal gizli həqiqətləri aşkar etməklə bütün xalqı öz ülvi əslinə qayıdışa dəvət edir.

Beyt 2: **Batdı əncüm, çıxdı gün, ya bir əsiri-eşqdir,**
**Tökdü dürri-əşki, çəkdi ahi-atəşbar sübh.**

Sözlük: Əncüm = ulduzlar; əşk = göz yaşı; atəşbar = odsaçan.

Nişanə 1: "Əncüm" – həm də dürri-əşk dünyəvi sərmayəni mənəvi bazarda xərcləməkdən nişanədir.

Nişanə 2: "Gün " – ilahi camal cilalarına eyham edən dünyəvi parlamalar nişanəsidir.

Nişanə 3: "Ahi-atəşbar ":

A – Bu beytdə qəlbin maddi yönünə bağlı müşahidə məqamına maneə olmuş küdurətləri "nari-məhəbbət" şöləsində yandırıb məhv etmək nişanəsidir.[2]

B – iç aləmin çöl aləmi işıqlandıran nurundan ibarətdir.

---

[1] Qəzəl 9, beyt 3, nişanə 1

[2] Qəzəl 17, beyt 2

Anlam: Aya, səma öz ulduzlarını xərcləməklə günəş camalını görüb göstərməyə nail oldu? Yoxsa bir aşiqin əşk sərmayəsi onun öz qəlbini, həm də bütün dünyanı işıqlandırmağa səbəb yaratdımı?

**Qeyd** 1: *Günəş parlamasına ulduzlar sərmayə olduğu kimi ürək parlamasına, yaxud şühud mərtəbəsinə də göz yaşı sərmayədirmi.*[1]

**Qeyd** 2: *Günəşin çıxmağı qara gecənin məhvliyinə bais olan kimi şühud parlamasına nail olmuş bir aşiq də küdurətli maddi bağlantılarını məhv etməlidir.*

Beyt 3: **Nola gər əmvatə ehya versə sübhün dəmləri,**
**Zikri-ləlindir kim, eylər dəmbədəm təkrar sübh.**

Sözlük: Əmvat = ölmüşlər = ölülər; dəm = nəfəs = ləhzə

Nişanə 1: "Əmvat " – maddi vücudun dar qəfəsində bir ölü kimi aciz qalmış iç həyata, yaxud mənəvi vücuda eyham etmək istəyir.

Nişanə 2: "Ehya " – ilahi yaxınlaşma nurunda mənəviyyat qazancından qafil qalmış ürəkləri, yaxud havavü-həvəs dustağında giriftar olmuş canları diriltməkdən nişanədir.[2]

Nişanə 3: "Sübh " – vəhdət nurunu parladan şəraitdən nişanədir.

Nişanə 4: "Dəm " – "rəhmani nəfəs", həm də "Həqq feyzi" ünvanlı ürfani mərtəbələri, bir də kamil insanların, ya da Allah-Təalanın özəl dostlarının xəstəyə şəfa bağışlayan nəfəslərinə eyham edərək sübhün ilahi cilalar yayan ləhzələrini təlqin etmək istəyir.

Nişanə 5: "Zikri-ləl":

A – Mütəal məbudun yoxu var edən iqtidarını yad etməkdən nişanədir.

B – mütəal məbudun həyat bağışlayan ilhamlarından, yaxud "rəhmani nəfəs" feyzindən ibarətdir.

Anlam:

A – Vəhdət ərəfəsindən saçılan nurun ölmüşləri diriltməsi heç də təəccüblü deyil.

B – Sübh şəraitində ehsan olmuş ilahi ilhamlar maddi vücud qəfəsində olmuş iç həyatı diriltməsə heçdə əcəb deyil.

Beyt 4: **Bir müsəvvirdir ki, zərrin kilk ilə hər gün çəkər**
**Səfheyi-gərdunə nəqşi-arizi-dildar sübh.**

---

[1] Qəzəl 3, beyt 3

[2] Fərhənge-istilahat-təbirate ürfani.

Sözlük: Müsəvvir = rəssam = hər bir şəxsə, yaxud hər bir şeyə özəl bir surət bağışlayan; zərrin = zərli; kilk = qələm, gərdun = fələk = çərx = səma; ariz = camal = surət.

Nişanə 1: "Müsəvvir" – rəssam həm də sübh bu beytdə yalnız vəhdət nurundan nişanədirlər.

Nişanə 2: "Zərrin": Zər, yaxud qızıl zavalsız olduğuna görə sübhün əbədiyyətə qovuşdurucu şəraitinə eyham etmək istəyir.

Nişanə 3: "Səfheyi-gərdun" – bu beytdə kəsrətin yaxud bütün maddi dünyanın mənəvi parlamalarını əks etdirməyindən, yaxud güzgü yönündən ibarətdir.

Nişanə 4: "Arizi-dildar" – ürfan qapılarının açılmağından, həm də aşiqi arzularından əlavə ilahi camal nurundan feyzyab etməkdən nişanədir.[1]

Anlam: Sübh şəraiti ilahi camal nurunu əks etdirməklə ülvi ölməz aləmdən yeni xəbərlər vermək istəyir.

Beyt 5: **Müjdə bir xurşiddən vermiş məgər badi-səhər**
**Kim, nisar eylər ona, yüz min düri-şəhvar sübh.**

Sözlük: Xurşid = günəş; dürri – şəhvar = şahlara layiq dürr, nisar = qurban = sovqat = müxtəlif sikkələri, yaxud qızıl-gümüşü başa, ayağa səpmək.

Nişanə 1: "Xurşid" – bu beytdə yeganə məbudun, idraka, düşüncəyə sığmaz vahid həqiqətindən, yaxud vəhdət ərəfəsindən ehsan olmuş parlamalardan nişanədir.

Nişanə 2: "Badi-səba" – həzrəti-Cəbraildən, yaxud mənəvi feyzlər xəbərini gətirən ilahi vasitələrdən nişanədir.

Nişanə 3: "Düri-şəhvar" – dünyəvi mahiyyətini yuyub batil edən qan-yaşa, həm də eşq bazarlığında xərclənmiş sərmayəyə eyham edərək dünya səmasından saçılan günəş nurunu təlqin etmək istəyir.

Nişanə 4: "Sübh" – təcrid, ya da bəsitlik şəraitindən ibarətdir.

Anlam: Aşiq vəhdət mərkəzindən, yaxud ilahi camaldan maddi kəsrət aləminə nur saçılmaq müjdəsini eşitmək ilə öz vücudunu qan-yaşda təmizləyib bəsitləşdirən kimi, dünya da özünü günəş cilaları ilə yuyub hazırlamaq istəyir.

Beyt 6: **Aşiqi-sadiqdir izhari-qəm eylir hər səhər,**
**Ah ilə xəlqi yuxusundan qılır bidar sübh.**

---

[1] Fərhənge lüğat və istelahat və təbirate ürfani, Doktor Seyyid Cəfər Səccadi

Sözlük:  Bidar = oyanmış = oyaq

Nişanə 1:  "Qəm":

A –  mütəal məhbub istəyi ilə çalışmaqdan ibarətdir.

B –  xəlqin qəminə ortaq olmaqdan nişanədir.

Nişanə 2:  "Səhər və sübh" – bəsitlik şəraitindən, yaxud məsum başlanğıcdan ibarətdir.

Nişanə 3:  "Ah" – ürəyi maddi ilgilərdən təmizləyib onu mənəvi seyr və hərəkətə nail edən "nari-məhəbbət" dən nişanədir.[1]

Nişanə 4:  "Yuxu" – bu beytdə iç aləmdən, yaxud mənəvi əhval-ruhiyyədən qəflətdə qalmaq nişanəsidir.

Anlam:  Sübh şəraitində aşiq qəlbindən qopan özəl münacat, yaxud sübhün bir sadiq aşiq kimi vəhdət nurunu tələb etmək nalələridir:

A – Xəlqi təbii yuxudan bidar edir.

B – Xəlqi qəflət yuxusundan oyadır.

P – İç aləmi həqiqi üstün həyatdan xəbərdar etmək məqsədilə silkələyir.

T – Dünyəvi şərait məhdudluğunda özünü həbs etmiş insanları mənəvi sonsuzluqdan xəbərdar etmək istəyir.

Beyt 7:    **Ey Füzuli, şami-qəm əncamına yoxdur ümid,**
**Bir təsəllidir sənə ol söz ki, derlər var sübh.**

Sözlük:  Əncam = qurtaracaq.

Nişanə 1:  "Şami-qəm" – qara maddi dünyadan həmişəlik nicat tapmaqdan, yaxud dünyəvi ömür fürsətində daimi bəst  və şühudun mümkünsüz olmağından nişanədir.

Nişanə 2: "Sübh" – bu beytdə maddi əngəllərdən həmişəlik xilas olmaq nişanəsidir.

Anlam:  Ey Füzuli, dünyəvi ömür fürsətində daimi bəst və şühud nailyyətinə yetmək, yaxud qəbz və hicran həbsindən daimi qurtulmaq mümkünsüzdür, çünki dünyəvi yaşayış meydanında hər bir bəstin arxasında bir qəbz olması, yaxud hər şadlığın bir qəmginlik ilə bağlılığı təbii sabit bir qanundur. Beləliklə, sübh müjdəsi, yaxud digər bəst mərhələləri yalnız dözümlülük və istiqamətlənmək səbəbləridirlər. Elə buna görə də lisanül-qeyb Hafiz ülvi nurani aləmdən qara maddi dünyaya süqut etməyin insan kökünü qoparan dərdi, badə ünvanlı rəhmani nəfəslər ilə unutmaq istəyir.[2]

---

[1] Qəzəl 7, beyt 2

[2] اگر نه باده غم دل زیاد ما ببرد        نهیب حادثه، بنیاد ما ز جا ببرد

## Q Ə Z Ə L 59

**( 1 ) Ol müşk bu ğəzalə ixlasım ilə vazih,**
**Bəlliğ səba səlamən miskiyyətər rəvayih.[1]**

**( 2 ) Olcaq həbibə vasil bizdən həm olma qafil,**
**La təqtə-ər-rəsail, la təktümis-sərayih.[2]**

**( 3 ) Üzdə sirişk qanı söylər qəmi nəhani ,**
**Qəd təzhərü-məani bil xətti fil-ləvayih.[3]**

**( 4 ) Mən mübtəlayi-hicran, məndən iraq canan,**
**Vəl ömrü keyfə makan mislür-riyahi rayih.[4]**

**( 5 ) Eşqin Füzuliyi-zar, tərk etmək oldu düşvar,**
**Ya arifən bima sar la tuksirin-nəsayih.[5]**

---

وگر نه عقل به مستی فرو کشد لنگر چگونه کشتی ازین ورطه بلا ببرد

1 Ey səhər yeli, məndən mişk qoxulu salam yetir.
2 Məktubları məndən kəsmə, ürəyindəkini məndən gizləmə.
3 Mənalar lövhələr üzərində xətt ilə zahir olur.
4 Ömür nə cür olursa-olsun külək kimi əsib gedəndir.
5 Ey olan şeyləri bilən, çox nəsihət etmə.

Beyt 1: **Ol müşk bu ğəzalə ixlasım ilə vazih,**
**Bəlliğ səba səlamən miskiyyətər rəvayih.**

Sözlük: Müşk = Xütən ahusunun göbəyindən alınan qaratəhər qəhveyi bir ətirli maddə; müşkbu = ətirli = yaxşı iyli; vazeh = aydın = aşkar = bəlli; bəlliğ = iblağ elə = yetir.

Nişanə 1: "Müşkbu ğəzal" ("müşk ətirli ahu"): Aşiqin ülvi ölməz aləmdə yaxud ilahi vüsal sahəsində yaşayışını onun iç aləmdə, yaxud ürəyində, yaxud duyum-düşüncəsində yadına salan mütəal məbudun özəl rayihəli yadigarlığından, yaxud həzrət mürşüdün təlimatından, yaxud bəşəri camalda əks etdirilmiş ilahi hüsndən ibarətdir.

Nişanə 2: "İxlas":

A – Xeyir işlərin özünü batil edən, yaxud ruhunu – həqiqətini fasidləşdirən riyakarlıqdan, məğrurluqdan saflanmış əməldən ibarətdir.

B – hər bir xeyir əməl ki nəfs onu görüb məğrur olmaqdan, mələk yazmaqdan, şeytan isə fitnə-fəsad etməkdən aciz ola, o əməl ixlas sahəsinə daxildir.[1]

P – Allah-Təaladan başqa hər bir şeydən üryan olub bəsitləşmiş əməl ixlasdan nişanədir.

T – Qurani Məcid " انه من عبادنا المخلصين "[2] buyurmaqla həzrəti-Yusifin ixlas sifətini sitayiş etmək istəyir.

Nişanə 3: "Səba" – Həzrəti-Cəbraildən, yaxud digər ilahi vasitələrdən ibarətdir.

Nişanə 4: "Miskiyyətər-rəvayih" – müşklü ahuya ərəfədən ehsan olmuş vəhdət rayihəli özəl feyzlərdən ibarətdir. İkinci misranın tərcüməsi: Ey səba, məndən müşk qoxulu salam yetir.

Anlam: Ey səba, mütəal məhbub hüzurunda mənim salamımı iblağ edərkən ixlas – iradətimdən söz açmaqla ilahi rayihələrdən ovuc-ovuc sovqat – sədəqə gətirməyi yaddan çıxarma.

Beyt 2: **Olcaq həbibə vasil bizdən həm olma qafil,**
**La təqtə-ər-rəsail, la təktümis-sərayih.**

Sözlük: Rəsail = məktublar; sərayih = aydınlar = xalislər = aşkarlar.

Nişanə 1: "Rəsail və sərayih" – ürəyin alovlu çaxnaşmasına bais olmuş aydın tələblər və ətəşlərdən nişanədir.

---

[1] Fərhənge -istelahat və təbirate-ürfani.

[2] Həqiqətən O ( Həzrəti-Yusif) bizim məsum və ixlaslı bəndələrmizdən biridir. (Quran, Yusif surəsi, 24 – cü ayədən bir hissə)

İkinci misranın tərcüməsi: Məktubları məndən kəsmə, ürəqindəkini məndən gizləmə.

Anlam: Ötən beyti davam etdirmək məqsədilə deyir: Ey səba, Mütəal məhbub hüzuruna nailiyyət imkanını tapanda mənim də ürək yandırıcı ətəşlərimdən söz açıb vəsatət etməyi yaddan çıxarma.

Beyt 3: **Üzdə sirişk qanı söylər qəmi nəhani ,**
**Qəd təzhərü-məani bil xətti fil-ləvayih.**

Sözlük: Sirişk = göz yaşı; nəhan = gizli = pünhan; məani = mənalar, ləvayih = layihələr = məktublar = parlaq nur = xətər

Nişanə 1: "Sirişk qanı" – dünyəvi mahiyyəti, yaxud mənliyi ürək qanıyla dolu göz yaşında yuyub batil edən həyəcanlaşdırıcı ətəş və tələbdən ibarətdir.

Nişanə 2: "Qəm nihani" – birinci nişanədə qeyd olunmuş ətəş və tələb hasilindən yaxud batini çalışmalardan nişanədir.

**Qeyd**: *Batini çalışmaq həm də tələb və ətəş, ilahi mərifət və istedad nişanələrindən ibarətdirlər.*

Nişanə 3: "Məani": Məani birinci və ikinci nişanələrdə qeyd etdir-diyimiz mənəvi həyəcan və batini hacətdən nişanədir.

Nişanə 4: "Xətt" – iç həyəcanların çöl təzahüründən, yaxud batinlə əlaqədar təzahürdən nişanədir.[1]

Nişanə 5: "Ləvayih" – A – Hələ öz istedadını kamilləşdirə bilməyən aşiqin iç aləmində sürətlə parlayıb sürətlə sönən ilahi cilalardan nişanədir.[2]

B – ilahi müvəqqəti cilalardan hasil olmuş batini həyəcanın zahiri təzahüründən nişanədir.

**Qeyd**: *Mütəal mehrban məbud ləvayih mərtəbəsinin davamsız cilalarını tədricən daimiləşdirməklə aşiqin istedadını kamal mərtəbəsinə yaxınlaşdırar. Ikinci misranın tərcüməsi: Mənalar lövhələr üzərində xətt ilə zahir olur.*

Anlam: Məktub yazıçının gizli fikrini aşkar edən kimi mənim də pərişan zahirim batini ətəşimi – tələbimi aydın göstərir.

Beyt 4: **Mən mübtəlayi-hicran, məndən iraq canan,**
**Vəl ömrü keyfə makan mislür-riyahi rayih.**

---

[1] Qəzəl 48, beyt 1

[2] Fərhəngi-Moin.

Sözlük: Riyah = yellər = nəsimlər; rayih = xoş iy verən = xoş rayihəli

Nişanə: "Mübtəla": Mübtəla bu beytdə aşiqin istedadını kamilləşdirmək məqsədilə onu müxtəlif bəlalarla sınağa çəkməkdən ibarətdir.

Anlam: A – Mənim ömrüm səfalı gülüstandan sovuşmuş nəsim ömrü kimi sürətlə başa çatdı.

B – Ey ilahi vasitə, həqiqi ölməz həyatımdan, yaxud mütəal məhbub ərəfəsindən yalnız bir iy almaq qədəri dünyəvi ömürdən bəhrələnmək istəyirəm.

**Qeyd**: *Beyt ülvi uca aləmdən maddi alçaq dünyaya düşmüş insanın öz mənəvi keçmişindən xəbərdarlığını, həm də öz ilahi əslinə qayıtmaq həsrətini təlqin etmək istəyir.*

Beyt 5: **Eşqin Füzuliyi-zar, tərk etmək oldu düşvar,**
**Ya arifən bima sar la tuksirin-nəsayih.**

Sözlük: Düşvar = çətin; sar = cərəyanlar (sar siyrurət göyündən, seyr asimanından gəlmiş adam); nəsayih = nəsihətlər

İkinci misranın tərcüməsi: Ey olan seyrləri bilən, çox nəsihət etmə.

Anlam: Ey bir çox hadisələr və həqiqətlərlə tanışlığı olan dünyagörmüş nəsihətçi, eşqin bir şirin can kimi mümkünsüz tərk edilməsini bilə - bilə məni danlayıb nəsihət etməyin təəccüblüdür.

**Qeyd**: *Eşq bir tərk olmaz özəl alın yazısı olduğuna görə, aşiqə nəsihət vermək onu öz alın yazısını silib – atmağa dəvət etməkdir, buna görə də aşiqə nəsihət təəccüblüdür.*

## Q Ə Z Ə L 60

**( 1 ) Kimsədə rüxsarına taqəti-nəzzarə yox,**
**Aşiqi öldürdü şövq, bir nəzərə çarə yox.**

**( 2 ) Bağrı bütünlər mənə tənə edərlər müdam,**
**Halımı şərh etməyə bir cigəri parə yox.**

**( 3 ) Yığdı mənim başıma dəhr qəmin neyləsin?**
**Badiyeyi-eşqdə mən kimi avarə yox.**

**( 4 ) Dəhrdə həmta sənə var yeri yox desəm,**
**Var gözəl çox, vəli, sən kimi xunxarə yox.**

**( 5 ) Gözdə gəzib çizginir qətreyi-əşkim müdam,**
**Qətreyi-əşkim kimi çərxdə səyyarə yox.**

**( 6 ) Çak görüb köksümü qılma ilacım, təbib,**
**Zaye olur mərhəmin, məndə bitər yarə yox.**

**( 7 ) Zarlığım eşqdən var, Füzuli, vəli,**
**Ol məhi-bədmehrdən rəhm məni zarə yox.**

Beyt 1: **Kimsədə rüxsarına taqəti-nəzzarə yox,**
**Aşiqi öldürdü şövq, bir nəzərə çarə yox.**

Sözlük: Rüxsar = sima = surət = camal; nəzzarə = tamaşa etmək = baxmaq

Nişanə 1: "Kimsə" – A – batini həyatdan xəbərsiz insandan nişanədir.

B – umumxaldan nişanədir.

Nişanə 2: "Ruxsar" – bu beytdə mütəal məbud camalından parlayan cilalardan, həm də vəhdət nöqtəsinin gizli və aydın cilvələrindən nişanədir.

Nişanə 3: "Şövq" – vüsal mərtəbəsinə nailyyət olandan sonra yenidən hicran mərhələsinə giriftar olmuş aşiqin ləzzətlə dolu əzab çəkməyindən, yaxud yarı ölü – yarı diri obrazlı biqərarlığından nişanədir.[1]

**Qeyd**: *Aşiq şövq mərhələsində yavaş-yavaş fiziki mahiyyətini unudarkən mənəvi – həqiqi həyatını tapmağa - tanımağa nail olar.*

Anlam: Yeganə məbud camalından parlayan cilaları görmək (idrak etmək) dünyəvi həyat şəraitində mümkünsüz olduğuna görə aşiq biqərarlıq atəşində vücud məhdudlugundan qurtulmaq məqsədilə dünyəvi əngəl şəraitindən xilas olmağa çalışır.

Beyt 2: **Bağrı bütünlər mənə tənə edərlər müdam,**
**Halımı şərh etməyə bir cigəri parə yox.**

Sözlük: Müdam = daim = həmişə.

Nişanə 1: "Bağrı bütünlər":

A – Vəhdət ərəfəsinə, yaxud əl çatmaz yüksəkliyə, ya da vüsal mərtəbəsinə nail olmuş kamil insanlardan nişanədir.

B – ilahi vasitələrdən, yaxud "bəst" mərtəbəsinə nail olmuşlardan nişanədir.

P – qəlbləri ilahi qəmzələrlə yarılmaq istedadını tapa bilməyənlərdən, mənəvi parlamalardan xəbərsizlərdən, yaxud ürəkləri parça-parça olmayan insanlardan nişanədir.[2]

Nişanə 2: "Cigəri parə" – dünyəvi əngəl mahiyyətinin məhvlik müqəddiməsindən ibarətdir.

**Qeyd**: *Cismani yaralar bədəni zəifləşdirən kimi zövqlü yaralar? Yaxud eşq zərbələri isə dünyəvi əngəl olaraq həyat əlaqələrini zəifltməklə aşiqiöz mənliyindən xilas olmağa hazırlaşdırır.*

Anlam:

---

[1] Qəzəl 24, beyt 6

[2] Qəzəl 57, beyt 5

A – Dünyaşünas əqldən dəm vuran insanların sərkilərindən şikayət etməyə bircə mənaşünas da tapa bilmirəm.

B – Vüsal mərtəbəsinə yüksəlmiş kamil insanlar hicran həbsində pozulan halımdan xəbər tutmağa heçdə mail olmurlar.

Beyt 3: **Yığdı mənim başıma dəhr qəmin neyləsin?**
**Badiyeyi-eşqdə mən kimi avarə yox**

Sözlük: Dəhr = zəmanə = ruzgar, badiyə = çöl = biyaban = səhra.

Nişanə 1: "Qəm ":

A – bu beytdə mütəal məhbub tələbində çalışmaqdan və biqərarlıqdan nişanədir.

B – dünyəvi ömür fürsətində bəstlərə aman verməyən qəbzlərdən ibarətdir.

P – hal qəribliyində tək – tənha yaşamaqdan nişanədir.[1]

Nişanə 2: "Avarə": – aşiqin fikrini – elmini bir quru ağac kimi karsız edən sərgərdanlıqdan ibarətdir.

Anlam: Dünyəvi ömür fürsətində hal qürbəti, həm də tələb arzusu qəlbimi biqərar edərkən əqlimi heyran etmişdir.

**Qeyd**: *Bütün xalq içrə özünü qərib hiss etmək həm də əqli fikri aciz görmək mənəvi yüksəkliklərlə tanış olmaqdan, iki aydın nişanədirlər. Beləliklə beyt aşiqin ülvi mərifətini, yaxud kamillik mərtəbəsinə müqəddimə hazırlamasını eyham etməklə bir növ "müfaxirə"(fəxr etmək) təlqin edir.*

Beyt 4: **Dəhrdə həmta sənə var yeri yox desəm,**
**Var gözəl çox, vəli, sən kimi xunxarə yox.**

Sözlük: Həmta = misli = tayı bərabəri; xunxarə = xunxar = cəllad.

Nişanə 1: "Həmta" – şərif ayədə "ليس كمثله شى"[2] buyurulduğu kimi mütəal məhbubun yeganəliyini, yaxud vəhdət məqamını təlqin edən nişanədən ibarətdir.

Nişanə 2: "Xunxarə" – A – dönə - dönə dediyimiz kimi aşiqi yüksək ürfan və insanlıq səviyyəsinə, yaxud kamal mərtəbəsinə qaldırmaq məqsədi ilə onu qəbzlər – bəlalar zindanında sınağa çəkən həkimi-məhbubun cəlal sifətindən nişanədir.

---

[1] Qəzəl 34, beyt 3

[2] Quran, Əl- Şura surəsi, 11-ci ayədən bir qismət( “O yeganə Allaha heç misl və tay yoxdur və O eşidən və görəndir”.)

B – dünyəvi əlaqələri, yaxud fiziki mahiyyəti bir dəri kimi aşiqin həqiqi vücudundan soyub, onu təcrid mərtəbəsinə, ya da qurbanlıq məqamına hazırlayan gərəkli cəfalardan ibarətdir.

P – aşiqi öz ürəyinin qanıyla yuyundurub paka çıxaran, yaxud onun maddi əngəl vücudunu batil edən ilahi sifətdən nişanədir.

T – şərif ayədə "يخرج الحى من الميت" [1] buyurulduğu kimi qəbzlər və ətəşlər sınağında özünü yox etmiş aşiqi yenidən var etməklə ona yeni bir mərifət və həyat bağışlayan ilahi iqtidar və ehsandan ibarətdir.

Anlam: Ey həkimi-məhbub, heç bir bəşəri hüsn, yaxud heç bir mürşüd, ya da heç bir ilahi vasitə aşiqi özlüyündən soyundurub qurbanlıq məqamına hazırlaşdırmaqda sənin camalından parlayan gözəl cilalar ilə bərabərlik, yaxud oxşarlıq edə bilmir. Beləliklə insana həqiqi etibar bağışlayan yalnız sənsən.

**Qeyd**: *Heç bir gözəl sənin tək məni məndən ayıra bilməyir.*

Beyt 5: **Gözdə gəzib çizginir qətreyi-əşkim müdam,**
**Qətreyi-əşkim kimi çərxdə səyyarə yox**

Sözlük: Əşk = göz yaşı; müdam = daimi = həmişə.

Nişanə 1: "Əşk" – A – Əşk, yuyucu bir maddə kimi aşiqin həqiqi vücudunu mənəm-mənəmlik ləkələrindən təmizləyən nişanədən ibarətdir.

B – biqərar aşiqin dünyəvi imkanlara razılıq göstərməməyindən nişanədir.

Anlam: Səma ulduzlarını xərcləməklə günəş zühuruna nail olduğu kimi mən isə tovhid günəşini görmək məqsədilə göz yaşlarımı bir sərmayə kimi toplayıram.

**Qeyd**: *Mütəal məhbubdan başqa hamını göz yaşıyla yuyub məhv etmək istəyirəm.*

Beyt 6: **Çak görüb köksümü qılma ilacım, təbib,**
**Zaye olur mərhəmin, məndə bitər yarə yox.**

Sözlük: Çak = çat = yarıq.

Nişanə 1: "Çak olunmuş köks" – A – köks, yaxud ürək çatı qan tökməklə paralel olduğuna görə qurbanlıq məqamına hazırlaşmaqdan nişanədir.

---

[1] انِ ِ ّ َ الله فالق الحب و النَّوى يخرج الحى من الميت و يخرج الميت من الحى ذالكم الله فانّى توفكون: (Allahdır ki yerin bətnində danəni yarır və dirini ölüdən və ölünü diridən yaradır, budur Allah bəs hara üz döndərirsiniz. Quran, Ənam surəsi, ayə 95)

B – Ürək çatı ülvi aləmə açılmış bir pəncərə olduğuna görə görünməz mərtəbələri göstərən, yaxud şühud məqamına nail edən gərəkli şərtdən ibarətdir.[1] Buna görə də Mövləvi buyurmuşdur:

هر که را از سینه باشد فتح باب     او ز هر شهری ببیند آفتاب [2]

**Qeyd**: *Həzrəti-İmam Hüseynin sadiq aşiqləri aşura gecəsi görünməz ülvi mərtəbələri görməklə sübhün açılmasına və şəhid olmağa tələsirlər.*

Nişanə 2: "Təbib": Təbib aşiqi nəsihət verən zahiddən, yaxud digər əqldən dəm vuran biganələrdən ibarətdir.

Nişanə 3: "Mərhəm" – dünyadan üstün aləmdən xəbərsizlərin nəsihətlərindən ibarətdir.

Nişanə 4: "Bitməyən yara" – mənəvi məqamlarla mərifət tapmış aşiqin dünyəvi imkanlardan hacətsiz olmağını yaxud canan ərəfəsindən başqa heç bir məqam vasitəsilə toxtaqlıq tapmayan ətəşini təlqin edən nişanədən ibarətdir.

Anlam: Ey təbib, elm və əql ilə eşq dərdinə çarə etmək mümkünsüz bir xəyaldır.

Beyt 7: **Zarlığım eşqdən var, Füzuli, vəli,**
**Ol məhi-bədmehrdən rəhm məni zarə yox**

Sözlük: Məh = mah = ay; bədmehr = məhəbbətsiz = acıqlı

Nişanə 1: "Zarlıq" – əzab verici qəbzlər sınağında dünyəvi mahiyyətini qat-qat soyunub incəlmiş, bəsitlənmiş, təcrid şəraitinə hazırlaşmış, yaxud "dəqiqə" məqamına nail olmuş vücuddan nişanədir.[3]

Nişanə 2: "Məh" – kəsrət güzgüsündə təzahür etdirilmiş vəhdət nurundan, yaxud qara maddədə əks etdirilmiş nurani mənadan ibarətdir.

Nişanə 3: "Rəhmi yox" – cəfa mərhələsində, yuxarıda xatırladığımız mənəvi tərbiyə səbəblərindən ibarətdir.

Anlam: Ey Füzuli, mən öz fiziki mahiyyətimi qat – qat soya – soya qəbzlər sınağından xilas olmaq imkanını tapa bilməyirəm.

**Qeyd**: *Hələ də ilahi təlimata möhtacam.*

---

[1] Qəzəl 53, beyt 2
[2] Məsnəviyi-mənəviyi Mövləvi, dəftəri-əvvəl, beyt 1435
[3] Qəzəl 12, beyt 1

## Q Ə Z Ə L 61

**(1) Nola gər qucsa miyanın kəməri-zər qüstax,**
**Gətirib çoxları ortayə zər, eylər güstax.**

**(2) Xaki-sağər gili-Cəmşiddir, ey piri-muğan,**
**Xəbər et saqiyə kim, tutmaya sağər güstax.**

**(3) Rəşk odilə yaxılır riştеyi-canım ki, neçün,**
**Dəyər ol arizə geysuyi-müənbər güstax.**

**(4) Rövzənindən qoma kim gün düşə xəlvətgəhinə,**
**Hərəmi-şahə nə layiq girə çakər güstax.**

**(5) Saxla, ey əşk, ədəb getmə səri-kuyinə çox**
**Ki, düşər gözdənü-üzdən sürünər hər güstax.**

**(6) Həvəsim badeyi-gülgunə bu ümmid ilədir**
**Kim, olam məst, tutam daməni-dilbər güstax.**

**(7) Bənzədirsən özünü itlərinə hər saət,**
**Ey Füzuli, ola bilməz sənə bənzər güstax.**

Beyt 1: **Nola gər qucsa miyanın kəməri-zər güstax,**
**Gətirib çoxları ortayə zər, eylər güstax**

Sözlük: Qüstax = cəsur = qorxubilməz = ədəbsiz = kobud = utanmaz = həyasız.Nişanə 1: "Miyan" – əqləsığmaz mənəvi nazikliyə yaxud mütəal məhbubun lütf ünvanlı naziklik sifətinə eyham edən nişanədir.

Nişanə 2: "Zər" – mənəvi sərmayəni, yaxud əbədiyyətlə həmcins olmağa eyham edən nişanədir.

Nişanə 3: "Kəməri-zər" – dünyəvi vücudun mənəvi istedadlara nail olmasına, yaxud eşqlə məşuq arasındakı fasilənin yox dərəcəsinə çatmasına eyham edən nişanədir.

Nişanə 4: "Qüstax" – özlüyündən çıxmış aşiqin zahiri qayda-qanundan xəbərsiz olmağından, həm də bəşəri "istiğna"[1] məqamına nail olmasından nişanədir.

**Qeyd** 1: *Öz iç aləmini dünyəvi ilgi - əlaqələrdən boşaldarkən "ney"*[2] *məqamına nail olmuş bir aşiqin boş vücudu ilahi sifətlərlə dolarkən onun bəşəri iqtidarının ilahi iqtidara çevrilməsi, yaxud onun bəşəri istiğna məqamına yetişməsidir, habelə "əzdad" bəhsini sübut etmiş təbii bir çevriliş, həm də mütəal məbudun vədə verdiyi qəti bir muzddur*[3].

**Qeyd** 2: *Bəşəri vücudunu, yaxud bəşəri iradəsini ilahi iradəyə çevirmiş bir insan:*

*A –dünyəvi iqtidarları həqir və aciz görməklə onların qarşısında qüstax olmalıdır.*

*B – öz məmlüklüyünü etiraf edərkən*[4] *həqiqi malikə söykənməklə onun "səmədiyyət" ünvanlı istiğna sifətindən bəhrələnib dünyəvilikdən hacətsiz olaraq bütün dünyaya qüstax olmalıdır.*

*P – zər ünvanlı zavalsız məqama (əbədiyyət) yetişərək zavala məruz qalmış maddi dünya qarşısında qüstax olmalıdır.*

*T – ilahi vədələrin həqiqi, həm də sabit olmasını bilərkən, tələb etməkdə qüstax olmalıdır. Elə buna görə də Hafiz demişdir: "Qiyamət günü behişt bağlarını mənə verməkdə müzayiqə etsələr, cənnət gözəllərini bir-bir eyvandan çəkib aşağı salaram .*[5]

---

[1] Qəzəl 30, beyt 3
[2] Qəzəl 1, beyt 2
[3] Həm "ayətallah", həm də "cəmali-vilayət" bəhsində izahı vardır.
[4] Qəzəl 1, beyt 6
[5] فردا اگرنه روضه ی رضوان به ما دهند غلمان ز غرفه حور ز جنت بدر کشم

Belə bir iddia mərifətə bağlı bir iqtidarı nişan vermək istəyir. Ancaq belə iqtidar bağışlayan mərifət özəl bir mərifətdir. Demək mərifətin müxtəlif çeşidləri – mizanları olduğuna görə hər bir idrakda – anlamda bir miqdar mərifətin olması hazırdır, buna görə də mərifət məşhur məfhumdur, ancaq belə bir məşhur mərifət umumi və xüsusi nöqteyi-nəzərlərdə o qədər fərqlənir ki insanlar sayca çeşidlər, dərinliklər və dəyərlər tapır.

Aydındır ki, bizim məqsədimiz "ikinci mərifət", yaxud mənəvi mərifət, ya da həm özünü, həm də başqa mərifətləri düz tanıyan özəl bir mərifətə işarə etməkdir. Füzuli də Hafiz kimi bu çeşid mərifətin həm özünü, həm də məhsulunu dəqiqliklə tanımışdır.

Mərifətin özünü tanımaq, onun xətasızlığını, həm də nişan verdiyi yolun müstəqimliyini sübut etməkdən ibarətdir, lakin mərifətin məhsulunu tanımaq "istiğna "ünvanlı məqsədi tanımaqdan, yaxud müsbət xudpəsəndlik ünvanlı mərtəbədə[1] maddi dünyaya təkəbbür göstərməkdən ibarətdir. Demək, ikinci mərifət ilə istiğna zirvəsinə yüksəlmiş bir insan axırətdə də dünya kimi sarsılmazlıqdan, yaxud xüdpəsəndlik ünvanlı xüdapəsəndlik və həqiqətpəsəndlikdən əl götürməz, o, həm öz əməllərini, həm də mehriban məbud müəyyən etdiyi muzdu dərindən tanımışdır, buna görə də həm bir ilahi muzd kimi behişti tələb edir həm də tələb qarşısında dikəlmiş maneələrə öz iqtidarını göstərməklə yeganə məbudun iqtidarını yaxud ilahi vədələrin düzgünlüyünü sübut etməklə sarsılmazlıq, ya da qüstaxlıq göstərir.

Nişanə 5: "İkinci misra" –dünyəvi sərmayə gücünə işarə etməklə mənəvi sərmayə gücünü hissiləşdirib başa salmaq istəyir.
Anlam: Həqir kəməri dilbər belinə bağlanmağa layiq bilmiş qızıl kimi təcrid etibarı, yaxud bəsitlik sərmayəsı də zavala məruz qalmış nalayiq bəndəni ilahi zavalsız məqama, yaxud əbədiyyətə, ya da həzrəti-məbuda söykənməyə (qürb) layiq bilir.

Beyt 2: **Xaki-sağər gili-Cəmşiddir, ey piri-muğan,**
**Xəbər et saqiyə kim, tutmaya sağər güstax.**

Sözlük: Xak = torpaq; sağər = cam = piyalə; gil = palçıq, Cəmşid = günəş oğlu = ölüm yaxalayan ilk insan = milli hekayələrdə qeyd olunmuş əfsanəvi şahlar silsiləsindən bir şah ki,"Ahuraməzda"[2] birinci dəfə öz dinini ona tapşırdı. Cəmşid dövründə 300 il xəstəlikdən,

---

[1] Qəzəl 1, beyt 2
[2] Zərdüştilərin, yaxud qədim iranlıların ulu Tanrısı

həm də ölümdən xəbər olmadı, ancaq o, axır – axırda yolunu itirib günahkar olduğyna görə dünya dönərkən xəstəlik, həm də ölüm qayıtdı.[1] Piri-muğan = Zərdüşt dininin rəhbəri.

Nişanə 1: "Sağər " – A – ilahi cəlaləri əks etdirmiş arif ürəyindən nişanədir.[2]

B – görünməz mənəvi aləmdən nümunəvi ziyalar təzahür etdirən hər bir şeydən ibarətdir.

P – aşiq qəlbini şövqləndirən səbəbdən nişanədir.

Nişanə 2: "Cəmşid":

A – dünyəvi iqtidar – etibardan nişanədir.

B - Cəmşid əfsanələrdə qeyd olunmuş ülvi aləmin görünməz sirlərini təzahür etdirən camın düzəldicisi olduğuna görə ilahi iqtidardan nişanədir.

Nişanə 3: "Piri-muğan " öz tələbələrinin qəlbini dünyəvi ilgilərdən ayırıb onlara mənəvi əhval-ruhiyyə bağışlayan ruhani rəhbərdən nişanədir.

Nişanə 4: "Saqi" – bu beytdə piri-muğan məktəbində bir sıra mənəvi seyrlər ilə tanış olmuş tələbədən nişanədir.

Anlam: Ey piri-muğan, sağər mərtəbəsinin ehtiram – etibarını tələbələrə tanıtdırmağa görə mənəvi təlimatını əlavə etməkdən müzayiqə etmə.

**Qeyd**: *Cəmşidin torpağından düzəlmiş sağər, məcazi mənadasa dünyəvi iqtidarların etibarsızlığına eyham etmək istəyir.*

Beyt 3: **Rəşk odilə yaxılır rişteyi-canım ki, neçün,**
**Dəyər ol arizə geysuyi-müənbər güstax.**

Sözlük: Rəşk = qibtə = qısqanclıq; ariz = surət = üz; geysu = hörük = saç; Müənbər = ətirli.

Nişanə 1: "Rəşk " – bu beytdə kamal zirvəsinə yüksəlmişlərin məqamını maraqlandıran müsbət həsrətdən nişanədir.

Nişanə 2: "Ariz" – ilahi camaldan parlayan hicabsız nurdan ibarətdir.

Nişanə 3: "Geysuyi-müənbər" – vəhdət nurunu əks etdirmək mərtəbəsinə çatmış kəsrətdən nişanədir.

Anlam: Bir çox qürb nailiyyətinə yetişənləri müşahidə etməklə həsrət, həm də qeyrət atəşində alışıram.

---

[1] Fərhəngi-Moin, Əlam
[2] İmam Xomeyninin şeirlər divanı

Beyt 4: **Rövzənindən qoma kim gün düşə xəlvətgəhinə,**
**Hərəmi-şahə nə layiq girə çakər güstax.**

Sözlük: Rövzən = baca = kiçik pəncərə = kiçik qapı = divar yarığı; Xəlvətgah = xəlvət yer, hərəm = hər bir evin yan – yörəsi = müqəddəs məkanların, xüsusilə Allah evi Kəbənin ətrafı = ev içi = ailənin sakin olduğu yer; Çakər = nökər = xidmətçi.

Nişanə 1: "Gün" – A – bu beytdə özünü dünyəvi yüksək mərtəbəyə qaldırmışlardan nişanədir.

B – özünü mənəvi məlumatlar məğrurluğuna giriftar etmişlərdən nişanədir.

Nişanə 2: "Xəlvətgəh" – A – "vilayət" ünvanlı ürfani mərtəbədə, mütəal məbuddan başqasını, xüsusilə özünü unutmaqla mənəvi kamal zirvəsinə yüksəlmək şəraitindən ibarətdir.

B – aşiqin məşuqa soykənmək şəraitindən yaxud onunla birləşmiş halından nişanədir.

Nişanə 3: "Hərəmi-şah" – A – xəlvətgəh mərtəbəsini təkrar edən nişanədir.

B – ötən beytdə qeyd olunmuş ariz ətrafına eyham edən nişanədir.

Nişanə 4: "Çakər" – birinci misrada qeyd olunmuş günü təhqir edən nişanədir.

Anlam: Ey mütəal məhbub, özünü kamil xiyal etmiş ədəbsiz – qabiliyyətsiz aşiqi xəlvətgəh məqamına (vəhdət) yol etməkdən məhrum qılmaqla onu öz naqisliyindən xəbərdar edərək əlavə tərbiyəyə nail qıl.

**Qeyd**: *Bu beytdə ötən beyt kimi zahirən Füzulini həsəd etmək şəraitində təqdim edir, ancaq qüstax rədifinə diqqət etsək, beyt onu həsəd yox, əksinə dua məqamında nişan verir, demək o, öz üstün mərifəti ilə kamil tərbiyə görməyən aşiqin qürb məqamına, yaxud hərəmi-şaha yaxınlaşmağını onun naqislik, yaxud cahilliyindən nişanə bilərkən, tənbih olmasına yaxud hərəmi-şahdan həqiranə qovulmasına, ya da kamillik məğrurluğunda kamal axtarmaq çalışqanlığını tərk etməsinə razılıq verə bilməyir, elə buna görə də Hafiz demişdir:*

تا به گیسوی تو دست ناسازایان کم رسد　　　هر دلی از حلقه ای در ذکر یارب یاربست

*Doktor Hüseynəli Herəvi özünün zəngin şərhində dilbər zülfündə əsirlik nemətini yalnız özünə həsr etmək məqsədilə naqis və nalayiq aşiqlərin əlinin o zülfdən uzaq olması üçün dua edir.*[1]

Alim və mühəqqiq dostum doktor Behruz Sərvətyan cənabları nalayiq aşiqlərin zülf nailiyyətinə imkan tapmalarını mütəal məhbubu

---

[1] Hafizin qəzəllərinin şərhi, doktor Hüseynəli Herəvi

incitmək olduğunu bilərkən onların zülf mərtəbəsindən uzaq düşməsini tələb edir.[1]

Buna diqqət etsək ki "geysu" tələb yolunu təlqin edən nişanədir və onun çox telli olmağı bu yolun müxtəlif çeşidlərinə eyham edərək çeşidlərin hər birinin özəl bir istedadını təlqin etmək istəyir, onda beytin məfhumu həsəd etmək, yaxud bədbinlikdən təmizlənib dua və xeyr-xahlıqla bağlı olar.[2] Beləliklə, Hafiz, ya da Füzuli istedad qazanmaqdan əvvəl tələb yolunda addım açmağı, yolu çaşmaq yaxud günaha düşməklə bərabər bilərkən günahdan qorunmaqdan ötrü dua edirlər.

Beyt 5: **Saxla, ey əşk, ədəb getmə səri-kuyinə çox**
**Ki, düşər gözdən-üzdən sürünər hər güstax.**

Sözlük: Əşk = göz yaşı.

Nişanə 1: "Əşk" – bu beytdə aşiqin həqir sərmayəsindən ibarətdir.

Nişanə 2: "Ədəb" – A – Zahir və batini paklayıb birləşdirməkdən nişanədir.

B – Ədəb ötən iki beytdə qeyd olunmuş hərəm-şah və ariz ətrafina yaxınlaşmaq tərbiyəsindən ibarətdir.

P – Ədəb, şərif ayədə "و الحافظون لحدود الله" buyurulduğu kimi[3] mütəal məhbubun hüdudunu yaxud əmr və qadağalarını gözləməkdən nişanədir.

Nişanə 3: "Səri - kuy" – ötən beytdə qeyd olunmuş xəlvətgəhdən, yaxud hərəmi-şah ərəfəsindən nişanədir.

Nişanə 4: "Gözdən-üzdən düşmək, sürünmək" – həqirlik və məhrumluqdan nişanədir.

Anlam: Ey aşiq, əşk ünvanlı həqir sərmayə ilə xəlvətgəh ərəfəsinə, yaxud ariz ətrafına dolanmaq iddiası ədəbsizlik olduğuna görə ilahi nemətlərdən məhrumluq müqəddiməsidir.

**Qeyd**: *Mənəm-mənəmliyi təmamilə yuyub təmizləməyən göz yaşı həqir sərmayədır.*

Beyt 6: **Həvəsim badeyi-gülgunə bu ümmidilədir**
**Kim, olam məst, tutam daməni-dilbər güstax.**

---

[1] Hafizin qəzəllərinin şərhi, doktor Behruz Sərvətyan

[2] Tafi-əndişe, cild 1, müəllif

[3] التائبون العابدون الحامدون السائحون الراكعون الساجدون الامرون بالمعروف و الناهون عن المنكر و الحافظون لحدود الله و بشر المومنون:(O Tövbə etmişlər, ibadət etmişlər, sitayiş etmişlər, oruc tutmuşlar, rüku etmişlər, səcdə etmişlər, düz əmələ əmr etmişlər, pis işlərdən qorumuşlar, Allahın hüdudunu qorumuşlar və muştuluq olsun möminlərə) Quran, Tövbə surəsi, ayə 112

Sözlük: Gülgun = gülə mail = qırmızı; damən = ətək

Nişanə 1: "Həvəs" – bu beytdə vəhdət ərəfəsini arzu etməkdən ibarətdir.

Nişanə 2: "Badeyi - gülgun" – qəbz müşkülünə üstün gələn bəst məstliyindən ibarətdir

Nişanə 3: "Məst" – iç aləmin eşqə məğlub olmağından, yaxud ilahi ilgilərlə dünyəvi və fiziki mahiyyətdən ayrılmış aşiqdən ibarətdir.

Nişanə 4: "Qüstax" – bu beytdə məstlık mərtəbəsində məşuq ilə vahidləşmiş aşiqin etibarından nişanədir.

Anlam: Məni mənliyimdən xilas etməklə məhbub ərəfəsində məhv-lik, yaxud fəna məqamına qaldıran badeyi-gülgun yardımını arzulayıram.

Beyt 7: **Bənzədirsən özünü itlərinə hər saət,**
**Ey Füzuli, ola bilməz sənə bənzər güstax.**

Nişanə: " İt " – bu beytdə toplansal hörmətlər məğrurluğundan çəkinib mütəal məhbub ərəfəsində öz məmlüklüyünü – həqirliyini etiraf etmiş aşiqdən ibarətdir.[1]

Anlam: Ey Füzuli, özünü mütəal məhbub ərəfəsinin ən həqir qullarına bənzətməklə ədəbsizlik və cəsurluq edirsən.

**Qeyd**: *Füzuli öz həqirliyini etiraf etməklə öz üstün mərifətini, yaxud ülvi ərəfəyə daxil olmağa hazırlaşmağını sübut edir.*

[1] Qəzəl 41, beyt 2

## Q Ə Z Ə L 62

( 1 ) Rəngi – ruyindən dəm urmuş sağəri – səhbayə bax!
Afitab ilən qılır dəva, tutulmuş ayə bax!

( 2 ) Şəm başından çıxarmış dud şövqi-kakilin,
Böylə kutah ömr ilə başındakı sevdayə bax!

( 3 ) Ey səlamət əhli, ol ruxsarə baxma zinhar!
Etiraz eylə məlamətdən, məni – rusvayə bax!

( 4 ) Bildi eşqində nəmədpuş olduğum ayinətək
Rəhm edib hərgiz mənə baxmaz, bu istiğnayə bax!

( 5 ) Sinəmi çak eylə, gör dil iztirabın eşqdən,
Rövzən aç, hər dəm həvadən mövc uran dəryayə bax.

( 6 ) Ey deyən kim, şəmi – iqbalın nə üzdən tirədir?
Sayə salmış ayə ol geysuyi - ənbərsayə bax.

( 7 ) Ey Füzuli, hər necə mən eyləsə naseh məni,
Baxma onun qövlünə, bir çöhreyi – zibayə bax.

Beyt 1: **Rəngi-ruyindən dəm urmuş sağəri-səhbayə bax!**
**Afitab ilən qılır dəva, tutulmuş ayə bax!**

Sözlük: Rəngi-ruy = rəng = sima; sağər = cam = piyalə = arif qəlbi; səhba = qırmızı rəngli şərab; afitab = günəş; dəva = dava = iddia.

Nişanə 1: "Rəngi - ruy" – aşiqə zövq bağışlayan mənəvi parlamadan, yaxud ilahi camal cilalarından ibarətdir.

**Qeyd:** *Zövq həm vüsalda, həm də hicranda, yaxud həm bəstdə həmdə qəbzdə dadmalı bir haldan ibarətdir, buna görə də* "ذقت البلا و ذقت الراحه"*demişlər.*[1]

Nişanə 2: "Dəm urmaq" – ikinci misrada qeyd olunmuş dəva etməkdən, yaxud müddəi olmaqdan nişanədir.

**Qeyd** 1: *Dəva etmək ixlas ilə təzadlı olduğuna görə, müddəi məşuq ərəfəsindən qovulmalıdır, çünki ixlas, mütəal məşuqdan başqasını, xüsusilə bəşəri və çəxsi mahiyyət qatqısını təmamilə unutmaqdan ibarətdir.*

**Qeyd** 2: *Dəva etmək iradət ilə təzadlı olduğuna görə müddəi, eşq nailyyətindən məhrum olmalıdır, çünki iradət fiziki vücud iradələrindən təmamilə boşalıb ilahi iradələr ilə dolmaqdan ibarətdir.*

**Qeyd** 3: *Özünü məmlük və məşuqu malik bilmək eşq əhlinin təbii və qəti nişanəsi olduğuna görə məmlükün iddia etməsi kimi müddəinin aşiq olması batil bir xəyaldır.*

**Qeyd** 4: *Dəva etmək hər sözdən əvvəl mənliyi sübut etmək ilə:*

*A – Müddəinin özlüyündən xəbərdar olmasını, beləliklə eşqdən xəbərsizliyini sübut edir, elə buna görə də Sədi buyurmuşdur:*

تا خبر دارم از او بی خبر از خویشتنم    با وجودش زمن آواز نیاید که منم

*B – İslamın ulu peyğəmbəri* "وجودک ذنب لایقاس به ذنب"[2] *buyurduğu kimi müddəilik günahkarlığı sübut etməkdən ibarətdir.* [3]

*Nişanə 3: "Sağər":*

*A – İlahi eşq ilə dolu ürəkdən, yaxud arifin qəlbindən nişanədir.*

*B – əbədiyyət səmasının nurunu əks etdirmiş səbəbdən nişanədir.*

Nişanə 4: "Səhba" – ürək qanına eyham edən ilahi qələbələrdən nişanədir.

**Qeyd** 1: *Aşiqin ürək qanı onun qəbul olunmuş sərmayəsindən ibarətdir.*

---

[1] Fərhəngi-istilahat və təbirati ürfani.
[2] Ey insan, mənəm-mənlik heç bir günah ilə müqayisə olmayan bir günahdır.
[3] Qəzəl 6, beyt 2

**Qeyd** 2: *Qan qırmızı olduğuna görə səhba mərtəbəsini təsdiq edən qələbə əlamətidir.*

Nişanə 5: "Afitab" – bu beytdə mütəal məbudun camalından parlayan hicabsız cilalardan ibarətdir.

Nişanə 6: "Tutulmuş ay" – maddi dünya zülmətində mənəvi nuranilik iddia eləyən şəxsdən ibarətdir.

Anlam: Bir mənəvi cilvə nailyyətində məğrur olub özünü kamil mərifətə, yaxud qəbzsiz bəstə layiq xəyal etmək əcəb heyrətamizdir.

**Qeyd**: 1 *Beyt ürəyin bir ilahi cilvəyə nail olmasını "səhba" tərkibi ilə təsdiq edir, ancaq onu tutulmuş ay tərkibi ilə istedadsız təlqin etmək istəyir.*

**Qeyd**: 2 *Beyt istedadsız ürəyə müddəi deyib sərki vurmaqla, onu oyatmaq və tərbiyə etmək istəyir.*

Beyt 2: **Şəm başından çıxarmış dud şövqi-kakilin,**
**Böylə kutah ömr ilə başındakı sevdayə bax!**

Sözlük: Dud = tüstü; kakil = kəkil; kutəh = qısa = gödək
Nişanə 1: "Şəm" – bu beytdə eşq atəşində alovlanmış həqir vücuddan nişanədir.

Nişanə 2: "Dud başdan çıxarmaq" – dünyəvi əngəl varlığın axıra qalmış əsərindən nişanədir.

**Qeyd** 1: *Tüstü dünyəvi vücuddan maddi bir əsər olduğuna görə mənəvi tələb qarşısında maneədir.*

**Qeyd** 2: *Tüstü məcazi vücudun axır varlığı olduğuna görə üryanlıq müqəddiməsi və tələb rüxsətidir.*

Nişanə 3: "Şövq" – həm vüsal nailyyətində, həm də hicran sınağında aşiqin özlüyünü onun yadından çıxaran əhvaldan ibarətdir.

Nişanə 4: "Kakil" – "təcəlla" ünvanlı ilahi parlamadan nişanədir.
Anlam:

A – Zavala məruz qalmış dünyəvi ömür fürsətində, əbədiyyət günəşinə qoşulmaq fikri heyrətləndirən fikirdir (mümkünsüzdür).

B – Dünyəvi varlıqdan əsər qala – qala (tüstü) mənəvi tələbkarlıq qəribə bir işdir.

Beyt 3: **Ey səlamət əhli, ol ruxsarə baxma zinhar!**
**Etiraz eylə məlamətdən, məni-rusvayə bax!**

Sözlük: Rüxsar = surət = sima = üz, zinhar = aman = saqın = uzaq ol.

Nişanə 1: "Səlamət əhli" – əql və elm əhlinin sərkilərində özünü qoruyan, yaxud dünyəvi etibarlarla maraqlanan cəmaətdən ibarətdir.

Nişanə 2: "Ruxsarə" – əqli idrakı quru bir ağac kimi qurudan şühud parlamalarından ibarətdir.

Nişanə 3: "Məlamət" – dünyəvi etibarların həqirliyini göstərmək məqsədilə aşiqi ümumi hörmətlərdən çəkindirən mərhələdən ibarətdir.

**Qeyd** 1: *Dünyəvi etibarlardan çəkinmək, mənəvi etibarlar tanışlığından nişanədir.*

**Qeyd** 2: *Mənəm-mənəmlik insanın birinci etibarı olduğuna görə məlamət aşiqi birinci hicabdan, yaxud ən böyük xətərdən xilas edən nişanədir.*

**Qeyd** 3: *Aşiq, onu məlamət edən cəmaəti gözdən salmaqla, çox saylı əngəldən, yaxud kəsrətin böyük bir hissəsindən xilas olmağa hazırlaşır*[1].

Nişanə 4: "Rüsva" – dünyaşünas əql və məntiq prinsiplərini həqir sanmaqla ümum camaatın sərki və danlağını qəbul etməkdən, beləliklə də camaatdan, yaxud kəsrətdən xilas olmaqdan nişanədir.

Anlam: Ey əqlini – elmini yüksək bir məqam kimi qoruyub ictimai etibarlarla maraqlanan insan, yaxud ey camaatın təhqirindən dəhşətə gələn şəxs, eşq ərəfəsinə yaxınlaşmaqdan saqın, çünki aşiq ictimai etibarları addımbaşı ayaqlamaqdadır.

Beyt 4: **Bildi eşqində nəmədpuş olduğum ayinətək**
**Rəhm edib hərgiz mənə baxmaz, bu istiğnayə bax!**

Sözlük: istiqna = naz = toxluq = özünü tox tutmaq = içi doluluq, nəmədpuş = keçə bürünmüş.

Nişanə 1: "Nəmədpuş":

A – "Fəqr"[2] mərtəbəsinə hazırlaşmaq məqsədilə öz yoxsulluğunu üzə çıxarıb özünü təhqir etməkdən nişanədir.

B – mənəm-mənəmlik etibarlarını məhv etmək məqsədilə maddi vücudu təhqir etməkdən nişanədir.

**Qeyd** 1: *Bir çox ariflər dünyəvi maraqları həqir sanmaq məqsədilə keçəyə bürünmüşlər.*

**Qeyd** 2: *Beyt keçmiş zamanda aynanı keçəyə büküb – qorumağa eyham edərək ürək güzgüsünü dünyəvi ilgilər zərbəsindən mühafizə etməyi təlqin etmək istəyir.*

---

[1] Qəzəl 1, beyt 5

[2] Qəzəl 3, beyt 4 və qəzəl 44, beyt 4

Nişanə 2: "İstiğna" – aşiqin nalələrinə baxmayaraq, onu müxtəlif bəlalarla sınaqlara çəkən mütəal məhbubun səmədiyyət sifətindən ibarətdir.[1]

Anlam: Dünyəvi əlaqələrdən ayrılıb yalnız bir keçəyə bürünmək, mücərrədlik və üryanlıq nailyyətinə yetişmək üçün qənaətbəxş deyildir, bir keçədən, isə ikinci beytdə xatırlanmış "dud" ünvanlı axıra qalmış dünyəvi əsər kimi ayrılmağına görə mütəal məhbubun müxtəlif qəbzlərindən istiqbal etmək gərəklidir.

Beyt 5: **Sinəmi çak eylə, gör dil iztirabın eşqdən,**
**Rövzən aç, hər dəm həvadən mövc uran dəryayə bax.**

Sözlük: Çak = yarıq; rövzən = baca = kiçik pəncərə.

Nişanə 1: "Sinə çak etmək" – bu beytdə təbii vücudun maddi örpəyini yarıb onun mənəvi əhvalını görmək və düşünməkdən nişanədir.

Nişanə 2: "Dil iztirabı" – ürək çırpıntısı, yaxud qəlbi ilahi məqsədə çatdıran özəl bir hərəkətdən nişanədir.

**Qeyd**: *Ürək döyüntüsü, yaxud qəlb hərəkətidir, "Molla Sədranın" izah etdiyi "cövhər hərəkəti"[2] kimi fəna ünvanlı məqsədə çatınca davam etməlidir.*

Nişanə 3: "Rozən" – çak mərtəbəsini təkrar edən nişanədən ibarətdir.

Nişanə 4: "Həva":

A – ürəyin dünyəvi əlaqələrdən mükəmməl surətdə boş olmasına eyham edən nişanədir.

B – məcazi ilgilərdən boşalmış ürəyin mənəvi həvəslərlə dolu olmasını təlqin edən nişanədir.

Nişanə 5: "Movc vuran dərya" – mənəvi hərəkətini döyüntü çeşidilə davam etdirən ürəkdən ibarətdir.

Anlam: Ey mürşüd, batini seyrimi nəzərdən keçirməklə, ilahi məqsədə nail olmağıma yardım göstər.

Beyt 6: **Ey deyən kim, şəmi-iqbalın nə üzdən tirədir,**
**Sayə salmış ayə ol geysuyi-ənbərsayə bax.**

Sözlük: Tirə = qara; geysu = hörük = saç; ənbərsa = ətirli

Nişanə 1: "İqbal" – mübarizə etmədən ilahi cazibələrə nail olmaqdan nişanədir.

---

[1] Qəzəl 30, beyt 3
[2] Əsfar, Molla Sədra

Nişanə 2: "Mah" – dünyəvi fenomenlərdə təzahür etmiş mənəvi cilalardan nişanədir.

Nişanə 3: "Geysu" – bu beytdə şühud nurunun kəsrət güzgüsündə təzahür etməsinə maneçilik törətmiş dünyəvi və mənəvi səbəblərdən ibarətdir.

**Qeyd** 1: Dünyəvi maneçilik törətmiş səbəblər, məcazi bağlantılardan ibarətdir.

**Qeyd** 2: Mənəvi maneə törətmiş səbəblər, aşiqin tərbiyə görməyinə gərəkli qəbzlər və sınaqlardan ibarətdir.

Nişanə 4: "Ənbərsa" – vüsal rayihəli hicrandan, yaxud bir üzü hayil[1] və başqa üzü hadi[2] olan kəsrətdən nişanədir.[3]

Anlam: İlahi parlamalar qarşısında maneçilik törətmiş dünyəvi və mənəvi səbəblər mənim bəxtimi qara etmişlər.

Beyt 7: **Ey Füzuli, hər necə mən eyləsə naseh məni,**
**Baxma onun qövlünə, bir çöhreyi-zibayə bax.**

Sözlük: Mən = mane olmaq = qabağını almaq; naseh = nəsihətçi; qövl = söz, vədə; çöhreyi-ziba = gözəl camal

Nişanə 1: "Naseh" – bəşəri hüsnün ilahi hüsn ilə əlaqədar olmasını idrak etməyən, həm də dünyaşünas əqli kamal nailiyyətinə qənaətbəxş bilən etirazçıdan ibarətdir.

Nişanə 2: "Çöhreyi-ziba" – Mənəvi parlamalardan, yaxud bəşəri camalda təzahür etmiş ilahi gözəllikdən nişanədir.[4]

Anlam: Ey Füzuli, mənəvi əhval – ruhiyyədən xəbərsiz nasehin irad və etirazına baxmayaraq dünyəvi və mənəvi gözəlliklərdən ilahi rayihə almağı tərk etmə.

---

[1] Hayil = hicab = maneçilik edən
[2] Hadi = hidayət edən = göstərən
[3] Qəzəl 4, beyt 3
[4] Qəzəl 12, beyt 2

## Q Ə Z Ə L 63

**( 1 ) Ləblərin tək ləl, ləfzin tək düri-şəhvar yox,**
**Ləlü gövhər çox, ləbin tək ləli-gövhərbar yox.**

**( 2 ) Səndən etmən dad “cövrün var, lütfün yox” deyib,**
**Məsti-zövqi-şövqünəm, birdir yanımda var-yox .**

**( 3 ) Kimə izhar eyləyim bilmən bu pünhan dərdi kim,**
**Var yüz min dərdi-pünhan, qüdrəti-izhar yox.**

**( 4 ) Dövr sərməsti-şərabi-qəflət etmiş aləmi,**
**Bunca sərməstin tamaşasinə bir huşyar yox.**

**( 5 ) Xəlqi mədhuş eyləmiş xabi-şəbi-tuli-əməl,**
**Sübh təhqiqi-əlamatinə bir bidar yox.**

**( 6 ) Surəti ziba sənəmlər yox demən bütxanədə,**
**Var çox, əmma sənə bənzər büti-xunxar yox.**

**( 7 ) Ey Füzuli, səhldir hər qəm ki, qəmxarı ola,**
**Qəm budur kim, məndə min qəm var, bir qəmxar yox.**

Beyt 1: **Ləblərin tək ləl, ləfzin tək düri-şəhvar yox,**
**Ləlü gövhər çox, ləbin tək ləli-gövhərbar yox.**

Sözlük: Düri-şəhvar = şaha layiq dürr = qiymətli mirvari; ləli-gövhərbar = gövhər yağdıran ləl.

Nişanə 1: "Ləb" – yoxu var edən, yaxud fiziki mahiyyəti bir ölü kimi fəaliyyət qabiliyyətindən ayırıb mənəvi mahiyyəti üzə çıxaran ilahi ilhamdan nişanədir.

Nişanə 2: "Ləl ":

A – ilahi ilhamın mənasını təlqin edən nişanədən ibarətdir.

B – qırmızı olduğuna görə dünyəviliyə qələbə göstərən mənəvilikdən nişanədir.

P – zavalsız olduğuna görə əbədiyyət səbəblərindən nişanədir.

Nişanə 3: "Ləfz " – ləbin məhsulundan, yaxud ilahi ilhamdan nişanədir.

Nişanə 4: "Ləli-gövhər" – ikinci misrada zavalsız dünyəvi dəyərlərdən nişanədir.

Anlam:

A – Ey gözəl məhbub, mənəvi hal-həyat ilə iç aləmi dirildən ilhamların kimi tükənməz sərvət tapılmaz.

B – Arif insanın yeganə yaraşığı ilahi cazibələrdən ibarətdir.

Beyt 2: **Səndən etmən dad "cövrün var, lütfün yox" deyib,**
**Məsti-zövqi-şövqünəm, birdir yanımda var-yox .**

Nişanə 1: "Cövr " – aşiqi ilahi sınaqlarda tərbiyə edib – yetişdirən qəbzlər – həarətlərdən ibarətdir.

Nişanə 2: "Lütf " – fürsətli şühud, yaxud davam etdirilmiş müşahidə məqamından ibarətdir.

Nişanə 3: "Məst" – çöl dünyası da iç aləmi kimi mənəvi əhvali-ruhiyyəyə məğlub olmuş aşiqdən ibarətdir. Belə bir aşiqin vücudu bəşəri iradədən boşalarkən ilahi iradə ilə dolmalıdır, demək onun əli yədullah, gözü eynullah və vücudu ayətullah olduğuna görə bütün əməllərinin mənşəyi mütəal məbudun öz istək – iradəsi olacaqdır.

**Qeyd**: *Məşhur ərəb pəhləvanı "Əmr ibn Əbdəvəd" özünü mövla Əli qılıncına giriftar görcək o həzrətin mübarək surətinə ağzının suyunu atdıqda həzrət mübarizədən əl götürüb o məlunu azad edir, demək əgər o kafirin ədəbsizliyi həzrətin şəxsi – bəşəri iradə və qəzəbini azda olsa oyatsaydı mövla onu azad etməklə o müharibəni bəşəri iradədən təmizə çıxardardı. Həzrəti Mövləvi belə bir ilahi vücuda çevrilmiş bəşəri vücudun cihad etmək vəsfində belə demişdir:*

گفت من تیغ از پی حق می زنم          بنده ی حقم نه مامور تنم

چمن در آمد در میان غیر خدا          تیغ را دیدم نهان کردن سزا

Nişanə 4: "Zövq ":

A – mükaşifə səmərəsindən ibarətdir.[1]

B – şühud məqamının birinci dərəcəsindən ibarətdir.

**Qeyd**: *Zövq həm vüsal nailyyətini həm də hicran həbsini dadmalıdır.*

Nişanə 5: "Şövq " – zövqdən sonra törənmiş müşahidə tələbindən ibarətdir, belə bir tələb fiziki mahiyyəti tədricən unutmaqla mənəvi mahiyyəti üzə şıxaran tələbdir.[2]

Nişanə 6: "Birdir yanımda var-yox " – var-yoxun bir olması vəhdət nailiyyətindən nişanədir.

**Qeyd** 1: *Var bir söz, yox başqa söz olduğuna görə, var – yox ikilikdən nişanədir, bunun üçün də vəhdət məqamına nail olmuş bir şəxs var ilə yoxu bir bilməlidir.*

**Qeyd** 2: *Var ilə yoxu bir bilmiş aşiqin nəzərində cəfa ilə vəfanın bir olması aydındır, elə bu xüsusda Mövləvi buyurmuşdur:*

[3] عاشقم بر قهر و بر لطفش بجد          بو العجب من عاشق این هر دو ضد

Anlam: Ey həkimi-məhbub, sənin cövrün də lütfün kimi aşiqi yetişdirib onu kamal nailyyətinə hazırlamağa gərəkli olduğuna görə istəməli və hörmətlidir.

**Qeyd**: Cövr və cəfa, mənəvi mahiyyətə yoxsa məstlik məqamına yüksəlmiş vücuda əsər etməkdən acizdir.

Beyt 3: **Kimə izhar eyləyim bilmən bu pünhan dərdi kim,**
**Var yüz min dərdi-pünhan, qüdrəti-izhar yox.**

Nişanə 1: "Dərd" – qürb ünvanlı yaxınlıqdan hasil olmuş iç aləmi ləkələrdən təmizləyən bəla – müsibətə asılı nemətdən ibarətdir.[4]

**Qeyd**: *Uzaqlıqdan hasil olmuş dərd, mənfilik və başı aşağılıq nişanəsidir.*

Nişanə 2: "Qüdrəti izhar yox" – "nitqim tutulur qönçeyi-xəndanını görcək" misrasını təsdiq etmiş əqli-idrakı aciz qoyan heyrət ünvanlı mərtəbədən ibarətdir.

Anlam: Əql ilə idrak, yaxud dünyəvi mahiyyət ilahi mərifətdən törənmiş tələb - ətəş dərdini düşünüb – bəyan etməkdən acizdirlər.

---

[1] Qəzəl 36, beyt 3
[2] Qəzəl 60, beyt 1
[3] Məsnəviyi-mənəviyi-Mövləvi,dəftər əvvəl, beyt 1612
[4] Fərhəngi-istilahat və təbirati ürfani.

Beyt 4: **Dövr sərməsti-şərabi-qəflət etmiş aləmi,**
**Bunca sərməstin tamaşasinə bir huşyar yox.**

Sözlük: Dur = dövr = əsr = zəmanə; sərməst = sərxoş; huşyar = huşlu.

Anlam: müxtəlif məcazi cazibələrlə sərxoş olmuş insanları qəflət yuxusundan oyatmağa bir ayıq insan axtaran yoxdur.

Beyt 5: **Xəlqi mədhuş eyləmiş xabi-şəbi-tuli-əməl,**
**Sübh təhqiqi-əlamatinə bir bidar yox.**

Sözlük: Mədhuş = heyran = sərgərdan; xab = yuxu; şəb = gecə; tuli-əməl = şox arzu etmək; təhqiq-əlamat = həqiqi əlamətlər; bidar = ayıq = oyaq

Nişanə: "Sübh təhqiqi əlaməti" – tovhid günəşindən parlayan cilalardan ibarətdir.[1]

Anlam: Ötən beyti davam etdirmək məqsədilə buyurur: Dünyəvi arzular cəmaəti elə məşğul etmişdir ki, onlar açıq-aşkar mənəvi cilalardan qafil olmuşlar.

Beyt 6: **Surəti ziba sənəmlər yox demən bütxanədə,**
**Var çox, əmma sənə bənzər büti-xunxar yox.**

Sözlük: Bütxanə = bütxana = büt evi

Nişanə 1: "Bütxanə " – bu beytdə mənəvi imkanlı müqəddəs məkanlardan, yaxud mürşidlər məktəbindən, ya da bəşəri camalda ilahi hüsnlər əks etdirmiş gözəllər əncümənlərindən ibarətdir.

Nişanə 2: "Büti-xunxar " – Dünyadan çıxmış bir insan kimi aşiqi dünyəvi ilgilər örpəyindən qoparan, həm də onun özünü öz qanılə yuyub paka çıxaran mütəal məhbubdan ibarətdir.[2]

Anlam: Ey mütəal məhbub, insanı mənliyindən ayırıb heyran etmiş gözəl çoxdur, lakin sənin kimi cövrü, lütfü ilə fərqsiz gözəl yoxdur.

**Qeyd**: *Öz aşiqini gah cövr, gah lütf ilə həqiqi kamala nail edən dilbər yalnız sənsən.*

Beyt 7: **Ey Füzuli, səhldir hər qəm ki, qəmxarı ola,**
**Qəm budur kim, məndə min qəm var, bir qəmxar yox.**

Sözlük: Səhl = asan; qəmxar = qəminə ortaq olan adam

---

[1] Qəzəl 1, beyt 1
[2] Qəzəl 40, beyt 4

Nişanə 1: "Qəm" – mütəal məhbub tələbində çalışqanlıqdan nişanədir.

Nişanə 2: "Qəmxar" – iman əhlinə müxtəlif mənəvi kamallar feyzini yağdıran "rəhim" sifətli mütəal məbuddan ibarətdir.

Anlam: Ey Füzuli, bəstlər ümidi ilə qəbzlərə dözmək asan bir dərddir, əfsus ki, mən bəstsiz də qəbz dərdinə giriftar olmuşam .

**Qeyd**: *"Yox" rədifi, mütəal məbuddan başqasını inkar etməklə bu qəzəlin tamamilə vəhdət məqamına aid olmasını təlqin etmək istəyir.*

## Q Ə Z Ə L 64

(1) Gərmdir şamü səhər mehrinlə çərxi-lacivərd,
Cəh sirişki al edər izhar, gəh ruxsari-zərd.

(2) Sübhə bənzər aşiqi-sadiq demən aləmdə kim,
Bir nəfəs keçməz ki, çəkməz suzi-dildən ahi-sərd.

(3) Yaxşı sanma ey könül, əhli-xirəd ətvarini,
Olma qafil, eşq dərdindən yaman olmaz bu dərd.

(4) Mümkün olduqca fələk mənsubəsindən qıl həzər,
Nişə kim, xali degil bidar nəqşindən bu nərd.

(5) Zülməti-qəm iztirabın çəkməz ol azadə kim,
Hər təəlüqdan ola xurşid tək aləmdə fərd.

(6) Ey Füzuli, kəsmə ol məhvəş vüsalindən ümid,
Səbr qıl kim, dövr dövrani degil bihudəgərd.

Beyt 1: **Gərmdir şamü səhər mehrinlə çərxi-lacivərd,**
**Gey sirişki al edər izhar, gəh ruxsari-zərd.**

Sözlük: Gərm = rövnəqli = məhəbbətli = isti; mehr = məhəbbət = günəş; gəy = gah; sirişk = göz yaşı; ruxsari-zərd = saralmış üz.

Nişanə 1: "Şam" – bu beytdə xəcalətdən qızarmış üzü təlqin edən şəfəqdən ibarətdir.

**Qeyd**: Şəfəq göyün gün batan çağı qırmızılaşmasıdır.

Nişanə 2: "Şamü-səhər" – gecə və gündüz ünvanlı zaman ölçü vahidinin əvvəlini və axırını (bütövlüyünü) təlqin edən nişanədir.

Nişanə 3: "Mehr" – "قد انار العشق للعشاق منهاج الهدا" misralarda deyildiyi kimi, bütün varlığın tovhid günəşinin nuruna bağlı olduğuna eyham edən nişanədir.

Nişanə 4: "Çərxi-lacivərd" – ədəbi "məcaz" cəhətindən göy sakinlərinə eyham edən səmavi kürələrdən ibarətdir.

Nişanə 5: "Sirişki-al" – məcazi əngəlin varlığı yuyub – batil etməyinə eyham edən şam ünvanlı birinci nişanənin təkrarından ibarətdir.

Nişanə 6: "Ruxsari-zərd" – səhərin açılmasını təlqin edən istiarədir, ancaq can vermək, yaxud həyatı dəyişməkdən, yəni dünyəvi həyat qurbanlığında mənəvi həyata yetişməyin müqəddiməsindən, həm də ilahi nemətlər önündə xəcalət çəkməkdən nişanədir.

Anlam: A – Ey mehriban məbud, göy sakinləri, yaxud müqəddəs ruhlar, ya mələklər və digər ülvi mücərrəd mövcudiyyət dəmbədəm sənin parlaq camalından nur almaqla aşiqanə həyat sürməklə məşğuldurlar.

B – Ey mütəal məhbub, yer – göy, yaxud bütün dünya sənin rəhmətindən nur və hərarət almaqla ilahi eşq bazarını rövnəqləndirmişlər.

P – Ey mütəal məhbub, dünya sənin nari-məhəbbətindən[1] nur və hərarət almaqla həyatını davam etdirir.

T – Ey mehriban məhbub, bütün dünya sən ehsan etdiyin dünyəvi və mənəvi ehsan qarşısında xəcalətdən qızararkən şükür etmək acizliyində, yaxud can vermək astanasında saralır.

S – Ey mehriban məbud, dünya mövcudluğunu davam etdirən yalnız sənin eşqindir.

**Qeyd**: *Beyt səmavi cansız kürələri, yaxud bütün cansız yaranmışları canlılar kimi təsbih etmək məşğuliyyətinə[2] eyham edərək onların ilahi nari-məhəbbətə yetişərkən şükr etmələrini göstərmət istəyir.*

---

[1] Qəzəl 9, beyt 3
[2] Qəzəl 4, beyt 1, (təsbih)

Beyt 2: **Sübhə bənzər aşiqi-sadiq demən aləmdə kim,**
**Bir nəfəs keçməz ki, çəkməz suzi-dildən ahi-sərd.**

Sözlük: Suzi-del = ürək yanğısı = yanıq ürək; ahi-sərd = soyuq ah

Nişanə 1: "Suzi-dil" – fəna mərtəbəsinə müqəddimə törədən "hərq" ünvanlı orta təcəllidən ibarətdir. [1]

Nişanə 2: "Ahi-sərd" – şühud nurunun, yaxud təcəlla mərhələsinin sürətlə bitməsindən hasil olmuş məyusluqdan ibarətdir.

Anlam: Bəst müddəti, yaxud təcəlla nailiyyəti ilk sübh[2] kimi sürətlə sovuşmaqla qəlbimi məyusluq müsibətinə giriftar etdi.

Beyt 3: **Yaxşı sanma ey könül, əhli-xirəd ətvarini,**
**Olma qafil, eşq dərdindən yaman olmaz bu dərd.**

Sözlük: Əhli-xirəd = əql əhli, ətvar = yollar = rəsmlər = təriqətlər.

Nişanə: "Xirəd ətvarı" – dünyaşünas əqlin nişan verdiyi yollardan ibarətdir.

**Qeyd**: *Əql ətvarında isə eşq ətvarı kimi*[3] *müxtəlif enişlər, yoxuşlar və təhlükələrə qarşı durmaq qəti bir haldır.*

Anlam: Əql dünyasında da eşq aləmi kimi müəyyən müşküllər – müsibətlər var, ancaq əql ilə əlaqədar çətinliklərə dözmək eşq ilə bağlı bəlalara dözməkdən:

A – çox asandır.

B – başı aşağılıq və həqirlik əlamətidir.

**Qeyd**: *Dönə - dönə xatırladığımız kimi əhli-xirəd dünyaşünas əqli kamal zirvəsinə yüksəlməyə qənaətbəxş bilmişlər. Halbuki, əql yalnız dünyəvi təcrübələr, yaxud maddi mərifətlər qazanmağa qadirdir, beləliklə, ilahi kamal, yaxud mənəvi mərtəbələr tanışlığı əql çərçivəsindən xaricdir.*

Belə bir dərin bəhsi araşdırıb – aydınlatmaq məqsədilə fəlsəfə də ürfan kimi müxtəlif izahlar aparmış, o cümlədən Bergsen adlı filosof zənn etmişdir ki: "...Nisbi həqiqətlər tanışlığının məişət keçirməyə qənaətbəxş olduğu, beləliklə, məişətin mütləq həqiqətlər idrakı ilə əlaqəsizliyi, yaxud fiziki həyat müşküllərinə qalib gəlməyin mütləq həqiqətlər dərki ilə mərbut olmamağı məlum edir ki, əql mqtləq həqiqətləri idrak etmək məqsədilə insana verilməmiş bəlkə də məişət keçirmək və həyat sürmək vəsiləsi kimi ona bağışlanmışdır,... belə ki,

[1] Qəzəl 46 , beyt 3
[2] Qəzəl 54, beyt 6
[3] Qəzəl 13, beyt 1

heyvanlar həyat sürmək məqsədilə caynaq, diş, buynuz, zəhər yaxud başqa şeylərdən fitri surətdə bəhrələnirlər,... lakin o vəsilələr insana ya verilməyib, ya da çox zəif və naqis verilmişdir, beləliklə, fitri vəsilələr insanın məişət keçirməyinə qənaətbəxş olmazlığına görə ona orta əql ünvanlı fitri naqislikləri təshih edən vəsilə bağışlanmışdır. Demək əql, həqiqətləri idrak etmək məqsədilə insana verilməyib, bəlkə məişət tədbirinə görə ona hədiyyə olunmuşdur və buna görə də maddi zəminlərə əməl etmək əqlin əsas işindən ibarətdir. Beləliklə, əql həyat sürüb – məişət keçirməyi asan etmək məqsədilə mahir bir düzəldici kimi müxtəlif əl aləti və vəsilə düzəltməyi insana təlim etmək istəyir, bunun üçün də insana "Natiq[1] heyvan" əvəzinə "Sane heyvan" da demişlər, nəhayət, həqiqətləri idrak etmək, mükaşifə[2], həm də müraqibə[3] ünvanlı iç aləmi görməyə qadir olan, yaxud canı müşahidə edən qüvvə ilə mümkündür.[4]

**Qeyd**: İlahi eşq qeyri maddi aləm ilə əlaqədardır və “qeyri maddi aləmi axtarmaq mövcud bir aləmi axtarmaqdan ibarətdir ki, onunla əlaqədar araşdırmaların mövcudluğunu dərk etmək heç bir elm və təcrübə ilə mümkün deyildir.[5]

Beyt 4: **Mümkün olduqca fələk mənsubəsindən qıl həzər,**
**Nişə kim, xali degil bidar nəqşindən bu nərd.**

Sözlük: Mənsubə = nəsəb olunmuş = iş tapşırılmış = nərd oyunlarının biri = şətrəncin ilk oyunu = şətrənc səhifəsi; həzər = pərhiz etmək = saqınmaq.

Nişanə 1: "Fələk mənsubəsi " – mənəvi mərtəbələr tanışlığını mümkünsüz edən dünyəvi iqtidar – etibarlar məşğuliyyətindən ibarətdir.

Nişanə 2: "Bidar nəqşi " – dünyəvi üstünlüklərin etibarsızlığını, həm də mənəvi məqamların məhrumluğunu təlqin edən nişanədir.

Anlam: Dünyəvi mərtəbələr məhdudluğunda, mənəvi maraqlardan məhrum qalmış bir insan özü – özünə zülm etmişdir.

**Qeyd** 1: "Güvən" və "fəsad" ünvanlı dalbadal icad olub zay olmaq maddənin qəti xasiyyəti olduğuna görə, maddi dünyanın məqamları da özü kimi səbatsızlığa məhkumdur, elə buna görə də ustad Şəhriyar digər

---

[1] Sane = düzəldici
[2] Qəzəl 1, beyt 1, nişanə 2
[3] Müraqibə-dünyəvi məşğulluqlardan qəlbi mühafizə edən, yaxud onu ibadət ilə xalisləşdirən qüvvədən ibarətdir.
[4] "Seyri-hikmət dər Aropa", Muhəmməd Əli Foruği, cild 3, s.293-298
[5] Yustos Hartnak" Nəzəriyyeyi-mərifət dər fəlsəfeyi-Kant", mütərcim:Qulam Əli Həddad Adil, 1-ci nəşr, 1376, s.31

adlım şairlər və ariflər kimi dünyanı vəfasız, həm də yalançı göstərmək məqsədilə buyurmuşdur:

Heydərbaba, dünya yalan dünyadı,
Süleymandan, Nuhdan qalan dünyadı,
Oğul doğan dərdə salan dünyadı ,
Hər kimə ki, hər nə verib alıbdı,
Əflatundan bir quru ad qalıbdı.

**Qeyd** 2: "Güvən" arxasınca gələn "fəsad"a görə Mövləvi hər bir dikəlməklə süqut etməyi qəti göstərmək məqsədilə maddi həyatı bir nərdivana təşbih etmişdir ki, özünü onun axır pilləsinə qaldırmış bir şəxsin süqut etmək zamanı ən xətərnak bir zamandır:

نردبان خلق این ما و منیست عاقبت این نردبان افتا دنیست
[1] هر که بالاتررود ابله ترست کاستخوان او بتر خواهد شکست

**Qeyd** 3: *Maddi dünyadan mənəvi seyr yolunda bir xidmətçi kimi istifadə edib özünü ilahi məqsədə çatdırmaq məqsədilə dünyəvi imkanlarla təchiz olmuş bir insan məcazi dünyanın "güvən" ünvanlı icad cəhətindən istifadə edərkən onun müsbətlik və vəfadarlığını nişan vermiş, elə buna görə də müqəddəs şəri dünyanı axirətin əkinliyi olduğunu buyurmuşdur.*

**Qeyd** 4: *Dünyanı təhqir etmək onun fəsad cəhətindən xəbərsizləri, yaxud özünü məhz maddilikdə məhdud edən kəsləri təhqir etməkdən ibarətdir.*

Beyt 5: **Zülməti-qəm iztirabın çəkməz ol azadə kim,**
**Hər təəlüqdan ola xurşid tək aləmdə fərd.**

Sözlük: Təəllüq = asılmaq = ürək bağlamaq = hər bir şey ki, onunla əlaqə saxlamaq mümkündür; xurşid = günəş

Nişanə 1: "Zülməti qəm iztirabı" – qəbzlər – qəzəblər çətinliklərini eyham edən dünyəvi həyat müşküllərindən ibarətdir.

Nişanə 2: "Azadə" – mütəal məhbub yardımçılığı ilə maddi dünya qurmuş tordan, həm də mənəm-mənəmlik caynağından can qurtarıb özünü ilahi sifətlərdə fəna etmiş aşiqdən ibarətdir.[2]

Nişanə 3: "Təəllüq" – dünyəvi ilgilərdən, yaxud məcazi ürəyə yatan şeylərdən ibarətdir.

---

[1] Mövləvi, dəftər 6, beyt 2782
[2] Doktor Mənuçöhr Daneşpejuh, Fərhəngi-istilahati-ürfani

Nişanə 4: "Fərd" – fərdilik dünyəvi bağlantıları qat – qat soyub tökməklə mücərrədlik, yaxud bəsitlik məqamına yetişməkdən ibarətdir.[1]

Anlam: Maddi təəlüqlərdən özünü azad etmiş bir insan həm dünyəvi, həm də mənəvi müşküllərdən azad yaşamalıdır.

**Qeyd**: İlahi eşq aləmində acılıqlar şirin olduğuna görə müşküllər də ürəyə yatandır, buna görə də beyt dünyəvi müşküllərin məhv olmasını təkidlə təlqin etmək istəyir.

Beyt 6: **Ey Füzuli, kəsmə ol məhvəş vüsalindən ümid,**
**Səbr qıl kim, dövr dövrani degil bihudəgərd.**

Sözlük: Məhvəş = mah camal = mahparə = gözəl; dövr = ruzgar = əsr; dövran = dolanmaq; bihudəgərd = faydasız dolanan = nəticəsiz hərəkət

Nişanə 1: "Məhvəş" – maddi qara kəsrətdə mənəvi parlaq camalını əks etdirmiş vahid məbuddan ibarətdir.

Nişanə 2: "Vüsal" – aşiq ilə məşuq arasındakı fasiləin yox dərəcəyə çatmağından, yaxud nəhayətə çatmış "qürb" məqamından ibarətdir.

Nişanə 3: "Bihudəgerd" – səmavi kürələr, həm də yer üzərində yaranmış canlı – cansız mövcudlar, demək irili-narınlı busbütün kainat, maddi aləm sahəsində müəyyən iş aşırmaqla məşğuldurlar, buna görə də demişlər ki:

قطره ای کز جویباری می رود          از پی انجام کاری می رود

Quran icmalçıları " يسبّح لله ما فی السماوات و ما فی الارض الملک القدس العزيز الحکيم"[2] ayəsinə əsaslanaraq hətta cansız yaranmışları mütəal məbuda "Təsbih" [3] edici təfsir edərkən onların bir çoxu "Jan Mari Gyui" bəyan etdiyi fəlsəfi nəzər kimi [4], cansız vücudların ibarə və cümlə ilə təsbih etməsinə, yaxud özəl bir can sahibi olmalarına nəzər yetirmişlər, elə o cür də beyt fəzada gərdiş edən ulduzları, həm də yer üzərində yaranmış fenomenləri müxtəlif çeşidlərdə müəyyən hərəkətli olduqlarına görə [5] müəyyən işlər aparmağa təlqin etmək istəyir. Ədəbiyyatda bu haqda sakit qalmamışdır, o cümlədən Sədi belə buyurmuşdur:

ابرو بادو مه و خورشيد و فلک درکارند          تاتو نانی به کف اری و به غفلت نخوری [6]

---

[1] Qəzəl 12, beyt 1

[2] Göylərdəki mövcudluqlar, həm də yer üzərindəki bütün yaranmışlar Allahdandır, o Allah ki, pak, əziz, həkim və sultandır:" Cümə" surəsi, ayə 1

[3] Təsbih = Allahın adını zikr etmək = “sübhanallah” demək

[4] Qəzəl 4, beyt 1

[5] Qəzəl 1, beyt 1 (hərəkət və yeniləşmək)

[6] Gülüstani-Sədi, dibaçə hissəsi

Demək bütün yaranmışlar, həm birlikdə həm də tək-tək iş aparmaqla həyata və nəhayət insanlara xidmətçi olduqlarını sübut edirlər, beləliklə xidmətçi olub xəbər yetirmək:

A – "Şükür "ünvanlı ürfani dərin bəhslər icad etmişdir.

B – "İbrət "ünvanlı elmi və dini araşdırmalara daxil olmuşdur.

P – "Vəhdət "ünvanlı fəlsəfi – ürfani cahanşümulluğu geniş surətdə izah etmişdir.

T – "Təklif "ünvanlı dini – fəlsəfi təhqiqlərlə dünyəvi təhlükələrdən nicat tapmağı yalnız "Ələst" [1] aləmində bağlanmış əhdə vəfa etməkdə, yaxud ələsti vəzifəşünaslığın əsası bilmişdir, beləliklə, bütün ilahi təbliğlərin əsas hədəfi vəzifəşünaslıqdan ibarətdir, elə buna görə də, fəlsəfə din ilə ortaqlaşıbdır. "Kant" etiraf etmişdir ki: "Bir müddət yuxuda həyat sürərkən mənfəət götürməyi yaşayışın yeganə hədəfi zənn edirdim, o zaman ki, oyandım, onun çətinliyini yeganə hədəf gördüm.[2]

S – "Həblillah" ünvanlı üfani bəhsə dair Əflarun bütün kainatın görünməz ilahi riştəyə olduğunu bağlı sübut etmişdir.[3] Bu riştə ilə mənəvi hərəkət etmək, yaxud ilahi iradə tabeliyi "təklif" ünvanilə qeyd etdiyimiz vəzifəşünaslıqdan ibarətdir.

Anlam: Ey Füzuli, dünya öz bütövlüyündə və genişliyində təfərrüatında imtahanedici olduğuna görə dünyəvi sərki və təhqirlər, habelə digər müşküllər önündə dözüm göstərmək, həm də qəbz və qəhr kimi mənəvi çətinliklərə dünyəvi ömür fürsətində səbr etmək, insanı ilahi məqsədə nail edən dəyərli bir sifətdir.

**Qeyd**: Dünya dərin bilgili vəzifəşünas insanlarla dost olaraq nadan şəxslərlə düşməndir.

---

[1] Qəzəl 19, beyt 4
[2] Muhəmməd Əli Foruği, Seyri-hikmət dər Aropa, cild 2, d.274
[3] Verniger, Paydya, cild 3, s.1234

## Q Ə Z Ə L 65

**(1) Nalədəndir ney kimi avazeyi-eşqim bülənd,**
**Nalə tərkin qılmazam mütləq kəsilsəm bənd-bənd.**

**(2) Qıl mədəd, ey bəxt, yoxsa kami-dil mümkün degil,**
**Böylə kim ol dilrüba bidərddir, mən dərdmənd.**

**(3) Dağlərdir odlu könlümdə qarası qopmamış,**
**Ya səbati- eşq üçün od üzrə bir neçə sipənd.**

**(4) Açılır könlüm gəhi kim giryeyi-təlxim görüb,**
**Açar ol gülrux təbəssüm birlə ləli-nuşxənd.**

**(5) Xaki-rahindən məni qaldıra bilməz sayə tək,**
**Qılsa gərdun afitabın hər şuaın bir kəmənd.**

**(6) Cam tut der, saqiye-gülçöhrə, zahid, tərki – cam,**
**Ey könül, fikr eylə, gör kim, qansıdır tutmalı pənd.**

**(7) Ey Füzuli, surəti-fəqrin qəbuli-dustdur,**
**Hiç dərvişi sənin tək görmədim sultanpəsənd.**

Beyt 1: **Nalədəndir ney kimi avazeyi-eşqim bülənd,**
**Nalə tərkin qılmazam mütləq kəsilsəm bənd- bənd.**

Sözlük: Avazə = şöhrət = səs

Nişanə 1: "Nalə" – A – ətəş atəşində alovlanmış ürəyin özəl münacatından ibarətdir.

B – aşiqin öz möhtaclığını etiraf etməyindən nişanədir.

P – mənəvi seyrlərə maneə törətmiş maddi əngəllərdən, xüsusilə, fiziki mahiyyətdən şikayət etmək nişanəsidir.

T – mütəal məhbub ilə dərdi-dil etməkdən nişanədir.

Nişanə 2: "Ney" – mənəvi ölməz həyata dübarə malik olmaq məqsədilə, yaxud namütənahi əslə qayıtmaq fikri ilə dünyəvi həyat ilgilərindən boşalmağa cəhd etməkdən nişanədir.[1]

**Qeyd**: *Budda, boş vücudu "şonya" ünvanlı ürfani mərtəbəyə yüksəlməklə ilahi məqsədə çatmağa hazırlaşmış bilir.*[2]

Nişanə 3: "Avazeyi-eşq" – ilahi vasitələri, yaxud ülvi aləm sakinlərini aşiqlə tanış etmək nişanəsidir.

Nişanə 4: "Bənd – bənd":

A – dünyəvi vücud bütövlüyünə eyham edən nişanədir.

B – dünyəvi mahiyyətdən hacətsiz bir vücuddan nişanədir.

P – neyin yeddi bəndinə eyham edən nişanədir.

T – Namaz qılanda maddi əngəl vücudun bütövlüyünü unutmaq məqsədilə yeddi üzvün yerə qoyulmasından nişanədir.

Nişanə 5: "Bənd – bənd kəsilmək" – sərkilər önündə, yaxud qəbzlər qarşısında dözüm göstərməkdən nişanədir.

Anlam: Mənəvi mərtəbələr tanışlığına yetişən ürək münacatını mən içgəncəli məlamətlər, yaxud qəbzlər önündə tərk etmərəm.

Beyt 2: **Qıl mədəd, ey bəxt, yoxsa kami-dil mümkün degil,**
**Böylə kim ol dilrüba bidərddir, mən dərdmənd.**

Nişanə 1: "Bəxt" – ilahi cazibələrə mübarizəsiz yetişməkdən, yaxud mütəal məbudun özəl ehsanından bəhrələnməkdən nişanədir.

Nişanə 2: "Kami-dil" – aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəyə çatmasından, yaxud "qürb" ünvanlı ilahi yaxınlaşmanın davam etməyindən nişanədir.

Nişanə 3: "Bidərd" – mütəal məhbubun istiğna ünvanlı "səmədiyyət" sifətindən nişanədir.[1]

---

[1] Qəzəl 1, beyt 2.

[2] Xəllaqiyyət, uşu, tərcümə Mərcan Lütfət, s.120

Nişanə 4: "Dərdmənd" – bu beytdə ətəş atəşilə iç aləmini paka çıxarmış aşiqdən ibarətdir.

Anlam: İlahi ehsansız kamal, yaxud vüsal nailiyyəti mümkünsüzdür.

Beyt 3: **Dağlərdir odlu könlümdə qarası qopmamış,**
**Ya səbati-eşq üçün od üzrə bir neçə sipənd.**

Sözlük: Sipənd = üzərrik.

Nişanə: "Dağ " – bu beytdə aşiqin qəlbinə girmiş ilahi nişandan ibarətdir.

Anlam: Ürək həyatımı müxtəlif afətlər önündə mühafizə edən yalnız eşq atəşidir.

**Qeyd**: Afət – qəlbi seyr yolundan qoyan məlamətçilər, dünyəvi ilgilər, əqli keyfiyyətlər və başqa məcazi əngəllərdən ibarətdir.

Beyt 4: **Açılır könlüm gəhi kim giryeyi-təlxim görüb,**
**Açar ol gülrux təbəssüm birlə ləli-nuşxənd.**

Sözlük: Gəhi kim = o vaxt ki; giryeyi təlx = acı ağlamaq; gülpux = gül üzlü = gözəl; nuşxənd = şirin gülümsəmək = şirin təbəssüm; ləli-nuşxənd = şirin dodaq.

Nişanə 1: "Açılır könlüm" – könlün açılmağı qəbzə giriftar olmuş qəlbin bəst duyumuna yetişmək ləhzəsindən nişanədir.

Nişanə 2: "Giryeyi-təlx" – qəbz çətinliyilə əlaqədar biqərarlıqdan nişanədir.

Nişanə 3: "Gülrux" – ürək açan şühud nurunu ehsan etmiş mütəal məhbubdan nişanədir.

Nişanə 4: "Təbəssüm" – müxalifətçilikdən sonra müvafiqət etməkdən nişanədir.

Nişanə 5: "Ləli nuşxənd" – mütəal məbudun razılıq göstərmək nişanəsidir.

Anlam: Mütəal məhbub ağlar günə qalmağıma təbəssüm edir, ya da öz razılığını göstərir.

**Qeyd**: Ağlar günə qalmaq öz məmlüklüyünü dərk etmiş aşiqin çarəsiz ətəşindən, həm də yetişkənlik müqəddiməsindən nişanədir.

Beyt 5: **Xaki-rahindən məni qaldıra bilməz sayə tək,**
**Qılsa gərdun afitabın hər şuaın bir kəmənd.**

---

[1] Qəzəl 30, beyt 3.

Sözlük: Xak = torpaq; rah = yol; gərdun = fələk = ruzgar; aftab = günəş

Nişanə 1: "Xaki-rah" – məmlüklük (bəndəlik) məqamından nişanədir.

Nişanə 2: "Gərdun" – bu beytdə dünyəvi iqtidardan nişanədir.

Nişanə 3: "Aftab" – bu beytdə dünyəvi etibardan nişanədir.

Anlam: Yer üzərindən kölgəni qoparmaq imkanı olmayan kimi eşq ərəfəsindən də məni qaytarmaq mümkünsüzdür.

**Qeyd**: *Beyt, mənəvi mərifətə nail olmuş aşiqin sarsılmazlığını təlqin edərək mənəviliyi dünyəvilikdən üstün və iqtidarlı bəyan etmək istəyir.*

Beyt 6: **Cam tut der, saqiye-gülçöhrə, zahid, tərki-cam,**
**Ey könül, fikr eylə, gör kim, qansıdır tutmalı pənd.**

Sözlük: Gülçöhrə = gül çöhrəli; pənd = nəsihət

Nişanə 1: "Cam" – mənəvi cəlaləri əks etdirmiş maddi vücuddan, yaxud bəşəri ilgilərdən boşalıb ilahi maraqlarla dolmuş mürşid ürəyindən, ya da məhz mənəvi ziyalardan ibarətdir.

Nişanə 2: "Saqi" – bu beytdə mənəvi feyzlər bağışlayan ilahi vasitələrdən nişanədir.

Nişanə 3: "Gülçöhrə" – şühud nurunu ehsan etməklə ürəyə bəst bağışlayan gözəl məbuddan nişanədir.

Nişanə 4: "Zahid" – bu beytdə dünyaşünas əqli yüksək insanlıq səviyyəsinə qaldıran əsas səbəb bilib[1] eşq hidayətini yerli – dibli inkar etmiş müddəidən ibarətdir.[2]

Anlam: Zahid, yaxud əqldən dəm vuran rəhbər, mütəal məbud sifətlərini dəlillərdə tərifləmək, tanımaq və tanıtdırmaq istəyir, lakin mürşid, yaxud eşq rəhrəri özünün, həm də başqalarının qəlbini – vücudunu güzgü məqamına çevirməklə onlarda ilahi sifətləri təzahür etdirir. Deməк, görməyin eşitməkdən əla olduğu aşiqin zahiddən üstünlüyünü sübut edir.

Beyt 7: **Ey Füzuli, surəti-fəqrin qəbuli-dustdur,**
**Hiç dərvişi sənin tək görmədim sultanpəsənd.**

Sözlük: Fəqr = fağırlıq = yoxsulluq; pəsənd = sevib – seçmək.

---

[1] Qəzəl 10, beyt 2
[2] Qəzəl 64, beyt 3

Nişanə 1: "Fəqr" – mütəal məbudun sonsuz iqtidarına mərifət yetirmiş aşiqin öz möhtaclıq və məmlüklüyünü etiraf etməyindən ibarətdir. [1]

Nişanə 2: "Surəti-fəqr" – öz məmlüklüyünü düşünmüş aşiqin malik məhbuba layiq bir əməl – ibadət edə bilməməzliyini təlqin edən nişanədir.

Nişanə 3: "Dust" – dünya və axirət nemətlərini mütəal məhbub eşqində fəda etməkdən ibarətdir.

Nişanə 4: "Dərviş" – fəqr nailiyyətində bəşəri iradədən boşalıb ilahi iradəyə dolmuş aşiqdən ibarətdir.

**Qeyd**: Dərviş kəlməsinin əsas kökü qapılardan asılı dilənçi mənalı "dərviz" kəlməsi olduğuna görə, mütəal məhbub ərəfəsindən asılı aşiqə, yaxud ülvi aləmdən dilənçilik edən məmlükə “dərviş” demişlər.[2]

Nişanə 5: "Soltan" – bu beytdə "səmədiyyət"[3] sifətini təzahür etdirmiş mütəal məbuddan ibarətdir.

Anlam: Ey Füzuli, mehriban məbud ərəfəsində qəbulluğa çatmış naqis ibadət və iradətin sənin xoşbəxt bir dərviş olmağını məlum edir.

---

[1] Qəzəl 44, beyt 4

[2] Doktor Mənuçöhr Daneşpejuh, Fərhəngi-istilahati-ürfani

[3] Qəzəl 30, beyt 3

## Q Ə Z Ə L 66

**(1) Göz xətindən mərdümün məhv etmədən bulmaz murad,**
**Zaye eylər hüsnünü xəttin səvad üzrə səvad.**

**(2) Ola bilməz çini-zülfündən cüda göz mərdümi,**
**Cari olmuşdur bu adət türrəsiz olmaz midad.**

**(3) Könlün ahimdən tərəhhüm surətin göstərdi, leyk**
**Mövcdən su nəqşinə çox etmək olmaz etimad.**

**(4) Əşkü ahim nifrəti qət etdi eldən ülfətim,**
**Cizginən çevrəmdə ya girdabdır, ya girdbad.**

**(5) Keçdi təndən oxların, tənha qalıb dil, dəmdəbəm,**
**Nalələr eylər köçən həmdəmlərin etdikcə yad.**

**(6) Çaki-sinəmdən könül çıxdıqca şad olsam nola,**
**Öylə afətdən yaxasın qurtaran olmazmı şad?**

**(7) Şiveyi-şümşad qəddin görsə eylər bağiban**
**Etidali-sərvdən əlbəttə səlbi-etiqad.**

**(8) Qoyma naqis əhli-dərd içrə Füzulini, təbib,**
**Eylə bir dərman ki, dərdim edə gün-gündən ziyad.**

Beyt 1: **Göz xətindən mərdümün məhv etmədən bulmaz murad,**
**Zaye eylər hüsnünü xəttin səvad üzrə səvad.**

Sözlük: Xət = üzün ətrafındakı narın tük

Nişanə 1: "Xət ":

A – Xət birinci beytdə gözəl camal ətrafını almış örpəkdən, yaxud vəhdət nuruna hicab olmuş kəsrətdən nişanədir.

B – Xət ikinci misrada özünü hicab arxasından göstərmiş camaldan ibarətdir.

Nişanə 2: "Hüsn" – mütəal məbuda həsr olunmuş bir yerdə cəmləşən kamallardan ibarətdir.

Nişanə 3: "Səvad üzrə səvad" – hicabların əlavə olmasından, yaxud bütün kəsrətin "hail" ünvanlı maneə törətmiş cəhətindən ibarətdir.

Anlam: Aşiqin gözü ilahi gözəl camal ətrafında mənəvi cilvələrə maneə törətmiş hüsn cazibələrindən məhrum edən hicablar əlindən öz bəbəyini məhv etməkdən başqa heç bir murad tanımamaqdan ibarətdir.

**Qeyd**: *İkinci misra bəşəri gözəlliklərin zavala məruz qalmasına da eyham etmək istəyir.*

Beyt 2: **Ola bilməz çini-zülfündən cüda göz mərdümi,**
**Cari olmuşdur bu adət türrəsiz olmaz midad.**

Sözlük: Cüda = ayrı = uzaq; türrə = tel =alın üstünü almış tük = paltar zinəti = yağışın qabağını almış eyvan; midad = qara çernil = qaş qələmi = zinət qələmi = qələmçik

Nişanə 1: "Çini zülf" – vəhdət nurunun qarşısında gah güzgüyə çevrilib, gah da hicab olmuş kəsrətdən ibarətdir.

**Qeyd** 1: *Çin kəsrət həbsinin darısqallığını təlqin etmək istəyir.*

***Qeyd** 2: Çin kəsrətin vüsətinə həmdə çoxsaylı olmağına iham etmək istəyidir.*

**Qeyd** 3: *Çin kəsrətin vəhdət rayihəli yönünü nişan vermək istəyir.*

Anlam:

A – Ey məhbub, qaş qələmi yaxud qaranlıq qaşdan ayrılmaz olan kimi mənimsə göz bəbəyim sənin zülfündən ayrılmazdır.

B – Ey məhbub, qələm mürəkkəbsiz olmayan kimi mənimsə göz-bəbəyim zülfsüz ola bilməz.

**Qeyd**: *Beyt zülfün göz üstünə tökülməyini, yaxud şühud nurunun hicab arxasında görünməz qalmağına da eyham etmək istəyir.*

Beyt 3: **Könlün ahimdən tərəhhüm surətin göstərdi, leyk**
**Mövcdən su nəqşinə çox etmək olmaz etimad.**

Sözlük: Tərəhhüm = rəhm etmək = rəhmi gəlmək; leyk = lakin

Nişanə 1: "Könül" – bu beytdə ilahi iradədən nişanədir.

Nişanə 2: "Ah": atəş su kimi paka çıxaran bir maddə olduğuna görə "ah" fiziki əngəl mahiyyətini yuyub – təmizləyən nişanədən ibarətdir.

Nişanə 3: "Tərəhhüm surəti" – bəst məqamına yetişən şühud ehsanından ibarətdir.

Nişanə 4: İkinci misra sürətlə arxası kəsilmiş bəst fürsətini təlqin etmək istəyir.

Anlam: Mütəal məhbub, ətəş atəşində alovlanmağıma rəhm edərək şühud ehsanına iradə qıldı, ancaq qəbz dalğaları su üzərində salınmış naxış kimi şühud nailyyətini, yaxud bəst fürsətini sürətlə aradan qaldırmaqdan əl götürməyir.

**Qeyd**: *Dünyəvi ömür fürsətində daimi bəst mümkünsüzdür.*

Beyt 4: **Əşkü ahim nifrəti qət etdi eldən ülfətim,**
**Cizginən çevrəmdə ya girdabdır, ya girdibad.**

Sözlük: Əşk = göz yaşı; nifrət = hürkmək = hürküşmək = vəhşət etmək; ülfət = munis olmaq = həmdəmlik = öyrənişmək; girdbad =üz – üzə toqquşub tozanaq qoparan yellər.

Nişanə 1: "Əşkü ah" – dünyəvilik təsirini yuyub – yandırmaqdan, yaxud mənəvilik həsrətilə biqərarlıq etməkdən nişanədir.

**Qeyd**: *Biqərarlıq mütəal canan camalı ilə tanış olmaqdan, yaxud ilahi mərifətdən nişanədir.*

Nişanə 2: "Nifrət" – vəhdət mərtəbəsilə tanış olmuş aşiqin camaat adlı ən xətərnak kəsrətdən xilas olmaq müqəddiməsidir.

Nişanə 3: "Girdab və girdbad" – mənəvi seyrlərə maneə törətmiş dünyəvi əngəl bağlantılarını qıran-qoparan səbəblərdən, yaxud aşiqi üryanlıq və bəsitlik məqamına hazırlayan şəraitdən ibarətdir.

Anlam: Ey yeganə dilbər, məcazi mahiyyətimi çapıb – talayıb dəridən çıxaran səbəblərdən başqa bir munisim yoxdur, beləliklə, kəsrət qoşununu hürküdüb – qovmaqla vəhdət nailiyyətinə hazırlaşmağıma elan etmək istəyirəm.

Beyt 5: **Keçdi təndən oxların, tənha qalıb dil, dəmdəbəm,**
**Nalələr eylər köçən həmdəmlərin etdikcə yad.**

Nişanə 1: "Keçdi təndən oxların" – oxların təndən keçməsi ötən beytdə qeyd olmuş bağlantılat məhviliyini təkrar edən nişanədir.

Nişanə 2: "Tənha qalıb dil" – ürəyin tənha qalmağı üryanlıq, yaxud bəsitlik şəraitindən nişanədir.

Nişanə 3: "Köçən həmdəmlər" – daimi vüsal mərtəbəsinə yaxud vəhdət şəraitinə nail olmuş aşiqlərdən nişanədir.

Anlam: Ey yeganə dildər, üryanlıq və bəsitlik şəraitini hazırlayaraq, daimi vüsal məqamına nail olmuş həmdəmlərim kimi mən vəhdət dənizində fəna olmağı arzulayıram.

Beyt 6: **Çaki-sinəmdən könül çıxdıqca şad olsam nola,**
**Öylə afətdən yaxasın qurtaran olmazmı şad?**

Sözlük: Çak = yarıq.

Nişanə 1: "Çaki sinə" – ötən beytdə qeyd olunmuş oxlar keçmiş bədəni təkrar edən nişanədir.

Nişanə 2: "Afət" – dönə-dönə xatırladığımız kimi mütəal məbuddan başqaları, yaxud kəsrət, xüsusilə, aşiqin öz fiziki mahiyyəti onunla məhbub arasında maneə olduğuna görə bəla və müsibətdir.

Nişanə 3: "Şad" – qəbz məhrumluğundan sonra bəst nailiyyətinə çatmış aşiqin ahval – ruhiyyəsindən ibarətdir.

Anlam: Ötən beytləri davam etdirmək məqsədilə buyurur: dünyəvi təhlükədən nicat tapmaqla şad olmuş bir insan kimi kəsrət hicabından xüsusilə, mənlik afətindən xilas olmağımla məstəm.

Beyt 7: **Şiveyi-şümşad qəddin görsə eylər bağiban,**
**Etidali-sərvdən əlbəttə səlbi-etiqad.**

Sözlük: Etidal = mütənasiblik = düz durmaq; səlb = bir şeyi başqa şeydən ayırmaq = qazmaq; səlbi-etiqad = etiqadını əldən vermək

Nişanə 1: "Şümşad qədd ":

A – davam etdirilmiş ülvi hüsnlər zühurundan ibarətdir.

B - vəhdət aləminə istiqamətli diqqət yetirməkdən nişanədir.

Nişanə 2: "Bağban" – bu beytdə dünyəvi ürəkaçan hüsnlər istiqbalçısından ibarətdir.

Nişanə 3: "Etidali-sərv" – bu beytdə davam etdirilmiş dünyəvi tənasüblər və məcazi yüksəkliklərdən nişanədir.

Anlam: Dünyəvi hüsnlərdən heyrət ilə istiqbal etmiş bir şəxs əgər qeyri-maddi, yaxud mənəvi hüsnlərdən bir ləhzə xəbərdar olsa, istiqbal etdiyi gözəllikləri, həm də öz mərifətini həqir görərkən yalnız mənəvi hüsnləri istiqbal etmiş olar.

Beyt 8: **Qoyma naqis əhli-dərd içrə Füzulini, təbib,**
**Eylə bir dərman ki, dərdin edə gün-gündən ziyad.**

Sözlük: Ziyad = ziyadə = əlavə = çox .

Nişanə 1: "Naqis" – naqislik fiziki mahiyyətini qat-qat soyub tökməyə iqdam etmiş aşiqin bir, yaxud neçə axıra qalmış dünyəvi vücud qatının təcrid nailiyyətinə maneə törətməyindən ibarətdir.[1]

Nişanə 2: "Əhli-dərd" – yarı yer hissəsini, yarı göy hissəsinə qovuşdurmaq məqsədilə (vəhdət) çalışıb taqətdən düşmüş aşiqlərdən ibarətdir.

Nişanə 3: "Təbib" – bu beytdə aşiqi kamal nailiyyətinə tərbiyələndirən mürşiddən ibarətdir.

Nişanə 4: "Dərman" – mürşid həzrətinin özəl təlimatından ibarətdir.

Nişanə 5: "Dərdin gün-gündən ziyad olması": Məcnun Kəbədə[2] olub əlavə dərd istəyən kimi[3], Füzuli isə dəmbədəm dərdə batmağı xahiş edir.

**Qeyd**: *Əlavə dərdlər önündə taqəti tükənmiş vücudun fəlakətə məruz qalması ilə həyatı dəyişmək, yaxud düvyəvilikdən mənəviliyə köçmək mümkün olduğuna görə ariflər özəl münacatla əlavə dərd tələb etmişlər:*

الهی سینه ای ده آتش افروز　　　در آن سینه دلی و آن دل همه سوز
کرامت کن درونی درد پرورد　　　دلی دروی درون درد و برون درد [4]

Anlam: Ey kamil mürşüd, Füzulini əlavə dərd çəkməklə tərbiyə etməklə ilahi hədəfinə nail qıl.

[1] Qəzəl 12, beyt 1.
[2] Kəbə = Allah evi = Beytullah
[3] Nizami, "Leyli və Məcnun".
[4]Vəhşi Bafqi, Nazir və mənzur,

## Q Ə Z Ə L 67

**(1) Ey məzaqi-canə cövrün şəhdü-şəkkər tək ləziz,**
**Dəmbədəm zəhri-qəmin qəndi-mükərrər tək ləziz.**

**(2) Atəşi-bərqi-fəraqın nari-duzəx tək əlim,**
**Cüreyi-cami-vüsalın abi-kövsər tək ləziz.**

**(3) Şərhi-əhvalım sana məstə nəsihət kimi təlx,**
**Təlx göftarın mana məxmurə sağər tək ləziz.**

**(4) Daği-eşqin dərdi zövqi-səltənət tək dilpəzir,**
**Xaki-kuyin seyri fəthi-həft kişvər tək ləziz.**

**(5) Nola bulsam zövq göydürdükcə sinəm üzrə dağ,**
**Əhli-dərdə dağ olur, bidərdə zivər tək ləziz.**

**(6) Tazə-tazə daği-dərdindir dili-suzanimə**
**Filməsəl hirs əhlinə cəmiyyəti-zər tək ləziz.**

**(7) Ey Füzuli, aləmin gördüm hami nemətlərin,**
**Hiç nemət görmədim didari-dilbər tək ləziz.**

Beyt 1: **Ey məzaqi-canə cövrün şəhdü-şəkkər tək ləziz,**
**Dəmbədəm zəhri-qəmin qəndi-mükərrər tək ləziz.**

Sözlük: Şəhd = bal; ləziz = ləzzətli = məzəli; mükərrər = təkrar olunmuş = dönə - dönə deyilmiş; Qəndi-mükərrər = şirinləşdirən = ərəb ədəbiyyatçıları təkrarı sözün şirinliyinə ziyanverici bilərkən " التكرارقبيح ولوكان مليح"[1] demişlər, ancaq İran ədəbiyyatçıları bəzi sözü təkrar etməyi "qəndi-mükərrər" tərkibilə istisna etmişlər.

Nişanə 1: "Məzaqi-can" – mənəvi tamları idrak edən iç qüvvədən ibarətdir.

Nişanə 2: "Zəhri-qəm" – şirinlikdən asılı əqlə - elmə sığmaz acılıqdan ibarətdir.

Anlam: Mütəal məhbub dönə - dönə qəzəb etməyin dönə - dönə lütf etmək kimi şirinlik üstün şirinlik bağışlayan nemət olduğunu buyurur.

**Qeyd** 1: *Qəzəb ilə lütfü fərqləndirmək ikiliyi, yaxud kəsrət başlanğıcını təsdiq etməkdən, yaxud vəhdət nailiyyətinə layiq olmamaqdan nişanədir.*

**Qeyd** 2: *Cövrü cəfanı qarşılamaq üryanlıq, yaxud mücərrədlik müqəddiməsindən ibarətdir. *

**Qeyd** 3: *Hicran isə mütəal məbudun iradəsinə bağlı olduğuna görə vüsal kimi əzizdir.*

Beyt 2: **Atəşi-bərqi-fəraqın nari-duzəx tək əlim,**
**Cüreyi-cami-vüsalın abi-kövsər tək ləziz.**

Sözlük: Nar = atəş = od; duzəx = cəhənnəm = axirət dünyasında müxtəlif əziyyətli heyvanları ilə dolu dərin bir quyu kimi qaranlıq bir yer. Zərdüşt dini duzəx heyvanlarının ən kiçiyini bir yüksək dağ irilikdə vəsf etmişdir[2]; Əlim = dərdləndirici = qüssələndirən = əzabverici; Abi-kövsər = kövsər suyu = behişt çeşməsi .

Nişanə 1: "Fəraq" – A – bu beytdə vəhdət ərəfəsindən həmişəlik məhrum olmağa eyham edən nişanədir. Elə bir fəraq dünyəvi bağlantılar torunda iç aləmi ixlas ünvanlı ürfani yüksək mərtəbəsindən məhrum etmiş mənfi fəraqdan ibarətdir.

B – Mənfi fəraq əzabverici, cəzalandıran fəraqdan ibarətdir, halbuki birinci beytdə qeyd olunmuş şirin cövr müsbət fəraqı təlqin edən tərbiyə çətinliyindən ibarətdir.

---

[1] Təkrar, duzlu olsa da çirkindir.
[2] Fərhəngi, Moin, Əlam

P – Fəraq bu beytdə ardı-arası kəsilməz qəbzlərdən nişanədir.

Nişanə 2: "Cüreyi-can" – ülvi seyr şəraitində kəşf edilmiş ilahi mərtəbələrdən nişanədir.

Anlam: İlahi kəşflərlə mənəvi əhval-ruhiyyə tapmaq, yaxud mütəal məhbub cəlalərindən ətirlənmək aşiqin behişti olduğu kimi bəstsiz qəbzədən həmişəlik hicrana giriftar olmaq isə onun cəhənnəmindən ibarətdir.

Beyt 3: **Şərhi-əhvalım sana məstə nəsihət kimi təlx,**
**Təlxgöftarın mana məxmurə sağər tək ləziz.**

Sözlük: Təlx = acı; Təlxgöftar = acı söz = acı söhbət; məxmur = xumarlanmış = xumar; sağər = şərab piyaləsi.

Nişanə 1: "Əhval" – bu beytdə ürək yağını əridən ətəş və tələbdən ibarətdir.

Nişanə 2: "Məst" – ilahi cazibələr önündə özlüyünü unutmuş kamil arifdən ibarətdir.

Nişanə 3: "Təlxgöftar" – ilahi qəhrlər sınağı, yaxud qəbzlər sıxıntısından ibarətdir.

Nişanə 4: "Məxmur" – ilahi cazibələr ətəşində mənəm-mənəmlik hicabından xilas olmuş aşiqdən ibarətdir.

Anlam: Ey gözəl canan, məst bir aşiq əql əhlinin nəsihətindən narazı olan kimi sən isə mənim şərhi-halımı eşitməyə razılıq göstərməyirsən, ancaq mən sənin qəhrini – qəzəbini hicrandan sonra hasil olmuş vüsal kimi əzizləyirəm (çünki məşuqun qəzəbi aşiqin yetkinliyinə gərəklidir).

Beyt 4: **Daği-eşqin dərdi zövqi-səltənət tək dilpəzir,**
**Xaki-kuyin seyri fəthi-həft kişvər tək ləziz.**

Sözlük: Dilpəzir = dilkəş = ürəyə yatan; xak = torpaq; həft kişvər = yeddi məmləkət = yer üzü/

Nişanə 1: "Daği-eşq" – mütəal məhbuba qulağı sırğalı bir qul olmaq nişanəsidir.

Nişanə 2: "Zövq" – bərqdən parlaq şühud nurunu müşahidə etməkdən nişanədir.

Nişanə 3: "Səltənət" – davam etdirilmiş ilahi əhval – ruhiyyədən ibarətdir.

Nişanə 4: "Həft kişvər" – göyləri yeddi pilləli pilləkan kimi ayaq altında qoyub kamal aləminə yüksəlməkdən, yaxud yeddi eşq vadisini[1] seyr edib vəhdət mülkünə daxil olmaqdan nişanədir.

Anlam: Ey mütəal məhbub, sənin qapında qul olmaq, yaxud sənin astanında dolanmaq yer üzünə sultan olmaqdan üstündür.

**Qeyd**: *Mütəal məbud ərəfəsində qul olmuş bir aşiq:*

*A – Allahdan başqalarını ümumən məmlük və möhtac görməklə heç bir insana, yaxud heç bir iqtidara yaltaqlıq edib baş endirməz. Bəlkə o, şərif ayə də* [2]‹‹ايّاکَ نعبُدُ و ايّاکَ نستعين››*buyurulduğu kimi yalnız mütəal məbuda baş endirər.*

*B –* "يا ايها الناس انتم الفقراءُ الى الله و اللهُ هوَ الغنىُّ الحميدُ"[3] *ayəsini əsas tutmaqla yalnız iqtidarlı Allahdan hacət diləyər.*

Beyt 5: **Nola bulsam zövq göydürdükcə sinəm üzrə dağ,**
**Əhli-dərdə dağ olur, bidərdə zivər tək ləziz.**

Sözlük: Bidərd = dərdsiz ; zivər = zinət .

Nişanə 1: "Dağ" – aşiq ürəyini ilahi nişanlı etmiş ətəş atəşindən ibarətdir.

Nişanə 2: "Əhli dərd" – ilahi məqsədə müraciət etmək yolunun acılıqlarını şirin bilmiş saliklərdən ibrətdir.

Nişanə 3: "Bidərd" – bu beytdə dünyaşünas əql məğrurluğunda eşq mərtəbələrini inkar etmiş cəmaətdən nişanədir.

**Qeyd**: *Dərd və dağ, eşq bazarlığına getmiş bir şəxsin gərəkli sərmayəsindən ibarətdir.*

Anlam: Əql əhli dünyəvi zinətlərlə fəxr etmiş kimi eşq əhli isə mənəvi qəmlər, yaxud ətəş atəşində alovlanmaqla iftixar edir.

**Qeyd**: *Aşiqin zinətlənməyi onun əzab çəkməyindədir.*

Beyt 6: **Tazə-tazə daği-dərdindir dili-suzanimə**
**Filməsəl hirs əhlinə cəmiyyəti-zər tək ləziz.**

Sözlük: Dili – suzan = alovlanmış ürək; filməsəl = məsələn.

---

[1] Eşq məqsədinə çatmaqdan ötrü (tələb, eşq, mərifət, istiğna, vəhdət, heyrət, fəna) bu yeddi vadini seyr etmək gərəkli olduğuna görə demişlər:

گفت مارا هفت وادى در راه است                    چون گذشتى هفت وادى، در گه است

( منطق الطير ، دكتر گوهرين )

[2] Quran, "Həmd" surəsi, ayə 5

[3] Ey insanlar, siz Allaha möhtac yoxsullarsınız. O, qəni və tərifə layiq (həmd) Allahdır.(Quran,"Fatir"surəsi, ayə 15)

Nişanə 1: "Tazə dərd": Dağ, yaxud dərdin təzələnməsi mərifətin yeniləşməyindən, yaxud ilahi ətəşin coşqunluğundan nişanədir.

Anlam: Hərəs əhli dünyəvi var – dövlət ilə məst olan kimi eşq əhli isə mənəvi qəmlər coşqunluğundan sərxoşdur.

Beyt 7: **Ey Füzuli, aləmin gördüm hami nemətlərin,**
**Hiç nemət görmədim didari-dilbər tək ləziz.**

Sözlük: Didar = görüş

Anlam: Ey Füzuli, dünyəvi nemətlərin heç biri ilahi mərifət, yaxud mənəvi nemətlə müqayisə olan deyil.

**Qeyd**: *Bu qəzəl də başdan-başa mənəvi mərtəbələri dünyəviləşdirib başa salmaq məqsədilə məcazi misallardan istifadə olunmuşdur.*

## Q Ə Z Ə L 68

**(1) Cilveyi-əşki-rüxün ayinədə, ey rişki-hur,**
**Rövşən etmiş onu kim xurşiddəndir ayə nur.**

**(2) Bərqi-ahim göy üzün tutmuş, sirişkim yer üzün,**
**Söhbətimdən həm vuhuş etmiş tənəffür, həm tuyur.**

**(3) Eşq rəsmi gər budur, müşkül yetər dərmanə dərd,**
**Dərd əhli bizəban, bidərdlər məsti-ğurur.**

**(4) Daği-dilsuzi-fəraqın oldu gün-gündən füzun,**
**Nuri-mah əfzun olur xurşiddən olduqca dur.**

**(5) Vədeyi-vəslin çox, əmma bəxt yar olmaz, nə sud,**
**Gül bitirməz abi-şirin vermək ilə xaki-şur.**

**(6) Tari-zülfündürmü rüxsarında canlar məskəni,**
**Ya buraxmış bir rəhi pürpiçü xəm gülzarə mur.**

**(7) Ol səri-kuy itləri içrə, Füzuli, yox yerim,**
**Bəs mənə matəmsəra, mən handanu handan surur?**

Beyt 1: **Cilveyi-əşki-rüxün ayinədə, ey rişki-hur,**
**Rövşən etmiş onu kim xurşiddəndir ayə nur.**

Sözlük: Cilveyi-əksi-rüx = camaldan əks etdirilmiş cilvə; rişk = qısqanclıq = qeyrət = qibtə; hur = huri; Rövşən = aydın; xurşid = günəş.

Nişanə 1: "Əksi-rüx" – bu beytdə "xəyal "ünvanlı qeyri maddi təcəssüm[1] şəraitindən ibarətdir.

**Qeyd** 1: *Xəyal – dünyəvi duyğulardan ayrılıb, mənəvi duyğular tapmaqdan nişanədir.*

**Qeyd** 2: *Gözlərdən qayib məbudu ürəklərdə hazır edən ürfani məruf qüvvələrdən biri də xəyaldır.*

Nitşe – xəyalpərvər şəxslərin kənar guşədə həyat sürməsini ictimai təhlükə, həm də milli şüursuzluq bilmişdir[2].

Con Bayker məhz həqiqətin görünməyini xəyal mərhələsinin bir ləhzəsində mümkün bilmişdir.[3] Elə buna görə də ədəbiyyatşünaslar xəyal incəliyini yüksək şeirin dəyişilməz daimi elementi hesab etmişlər, çünki şairi dünyəvilik həbsindən çıxarıb mənəvilik səmasında seyr verən ən güclü səbəblərdən biri incə xəyaldır. Belə bir baxımla Uşu xəyalən canlanmağı ilahi ərəfəyə yaxınlaşdıran ən etibarlı bir vəsilə bilmişdir.[4] Bunun üçün də bir çox ariflər, xüsusilə, şairlər "müfaxirə" ünvanlı ədəbi mərtəbədə özləri və sözlərilə iftixar etmişlər.[5] Çünki onlar xəyal aləmində şəxsi mənlərini məhv edib ilahi mənliyə çatmışlar, beləliklə, onların mən – mən deməyi kəsrəti vəhdət mərkəzində cəmləşdirən ümumi mən, yaxud ilahi mənlərin sayca müxtəlif mənada vahid olmaqdan ibarətdir. Şair belə bir ədəbi – mənəvi vəziyyətdə rəsul olar, şeir isə dəyanətə çevrilər[6]:

Aləmdə rəsul olmasa şeirim demərəm şeir,
Şeytan gözünə şeiri sənan eyləmişəm mən.[7]

Buna görə də həkim Nizami "پس شعرا آمد و پیش انبیا" buyurmuşdur. Deməк müfaxirə özünü vəsf etmək deyil, bəlkə dəyanət ilə mənəviyyəti vəsf etməkdən ibarətdir.

---

[1] Təcəssüm = cisim bağışlamaq = xəyali bir cisim.
[2] "Xəllaqiyyət", Uşu, Tərcümeyi-Mərcan Fərəci, s.167
[3] "Məfhumi-xoda", Con Bayker, Tərcümeyi-Əzra Əlyan Ləngərudi, Tehran, Kitabxaneyi muzey və mərkəzi-əsnad-Məclisi-Şurayi-İslami, 1383, s. 81
[4] "Xəllaqiyyət", Uşu, s.92
[5] Qəzəl 10, beyt 2
[6] "Xəllaqiyyət", Uşu, s.101
[7] Bu sətrlər müəllifinin bir qəzəlindən bir beyt.

Nişanə 2: "Ayinə" – kamal zirvəsinə yüksəlmiş mürşüd qəlbindən, yaxud vəhdət nurunu əks etdirmiş kəsrətdən ibarətdir.

Nişanə 3: "Rişk" – bu beytdə yüksək bir məqamı arzu edən şəxsin qibtə ünvanlı müsbət qısqanclığından ibarətdir.

Anlam: Ey mütəal məbud, ay günəşdən işıq alan kimi kamil insanların ürəkləri də sənin camalından feyz almışlar.

Beyt 2: **Bərqi-ahim göy üzün tutmuş, sirişkim yer üzün,**
**Söhbətimdən həm vuhuş etmiş tənəffür, həm tuyur.**

Sözlük: Sirişk = göz yaşı = sıçrayan atəş = qığılcım; söhbət = oturuşmaq = həmdəmlik; vuhuş = vəhşi heyvanlar; tənəffür = hürkmək = nifrət etmək; tuyur = qanadlılar = quşlar.

Nişanə 1: "Bərqi-ah" – maddi küdurətləri qat – qat yandırıb aradan qaldırmaqla aşiqi bəsitlik məqamına nail edən nişanədən ibarətdir.

Nişanə 2: "Sirişk" – iç aləmdən fiziki mahiyyət ləkələrini təmizləyən nişanədən ibarətdir.

Anlam: A – Səmavi kürələrdə də yer kürəsi kimi mənim bir nəfərdə rəqibim yoxdur.

B – Göy sakinləri də yer əhli kimi məni dərk etməkdən acizdirlər.

P – Dünyəvi ömür fürsətimi, yaxud həyat sürməyimi göy aləminə aparsam yenə də qəriblikdən azad olmaram.

**Qeyd**: *Dünyəvi ömür möhlətində çarəsiz qürbət, vəhdət aləminə qəribsəməkdən, yaxud tələb qürbətindən ibarətdir.*[1]

T – Beyt fiziki mahiyyətini unudub, ilahi iradə nailiyyətində məhbub xəlifəsi olmuş kamil insanın maddi cahana sığmamazlığını təlqin etmək istəyir.

S – Beyt yerə - göyə baş endirməyən aşiqin istiğna məqamını[2] təlqin edərək Hafizin bu beytinə eyham edir:

من که سر در نیاورم به دو کون گردنم زیربارمنت اوست

C – Əşk və ah yeri – göyü yuyub yandırmaqla təəllüqləri [3] məhv edərək aşiqi azadlıq yaxud fərdilik[4] məqamına nail etməlidir.

Ç – Quşlar, xüsusilə, vəhşi heyvanlar söhbətindən hürkən bir aşiqdən bütün insanların hürküb kənar olmağıyla:

1 – aşiq camaat ünvanlı ən xətərnak kəsrətdən xilas olur;

2 – yalnız mütəal məbuddan hacət diləyir;

---

[1] Qəzəl 34, beyt 3
[2] Qəzəl 30, beyt 3
[3] Qəzəl 64, beyt 3 və 4
[4] Qəzəl 64, beyt 3 və 4

3 – yalnız mütəal məbudun razılığını nəzərdə tutur;

Beyt 3: **Eşq rəsmi gər budur, müşkül yetər dərmanə dərd,**
**Dərd əhli bizəban, bidərdlər məsti-ğurur.**

Sözlük: Bizəban = dilsiz = lal = sakit.

Nişanə 1: "Dərmana yetməyən dərd" – dərmansız dərd ilahi eşqdən ibarətdir.[1]

Nişanə 2: "Dərd əhli" – dünyəvi ömür möhlətində mənəvi ölməz həyata, yaxud hicrana çevrilmiş ilahi vüsala müraciət etmək xəyalilə çalışqanlıq edən aşiqlərdən ibarətdir.

**Qeyd**: *A – Bədənləri fiziki fəaliyyətdən ayıran xəstəlik, yaxud cisim dərdi ölüm müqəddiməsi olduğu kimi batini-dərd, yaxud mənəvi dərd də aşiqi fiziki əngəl mahiyyətindən, yaxud mənəm-mənəmlik fəaliyyətindən ayıran səbəbdən ibarətdir.*

*B – Dünyəvilikdən öldürüb mənəviliyə dirildən, yaxud İslam Peyğəmbərinin buyurduğu " موتوا قبل ان تموتوا " məqamına qaldıran vəsilədən ibarətdir.[2] Buna görə də alimlər dərmanı sifariş edən kimi ariflər dərdi sifariş etmək məqsədilə demişlər:*

الهی سینه ای ده آتش افروز     در آن سینه دلی و آن دل همه سوز
کرامت کن درونی درد پرورد     دلی دروی درون دردو برون درد [3]

Nişanə 3: "Bizəban" – A – heyrət vadisində nitqdən düşmüş aşiqdən ibarətdir.

B – Bizəban, məcazi xarakterini yaddan çıxarmaqla müddəiliyini məhv etmiş aşiqdən ibarətdir.

Nişanə 4: "Bidərd" – qəbz və bəstdən, yaxud ilahi ətəşdən məhrum olmuş ürəkdən, yaxud əql əhlindən ibarətdir.

**Qeyd** 1: *Atəş hərəkətin əsas səbəbi olduğuna görə bidərd mənəvi seyrdən məhrumdur.*

**Qeyd** 2: *Saqi hüzurunu dərk etməyin ətəş mərtəbəsinə bağlı olmağı bidərdin ilahi vasitələr gətirən feyzlərdən məhrumluğuna sübutdur.*

**Qeyd** 3: *Bidərd sözü mütəal məhbub ərəfəsinə, yaxud ilahi məqsədə, yaxud mənəvi aramlığa çatmışlara eyham edir. Ancaq bu məna bu beytdə münasib nəzərə gəlmir.*

Nişanə 5: "Məsti-qürur" – əqlinə və elminə güvənməklə həqiqətdən xəbərsiz qalmış müddəidən ibarətdir.

---

[1] Doktor Mənuçöhr Daneşpəjuh. Fərhəngi-istilahati-ürfani.
[2] Qəzəl 6, beyt 6, nişanə 2 (zülm)
[3] Vəhşi Bafqi Məsnəviyə Nazir və Mənzur.

**Qeyd**: *Məsti qürur qeyrət mərhələsilə bağlı müsbət məğrurluğu, yaxud ilahi istiğnalı vasitələri – mürşidlərə də eyham edir, ancaq bu məna bu beytdə münasib görünməyir.*

Anlam: Sərgərdan aşiqin nitqdən düşməsi, həm də müddəi camaatın mənəvi niyazlar önündə bir kar – kor kimi sakit olmağı, yaxud eşq əhlinin qəribliyi onların dünyəvi ömür fürsətində məqsədə nail olmalarını mümkünsüz edir.

Beyt 4: **Daği-dilsuzi-fəraqın oldu gün-gündən füzun,**
**Nuri-mah əfzun olur xurşiddən olduqca dur.**

Sözlük: Dilsuz = ürək yandıran; füzun = əlavə = artıq = əfzun; xurşid = günəş; dur = uzaq.

Nişanə 1: "Daği dilsuz" – maddi küdurətləri ürəkdən yumaqla qəlbi ilahi nişanlanmağa, həm də mənəvi seyrə layiq edən "nari-məhəbbət"dən[1] ibarətdir.

Nişanə 2: "Fəraq" – kəsrət sahəsində sərgərdan olmuş vəhdət nişanlı aşiqin ilahi əslinə müraciət etmək çalışqanlığından ibarətdir.

**Qeyd**: *Fəraq həbsindən həmişəlik nicat tapmaq yalnız ölməklə mümkündür.*

Anlam: Günəşdən uzaqlaşmış ayın nuru artan kimi qəlbimin atəşi də fəraq ilə dolu olur.[2]

Beyt 5: **Vədeyi-vəslin çox, əmma bəxt yar olmaz, nə sud,**
**Gül bitirməz abi-şirin vermək ilə xaki-şur.**

Sözlük: Vəsl = vüsal = vəslət; sud = fayda = bəhrə; abi şirin = şirin su; xaki şur = şoranlıq = şoran torpaq .

Nişanə 1: "Vəsl" – ötən beytdə qeyd olunmuş fəraq atəşindən daimi nicat tapmaqdan nişanədir.

Nişanə 2: "Bəxt" – istedadsız aşiqi ilahi cazibələrə nail edən ehsandan ibarətdir.

Nişanə 3: "Abi-şirin" – ilahi feyzlərdən nişanədir.

Anlam: Şirin su gücünə şoranlıqda gül bitirmək mümkünsüz olduğu kimi ilahi feyzlər ilə iç aləmi çöl əngəl vücuddan kamil surətdə ayırmaq imkansızdır.

**Qeyd**: *Beyt dünyəvi ömür möhlətində mənəvi canın maddi cismlə bağlı həyat sürmək məcburiyyətinə eyham etmək istəyir.*

---

[1] Qəzəl 9, beyt 3, nişanə 1

[2] Yaxından əks etdirilmiş nurun şüa buraxması naqisdir.

Beyt 6: **Tari zülfündürmü rüxsarında canlar məskəni,**
**Ya buraxmış bir rəhi pürpiçü xəm gülzarə mur.**

Sözlük: Tar = riştə = tel; rüxsar = camal = üz = sima; rəh = yol; pürpiçü xəm = ayrı = müşkilatlı; mur = qarışqa

Nişanə 1: "Tari zülf" – bu beytdə ilahi gizli sirlərdən, həm də tovhid günəşinə yaxınlaşmış kəsrətdən nişanədir.

Nişanə 2: "Ruxsar" – bütün insanlara elm və həyat bağışlayan ilahi camal cilalarından ibarətdir.

Nişanə 3: İkinci misra ilahi seyr yolunun mübhəm çətinliklərini eyham edən nişanədən ibarətdir.

Nişanə 4: "Cam" – hər bir vücudun mənəvi hissəsindən, yaxud həqiqətindən ibarətdir.

Anlam: Ey gözəl məbud, seyr yolunun mübhəmliyi, yaxud təcəlli nurunu pünhan etmiş gizli sirlər aşiqi sərgərdan etmiş.

Beyt 7: **Ol səri-kuy itləri içrə, Füzuli, yox yerim,**
**Bəs mənə matəmsəra, mən handanu handan surur?**

Sözlük: Matəmsəra = matəmxana; surur = şadlıq .

Nişanə 1: "Səri kuy"– məmlüklük, yaxud bəndəlik məqamından ibarətdir.

Nişanə 2: "İt":

A – mənəvi seyrlər yolunda maneə törətmiş xətakar nəfsi təhqir etmək nişanəsidir.

B – it, aşiqin mütəal məbud qarşısında öz həqirliyinə, etiraf etmək nişanəsidir.[1]

Anlam: Ey Füzuli, mütəal məhbub ərəfəsində bəndəlik məqamına nail olmağa qabiliyyət qazanmadığına görə fəraq həbsində müxtəlif qəbzlər ilə tənbih olmalısan.

---

[1] Qəzəl 41, beyt 2.

## Q Ə Z Ə L 69

**(1) Yanan eşq atəşinə atəşi-duzəxdən eymənddir,**
**Nə kim bir gəz yanar yandırmaq onu ğeyri-mümkindir.**

**(2) Buraxdım zövrəqi-dil əşk bəhrinə, saqın, ey mah,**
**Təməvvüc verməsin təşviş ona kim onda sakindir.**

**(3) Dəhanin dürcini xali-ləbin gözdən nihan etmiş,**
**Əmanət gör ki hindu məxzəni-lölöyə xazindir.**

**(4) Qəmin kim, tökdü qanim dildə pünhan olduğun bildim**
**Ki, xəlvət çəkməyin təsiri kəşfi-sirri-batindir.**

**(5) Cigər dağinə mərhəm oldu peykanin,bihəmdillah,**
**Səadət kövkəbinə əxtəri-bəxtim müqarindir.**

**(6) Rüxündən nur oğurlar şəm başin kəssələr cayiz,**
**Budur bir qul sərəncami ki, sultaninə xaindir.**

**(7) Füzuli, xali olmaz surəti-dil dust fikrindən,**
**Bu mənidən ki, beytullah derlər qəlbi-mömindir.**

Beyt 1: **Yanan eşq atəşinə atəşi-duzəxdən eymәndir,**
**Nə kim bir gəz yanar yandırmaq onu ğeyri-mümkindir.**

Sözlük: Duzəx = cəhənnəm; qeyri-mümkin = mümkünsüz .

Nişanə: "Eşq atəşi" – məşuq ilə nisbətsiz ilgiləri aşiq qəlbində yandıran tüstüsüz bir alovdan ibarətdir (nari-məhəbbət) .

**Qeyd**: *İti nəfsin eşq atəşindən nicat tapmış tör-töküntüsünü həsrət havası, süpürgə çəkməklə təmizləyib, aşiqi vüsal məqamına hazırlaşdırar.*[1]

Anlam: Bir vücudu bir dəfə yandırıb cəzalandırmağın kifayət olması onun ikinci dəfə yanmaqdan azad olduğunu məlum edir. Deməк, eşq oduna yanmış aşiqin cəhənnəm oduna yanmağı yersiz bir hekayədir.

**Qeyd** 1: *Beyt bir şəxsin iki dəfə cəzalanmağını ədalətpərvərlikdən kənar kənar hesab edir.*

**Qeyd**: *Beyt eşq atəşində yanıb yox olmuş mahiyyətin yenidən yanmağını yaxud yoxuyandırmağın mümkünsüz olduğunu təlqin etmək istəyir.*

Beyt 2: **Buraxdım zövrəqi-dil əşk bəhrinə, saqın, ey mah,**
**Təməvvüc verməsin təşviş ona kim onda sakindir.**

Sözlük: Zövrəqi-dil = ürək gəmisi; əşk = göz yaşı; bəhr = dəniz, təməvvüc = movclanmaq = dalğalanmaq

Nişanə 1: "Zövrəqi-dil" – özünə maddi – fiziki bağlantılardan nicat vermiş ilahi aləmdə seyr edən "Səbbah"[2] ünvanlı ürəkdən, yaxud iç vücuddan ibarətdir.

**Qeyd** 1: *Üzgünçü paltarını soyunan kimi səbbah da öz varlığını soyunmalıdır.*

İstəsən pərdə dalından səni agah edələr
Gərək əvvəl soyunub varlığı üryan olasan[3]

**Qeyd** 2: *Dünyəvilikdən kamil surətdə soyunmağın, yaxud asılılıqdan uzaqlaşmağın əzəmətini*[4]*, həm də çətinliyini təlqin etmək məqsədilə Mövləvi buyurmuşdur:*

چون نئی سباح ونی دریائیی        در میفکن خویش از خودر ائیی [5]

---

[1] Fərhəngi- istilahat və təbirati-ürfani.
[2] Səbbah = üzgün = üzülmüş
[3] Müəllifin bir qəzəlindən bir beyt
[4] Qəzəl 64, beyt 6
[5] Məsnəviyi-Mövlana, dəftər əvvəl, beyt 1650

**Qeyd** 3: *Dünyəvilikdən bir damla qədəri əsər saxlamış vücud səbbahlıq nemətindən məhrum qalmalı və nəhayət məhv olmalıdır*.

Nişanə 2: "Əşk bəhri" – fiziki mahiyyəti, yaxud mənəm-mənəmliyi yuyub iç vücudu səbbahlıq məqamına hazırlayan mərtəbədən ibarətdir.

Nişanə 3: "Mah":

A – bu beytdə səbbahlıq məqamına hazırlaşmış aşiqin ilahi nur əks etdirmiş öz vücudundan ibarətdir.

B – ilahi vasitələr – mürşüdlərdən ibarətdir.

Nişanə 4: "Təməvvüc" – bu beytdə əşk ilə yuyunmağa maneə törətmiş dünyəvi cilvələrdən ibarətdir.

Nişanə 5: "Təşviş" – mənəvi haldan dünyəvi hala qayıtmaqdan nişanədir.

Anlam: Ey mütəal məhbub, səbbahlıq ehsanından bəhrələnmək məqsədilə məcazi mahiyyətimi yuyub aradan qaldırmaqla məşğul olmuşam, ancaq sən yardımçılıq etməsən, bu mərhələnin çətinliklərindən qurtarmaq mümkünsüz olar.

Beyt 3: **Dəhanin dürcini xali-ləbin gözdən nihan etmiş,**
**Əmanət gör ki hindu məxzəni-lölöyə xazindir.**

Sözlük: Dəhan = ağız; dürc = ətir, yaxud cəvahir sandıqçası; nihan = pünhan = gizli; hindu = hindli = qara qul; məxzən = xəzinə, lölö = mirvari = dürr; xazen = xəzinəçi = xəzinədar.

Nişanə 1: "Dəhan dürcü" – aşiqi bəzi sirrlərdən xəbərdar edən ilahi ilham – işarədən nişanədir.

Nişanə 2: "Xali-ləb":

A – bu beytdə yaraniş dayrəsinin bəşəri idraka sığmaz mərkəz nöqtəsindən, yaxud ilahi gizli sirrdən nişanədir.

B – Xal – ilahi mərtəbələr tanışlığını müşkül edən bəşəri mahiyyət – idrak qaranlığından ibarətdir.

Nişanə 3: "Hindu" – vəhdət günəşinin qarşısında maneə törətmiş qara kəsrətdən, yaxud xali-ləbdən nişanədir.

Nişanə 4: "Məxzəni-lölö" – bəşəri mərifətə sığmaz ilahi mərtəbələrdən nişanədir.

Anlam: Ey mütəal məhbub, qara bir qul cəvahir xəzinəsini qoruyan kimi kəsrət hicabı, yaxud idrak acizliyi sənin cilalarını gözlərdən gizli saxlayır.

Beyt 4: **Qəmin kim, tökdü qanim dildə pünhan olduğun bildim**
**Ki, xəlvət çəkməyin təsiri kəşfi-sirri-batindir.**

Nişanə 1: "Qəm" – məşuq tələbində çalışqanlıq etməkdən nişanədir.

Nişanə 2: "Tökdü qanim" – Qan tökülmək qurbanlıq məqamına hazırlaşmaq, yaxud vəhdət aləminə söykənmək müqəddiməsindən ibarətdir.

Nişanə 3: "Pünhan" – ikinci misrada qeyd olunmuş xəlvətdən ibarətdir.

Nişanə 4: "Xəlvət" – "bədən xəlvəti" bir də "təfəkkür xəlvəti" ünvanları ilə dərin bəhslərə daxil olmuş gizli məqamdan ibarətdir:

A – "Bədən xəlvəti": 1 – Bədən xəlvəti iç aləmi, yaxud həqiqi vücudu mütəal məbudla məşğul etmək məqsədilə bədəni büsbütün maddi təcrübələr və fiziki yöndəmlər, yaxud kəsrət hacətindən ayıran xəlvətdir.

2 – Kəsrət hacətindən ayırıb vəhdət nailiyyəti bağışlayan xəlvət, "məkaşifə" ünvanlı ürfani özəl aləmə bağlıdır.

3 – Möminlər, ariflər hətta İslamın ulu peyğəmbəri bədən xəlvətini sınamaq üçün, xəlvətxanalarda müəyyən vaxtlar xəlvət etmişlər.

4 – Göz, qulaq, dəri və başqa hissi üzvlər vasitəsilə Allahın ürək adlı özəl evində təbii surətdə əsər qoyub yer tutumuş fərş, çırağ, pərdə, nur, rəng, naxış və başqa yöndəmlər Allah evinin işğalçıları olduqlarına görə, xəlvətxana nə qədər təng və kiçik olsa bir o qədər işğalçılıq imkanı daralmalıdır. Bunun üçün də ariflər darısqal xəlvətxananı xəlvət etməyi münasib bilmişlər.

B – "Təfəkkür xəlvəti": bədən xəlvəti bir sinif kimi təlim və təmrin ilə insanı təfəkkür xəlvətinə hazırlaşdırır buna görə də iç aləmi mütəal canan ilə məşğul etməklə, yaxud qürb və hüzur məqamına nail olmaqla, daha xəlvətxanaya, hacət olmaz, demək insan bazarda, mağazada, məclisdə, məsciddə, idarədə, camaat içində həm hazır, həm də qayib olanda Sədi buyurmuş kimi o iki yönlü vücudun batin ünvanlı bir yönünü mütəal məbudla, zahir adlı başqa yönünü isə camaat ilə məşğul edir:

هر گزوجود حاضروغایب شنیده ای
من در میان خلق و دلم جای دیگرست

Bu mərtəbədə insanın alqı – satqısı, söhbət etməyi, şadlığı, qeyzə gəlməyi, mübarizəsi və hər bir hərəkəti Allahın razılığına, həm də iradısinə bağlı olmalıdır.[1]

Nişanə 5: "Kəşf " – bir sıra idraka – duyğuya sığmaz mənəvi görünməz həqiqətlərin ürəkdə aşkar olmasından ibarətdir.

Nişanə 6: "Sirri-batin" – iç aləmdə qoyulmuş ruhdan daha lətif əlçatmaz ilahi əmanətdən ibarətdir.

**Qeyd**: *Ruh məhəbbət mərkəzi, qəlb mərifət xəzinəsi və sirr müşahidə qüvvəsidir*.[1]

---

[1] Qəzəl 63, beyt 2

Anlam: Qəbzlər – qəzəblər sınağında, yaxud qurbanlıq astanasında (qan tökülmək) çöl aləmdən ayrılmağı imtahan edərək kəşflər – sirlər göstərən iç aləmdən xəbərdar oldum.

Beyt 5: **Cigər dağinə mərhəm oldu peykanin,bihəmdillah,**
**Səadət kövkəbinə əxtəri-bəxtim müqarindir.**

Sözlük: Peykan = ox ucu; səadət kövkəbi = səadət ulduzu = ulduz doğuşu, əxtər = ulduz; müqarin = iki şəxsin bir olmağı = həmdəmlik = iki ulduzun bir dərəcədə vaqe olmağı.

Nişanə 1: "Dağ" – aşiqin qəlbini ilahi nişan taxılmağa tərbiyə edən atəşdən ibarətdir.

Nişanə 2: "Peykan" – maddi həyata sədəmə vurmaqla mənəvi yaşayışa hazırlayan səbəbdən ibarətdir.

Nişanə 3: "Səadət kövkəbi" – ilahi feyzlərə mübarizəsiz nail edən ehsandan ibarətdir.

Nişanə 4: "Əxtəri-bəxt " – səadət kövkəbilə birləşmiş nişanədən ibarətdir.

Anlam: Tələb və ətəş atəşi dəmbədəm təzələnməklə, yaxud hicran və həsrət dərdi dalbadal əlavə olmaqla ilahi qeyzlərə, yaxud vüsal nailiyyətinə tərbiyə olmğımdan xəbər vermək istəyirlər.

Beyt 6: **Rüxündən nur oğurlar şəm başin kəssələr cayiz,**
**Budur bir qul sərəncami ki, sultaninə xaindir.**

Sözlük: Rux = üz = camal = sima

Nişanə 1: "Rux" – özəl təcəllilər ehsan etmiş ilahi camaldan ibarətdir.

Nişanə 2: "Şəm" – bu beytdə dünyəvi və mənəvi üstünlüklər iddiaçısından ibarətdir.

Anlam: İlahi tanışlıqlar iddiası, yaxud özünün yüksək ürfan və insanlıq səviyyəsinə layiq olduğunu xəyal etmiş müddəi öz sultanına xəyanət etmiş bir qul kimi cəzalanmalıdır.

**Qeyd**: *Baş kəsilmə qurbanlıq müqəddiməsi olduğuna görə şəm ilahi ərəfə dilənçisindən istiarədir. Beləliklə bu nişanə (şəm) beytin müsbət mənasına da eyham etmək istəyir.*

Beyt 7: **Füzuli, xali olmaz surəti-dil dust fikrindən,**
**Bu mənidən ki, beytullah derlər qəlbi-mömindir.**

---

[1] Fərhəngi-istilahat və təbirati ürfani.

Sözlük: Beytullah = Allah evi.

Nişanə 1: "Surəti-del" – ürək həqiqətindən ibarətdir.

**Qeyd** 1: *Əvvəli axıra bağlayan bir nöqtə ki, vücud dayirəsi onun hərəkətindən icad olur, surəti-dildən ibarətdir.*

**Qeyd** 2: *Sinədə çırpınan ürək təxtində oturub bədən üzvlərinə fərman verən sultan surəti-dil, yaxud həqiqi ürəkdir.*[1]

**Qeyd** 3: *Mütəal məbudu tanıyıb – müşahidə edən yalnız surəti-dildən ibarətdir.*

**Qeyd** 4: *İslamın ulu Peyğəmbərinin buyurduğu kimi, mütəal məbud mənzili olan cahana sığmaz həqiqət, surəti-dil, yaxud həqiqi ürəkdir:*

گفت پیغمبر که حق فرموده است     من نگنجم هیچ در بالا و پست

در زمین و آسیمان و عرش نیز     من نگنجم این یقین دان ای عزیز

در دل مومن بگنجم ای عجب     گر مرا جویی در آن دلها طلب [2]

Nişanə 2: "Dust" – dünya və axirət məqamlarını aşiqin gözündən salarkən onu yalnız öz camalı ilə məşğul edən mütəal məhbubdan ibarətdir.

Anlam: Ey Füzuli, dünyəvi əngəl hicablar hətta qəbz və qəzəb kimi mənəvi müşküllər, mütəal məhbub eşqini qəlbimdən xaric edə bilməz.

**Qeyd**: *Ürək Allahın evi olduğuna görə Allah qəlbə malikdir, beləliklə qəlbi Allahdan ayırmaq malikiyyəti malikdən ayırmaq kimi mümkünsüzdür.*

---

[1] Qəzəl 13, beyt 2 (ətvar)

[2] Məsnəviyi-Moləvi, dəftəri əvvəl, beytlər 2715, 2716, 2717

## Q Ə Z Ə L 70

(1) Çeşmi-surətbazimə müjgan səfi həngamədir,
Qanə batmış hər müjəm bir şuxi-gülguncamədir.

(2) Göstərir hər dəm əlamətlər qiyamətdən qədin,
Qaim etmiş həşr bürhanin, əcəb əllamədir.

(3) Ta xətin üzrə xəmi-əbrulərin sərgərmiyəm,
Hər sözüm dərdi-dil imlasinə bir sərnamədir.

(4) Qorxum oldur kim, müsəlman olmuş ol tərsabəçə,
Küfrə olan zülmlər təni bu gün islamədir.

(5) Üzdə nəqşi-xuni-dil razi-nihanim faş edər,
Şərhi-qəm təhririnə hər kirpigim bir xamədir.

(6) Ey səba, rəhm et kim ol bidərd qılmış tərki-cövr,
Çareyi-dərdi-dilim movquf bir e'lamədir.

(7) Ey Füzuli, bulmadım rəngi-riyadən bir səfa,
Nola gər meylim bu rəng ilə meyi-gülfamədir.

Beyt 1: Çeşmi-surətbazimə müjgan səfi həngamədir,
Qanə batmış hər müjəm bir şuxi-gülguncamədir.

Sözlük: Çeşm = göz; surət baz = müxtəlif tamaşalar düzəltməklə yığıncağı məşğul və məst edən şəxs; müjgan = kirpiklər; səfi-həngamə = hay-həşir səfi = müharibə səfi; gülgun = ağa mail qırmızı = gülgəz; came = paltar = toxunmuş parça = tikişsiz parça

Nişanə 1: "Surət ":

A – Vəhdəti əks etsirmiş kəsrətdən ibarətdir.

B – hər bir yaranmışın həqiqətindən ibarətdir.

**Qeyd**: 1: *İnsanın batini xarakteri onun simasında təzahür etdiyinə görə simaya surət demişlər, elə buna görə də Mövləvi buyurur:*

حق چو سیما را معرّف خوانده است چشم عارف سوی سیما مانده است[1]

**Qeyd** 2: **Dini, ürfani və fəlsəfi mənbələrin dediyi kimi mütəal məbudun "Vəcəh" ünvanlı surəti var, ancaq ilahi surəti bəşəri surətlə müqayisə etmək mümkünsüzdür, ona görə ki bəşəri surət solğunlaşıb, pozulub – töküləndir, halbuki ilahi vəcəh şərif ayənin "وَيَبقى وَجهُ رَبّکَ ذُوالجلال وَ الاکرام" [2] buyurduğu kimi əbədi və sabitdir.**

Nişanə 2: "Surəti baz" – bu beytdə ilahi cilalar, yaxud şühud cazibələri ilə məst olmuş iç aləmdən ibarətdir.

Nişanə 3: "Müjgan":

A – bu beytdə istedadsız aşiqi şühud nailiyyətindən məhrum etmiş müxtəlif hicablardan nişanədir.

B – şühud aləminə pəncərə açmaq məqsədilə ürəyi yaran ilahi qəmzə satmaqlardan nişanədir.

Nişanə 4: "Qana batmaq" – fiziki mahiyyəti batil etməklə iç aləmi paka çıxarmaqdan nişanədir.

Anlam: Maddi vücudu qan-yaşla yuyub şühud nailiyyətinə müqəddimə törətməyim ən gözəl və təmtəraqlı bir mərtəbədir.

Beyt 2: Göstərir hər dəm əlamətlər qiyamətdən qədin,
Qaim etmiş həşr bürhanin, əcəb əllamədir.

Sözlük: Qaim etmiş = bərpa etmiş = qoparmış

Nişanə 1: "Qəd" – ilahi əzəmətlər təzahürün davam etdirmiş mərtəbədən ibarətdir.

Nişanə 2: "Qiyamət" – bu beytdə suğra (kiçik) qiyamətdən ibarətdir.

---

[1] Məsnəviyə Mövləvi, Dəftərə-əvvəl, beyt 1297

[2] Quran, Rəhman surəsi, ayə 27

**Qeyd**: *Suğra qiyaməti islam peyğəmbərinin buyurduğu "موتوا قبل ان تموتوا" mərtəbəsindən*[1]*, yaxud "ارادی موت" ünvanlı ömür sona çatmaqdan əvvəl ölməklə mənəvi həyat tapmaqdan nişanədir.*

Anlam: Ey iqtidarlı məhbub, gözəl cazibələrlə dəmbədəm fiziki mahiyyətimi pozub ilahi mahiyyətimi canlandıran məbud yalnız sənsən.

**Qeyd**: *Beyt qiyamət günü ölmüşlərin dirilməyinə də eyham edir.*

Beyt 3: Ta xətin üzrə xəmi-əbrulərin sərgərmiyəm,
Hər sözüm dərdi-dil imlasinə bir sərnamədir.

Sözlük: Xət = üz ətrafında göyərmiş narın tük; xəm = əyri, əbru = qaş; sərgərm = məşğulluq = baş qarışması, sərnamə = ünvan = başlanğıc.

Nişanə 1: "Xət" – bu beytdə sona çatmış "əqrəb" ünvanlı qürb məqamına çatdıran ilahi sifətlərdən ibarətdir.[2]

Nişanə 2: "Xəmi-əbru" – ilahi sirlərdən, həm də ilahi zatə ən yaxın lətif sifətlərdən ibarətdir.

Anlam: Əqlə - idraka sığmaz ilahi zərif sifətlər məşğuliyyəti qəlbimin gizli ətəş – atəşini açıq-aşkar nişan verir.

Beyt 4: Qorxum oldur kim, müsəlman olmuş ol tərsabəçə,
Küfrə olan zülmlər təni bu gün islamədir.

Sözlük: Tərsa bəçə = tərsa balası = məsihi balası = İsa ümməti; tən = təhqir etmək = sərki vurmaq = atmaca atmaq = nizə atmaq = eyibləmək.

Nişanə 1: "Müsəlman" – bu beytdə dini adab zahirinə maraq göstərməkdən nişanədir.

Nişanə 2: "Tərsa bəçə " – bu beytdə özünü kamal zirvəsinə qaldırmış mürçiddən ibarətdir.

Anlam: Eşq əhlinin əqli mülahizələrilə ehtiyatkarlıq edən mürşid həzrətinə irad – etiraz etməyindən qorxuram.

**Qeyd**: *Gah da mürşid bir sıra zahiri mülahizələri gərəkli bilir.*

Beyt 5: Üzdə nəqşi-xuni-dil razi-nihanim faş edər,
Şərhi-qəm təhririnə hər kirpigim bir xamədir.

Sözlük: Xuni-dil = ürək qanı; razi-nihan = gizli sirr; faş etmək = açıb-ağartmaq; təhrir = yazmaq; xamə = qələm

Nişanə 1: "Xuni-dil"- bu beytdə məlamətçilər önündə aşiqin gizli sirrini açıb – ağartmış biqərarlıqlardan ibarətdir.

---

[1] Qəzəl 6, beyt 6, nişanə 2 (zülm)

[2] Qəzəl 48, beyt 1

Nişanə 2: "Qəm" – bu beytdə alovlanmış ürəyin çırpıntı adlı işindən ibarətdir.

Anlam: Birinci beytdə "surət" nişanəsində qeyd etdiyimiz batini əhval-etiqadın zahirdə əks etdirilməsi, həm də Sədi demişkən, atəş üstündə qaynamamağın mümkünsüz olduğu [1] gizli sirrimi açıb-ağartmağılə:

A – məlamətçilər əlinə girəvə düşməyə bais olur.

B – eşq sirrini gizli saxlamaq mürşüdün ilk hökmü olduğuna görə aşiqin istedadsızlığını, həm də məhkumluğunu məlum edir.

P – zahir və batin biqərarlığını nişan verməklə mütəal məbud yardımçılığını xahiş edir.

Beyt 6: Ey səba, rəhm et kim ol bidərd qılmış tərki-cövr,
Çareyi-dərdi-dilim movquf bir e'lamədir.

Sözlük: Movquf = mərbut = həsr olunmuş; elam =elan etmək

Nişanə 1: "Səba" – xeyr xəbəri gətirən ilahi vasitədən, yaxud mənəvi nəsimdən ibarətdir.

Nişanə 2: "Bidərd" – şərif ayədə "اللهُ الصمد" buyurulduğu kimi[2] "istiğna" məqamında səmədiyyət sifətilə təcəlla edən vahid məbuddan ibarətdir.[3]

Nişanə 3: "Tərki-cövür" – cövrün tərk olması aşiqin məşuq yanından çıxmasını göstərən mənfi mərtəbədən ibarətdir.

**Qeyd** 1: *Dönə – dönə xatırladığımız kimi aşiqin yetkinliyinə gərəkli səbəblərdən biri cövr çəkməkdir.*

**Qeyd** 2: *Cövrün tərk olmağı dünyəvi ömrün sona çatması ilə onun vəhdət mülkünə daxil olmasına gətirib çıxarır.*

Nişanə 3: "Bir əlam" – səba gətirən mənəvi xəbərdən ibarətdir.

Anlam: Ey səba, mütəal məbud unutmuş aşiqin dübarə yada düşməyini sən bizə ilahi tənbihlər (cövrü cəfa) xəbərini gətirmək ilə muştuluq ver.

**Qeyd**: *Aşiqin çarəsiz dərdinə dərman edən, yaxud ona vüsal istedadı bağışlayan məşuq cəfalarından ibarətdir.*

Beyt 7: Ey Füzuli, bulmadım rəngi-riyadən bir səfa,
Nola gər meylim bu rəng ilə meyi-gülfamədir.

---

[1] درسوخته پنهان نتوان داشتن آتش          ما هيچ نگفتيم و حکايت بدر افتاد

[2] Quran, İxlas surəsi, ayə 2

[3] Qəzəl 30 , beyt 3

Sözlük: Gülfam = qırmızı = gülgəz

Nişanə 1: "Rəngi-riya" – riyanın zavala məruz qalmış son əsərlərindən ibarətdir.

Nişanə 2: "Riya":

A – Qəbzlər sıxıntısı ilə məcazi qatmacalarını tamamamilə eşiyə atmayan qəlbin sifətindən ibarətdir.

B – dünyəvi ilgilərdən mükəmməl surətdə boşalmayan, yaxud "ney" məqamına[1] yetişməyən ürəyin naqis sədaqətini təlqin edən nişanədir.

Nişanə 3: "Səfa" – küdurətin əksindən ibarətdir.

**Qeyd** 1: *Küdurət maddənin yaranış hissəsi, yaxud zatı olduğuna görə səfa iç aləmi maddi küdurətdən durultmaq, yaxud bəşəri sifətlərdən boşaltmaq nişanəsidir.*

**Qeyd** 2: *Səfa, müxtəlif xəlvətlər ilə[2] qəddar dünyanı unutmaq və nəhayət mütəal məbuddan başqası ilə əlaqə saxlamamaq nişanəsidir.*

Nişanə 4: "Mey" – ilahi eşq qələbələrindən nişanədir.

Nişanə 5: "Gülfam" – mey mərtəbəsinin bəst bağışlayan qalib sifətini təlqin edən nişanədir.

Anlam: Ey Füzuli, məcazi mahiyyəti tamamilə unuda bilmədin, buna görə də sənin mey mərtəbəsinə mail olmağın yersizdir.

---

[1] Qəzəl 1, beyt 2.

[2] Qəzəl 69, beyt 4.

## Q Ə Z Ə L 71

**(1) Şöleyi-şəmi-rüxün əğyarə bəzməfruz olur ,**
**Ah kim, yetkəc mənə bir bərqi-aləmsuz olur.**

**(2) Ğeyri çeşmindən bulur hər dəm nigahi-mərhəmət,**
**Mən nə qıldım kim, nəsibim navəki-dilsuz olur.**

**(3) Hər gün açar könlümü zövqi-vüsalın yengidən,**
**Gərçi güllər açmağa hər ildə bir novruz olur.**

**(4) Halə tək çıxmaz evindən mahtələtlər müdam,**
**Hər kimin dövri-qəmərdə taleyi firuz olur.**

**(5) Saidin zövqilə tərk etmiş Füzuli aləmi,**
**Meyli-səhra eyləməz bir quş ki dəstamuz olur.**

Beyt 1: Şöleyi-şəmi-rüxün əğyarə bəzməfruz olur ,
Ah kim yetkəc mənə bir bərqi-aləmsuz olur.

Sözlük: Rüx = üz = camal = surət; bəzməfruz = məclis işıqlandıran = yığıncaq ziyası; aləmsuz = dünyaya od salan = dünyanı yandıran.

Nişanə 1: "Şəmi-rux" – ürfan nurundan, yaxud ilahi camal cilasından ibarətdir.

Nişanə 2: "Əğyar" – bu beytdə şühud nuruna yetişmiş istedadsız aşiqlərdən ibarətdir.

Nişanə 3: "Bərqi-aləmsuz" – təccəlli[1] məhrumluğundan hasil olmuş həsrət atəşindən ibarətdir.

Anlam: Ey həkimi-məhbub, bir çox istedadsız aşiqi şühud ehsanından bəhrələndirirsən, amma məni məhrumluq atəşindən xilas etməyirsən.

Beyt 2: **Ğeyri çeşmindən bulur hər dəm nigahi-mərhəmət,**
**Mən nə qıldım kim, nəsibim navəki-dilsuz olur.**

Sözlük: Çeşm = göz; nigah = nəzər = baxış;
navək = uc; dilduz = ürək sökən = ürək yaralayan

Nişanə 1: "Ğeyr" – ötən beytdə qeyd olunmuş əğyardan ibarətdir.

Nişanə 2: "Çeşm" – bu beytdə şühud ehsanından ibarətdir.

Nişanə 3: "Nigahi-mərhəmət":

A – Nigahi şühud ehsanının müqəddiməsindən ibarətdir.

B – mütəal məbudun rəhmani nəzərindən, yaxud mənliyini unutmuş bəndəsinə diqqət yetirməsindən ibarətdir.

Nişanə 4: "Navəki-dilduz " – yararlı əməllər etmiş arifin mehriban məbudun "rəhmani nəzər" ünvanlı rəhmətindən gah gizli, gah da aşkar bəhrələnməyindən ibarətdir.[2]

**Qeyd**: *Navəki dilduz bu beytdə qəbz ünvanlı ilahi diqqətdən gizli istifadə etməkdən ibarətdir.*

Anlam: Özgə aşiqləri (əğyarı) bəst rəhmətindən bəhrələndirən həkimi-məhbub məni qəbz rəhmətilə bəhrələndirir.

Beyt 3: Hər gün açar könlümü zövqi-vüsalın yengidən,
Gərçi güllər açmağa hər ildə bir novruz olur

Nişanə 1: "Könlün açılmağı" – mehriban məbud rəhməti ilə bəst məqamına yetişmiş aşiqin hər bir şeyə təsir etməyindən, amma heç bir şeyin onda əsər-əlamət qoymamağından ibarətdir.

---

[1] Qəzəl 46, beyt 3.
[2] Qəzəl 2, beyt 5

**Qeyd**: *Bəst məqamına nail olmuş bir aşiqin iç aləmində hər bir şey sığışar, ancaq o heç bir şeyə sığmaz.*

Nişanə 2: "Zövq" – şühud nailiyyətinin ilkin dərəcəsindən ibarətdir.

**Qeyd**: *Zövq bəst mərtəbəsilə bağlı özəl bir ləzzətdir, ancaq qəbz mərhələsində də aşiqi tərk etməz.*

Nişanə 3: "Vüsal" – nəhayətə çatmış qürbdən, yaxud aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəyə çatmağından nişanədir.

Nişanə 4: "Yengi" – ürfani əhval-ruhiyyənin, həm də ilahi tanışlıqların dəmbədəm təzələnməyinə eyham edən nişanədir.

**Qeyd** 1: *Təzələnmək maddi yaranmışların varlığını davam etdirən şərtdən ibarətdir. Beləliklə, fəlsəfə elmi yeniləşmək xüsusiyyətindən ayrılmış varlığı şərh edilməz və açılmaz bilərkən onu hətta cövhər silkinə daxil etmişdir.*[1]

**Qeyd** 2: *Maddi vücudlar kimi mənəvi əhval – ruhiyyələr, həm də elmi – fəlsəfi mərifətlər də dəmbədəm təzələnməyə möhtacdırlar, beləliklə, həm elmin təcrübə etdiyi maddi yenilənməklər, həm də eşqin nail olduğu əhval – mərifət təzələnməyi elm, tarix, ictimai elmlər, fəlsəfə və din dünyasına təzə - təzə qapılar açmışdır.*

**Qeyd** 3: Əql, maddi yeniləşməyi aramaqla bir rəsul kimi insanları əbədiyyət mülkünə hidayət edir.

**Qeyd** 4: *Eşq mənəvi əhval – ruhiyyənin təzələnməyini duyub – düşünməklə aşiqi vəhdət nöqtəsinə, yaxud "innə lillah"*[2] *aslinə hidayət edir.*

**Qeyd** 5: *Qiyamətəcən verilən dini suallara aydın cavab almaq, yaxud təzə əsrlərdə təzə nəsillər suallarına cavab vermək dini yeniləşməyə bağlıdır.*

**Qeyd** 6: *Mövləvi dünyəvi həvəskarlığın məhv olmağını dini yeniləşməyin əsas şərti bilərkən buyurmuşdur:*

تازه کن ایمان نه از گفت زبان　　　ای هوی را تازه کرده در نهان

تا هوی تازه است ایمان تازه نیست　　　کاین هوی جز قفل آن دروازه نیست [3]

**Qeyd** 7: *Təzə suallara təzə cavab verməyin əsas şərti təzə mərifət təhsil etməkdir, buna görə də mərifət mənbəyinin tükənməzliyi, yaxud namütənasibliyi, beləliklə, dinin daima təzə olmağı gərəkli olur.*

---

[1] Qəzəl 1, beyt 1, nişanə(salik, A, hərəkət və yenilənmək)

[2] Quran, Bəqərə surəsi, ayə 156 (الذين اذا اصابتکم مُصيبه قالو اِنّا لله واِنّا اليه راجعون) "Onlar ki, onlara müsibət yetişcək dedilər, biz həqiqətə, Allaha mərbutuq və həqiqətən Allaha sarı qayıdırıq"

[3] Məsnəviyi-Mövləvi, birinci dəftər, beyt 1101, 1102

*Beləliklə, "..., təzələnmək, yaxud təzə söz, təzə cavab, təzə tanışlıq tapmaq, mərifət dənizinə qoşulmuş insanın birinci xasiyyətidir."*[1]

**Qeyd** 8: *Mütəal məbudun "قُل"(qul) buyurmağı ("قُل هواللهُ الاحد") dönə - dönə qiraət edilmiş vahid ayədən hər dəfə təzə bir məna və mərifət dərk etmək üçündür. Elə buna görə də duaların təkrarını, yaxud ömür boyu namazlarda bir surənin qiraətini önəmli bilmişlər.*

Nişanə 5: "Novruz" – təfriqə məqamından ibarətdir.

**Qeyd**: *Cəm ilə təfriqə zahirən bir – birilə müxalif nəzərə gəlsələr də ürfan əsasında yeganəpərəst insanı, yaxud saliki hidayət etməyə iki müvafiq əsldirlər. Cəm mütəal məbudun özü ilə məşğul olmaqdan nişanədir. Təfriqə – xəlqlə məşğul olmaq nişanəsidir, ancaq insan təfriqə halında bütün xəlqdə, hətta bütün yaranmışlarda yaradıcı məbudun əks etdirilmiş nurunu görməklə onlarla məşğul olar, demək bu çeşid xəlqlə məşğul olmaq elə xaliqlə məşğul olmaq deməkdir. Elə buna görə də ilahi hüsnü təbiət güzgüsündə göstərən novruz dərin ürfani bəhslərə daxil olmuş, amma bizim hələlik bu bəhsə qarışmaq imkanımız yoxdur.*

Anlam: Dünya təbiəti ildə bir yol təzələtməklə gözəlləşir, lakin aşiqin təbiəti, yaxud onun iç aləmi gündə neçə yol yeniləşməklə dönə - dönə təzə hal və yeni bəst gözəlliyinə nail olur.

**Qeyd**: *Bu anlam ötən iki beytin gileylik surətində təşəkkür etməyini məlum edir.*

Beyt 4: **Hələ tək çıxmaz evindən mah tələtlər müdam,**
**Hər kimin dövri-qəmərdə taleyi firuz olur.**

Sözlük: Mah tələt = mah camal = gözəl; müdam = daim = həmişə; qəmər = ay; firuz = qalib

Nişanə 1: "Hələ" – gözəl surətin ətrafında "xət" ünvanlı təzəcə bitmiş nazik tükdən ibarətdir.[2]

**Qeyd**: *Adlı-sanlı, ədəbiyyatşünaslar, xət nişanəsini reyhan, səbzə, mehri-giyah, firuzə, zümrüd, mina, zəngar, zərnigari, festeqi, tuti, xızr, lam, dal və dairə ünvanlı on dörd sifət ilə vəsf etmişlər, amma Xorasan şairləri onu "hələ" ünvanı ilə vermişlər.*[3]

**Qeyd** 2: *Hələ kəsrətin vəhdət ilə hadilik və hayinlik*[4] *nisbətinə də eyham edir.*[5]

---

[1] Suruş, Xumari-aşiqanə, Əbdülkərim, Tehran,1379, səh.6,7
[2] Qəzəl 48, beyt 1
[3] Doktor Mənuçöhr Daneşpejuh, Fərhəngi-istilahati-ürfani
[4] Hadi = hidayət edən, hayin = maneə = maneə törədən
[5] Qəzəl 4, beyt 3, nişanə 2, ayinə

Nişanə 2: "Mah tələtlər" – feyz muştuluğu verən ilahi vasitələrdən, mürşidlərdən, həm də bəşəri camalda ilahi hüsnlə əks etdirilmiş gözəllərdən nişanədir.

Nişanə 3: "Dövri-qəmər" – nailiyyət zamanından nişanədir.

**Qeyd**: *Keçmişlərdə ay – ulduz seyrini insanların alın yazısına təsir edici bilmişlər, beləliklə, ay, tir, nahid, xurşid, bəhram, bərcis və keyman adlı yeddi səyyarədən nahid və bərcis adlı iki səadət səyyarəsinin yaxınlaşıb birləşməsini "qərani-sədeyn" ünvanlı nailiyyət zamanı hesab etmişlər.*[1] *Demək, belə bir zamanda dualar qəbul olunur və insanlar arzularına nail olurlar, əksinə bəhram və keyman adlı iki nəhs ulduzun birləşməsini "qərani-nəhseyn" ünvanlı qatma-qarışıq zaman, yaxud giriftarlıq və bədbəxtlik zamanı bilmişlər. Beləliklə, dövri-qəmər nailiyyət və müvəffəqiyyət zamanını təlqin edən nişanədir.*

Anlam: Halə aydan, yaxud xət üzdən ayrılmaz olduğu kimi, kəsrət vəhdətdən

( xəlq xaliqdən), yaxud aşiq məşuqdan ayrılmazdır.

**Qeyd**: *Beyt kəsrətin vəhdət ilə daimi əlaqədarlığını, yaxud maddi yaranmışların mənəvi cələlər güzgüsü olduğunu təlqin etmək istəyir.*

Beyt 5: Saidin zövqilə tərk etmiş Füzuli aləmi,
Meyli-səhra eyləməz bir quş ki dəstamuz olur.

Sözlük: Dəst amuz = əldə bəslənmiş

Nişanə 1: "Said" – mütəal məbudun məhz iqtidarından nişanədir.

Nişanə 2: "Zövq" – bu beytdə ilahi iqtidar tanışlığından ibarətdir.

Nişanə 3: "Tərk" – aləmin tərki, qəflət yuxusundan ayılmış aşiqin vəhdət mülkünə qayıtmaq eşqilə kəsrəti, hətta ikiliyi unutmağından ibarətdir.

Anlam: İlahi eşq toruna giriftar olmuş Füzuli maddi dünya məhdudluğuna sığmazdır.

**Qeyd**: *İkinci misra mənəvi əhvalı dünyəviləşdirib başa salmaq istəyir.*

---

[1] Fərhəngi-Moin, Əlam.

## Q Ə Z Ə L 72

(1) Səbuh üçün mənə dürdi-meyi-şəbanə yetər,
Əsər ki, var, xərab olmağa bəhanə yetər.

(2) Cəfa oxun mənə yağdırman ancaq, ey əflak,
Demin ki, yeddi kamandarə bir nişanə yetər.

(3) Bəyanə yetməyə dərdü qəmim fəsanələri
Zəbanim atəşi-dildən çıxan zəbanə yetər.

(4) Qopardı mərdümi-çeşmim könül binasın kim,
Hübabi-əşki-həva nəqdinə xəzanə yetər.

(5) Ləbin xəyali ilə parə-parə oldu cigər,
Güvahi hal mənə əşki-danə-danə yetər.

(6) Hərifi-bəzmi-qəməm, xuni-dil şərabim olub,
Təraneyi-tərəbim ahi-aşiqanə yetər.

(7) Füzuli ,istəməzəm məsnədi-Cəmü Cəmşid ,
Mənə nişiməni-dövlət, şərabxanə yetər.

Beyt 1: **Səbuh üçün mənə dürdi-meyi-şəbanə yetər,**
**Əsər ki, var, xərab olmağa bəhanə yetər.**

Sözlük: Səbuh = sübh zamanı içilən süd, yaxud şərab, yaxud başqa anlayışlar, dürd = torta = yağ, yaxud şərab çöküntüsü; şəbanə = gecəlik = gecə vaxtı/

Nişanə 1: "Səbuh":

A – səbuh, ülvi ölməz aləmdə, yaxud "ələst"[1] aləmində ilahi vüsal şərabından məst olmuş aşiqin maddi hicran dünyasında xumarlığını sındıran təcəlla nurundan ibarətdir.[2]

B – dünyəvi maraq – müşahidədən xəlvət[3] etmiş aşiqin mütəal canan ilə dərdi-dil etməyindən nişanədir.

**Qeyd**: *Dərdi dil etmək görüş hazırlığının şərti olduğu kimi hazırlıq da müşahidəyə bağlıdır beləliklə, dərdi-dil səbuh, şühud və hüzur mərtəbəsini təlqin edən nişanədir*.

Nişanə 2: "Dürdi-mey" – ilahi məhəbbət qələbəsində şəxsi möhnəti yaddan çıxaran nişanədən ibarətdir.

Nişanə 3: "Şəbanə ": Gecə ictimai – ümumi çalışqanlıqların dayandığı çağ olduğuna görə aşiqi kəsrətdən ayırıb bəsitləşdirməklə vəhdətə yetirən istiarədən ibarətdir.[4]

Nişanə 4: "Əsər": A – xəlvət şəraitində unudulmuş mənəm-mənəmliyin, yaxud məcazi mahiyyətin tör-töküntüsündən ibarətdir.

B – Əsər dürdi-mey şəbanəsindən ibarətdir.

Nişanə 5: "Xərab" – xərab bəşəri sifətləri unutmaqla ilahi sifətlərə yer açmaq nişanəsidir.

Anlam: Ey mürşid, yaxud ey ilahi vasitə, dünyəvilik hicabından, xüsusilə mənəmlik torundan xilas olub şühud və hüzur məqamına, yaxud ilahi vüsal mərtəbəsinə dübarə nail olmaqla xumar sındıran mənəvi feyzlərə möhtacam.

Beyt 2: **Cəfa oxun mənə yağdırman ancaq, ey əflak,**
**Demin ki, yeddi kamandarə bir nişanə yetər.**

Sözlük: Əflak = fələklər = göylər; kamandar = kamançı = qabil ox atan/

Nişanə 1: "Cəfa"–bu beytdə ürəyi mənəvi maraq və müşahidədən məhrum edən mərhələdən ibarətdir.

---

[1] Qəzəl 19, beyt 4
[2] Qəzəl 57, beyt 1
[3] Qəzəl 69, beyt 4
[4] Qəzəl 71 beyt 4 (dövri-qəmər)

Nişanə 2: "Əflak"– alın yazısına təsir edən ulduzlar seyrindən ibarətdir.[1]

**Qeyd**: *"Hal məhəl" ünvanlı ədəbi məcaz sənət baxımıından əflak, ulduzlar, yaxud göy sakinlərindən ibarətdir.*

Nişanə 3: "Yeddi kamandar"–əflakı təkrar edən nişanədən ibarətdir.

**Qeyd**: *A – Yeddi rəqəmiçox saylılıq, həm də bütövlük nişanəsidir.*

*B – İslam və İran mədəniyyətində hikmətli müqəddəs bir ədəddir, Qurani – Kərim bir çox mənəvi, yaxud maddi həqiqətləri, o cümlədən, əzəmətli göyləri yeddi mərtəbəli bəyan etmişdir.*[2]

İslami ürfan insanın cahana sığmaz qəlbinin yeddi təbəqədən ibarət olduğunu izah etmişdir.[3] Ürfani əhval bəhslərində aşiqi ilahi məqsədə nail edən eşq vadiləri yeddi vadi sayılmışdır. Beləliklə, dini - ədəbi – ürfani mədəniyyətdə yeddi dəniz, yeddi üzv, yeddi xeyirxah, yeddi rəng, Quranın yeddi bətni, yeddi bənd, yeddi sultan, yeddi təkbir, yeddi cövhər, yeddi çeşmə, yeddi xal, yeddi xəzinə, yeddi əl və habelə bir çox başqa yeddi mərtəbəli sirrlər qeyd və izah olunmuşdur.

Anlam: Ey alın yazısına təsir edən ulduzlar, yaxud ey səmavi iqtidarlar, mənim qəlbimi şühud mərtəbəsindən məhrum etmək məqsədilə birləşməyi rəva bilməyin.

Beyt 3: **Bəyanə yetməyə dərdü qəmim fəsanələri**
**Zəbanim atəşi-dildən çıxan zəbanə yetər.**

Sözlük: Fəsanə = əfsanə; zəbanə = şölə = alov

Nişanə 1: "Dərdü qəm fəsanələri" – mütəal məhbub tələbində müxtəlif çalışqanlıqlardan, həm də bəlalardan asılı nemətlərdən, yaxud şirinliklərə qatqı acılıqlardan ibarətdir.

Nişanə 2: "Zəbanə" – A – idraka – bəyana sığmaz eşq atəşini başa salmaq məqsədilə dünyəviləşdirilən nişanədən ibarətdir.

B – zəbanə, vücudun iç üzünü alovlayan nari-məhəbbəti onun çöl üzündə əks etdirmiş nişanədən ibarətdir.

Anlam: İçimi yandıran eşq atəşi, həm də çölümdə təzahür etməklə gizli qəmlərimi aşkara çıxarır.

Beyt 4: **Qopardı mərdümi-çeşmim könül binasın kim,**
**Hübabi-əşki-həva nəqdinə xəzanə yetər.**

---

[1] Qəzəl 71, beyt 4 (Dövri-qəmər)

[2] Quran, İsra surəsi, 44-cü ayədən bir qismət: "تُسَبِّحُ لهُ السّماواتُ السَبعُ وَ الأَرضُ وَ من فِيهنَّ وَ ... "

[3] Qəzəl 13, beyt 1 ( Ətvar)

Sözlük: Mərdümi çeşm = göz bəbəyi = bəbək; hübab = köpük; əşk = göz yaşı.

Nişanə 1: Birinci misra mətlədə qeyd olunmuş "əsər" ünvanlı məcazi mahiyyət tör-töküntüsünü yuyub aradan aparmaq nişanəsidir.

Nişanə 2: "Könül binasını qoparmaq ":

A – İç aləmdən xaric dünya ilgilərini qoparmaq nişanəsidir.

B – aşiqin yarı yer sakinliyini onun yarı göy sakinliyinə qovuşduran nişanəsindən ibarətdir.

Nişanə 3: "Hübabi əşk" – maddi bağlantılar küdurətini yuyub təmizləyən nişanədən ibarətdir.

Nişanə 4: "Həva nəqdi" – dünyəvi malikiyyətlərdən ayrılmaqla yoxsulluq, yaxud fəqr məqamında, "istiğna" ünvanlı mənəvi dövlət tapmaqdan [1], yaxud asılılıqlardan ayrımaq mərtəbəsindən [2], yaxud müxtəlif xəlvətlərlə dünyəvi maraqlardan boşalmış ürəyin mənəvi qismətindən [3] nişanədir.

**Qeyd**: *Beyt, xüsusilə ikinci misra məmlükluq, yaxud heç olmağı ilahi eşq nailiyyətinin birinci şərti bəyan etmək istəyir.*

Nişanə 5: "Xəzanə" – bu beyt də fitri dəyərdən, yaxud ilahi qiymətdən nişanədir.

Anlam: Fitri yüksəkliyə, yaxud ilahi kamala nail olmaq məqsədilə iç vücudumu dünyəvi ilgilərdən, həm də fiziki mahiyyət törətmiş maneələrdən xali etmişəm.

Beyt 5: **Ləbin xəyali ilə parə-parə oldu cigər,**
**Güvahi hal mənə əşki-danə-danə yetər.**

Sözlük: Güvah = şəhadət verən = həqqi – həqqaniyyəti təsdiq edən;
əşk = göz yaşı

Nişanə 1: "Ləb" – yoxu var edən, yaxud mənəvi həyat bağışlayan ilahi ilham – işarədən ibarətdir.

Nişanə 2: "Parə - parə cigər" – A – Fiziki əngəl mahiyyətin məhvlik müqəddiməsindən, yaxud təcəlla ünvanlı ilahi maraq və müşahidəyə hazırlaşmaqdan ibarətdir.

B – insanı qurbanlıq məqamına hazırlayan müqəddimədən ibarətdir.

---

[1] Qəzəl 44, beyt 4
[2] Qəzəl 64, beyt 6
[3] Qəzəl 65, beyt 1

Nişanə 3: "Danə-danə əşk" – ikinci misra da əvvəlki misranı təsdiq edən nişanədən ibarətdir.

Anlam: Mənəvi maraq və müşahidə eşqilə dünyəvi əngəl həyatdan ayrılmağa hazırlaşmışam.

Beyt 6: **Hərifi-bəzmi-qəməm, xuni-dil şərabim olub,**
**Təraneyi-tərəbim ahi-aşiqanə yetər.**

Sözlük: Bəzm = məclis = yığıncaq; xuni-dil = ürək qanı; tərəb = şadlıq = məstlik Nişanə 1: "Hərif" – iç vücudunu dünyəvi ilgilərdən boşaldan, çöl vücudundasa ilahi cəlaləri əks etdirən aşiqdən ibarətdir.

Nişanə 2: "Qəm" – bu beytdə müxtəlif qəsdlər sıxıntısından nişanədir.

Nişanə 3: "Xuni-dil" – ürək qanını şərab etmək ilahi eşq qələbəsində qurbanlıq məqamına hazırlaşmış vücuddan ibarətdir.

Nişanə 4: "Tərəb" – bəsitlik, yaxud mücərrədlik şəraitində mütəal məhbubla isinişməkdən ibarətdir.

Nişanə 5: "Ah" –A – Sözə - bəyana sığmaz eşq hərarətindən ibarətdir.

B – insanı əqlə-idraka sığmaz kamal mərtəbəsinə qaldıran nişanədən ibarətdir.

Anlam: Qəlbimi mütəal məhbubla isinişdirən ahıma, həm də xuni-dilimə minnətdaram.

Beyt 7: **Füzuli ,istəməzəm məsnədi-Cəmü Cəmşid ,**
**Mənə nişiməni-dövlət, şərabxanə yetər.**

Sözlük: Məsnəd = söykənəcək = böyük yastıq = yuxarı başa salınmış fərş = Sultan dirsəklənən yastıq; Cəmü Cəmşid = Cəm ləqəbli Cəmşid İran milli hekayələrində pişdadi ünvanlı əfsanəvi şahlardan biri[1]; nişimən = ev = oturacaq/

Nişanə 1: Məsnədi Cəmü Cəmşid – dünyəvi iqtidar və etibardan nişanədir.

Nişanə 2: "Nişiməni-dövlət" – sonsuz səadətdən nişanədir.

Nişanə 3: "Şərabxanə": A – Hər bir vücudun həqiqətindən, yaxud iç üzündən ibarətdir.

B – şərabxanə, ruhların gəzib-dolandığı mənəvi görünməz aləmdən ibarətdir.

[1] Qəzəl 45, beyt 4

P – şərabxanə, özünü kamal zirvəsinə qaldırmış arifin iç vücudundan, yaxud qəlbindən ibarətdir.

Anlam: Ey Füzuli, dünyəvi iqtidar və etibara heç də hacətim yoxdur, əksinə, mən ilahi cazibələrlə dolu ürək, yaxud mənəvi bir yaşayış axtarıram.

## Q Ə Z Ə L 73

(1) Gəh gözdə, gəh könüldə xədəngin məkan tutar,
Hər qanda olsa qanlını, əlbəttə, qan tutar.

(2) Dil çəksə nola canü təni xaki – kuyinə,
Xarü xəs artar orda ki quş aşiyan tutar.

(3) Zikri-ləbinlə zülfünə can oldu dəstrəs,
Onun kimi kim, oxuyub əfsun ilan tutar.

(4) Dil tutdu qönçə ilə bərabər dəhanını,
Bu əqli-naqis ilə özün nüktədan tutar.

(5) Xurşid xərməninə urar şölə-şölə od,
Ahim ki, ləhzə-ləhzə rəhi-asiman tutar.

(6) Can eylədikcə meyli-təmaşayi-qamətin,
Göz rövzənin sirişki-rəvanım rəvan tutar.

(7) Tutmaq dilər qapında Füzuli məqam, leyk
Bu sirri kimsəyə aça bilməz, nihan tutar.

Beyt 1: **Gəh gözdə, gəh könüldə xədəngin məkan tutar,**
**Hər qanda olsa qanlını, əlbəttə, qan tutar.**

Sözlük: Gəh = gah; xədəng = ox ucu = düz hədəfə dəyən ox

Nişanə 1: "Xədəng" – müxtəlif qəmzə satmaqla aşiqin yaralı qəlbini fəryad ünvanlı özəl münacata vadar etməkdən nişanədir.

Nişanə 2: "Qanlı" – ürək qanını göz yaşına qatmış gözdən, həm də ürəkdən nişanədir.

Anlam: Mütəal məhbub müxtəlif qəmzə satmaqla gah qəlbimi, gah da gözümü cəzalandırmaq istəyir.

**Qeyd** 1: *Mütəal məhbubdan başqalarını, yaxud kəsrəti görən göz günah etmişdir və bunun üçün də cəzalanmalıdır.*

**Qeyd** 2: *Fiziki həyata, yaxud dünyəvi ilgilərə mail olmaqla günahkarlıq edən ürək cəzalanmalıdır.*

**Qeyd** 3: *Cəza caynağı adam öldürən bir şəxsi yaxalayan kimi, mənəvi həyatını bir ölü kimi unutmuş insanı isə eşq caynağı giriftar etməlidir.*

**Qeyd** 4: *Göz şühud vasitəsi və ürək Allah evi olduğuna görə hər ikisinin dünyəviliyini öldürmək (qan tutmaq) mütəal məhbubun lütf və mərhəmət nişanəsidir.*

**Qeyd** 5: *Qanlı ləfzinin bir mənası da qan sahibi, yaxud qan malikidir, bunun üçün də:*

*A – Qan aşiqi qurbanlıq bazarına hazırlayan sərmayədan ibarətdir.*

*B – maddi həyatı bir əngəl kimi mənəvi həyat qarşısında dikəldiyinə görə tökülməlidir.*

*P – Öz məmlüklüyünü [1] (bəndəliyini) duyub – düşünmüş bir aşiqə malik, yaxud sahib olmaq böyük günahkarlıq, bunun üçün də onu qan tutmaq, yaxud qan malikiyyətindən ayırmaq onu Peyğəmbərin nail olduğu bəndəlik məqamına qaldırmaqdan ibarətdir.*[2]

**Qeyd** 6: *"Qan tutar" ifadəsi rəhmsiz cinayəıtkarların cəza caynağı ilə yaxalanmağına eyham edərək ictimai ibrətlənməyi təlqin edir.*

Beyt 2: **Dil çəksə nola canü təni xaki – kuyinə,**
**Xarü xəs artar orda ki quş aşiyan tutar.**

Sözlük: Xak = torpaq; xarü xəs = kol – kos; Aşiyan = yuva.

---

[1] Qəzəl 1, beyt 6
[2] Qəzə 2, beyt 3

Nişanə 1: "Dil" – aşiqin ilahi eşqlə dolmuş ürəyindən, yaxud yerə-göyə sığmaz həqiqi iç aləmindən ibarətdir.[1]

Nişanə 2: "Canü tən" – bu beytdə hər bir həyatın dünyaya söykənmiş maddi yönümündən, yaxud hər bir şəxsin fiziki mahiyyətindən ibarətdir.

Nişanə 3: "Xarü xəs" – "canü tən" ilə tənləşmiş məcazi mahiyyəti təhqir edən nişanədir.

Nişanə 4: "Quş" – aləmə sığmaz qəlbi dünyəviləşdirən nişanədir.

Anlam: Ey mütəal məhbub, quş yuvasının ətrafında kol – kosun cəmləşməyi təbii olan kimi, ilahi ərəfəyə dəxil düşmüş qəlbimə söykənən fiziki mahiyyət tör – töküntüsü də təbii bir müşküldür.

**Qeyd**: Beyt gah dünyəvi ömür möhlətində mükəmməl surətdə insandakı "mən"dən xilas olmaq çətinliyini, gah da mümkünsüzlüyünü eyham etmək istəyir.

Beyt 3**: Zikri-ləbinlə zülfünə can oldu dəstrəs,**
**Onun kimi kim oxuyub əfsun ilan tutar**.

Sözlük: Dəstrəs = əl tutmaq = əl vurmaq = toxunmaq.

Nişanə 1: "Zikri-ləb" – ilahi ilham və işarələr xəyalı ilə ürəyə həyat vermək nişanəsidir.

Nişanə 2: "Zülf" – bu beytdə vəhdət cilalarını əks etdirmiş kəsrətdən nişanədir.

Nişanə 3: "Can" – vücudun ilahi yönünü, yaxud həqiqi və batini vücudu təlqin edən nişanədir.

Nişanə 4: "Əfsun": A – Bu beytdə ilahi cazibələr eşqilə ürəyi maqnit, yaxud cəzb məqamına yetirən nişanədir.[2]

B – Əfsun bu beytdə maddənin gizli yönünü, yaxud mənəvi cəhətini tapıb-tanımaq nişanəsidir.

Nişanə 5: "İlan" – zülfü dünyəviləşdirib başa salmaq məqsədilə onunla tənləşmiş nişanədən ibarətdir.

**Qeyd**: *İlan nişanəsi çalıb-öldürməyi təlqin edərək* "موتوا قبل ان تموتوا" *ünvanlı əcəlin gəlişindən əvvəl ölməyi*, *yaxud "iradi ölümə" eyham etmək istəyir.*[3]

[1] Qəzəl 13, beyt 1
[2] Qəzəl 23, beyt 8
[3] Qəzəl 6, beyt 6, nişanə 2 (zülm)

Anlam: Can mahir bir ovsunçu kimi özəl münacatı ilə (zikri-ləb) maddi vücudlardan mənəvi cilvələri, yaxud kəsrət güzgüsündə vəhdət cilalarını kəşf etməyə nail oldu.

**Qeyd**: *Beyt hər bir yaranmışda yaradıcı məhbubun ətrini almağa eyham etmək istəyir.*

Beyt 4: **Dil tutdu qönçə ilə bərabər dəhanını,**
**Bu əqli-naqis ilə özün nüktədan tutar.**

Sözlük: Dəhan = ağız; nöktədan = bilici

Nişanə 1: "Dil" – bu beytdə mənəvi hüsnü idraka və düşüncəyə sığışdıran qüvvədən yaxud əql ilə bərabərləşmiş qəlbdən ibarətdir.

Nişanə 2: "Qönçə" – üç yarpaqlı olduğuna görə mübhəmlik eyham edən nişanədir.

Nişanə 3: "Dəhan" – bu beytdə əqlə və elmə sığmaz ilahi intibahlar feyzindən ibarətdir.

Anlam: Mənəvi hüsnləri dünyəvi ölçülərə sığışdırmaq nadanlıq və xəbərsizlik əlamətidir, elə bunun üçün də şərif ayədə "لَيسَ كَمِسلِهِ شَئٌ" [1] buyurulmuşdur.

Beyt 5: **Xurşid xərməninə urar şölə-şölə od,**
**Ahim ki, ləhzə-ləhzə rəhi-asiman tutar**.

Sözlük: Xurşid = günəş; rəh = yol

Nişanə 1: "Xurşid xərməni" – bu beytdə dünyəvi yüksəklik nişanəsidir.

Nişanə 2: "Ah" – A – Ürəkdə şölələnmiş ilahi eşqdən ibarətdir.

B – Atəş də su kimi yuyucu və paka çıxaran olduğuna görə ah mənəvi müşahidələrə maneə törətmiş maddi küdurətləri iç aləmdən təmizləyən nari-məhəbbətdən ibarətdir.

Nişanə 3: "Rəhi-asiman tutmaq ":

A – Dünyəvi yüksəliş əlamətidir.

B – Mənəvi yüksəlmək müqəddiməsidir.

Anlam: A – Mənəvi seyrlər qarşısında dikəlmiş maneələri mən bir ah ilə aradan qaldırıb məhv edərəm.

B – Nari-məhəbbət tərbiyəsilə kəlam zirvəsinə yüksəlmiş qəlbimin qarşısında dünyəvi yüksəlişlər təmamilə həqir və alçaqdırlar.

[1] Quran, "Şura" surəsi, 11-ci ayədən bir qismət: (Heç bir şey ona bənzər ola bilməz)

Beyt 6: **Can eylədikcə meyli-təmaşayi-qamətin,**
**Göz rövzənin sirişki-rəvanım rəvan tutar.**

Sözlük: Rövzən = baca; sirişk = göz yaşı

Nişanə 1: "Can" – A – Vücudun iç üzündən yaxud, insanın həqiqi yönündən ibarətdir.

B – Can bu beytdə yeddi mərtəbəli qəlbin, mənəvi görünməz yöndəmlərini görməyə qadir olan "fuad" ünvanlı dördüncü mərtəbədən ibarətdir.[1]

Nişanə 2: "Qamət" mütəal məbuda məxsus yararlı pərəstişdən ibarətdir.

Anlam: Ey mütəal məhbub, batinim, yaxud həqiqi vücudumla sənə pərəstiş etmək ləzzətindən gözüm şövq yaşlarını yağdırır, amma göz yaşı da maddilik və mənlik nişanəsi olduğuna görə həqiqi vüsala maneədir.

Beyt 7: **Tutmaq dilər qapında Füzuli məqam, leyk,**
**Bu sirri kimsəyə aça bilməz, nihan tutar**.

Sözlük: Nihan = pünhan = gizli.

Nişanə 1: "Məqam tutmaq" ardı-arası kəsilməz şühud məhəlində sakin olmaqdan ibarətdir.

**Qeyd**: *Mürşüdlər şühud nuru kəsilmiş məkanda sakinliyi düzgün bilməmişlər.*

Nişanə 2: "Qapı" – ilahi ərəfədən, yaxud bəndəlik məqamından ibarətdir.

Nişanə 3: "Sirr" – vücudun iç üzündə əmanət qoyulmuş ruhdan ən gözəl müşahidə qüvvəsindən ibarətdir.[2]

Anlam: Füzuli davam etdirilmiş müşahidə məqamına, yaxud bəndəlik mərtəbəsinə nail olmaq diləyir, amma bu sirri əql əhlindən gizli saxlamaq məqsədilə çətinliklər çəkir.

**Qeyd**: *Beyt əql əhlinin ürfani məqamlara naməhrəm olduğuna eyham etmək istəyir.*

---

[1] Qəzəl 13, beyt 1

[2] Fərhəngi- istilahat və təbirati ürfani .

## Q Ə Z Ə L 74

(1) Xoşam kim, dəmbədəm giryan gözüm ol xaki-padəndir,
Ziyanı olmaz ol göz yaşının kim, tutiyadəndir.

(2) Dəmadəm mərdümi-çeşmim içər qan zülfü xalından
Bəli, əksər məaşı əhli-dəryanın qəradəndir.

(3) Demə Fərhad qanın tökmüş ancaq eşq şəmşiri,
Mənim gör qanlı yaşım kim, bu həm ol macəradəndir.

(4) Müənbər sünbülündən almadan bu, olmadım rüsva,
Bu rüsvalıq mənə səndən degil, badi-səbadəndir.

(5) Hübabi-əşk içində muyi-julidəmlə xoşhaləm,
Başımda bu humayun sayə ol alibinadəndir.

(6) Vəfa rəsmin unutmuşsan deyib incinməzəm, zira
Bu kim, məndən cəfa kəm eyləməzsən, həm vəfadəndir.

(7) Kəmali-hüsni-məşrəb ari olmaqdır təərrüzdən,
Riya əhlinə həm çox etiraz etmək riyadəndir.

(8) Füzuli, tökmə çox yaş, ehtiyat et getməsin nagəh
Gözündən sürmə kim, gərdi-rəhi-əhli-səfadəndir.

Beyt 1: **Xoşam kim, dəmbədəm giryan gözüm ol xaki-padəndir,**
**Ziyanı olmaz ol göz yaşının kim, tutiyadəndir.**

Sözlük: Xaki-pa = addımlanmış torpaq = ayaq altındakı torpaq.

Nişanə 1: "Giryan": giryanlıq mənəm-mənəmliyi yuyub bəsitlik mərtəbəsinə, yaxud vəhdət nailiyyətinə hazırlayan nişanədir.

Nişanə 2: "Xaki-pa" – yaxud tuti dünyaşünas gözü örtmək ilə mənaşünas gözü qüvvətləndirən səbəbdən ibarətdir.

**Qeyd** 1: *Ürfan mədəniyyətində bir çox etibarlar, xüsusilə anlamlar baş – ayaq olduğu kimi dilbər astanasının tuti ünvanlı torpağı isə əksinə olmalıdır. Demək bu torpağın gözə dolmağı zərərli deyil,bəlkə də bəsirət bağışlayan xeyir – mənfəətdir.*[1]

**Qeyd** 2: *Beyt tutiyanın keçmişlərdə göz dərmanı yaxud göz yuyucusu olduğuna da eyham etmək istəyir.*

Anlam: Tutiya xəstə gözə dərman olduğukimi, dilbər astanasının torpağı isə dünyəvi əngəllərin xəstələndirdiyi gözümün sağlaşmağına, həm də nurlanmasına səbəb olur.

**Qeyd**: *Beyt torpağa düşməyə, yaxud bəndəlik göstərməyə də eyham edir.*

Beyt 2: **Dəmadəm mərdümi-çeşmim içər qan zülfü xalından**
**Bəli, əksər məaşı əhli-dəryanın qaradəndir.**

Sözlük: Dəmadəm = dəmbədəm; mərdümi-çeşm = göz bəbəyi.

Nişanə 1: "Qan içmək" – A – Şühud həsrətilə qəlbi çulğalayan işgəncəli qəm – qüssədən ibarətdir.

B – cismi həyat, yaxud maddi mahiyyətdən qurtarmaq müqəddiməsidir.

Nişanə 2: "Zülf" – bu beytdə ilahi camal ətrafını almış hicablardan, yaxud insani vəhdət nurundan məhrum etmiş kəsrət bağlantılarından ibarətdir.

Nişanə 3: "Xal" – A – Əqlə - idraka sığmaz vəhdətdən, yaxud mənəvi həqiqətdən ibarətdir.

B – insanı ilahi cilvələrdən məhrum edən nalayiqlik zülmətindən ibarətdir.

**Qeyd** 1: *Xal və zülf, bu beytdə mənəvi təcrübələrdən xəbərsiz qəlbi tərbiyə edib yetişdirən qəbzlərə eyham edən nişanələrdirlər.*

---

[1] Qəzəl 34, beyt 3

**Qeyd** 2: *Xal və zülf qara olduqlarına görə müşahidə nailiyyətinin, həm də mənəvi tanışlığın qaranlıqda mümkünsüz olduğuna eyham edir.*

**Qeyd** 3: *Qara-keçmişlərdə balıq tutanların gecə vaxtı ovçuluq etməyinə eyham edərək bəstin qəbz ilə yaxud nurun zülmət ilə bağlılığını təlqin etmək istəyir.*

**Qeyd** 4: *"Hər bir şeyi tanımaq onun əksi ilə tanış olmağa bağlı olduğuna görə" aləm də qara zərrələrin bətnində parlaq nur kəşfinə çalışqanlıq etmişdir*[1] .

**Qeyd** 5: *Ürfan da şərif ayədə* "يولجُ الَّيلَ فيِ النَّهارِوَ يوُجُ النَّهارِ فيِ الَّيل "[2] *buyurulduğu kimi nurun zülmətdən doğulmağını təsdiq edərək ürəyin sevda ünvanlı qara nöqtəsini bilik nurunun mərkəzi və gözün bəbək adlı qara nöqtəsini onun işıqlıq mənbəyi bilmişdir.*

Nəticə: Qara-quruluq mənasilə keçmiş şühud nurunun qara zülf və xaldan doğulmağına eyham etmək istəyir.

Nişanə 4: "Dərya" – sonsuz varlığı yaxud büsbütün dünyanı nur dalğalarından yaradan mütləq iqtidarı təlqin edən nişanədir.

Anlam: Ötən beyti davam etdirmək məqsədilə buyurur: A – Dəniz ovçularının (balıq tutanların) bir çox alğı- satqısı quruluqda olan kimi, mənim də qan-yaş dənizində qərq olmuş gözüm mütəal məhbub ərəfəsində, yaxud eşq bazarında mənəvi maaş axtarmaqla məşğuldur.

B – Dəniz təhlükələri ilə əlbəyaxa olmaq quruluq maaşına bağlı olduğu kimi qəmlərə, məlamətlərə dözmək də vəhdət mülkünə qayıtmağın şərtidir.

Beyt 3: **Deмə Fərhad qanın tökmüş ancaq eşq şəmşiri,**
**Mənim gör qanlı yaşım kim, bu həm ol macəradəndir.**

Anlam: Fərhadın qanını tökmüş şəmşir mənim də ürək qanımı göz yaşıma qatmışdır.

**Qeyd**: *Dönə- dönə xatırladığımız kimi: Bəşəri hüsn ilahi hüsnlərlə uyğun olduğuna görə məcazi pak eşq də mənəvi eşq kimi müqəddəsdir, demək bəşəri eşq bir çox aşiqi mal- dövlətdən, aram- qərardan, yemək-yatmaqdan və digər ilgi - əlaqədən ayırmağıyla ona fədakarlıq və fərdlik məşqini yaxud ilahi eşq ünvanını öyrədir. Beləliklə, bəşəri eşqini kamil etmiş bir aşiqin ilahi eşqlə bir addım fasiləsi var, demək məcazi eşq bir*

[1] Paydiya, Vurunriger s.994, İntişarate-Xarəzmi, 1376

[2] "ذالکَ بأنَّ اللهَ يولجُ الّيلَ فى النَّهار و يولجُ النّهار فى الّيل و انَّ اللهَ سميعُ بصير ": “Bu Allahın gecədən kəsib gündüzə artırması və gündüzdən kəsib gecəyə artırmasına görədir. Və Allah eşidən və görəndir” (Quran, Həcc surəsi, ayə 61)

*nərdivana bənzədilərsə axır pillədə mənəvi eşq aləminə söykənməlidir, bunun üçün də beyt Fərhadın bəşəri eşq ərəfəsində qurban olmağını dünyəviliyə son qoymaq, yaxud mənəviliyə daxil olmaq müqəddəsini təlqin etmək istəyir.*

Beyt 4: **Müənbər sünbüləndən almadan bu, olmadım rüsva,**
**Bu rüsvalıq mənə səndən degil, badi-səbadəndir.**

Sözlük: Müənbər = ətirli = ənbər qatılmış; bu = iy = əsər.

Nişanə 1: "Müənbər sünbül"– vəhdət rayihəli kəsrətdən nişanədir.

Nişanə 2: "Badi-səba" – bu beytdə vəhdət rayihəli mənəvi nəsimin maddi atmosferə daxil olmasından nişanədir.

Nişanə 3: "Rüsva" – A – Müənbər sünbül önündə öz istedadsızlığından xəcil olmuş aşiqdən ibarətdir.

B – vəhdət rayihəsilə yaxud səba vasitəsilə mənaşünaslığa nail olmaqla məcazi etibarlardan nifrət etməkdən, beləliklə dünyaşünasların sərki – danlağını qəbul etməkdən nişanədir.

Anlam: Vüsal mərtəbəsini, yaxud ilahi cilvələri vasitəsiz dərk etməkdən aciz olduğuma görə, mehriban məbud səba vasitəsilə möhtac qəlbimi rəhmət rayihələrlə bəhrələndirdi, amma vasitə ikilik əlaməti olduğuna görə ( bir aşiq bir də vasitə) ərəblər "كل سرّ جاوز الاثنين" [1] demişkən sirrim aşkara çıxmaqla rüsvalığıma bais oldu.

**Qeyd** 1: *Dünyəvi ömür möhlətində vasitəsiz vüsal mümkünsüz olduğuna görə eşq dünyəvi yaşayışda rüsvay olmalıdır.*

**Qeyd**: *Hafiz də bu mərhələyə nəzər edərək buyurmuşdur:*

تورا صبا ومرا آب دیده شد غمّاز　　وگرنه عاشق ومعشوق رازدارانند[2]

Beyt 5: **Hübabi-əşk içində muyi-julidəmlə xoşhaləm,**
**Başımda bu humayun sayə ol alibinadəndir.**

Sözlük: Hübab = köpük; əşk = göz yaşı; muyi-julidə = pırpız = pırtlaşıq tük = qocalıq; humayun = mübarək = İran və Azərbaycan muğamlarından biri.

Nişanə 1: "Hübabi-əşk" – dünyəvi ilgi - əlaqələri, xüsusilə bəşəri sifətləri yuyub iç aləmi "ney" ünvanlı boş mənzilə çevirmiş mərtəbədən ibarətdir.

---

[1] İki, yaxud üç şəxsin bildiyi aşkar olmalıdır.

[2] Müəllif "Ta Qafi-əndişə" kitabının ikinci cildində həmin beyti izah etmişdir.

**Qeyd**: *İlahi sifətlər ilə dolmağın ilk şərti için boşluğudur.*

Nişanə 2: "Muyi-julidə" – qocalıq əlamətindən ibarətdir.Qocalıq isə:

A – Mürşid və rəhbər olmaq əlamətidir.

B – Dünyəvi həbs, yaxud fiziki mahiyyət əngəlindən xilas olmaq nişanəsidir.

Nişanə 3: "Ali bina" – hübab məqamına, yaxud içi boşluğa nail olmağı təkrar edən nişanədən ibarətdir.

Anlam: Göz yaşilə yuyunub paka çıxmış vücudum ilahi sifətlər bağışlayan "hübab" mərtəbəsinə nail olmuşdur.

Beyt 6: **Vəfa rəsmin unutmuşsan deyib incinməzəm, zira**
**Bu kim, məndən cəfa kəm eyləməzsən, həm vəfadəndir**.

Nişanə 1: "Vəfa" – A – daimi şühud nailiyyətindən ibarətdir.

B – istedadsız aşiqi ilahi ehsandan bəhrələndirən nişanədir.

Nişanə 2: "Cəfa" – aşiqin tərbiyəsinə gərəkli qəbzlərdən, yaxud onun qəlbini müxtəlif örpəklər ilə şühud nurundan məhrum edən nişanədən ibarətdir.

Anlam: Ey həkimi-məhbub, sənin cəfaların da müxtəlif xeyirlər – mənfəətlər vasitəsi olduğuna görə vəfaların kimi hörmətlidir.

Beyt 7: **Kəmali-hüsni-məşrəb ari olmaqdır təərrüzdən,**
**Riya əhlinə həm çox etiraz etmək riyadəndir.**

Sözlük: Hüsni-məşrəb = yaxşı rəftar etmək; məşrəb = dini və fəlsəfi yol = rəftar = su içmək yeri; ari = üryan = lüt; təərrüz = etiraz etmək.

Anlam: Dünyaşünaslıqdan dəm vuranlara çoz etiraz etmək dünyəviliyi mükəmməl surətdə unutmamaqdan nişanədir.

**Qeyd**: *Yüksək ürfan və insanlıq zirvəsinə çatmağa yalnız mənəvi seyr kifayət etməz buna görə də yaxşı – yaman cəmaət ilə keçinməyi, yaxud zahiri, yaxud ictimai seyrləri də salik üçün gərəkli bilmişlər, salik batində yaradıcı xaliqi və zahirdə yaranmış xəlqi nəzərdə tutub seyr etməlidir.*[1] *Salik, yaxud aşiq nə bir şəxsi incidər, nə də bir şəxsdən incikli olar, çünki incimək məcazi vücud xasiyyətidir, halbuki məcazi*

[1] Doktor Cavad Nurbəxş,[1] "Sufi kist" s.10, 11, 15, 21

*vücud aşiq üçün böyük bir günahdır,*[1] *buna görə də İslamın ulu Peyğəmbəri* "موتوا قبل آن تموتوا" *buyurmuşdur.*[2]

Beyt 8: **Füzuli, tökmə çox yaş, ehtiyat et getməsin nagəh**
**Gözündən sürmə kim, gərdi-rəhi-əhli-səfadəndir.**

Sözlük: Nagəh = nagah; gərd = toz; rəh = yol.

Nişanə 1: "Yaş tökmək" – bu beytdə səbirsizlikdən nişanədir.

Nişanə 2: "Sürmə, gərdi rəh" – birinci beytdə bəyan olmuş tutiya mərtəbəsini təkrar edən nişanədən ibarətdir.

Nişanə 3: "Əhli-səfa" – asılılıqdan qurtulmuşlardan[3], yaxud yalnız mütəal məbudla məşğul olanlardan nişanədir.

Anlam: Ey Füzuli, bir çox səbirsizlik məhbub cəfalarının bitməyinə bais olmaqla aşiqi daimi naqislik – nalayiqliyə giriftar edər.

---

[1] Doktor Cavad Nurbəxş, "Sufi kist" s.10, 11, 15, 21

[2] Doktor Cavad Nurbəxş, "Sufi kist" s.10, 11, 15, 21

[3] Qəzəl 64, beyt 4

## Q Ə Z Ə L 75

**(1) Pərişan xəlqi – aləm ahü əfğan etdigimdəndir,**
**Pərişan olduğum xəlqi pərişan etdigimdəndir.**

**(2) Təni – zarimdə dərdi – eşq gün – gündən füzun olmaq,**
**Yetən bidərdə tədbirilə dərman etdigimdədir.**

**(3) Gözüm kim, bağrımın qanın tökər pərkalə - pərkalə,**
**Dəmadəm arizuyi – ləli – canan etdigimdəndir.**

**(4) Degil bihudə gər yağsa fələkdən başimə daşlar,**
**Binasın tişeyi – ahimlə viran etdigimdəndir.**

**(5) Qaçan rüsva olurdum qan udub səbr edə bilseydim,**
**Məlamət çəkdiyim bihudə əfğan etdigimdəndir.**

**(6) Xəta səndən degil, cismim oxundan binəsib olsa,**
**Hübabi - əşki – gülgun içrə pünhan etdigimdəndir.**

**(7) Füzuli, ixtilati – mərdümi – aləmdən ikrahim,**
**Pərivəşlər xəyalın munisi – can etdigimdəndir.**

Beyt 1: **Pərişan xəlqi – aləm ahü əfğan etdigimdəndir,**
**Pərişan olduğum xəlqi pərişan etdigimdəndir.**

Nişanə 1: "Pərişan" – bu beytdə "təfriqə" mərhələsindən, yaxud bir çox adamın məşğul olmasından nişanədir.

Nişanə 2: "Ahü-fəğan" – bu beytdə istedadsızlığa bağlı səbirsizlikdən nişanədir.

Anlam: Öz istedadsızlığım gizli sirrimi açıb – ağartmaqla camaatın sərki və danlağına, yaxud irad – etirazına, həm də ilahi cilaların qət olmasına bais olur.

**Qeyd**: *Pərişanlığın bir mənası da yaradıcı xaliq cilvələrini yaranmış xəlqdə görmək olduğuna görə, beyt istedadlı qabil aşiqin yüksəkliyini və nəhayət təşəkkürünü təlqin etmək istəyir. Belə bir baxımla "ahu fəğan" da iç aləmi paka çıxaran özəl münacatdan ibarət olur.*

Beyt 2: **Təni – zarimdə dərdi – eşq gün – gündən füzun olmaq,**
**Yetən bidərdə tədbirilə dərman etdigimdədir.**

Sözlük: Füzun = əlavə = artıq.

Nişanə 1: "Dərdi-eşq" – bu beytdə ardı-arası kəsilməz qəbzlərdən, həm də atəş qoparan ətəşlərdən ibarətdir.

Nişanə 2: "Bidərd" – bu beytdə mənəvi cazibələrdən xəbərsiz əql tərəfdarlarından nişanədir.

Anlam: A – Əql əhlini yaxud naməhrəmləri eşq cazibələrindən xəbərdar etməyə çalışqanlığım mənin bərk tənbih olmağıma bais olmuşdur.

B – Əql əhlini eşq yoluna hidayət etməyim yetginlik bağışlayan dərdlərlə dəmbədəm mənin muzdumu artırır.

Beyt 3: **Gözüm kim, bağrımın qanın tökər pərkalə - pərkalə,**
**Dəmadəm arizuyi – ləli – canan etdigimdəndir.**

Sözlük: Pərkalə - pərkalə = tikə - tikə = parça – parça = hissə = hissə; dəmadəm=dəmbədəm.

Nişanə 1: "Qan tökmək" – fiziki əngəl mahiyyəti, yaxud mənəm-mənəmliyi batil etməkdən nişanədir.

Nişanə 2: "Ləl": Ləl bu beytdə ilahi ilhamlarla, dünyəvilikdən boşalıb, mənəviliyə dolan ürəkdən nişanədir.

Anlam: Qəlbim parça-parça olmaqla: A – İlahi ilhamlar istedadını qazanmaq istəyir.

B – Öz istedadsızlığını etiraf etmək, həm də cəzalanmaq istəyir.

Beyt 4: **Degil bihudə gər yağsa fələkdən başimə daşlar,**
**Binasın tişeyi – ahimlə viran etdigimdəndir.**

Sözlük: Bihudə = batil = yersiz = faydasız

Anlam: Dünyəvi etibarların həqirligini açıb – ağartmağıma görə dünya da mənəvi cilvələr qarşısında maneələr dikəldib məni cəzalandırmaq istəyir.

**Qeyd** 1: *Beyt kəsrətin hayil olmağından şikayət edir.*

**Qeyd** 2: *Bu beyt ötən beytlərdə nəzərə gəlmiş gileyliklərin təşəkkürlə bağlı olduğuna eyham etmək istəyir.*

Beyt 5: **Qaçan rüsva olurdum qan udub səbr edə bilseydim,**
**Məlamət çəkdiyim bihudə əfğan etdigimdəndir.**

Anlam: Mən də əql əhli kimi siyasətbazlıq bacarsaydım bir belə rüsvay olmazdım.

**Qeyd**: *Beyt siyasətsizlıiyi nəhayət rüsvaylığı yetkinlik səbəbləri, yaxud dəyərli etibarlarla təlqin etmək istəyir.*

Beyt 6: **Xəta səndən degil, cismim oxundan binəsib olsa,**
**Hübabi - əşki – gülgun içrə pünhan etdigimdənir.**

Sözlük: Binəsib = nəsibsiz = bəhrəsiz; gülgun = gülgəz = qırmızı.

Nişanə 1: "Cism" – fiziki əngəl mahiyyətindən ibarətdir.

Nişanə 2: "Ox" – ilahi qəmzə satmaqlar önündə cismi unutmaq nişanəsidir.

Nişanə 3: İkinci misra göz yaşıyla mükəmməl surətdə yuyulmayan məcazi vücuddan, yaxud fiziki mahiyyət tör-töküntüsündən nişanədir.

Anlam: Ey mehriban məhbub, öz maddi vücudumun ilahi cılalar önündə dikəltdiyi maneələrdən gileyliyəm.

Beyt 7**: Füzuli, ixtilati – mərdümi – aləmdən ikrahim,**
**Pərivəşlər xəyalın munisi – can etdigimdəndir.**

Sözlük: İxtilat = qarışmaq = oturub – durmaq = söhbət etmək; pərivəş = pəri çöhrə = pəri sima = gözəl.

Nişanə 1: "Pərivəşlər" – rəhmani feyz gətirən mənəvi vasitələrdən, yaxud mürşüdlərdən, ya da bəşəri camalda ilahi hüsnlər əks etdirmiş gözəllərdən ibarətdir.

Nişanə 2: "Xəyal" – dünyəvi duyğulardan xali olmuş vücudun mənəvi görünməz mərtəbələrini görmək qüvvəsindən ibarətdir.

Nişanə 3: "Can" – ilahi təcəllilləri əks etdirmiş iç aləmdən, yaxud aşiqin həqiqi vücudundan ibarətdir.

Anlam: Ey Füzuli, mənəvi vasitələr tanışlığı dünyəvi etibarlara uymuş xəlqi gözümdən salmışdır.

## Q Ə Z Ə L 76

**(1) Qəbrim daşına kim qəm odundan zəbanədir,**
**Tən oxun atma kim, xətəri çox nişanədir.**

**(2) Eylər qədəh zəmanə qəmin dəf qaliba,**
**Dövri – qədəh, muxalifi-dövri-zəmanədir.**

**(3) Qaldırdı əşki-dun məni ol astanədən**
**Kim, məqsədim mənim dəxi ol astanədir.**

**(4) Vaiz sözünə tutma qulaq, qafil olma kim,**
**Qəflət yuxusunun səbəbi ol fəsanədir.**

**(5) Nəzr etmişəm fəraqinə kim, yox nihayəti,**
**Nəqdi – sirişkimi ki, tükənməz xəzanədir.**

**(6) Can verməyimmi qürbətə kim bimi- tənədən,**
**Yadi – vətən fəğanimə sənsiz bəhanədir.**

**(7) Ey dil, həzər qıl atəşi- ahinlə yanmasın**
**Cismim ki, dərd quşlarına aşiyanədir.**

**(8) Məndən, Füzuli, istəmə əşari-mədhü zəmm,**
**Mən aşiqəm, həmişə sözüm aşiqanədir.**

Beyt 1: **Qəbrim daşına kim qəm odundan zəbanədir,**
**Tən oxun atma kim, xətəri çox nişanədir.**

Sözlük: Zəbanə = şölə = alov; tən = tənə = təhqir etmək = sancmaq.

Anlam: Ürəyimin sönməz atəşilə şölələnmiş qəbrimi təhqir etmək bütün eşq və ürfan əhlini məlamət etməkdir.

**Qeyd**: Eşq atəşilə şölələnmiş qəbir daşı məni inkar edənlərin daşdan bərk ürəlkərini məzəmmət edir.

Beyt 2: **Eylər qədəh zəmanə qəmin dəf qaliba,**
**Dövri – qədəh muxalifi-dövri zəmanədir.**

Nişanə 1: "Qədəh" – ilahi feyzlərə nail olmaq istedadından, həm də təcəlla vaxtından nişanədir.[1]

Nişanə 2: "Zəmanə qəmi" – dünyəvi əngəllər zəhmətindən, həm də birinci beytdə işarə edilən daş qəlbli insanların sərkisindən ibarətdir.

Anlam: Mənəvi təcəllilər önündə dünyəvi maneələr məhv olmalıdır.

Beyt 3: **Qaldırdı əşki-dun məni ol astanədən,**
**Kim məqsədim mənim dəxi ol astanədir.**

Sözlük: Əşk = göz yaşı; dun = alçaq = həqir.

Nişanə 1: "Əşki dun" – bu beytdə istedadsız aşiqin səbirsizliyinə sərkidir.

**Qeyd** 1: Göz yaşı aşağı axdığına görə "dun" sifətilə vəsf olunmuşdur.

**Qeyd** 2: eşq sirrini açıb – ağartmağına görə "dun" kimi vəsf olunmuşdur.

**Qeyd** 3: səbrsizlik əlaməti olduğuna görə "dun" vəsf olunmuşdur.

Anlam: Göz yaşı "dun" olduğuna görə mənim mütəal məhbub ərəfəsindən kənar olmağıma bais oldu.

Beyt 4: **Vaiz sözünə tutma qulaq, qafil olma kim,**
**Qəflət yuxusunun səbəbi ol fəsanədir.**

Sözlük: Fəsanə = əfsanə = mövhumi-hekayət = mövhumat.

Anlam: Ey aşiq, əqldən dəm vuran nəsihətçilərin sözünü qulaq ardına vurmaq gərəkdir, çünki onların sözü mövhumat kimi faydasızdır.

---

[1] Fərhəgi-istilahati ürfani, doktor Mənuçehr Daneşpejuh

**Qeyd** 1: Əql dünyasının nəsihəti eşq aləmində kara gəlməzdir.

**Qeyd** 2: Vaiz nəsihəti xeyrxahcasına olsa da yalnız əql əhlinin karına gələr.

Beyt 5: **Nəzr etmişəm fəraqinə kim, yox nihayəti,**
**Nəqdi – sirişkimi ki, tükənməz xəzanədir**

Nişanə: "Fəraq" – vəhdət mərkəzindən qayiblik nişanəsidir.

Anlam: A – Hicran uzandıqca aglamaq, yəni gözünün yaşları mənim nəzirimdir.

B – Dünyəvi ömür möhlətində həmişəlik vəhdət mülkünə qovuşmaq mümkünsüz olduğuna görə həmişəlik biqərarlıqdan xilas olmaq da mümkünsüzdür.

P – Məşuqun naz satmaqları nəhayətsiz olduğuna görə aşiqin də biqərarlığı nəhayətsizdir.

Beyt 6: **Can verməyimmi qübətə kim bimi- tənədən**
**Yadi – vətən fəğaninə sənsiz bəhanədir.**

Sözlük: Bim = qorxu.

Nişanə 1: "Qürbət" mənəvi ölməz aləmdə, yaxud vəhdət mülkündə, ya da mütəal canan hüzurunda yaşamış insanın maddi quruğulu hicran dünyasına atılmağından ibarətdir.[1]

Nişanə 2: "Vətən" – vəhdət mülkündən, yaxud ilahi ölməz aləmdən ibarətdir.

Anlam: Hicran atəşinə dözməklə özümü ölümdən qorumağım o səbəbdəndir ki:

A – Canan camalını görməyincə can verməyə razi degiləm

B – Canan hüzuruna hədiyyə etmək məqsədilə canımı mühafizə edirəm.

**Qeyd**: Lisani-qeyb Hafiz isə "A" və "B" məqamlarına mail olarkən demişdir:

روز مرگم نفسی مهلت دیدار بده      تا چو حافظ ز سرجان و جهان برخیزم

P – Qürbətdə can versəm vüsal məqamına nail olmuş ariflərin təhqirinə giriftar olmalıyam.

Beyt 7**:** **Ey dil, həzər qıl atəşi- ahinlə yanmasın**

---

[1] Qəzəl 34, beyt 3

**Cismim ki, dərd quşlarına aşiyanədir.**

Sözlük: Aşiyanə = yuva.

Anlam: Ötən beyti davam etdirərkən ölümdən pərhiz etməyini dəlilləşdirmək məqsədilə buyurur: Ey ətəş və tələb atəşində alovlanmış ürəyim, zahiri vücudumu yandırıb kül etməklə məni cəfalar, yaxud bəlalar bərəkətindən məhrum etmə.

**Qeyd** 1: *İnsanın qabiliyyətini müəyyən edib üzərə çıxaran çalışqanlıq, fədakarlıq, sınaq – sıxıntı, cəfa çəkmək, bəlalara dözmək, hətta şəhid olmaq cisimsiz imkanlı olmadığına görə, cismi həyatı yaxud dünyəvi ömrü mühafizə etmək vəhdət mülkünə hədiyyə hazırlamaq sərmayəını qorumaqdan ibarətdir, buna görə də buyurulub:* " الدنيا مزرعه الآخره" [1]

**Qeyd** 2: *Cisimsiz dərd çəkmək yaxud bəladan asılı nemətdən bəhrələnmək yaxud şəhid olmaq... mümkünsüzdür.*

Beyt 8: **Məndən, Füzuli, istəmə əşari-mədhü zəmm,**
**Mən aşiqəm, həmişə sözüm aşiqanədir.**

Sözlük: Əşar =şerlər, zəmm = həcv etmək = məzəmmət etmək.

Anlam: Ey Füzuli, mütəal məhbubun hədiyyə etdigi aşiqanə fərasətimdən bir silah yaxud bir siyasət kimi dünyəvi müamilələr və əqli mübarizələrdə istifadə etmərəm.

**Qeyd**: *Beytin məfhumundan belə məlum olur ki:*

*1 – Fərasət, zəka ilahi özəl bir nemətdir.*

*2 – Hər bir şair üçün ilahi əmanətdən dürüst istifadə etmək ilahi bir təklifdir.*

*3 – Hər fərasət özəl çeşidli olduğuna görə onun çeşidini əvəz etmək, məsələn aşiqanə fərasətdən siyasi söz ummaq o əmanətə xəyanət etməkdir.*

*4 – Aşiqanə şer, camaatın dünyəvi əlaqələrini, yaxud məcazi qatlarını lay – lay soyub onları bəsitləşdirə bilsə, yaxud bütün yaranmışlarda, xüsusilə bütün insanlarda əks etdirilmiş ilahi gözəllikləri nişan verməgə nail olsa, deməli böyük ictimai vəzifə daşıyıbdır. Beləliklə, öz ilahi xarakterini yaxud öz ilahi istedadına bağlı vəzifəsini tanımış bir şairdən fərasətindən başqa bir şer ummaq, yaxud ona vəzifə müəyyən etmək yersiz və məntiqsizdir. Elə buna görə də Ayris Mərdak demişdir:*

[1] Dünya axirətin əkin yeridir.

*"... mən fikr etməyirəm ki şair hünərli olduğuna görə ictimai vəzifə daşımalıdır: "..., bəlkə də o, hünərinə, yaxud ona ilahi verilmiş əmanətə görə vəzifəlidir [1] ". Deməк, fərasət hər bir çeşiddə olsa, ilahidən verildiyinə görə ictimai xidmətdən xali ola bilməz.*

*5 – Mənəvi fəaliyyətdən dünyəvi mənfəət axtarmaq əmanəti təğyir etmək, yaxud vəzifədən qafil olmaqdır.*

---

[1] Berayan Megi,Mərdani-əndişe, səh 428 və 430

## Q Ə Z Ə L 77

**(1) Cani kim canani üçün sevsə, cananın sevər,**
**Cani üçün kim ki, cananın sevər, canın sevər.**

**(2) Hər kimin aləmdə miqdarıncadır təbində meyl,**
**Mən ləbi-cananımı, Xizr abi-heyvanın sevər.**

**(3) Başə dəm düşdükcə təqsir eyləməz, axar müdam,**
**Ol səbəbdən müttəsil çeşmim cigər qanın sevər.**

**(4) Mişki –Çin avarə olmuşdur vətəndən mən kimi,**
**Qansı şuxun bilməzəm zülfi-pərişanın sevər.**

**(5) Su ki sərgərdan gəzər başında vardır bir həva,**
**Qaliba, bir gülruxun sərvi-xuramanın sevər.**

**(6) Aqibət rüsva olub mey tək düşər el ağzına**
**Kim ki, bir sərməst saqi ləli-xəndanın sevər.**

**(7) Nolacaqdır, tərki-eşq etmə, Füzuli, vəhm edib,**
**Qayəti, derlər, ola bir bəndə sultanın sevər.**

Beyt 1: **Cani kim canani üçün sevsə, cananın sevər,**
**Cani üçün kim ki, cananın sevər, canın sevər.**

Anlam: Həqiqi aşiq, mütəal məhbuba xidmət etmək məqsədilə öz vücudunu mühafizə edər, əksinə, naqis və nalayiq aşiq, yaxud müddəi öz şəxsi vücudunu bəhrələndirmək məqsədilə məşuqdan dəm vurar.

**Qeyd** 1: *Canını, yaxud varlığını unutmayan bir şəxs eşq ilə tanış olmağa nail ola bilməz.*

**Qeyd** 2: *Can, yaxud varlıq canın canan ərəfəsində hədiyyə etmək məqsədilə mühafizə etməlidir.*

Beyt 2**:** **Hər kimin aləmdə miqdarıncadır təbində meyl,**
**Mən ləbi-cananımı, Xizr abi-heyvanın sevər**

Sözlük: Xizr = müsəlmanlar Xizri həzrəti-Musanı hidayət etmiş peyğəmbər tanımışlar. O, təsəvvüf baxımıyla yüksək məqamlı bir arifdir. Xizrin mahiyyətini aydın tanıyıb – tanıtdırmaqda qərb ölkələri araşdırıcıları bir çox ixtilaflar etmişlər.Bəziləri "İlya" peyğəmbəri və "Cərcis" peyğəmbəri Xizr obrazında zühur etmiş bilmişlər. İslami rəvayətlər isə onu dünyada ölməz həyata nail olmuş bir peyğəmbər kimi qeyd etmişlər.[1] Abi-heyvan = dirilik suyu.

Nişanə 1: "Miqdar" – bu beytdə istedad və qabiliyyət nişanəsidir.

Nişanə 2: "Meyl" – bu beytdə batini cazibə nişanəsidir.

Nişanə 3: "Ləbi-canan" yoxu var edən ilahi ilhamlar-intibahlar nişanəsidir.

Nişanə 4: "Abi-heyvan" bu beytdə dünyəvi yaşayışı ölməz bir həyat kimi davam etdirən mərtəbədən nişanədir.

Anlam: Xızır dirilik suyunu sevdi, ancaq mən ölüm suyunu bəyəndim, demək hər şəxs öz istedadı qədər mənəvi nemətlərdən bəhrələnir.

**Qeyd**: *Ölüm suyu "موتوا قبل ان تموتوا"* [2] *mərtəbəsinə nail edən eşq çeşməsindən ibarətdir.*

Beyt 3**: Başə dəm düşdükcə təqsir eyləməz, axar müdam,**
**Ol səbəbdən müttəsil çeşmim cigər qanın sevər.**

Sözlük: Təqsir = gödəltmək = günah = xəta = birinci vacib həccdə baş tükünü, həm də dırnağı gödəltmək; müdam = dayimi; çeşm = göz

---

[1] Fərhəngi Moin, Ələm

[2] Qəzəl 6, beyt 6

Nişanə 1: "Başa dəm düşmək" – Beyin qızışmasından, yaxud məst olmaqdan nişanədir.

**Qeyd**: *Beyini qızışdıran hərarət həqiqi vücudu seyr etdirən təcəlla hərarətindən ibarətdir.*

*B – Başa dəm düşmək beyin qutusunun ilahi aləm həvasi ilə dolanmağından ibarətdir.*

**Qeyd**: *Başına dəm düşmüş aşiqin mənəvi ləzzət aparmaqları bir axar su kimi dəmbədəm həm artar, həm də təzələnər.*

Nişanə 2: "Cigər qani" məcazi mahiyyəti, xüsusilə mənəm-mənəmliyi yuyub batil edən nişanədən ibarətdir.

Anlam: İlahi aləm həvası ilə dolmuş başin hərarəti, yaxud ləzzəti tükənməz olduğuna görə gözümün qan yaşı, yaxud qurbanlıq sərmayəım tükənməzdir.

**Qeyd**: *Göz yaşı, yoxşa ürək qanı başa dəm düşmək sərmayəsidir.*

Beyt 4: **Mişki –Çin avarə olmuşdur vətəndən mən kimi,**
**Qansı şuxun bilməzəm zülfi-pərişanın sevər.**

Nişanə 1: "Müşk" – Erkək ahu göbəyindən kəsilmiş qara təhər ətirli bir maddədir və zülfün ətrinə, yaxud vəhdət rayihəli kəsrətə işarədir.

Nişanə 2: "Vətən" – insanın maddi kəsrət dünyasına düşməyindən əvvəl mənəvi vəhdət aləmində ölməz yaşayışını təlqin edən nişanədən ibarətdir.

Nişanə 3: "Şux" – ilahi cəlaləri bəşəri vücudda əks etdirmiş gözəl simalı insandan, yaxud mürşüddən, ya da vasitədən ibarətdir.

Nişanə 4: "Zülfi-pərişan" – bəşəri hüsnlərə, həm də ilahi cəlalərə gah hayil gah da hadi olmuş səbəblərdən ibarətdir.[1]

Anlam: Müşk kəsildiyi göbəyin ətrini qara zülflərdən alır, mən isə küdurətli kəsrətdən nurani vəhdət rayihəsini almaq istəyirəm.

Beyt 5: **Su ki sərgərdan gəzər başında vardır bir həva,**
**Qaliba, bir gülruxun sərvi-xuramanın sevər**

Sözlük: Gülrux = gül üzlü, xuraman = qəmzə satan = naz və təkəb-bürlə addım atan.

Nişanə 1: "Sərgərdan": İlahi bargah əzəmətinə heyran olmuş aşiqdən ibarətdir.

Nişanə 2: "Həva" – tənəffüsə, yaxud dünyəvi və mənəvi həyata ey-ham edən nişanədir.

[1] Qəzəl 4, beyt 3

Nişanə 3: "Gülrux" – bəst məqamına nail edən vasitədən ibarətdir.

Nişanə 4: "Sərvi-xuraman": A – Yüksək ürfan və insanlıq mərtəbəsinə eyham edən nişanədir.

B – davam etdirilmiş hüsnlərdən ibarətdir.

Anlam: A – Sərvin su sayəsində boy atdığı kimi insanın kamallanmağı isə eşq çeşməsinə bağlıdır.

B – Sərv axtaran su kimi eşq çeşməsi kamil istedadlı insan axtarır.

P – Hər bir yaranmış istər-istəməz vəhdət xəyalı ilə kəsrətə məşğul olur.

T – Su, yaxud başqa yaranmışlar yaradıcı məhbubun ünvanına eyham edirlər.

S – Su dənizə çatmaq məqsədilə axıcı, yaxud sərgərdan olduğu kimi insan isə vəhdət dənizinə qarışmaq məqsədilə kəsrət dənizində sərgərdanlıq edir.

Beyt 6: **Aqibət rüsva olub mey tək düşər el ağzına**
**Kim ki, bir sərməst saqi ləli-xəndanın sevər.**

Sözlük: Sərməst = məst = sərxoş = məğrur = xumar

Nişanə 1: "Mey": Mey, bu beytdə günahkarlığa eyham edən mənfi nişanədən ibarətdir.

Nişanə 2: "Sərməst" – varlığı büsbütün mütəal məbud eşqinə məğlub etməklə ilahi istiğnadan bəhrələnmiş mürşüddən, salikdən və aşiqdən ibarətdir.

Nişanə 3: "Saqi" – ilahi feyz bağışlayan sərməstdən ibarətdir.

**Qeyd**: *Gah da saqi eşq nemətini ehsan etmiş mütəal məbuddan ibarətdir.*

Anlam: Saqi rəhmətinə nail olmuş bir insan, dəyərlərin baş- ayaq olduğunu bildirir, beləliklə Xaqaninin buyurduğu kimi:

پس از سی سال روشن گشت بر خاقانی این مطلب که سلطانیست درویشی و درویشیست سلطانی

Alçaq sultanları və yüksək dərvişləri[1] tanıyıb dərk etməklə xalq ixtiyar etdiyi dəyərlərin əksini seçər və beləliklə, camaat nəzərində bir xətakar kimi təhqir olunar.[2]

Beyt 7**:** **Nolacaqdır, tərki-eşq etmə, Füzuli, vəhm edib,**
**Qayəti, derlər, ola bir bəndə sultanın sevər.**

---

[1] Qəzəl 25, beyt 5,

[2] Baş-ayaq ünvanlı bəhsdə dərdin dərman olması, şirinliyin acılıqdan asılılığı və dərvişin şahlığı dönə-dönə deyilmişdir.

Sözlük:  Vəhm = mövhum = xəyal; qayət = nəhayət = axır = nəticə

Nişanə 1:  "Vəhm" – A – Maddi dünyadan, yaxud imkan aləmindən ibarətdir.

B – Vəhm bu beytdə kəsrət məşğuliyyəti ilə zülmətə düşmüş fikirlərdən nişanədir.

Anlam:  Ey Füzuli, məmlükün mütəal malikə aşiq olmağını mövhumat xəyal edib sərki vursalar da sən ilahi eşqini tərk qılma (həqir məmlükü əziz edən malik onun naqis vücudunu da kamilləşdirməyə qadirdir.)

## Q Ə Z Ə L 78

(1) Mehri könlümdə nihan olduğun ol mah bilir,
Kimsə bilməz, füqəra sirrini ol şah bilir.

(2) Sormanız ol məh ilə hali-dılim Tanrı üçün,
Biləli onu özüm, bilməzəm Allah bilir.

(3) Gah yüz lütf qılar, gah təğafül, guya
Gah bilməz bu giriftarlığım, gah bilir.

(4) Can fəda eyləməyi yarə həmin mən bilirəm,
Bu təriqi demə bir qafilü gümrah bilir.

(5) Nəzəri-lütf dəriğ etmə Füzulidən kim,
Sənə sidq ilə üzün bəndeyi-dərgah bilir.

Beyt 1: **Mehri könlümdə nihan olduğun ol mah bilir,**
**Kimsə bilməz füqəra sirrini ol şah bilir.**

Sözlük: Mehr = məhəbbət = günəş; nihan = pünhan = gizli, mah = ay; füqəra = fağırlar = yoxsullar

Nişanə 1: "Mehr" – ülvi məqsədə çatmağı yəqinləşdirmiş aşiqi ilahi əslinə qaytaran məhəbbət hərarətindən ibarətdir.

**Qeyd** 1: *Məhəbbət hərarəti atəş hərarəti kimi hərəkət bağışlayan bir qüvvədir.*

**Qeyd** 2: *Məhəbbət hərarəti maddi hərarət kimi nur yağdıran qüvvədir.*

**Qeyd** 3: *Mərifət nailyyətinin əsas şərti nurlanmaqdan ibarətdir.*

Nişanə 2: "Mah":

A – Mənəvi cilalarını maddi şəraitdə əks etdirmiş mütəal məhbubdan ibarətdir.

B – Mah, kəsrət güzgüsündə zühur etmiş vəhdət nurundan ibarətdir.

Nişanə 3: "Füqəra":

A – maddi dünyanın hər bir şeyini ilahi imtiyazlara fəda etmiş insanlardan ibarətdir.

**Qeyd** 1: *Hər bir halalın özəl bir hesabı və hər bir haramın məxsus əzabı olduğuna görə, füqəra halalı da haram kimi tərk etməklə sual – cavabdan azaddırlar (məafdırlar).*[1]

**Qeyd** 2: *Hesab ayağında müddət sovuşdurmaq məhbub məşğuliyyətindən kənar qalmağın şərtidir, bunun üçün də aşiq həlalı tərk etməlidir.*

*B – Füqəra bütün malikiyyətləri, hətta elm və iradə malikliyini də istiğna məqamlı məbuda məxsus bilən məmlüklırdən ibarətdir.*[2]

*P – Füqəra "devriliş", yaxud "baş-ayaq" ünvanlı ürfani mərtəbədə yoxsulluqdan varlılığa çatmış, ya da ilahi istiğnadan bəhrələnmiş bəndələrdən ibarətdir.*[3]

Nişanə 4: "Şah" – mürşüd həzrətindən, yaxud "səmədiyyət"[4] mərtəbəsilə cilvələnmiş mütəal məhbubdan ibarətdir.

Anlam: İçimi yandıran tələb atəşindən, həm də dünya tərkinə bais olmuş məmlükluq əhval – ruhiyyəmdən yalnız mütəal məbud xəbərdardır, çünki iç aləmləri yaxud görünməz mərtəbələri aydın görən

---

[1] Fərhəngi- istilahat və təbirati ürfani.
[2] Qəzəl 2, beyt 3
[3] Qəzəl 30, beyt 3
[4] Qəzəl 30, beyt 3

yalnız o məhbubdur. Elə buna görə də şərif ayədə buyurulur: يوم يجمع الله الرسل فيقول ما ذا اجيبتم قالو لا علم لنا انک انت علّامُ الغيوب [1]

**Qeyd** 1: *Dünyəviligi tərk etmiş füqəranın ehtiyacları da qeyri dünyəvidir.*

**Qeyd** 2: *Qeyri dünyəvi hacətlərdən yalnız mütəal məbud xəbərdardır.*

Beyt 2: **Sormanız ol məh ilə hali-dilim tanrı üçün,**
**Biləli onu özüm, bilməzəm Allah bilir.**

Sözlük: Məh = mah =ay,

Nişanə 1: "Məh" – ötən beytdə bəyan olmuş “mah” ifadəsini təkrar ilə təkid etmək istəyir.

Anlam: Ötən beyti təkrar və təkid etmək məqsədilə buyurur: Mənəvi əhval – ruhiyyəni, yaxud iç vücudun görünməz qayğılarını sirrlərdən xəbərdar mütəal məbud bilir.

**Qeyd**: *Dünyəvi ölçülərə sığmaz mənəvi əhvalı dilə gətirib bəyan etmək, yaxud dünyaşünas əqldən dəm vuran nəsihətçiləri sual-cavab yolu ilə başa salmaq mümkünsuzdur.*

Beyt 3: **Gah yüz lütf qılar, gah təğafül, guya,**
**Gah bilməz bu giriftarlığım, gah bilir.**

Sözlük: Təğafül = göz çəkmək = göz örtmək = bilməməzlik

Nişanə 1: "Lütf":

A – Batini seyri gərəkli, zahiri enerjilərə yardımçılıq edən ilahi təvəccühdən ibarətdir.

B – Aşiqi müşahidə və mühafizə mərhələlərində tərbiyə etməkdən ibarətdir.

Anlam: Həkimi-məhbub gah mərhəmət gah qəzəblə, yaxud qəbzlərə bağlı bəstlərlə qəlbimi özünə yetişdirmək istəyir.

**Qeyd**: *Mövləvi "Zindegani aştiye-ziddhast" buyurduğu kimi*[2] *hər bir varlığın həyat əsası öz ziddinə bağlı olduğuna görə dünyəvi ömür möhlətində qəbzsiz bəst mümkünsüzdür, elə buna də görə demişlər:*

**Gözlərin memari-mahirdir, ürəklər payəsin**
**Gəh yıxıb viran edər, gəh qalxızıb abad edər.**[3]

---

[1] Quran, Maidə surəsi, 109 “Allah elçiləri toplayıb onlardan: Sizin dəvətinizi necə qarşıladılar? – deyə soruşduğu gün elçilər deyərlər: Bizim elmimiz yoxdur. Qeybi bilən sənsən.”

[2] “Həyat ziddiyyətlərin barışmasıdır. ”Məsnəviyi-Mövləvi, dəftər əvvəl, beyt 1324

[3] Tacüş-şüəra Yəhyəvi Ərdəbili

Beyt 4: **Can fəda eyləməgi yarə həmin mən bilirəm,**
**Bu təriqi deme bir qaflü gümrah bilir.**

Sözlük: Təriq = yol = məzhəb = hal = adət = iş

Nişanə 1: "Can fəda eyləmək" – qurbanlıq məqamına hazırlaşmaqdan nişanədir.

Nişanə 2: "Təriq":

A – İlahi mərasimdən, həm də mənəvi təklifdən ibarətdir.

B – ilahi vüsal yolundan ibarətdir.

**Qeyd** 1: *"... hər bir təriqdə min dəniz və hər bir dənizdə min gəmi və hər bir gəmidə sınaqlar hiyləbazlar, və müxtəlif maneələr var... Həqiqi eşq əhli vəhdət dənizində boğularkən, təriq dənizini, sınağını, hiyləbazları və maneələrini görməyib rahət sovuşaraq məqsədə nail olar."*

**Qeyd** 2: *Dəniz, dünyaşünas həmdə mənaşünas əqlə qələbə edən xətakar nəfs qüvvələrindən ibarətdir.*

**Qeyd** 3: *Maneə şühud nemətindən məhrum edən elm məğrurluğundan ibarətdir.*

**Qeyd** 4: *Hiyləbaz – iç aləmə nüfuz etmiş şeytandan ibarətdir.*

***Qeyd** 5: İlahi məqsəd nailiyyəti axtaran hər bir aşiq nəfsini, elmini və əqlini məğlub etməlidir.*[1]

Beyt 5: **Nəzəri-lütf dəriğ etmə Füzulidən kim,**
**Sənə sidq ilə üzün bəndeyi-dərgah bilir.**

Sözlük: Dəriğ = əsirgəmək; sidq = sadiqlik = xalislik; dərgah = bargah

Nişanə 1: "Nəzəri-lütf" – ilahi müşahidə və mühafizədən ibarətdir.

Nişanə 2: "Sidq" – bəşəri əməlin ilahi əhvala bağlılıqdan, yaxud çöl vücudun iç vücud ilə müvafiqət etməgindən nişanədir. [2]

Nişanə 3: "Bəndə" – öz məmlüklüyünü etiraf etmiş aşiqdən ibarətdir.

Anlam: Ey mütəal malik, öz düzgün məmlükündən ehsanını əsirgəmə.

---

[1] Fərhəngi- istilahat və təbirati-ürfani, doktor Seyyid Cəfər Səccadi

[2] Fərhəngi istilahati-ürfani, Doktor Mənuçehr Daneş Pejuh

## Q Ə Z Ə L 79

**(1) Müjəm sərçeşmələr mənzil tutan aşüftə məcnundur,**
**Onunçun bəsteyi-zənciri-seyli-əşki-gülgundur.**

**(2) Səvadi-nöqteyi-girdabə bənzər mərdümi çeşmim,**
**Ki, daim ğərqeyi-girdabi- əşki-çeşmi -pürxundur.**

**(3) Xəmidə qamətim kim, daği-dildən qanə qərq olmuş,**
**İçində nöqtəsi guya ki, qan fərqindəki nundur.**

**(4) Eşit dərdi-dilim, əfsaneyi-Məcnunə meyl etmə,**
**Kim, ol əfsanədən həm anlanan mütləq bu məzmundur.**

**(5) Fərəhbəxşi-dili-məşuq olur şərhi-qəmi-aşiq,**
**Sürudi-bəzmi-Şirin, naleyi-Fərhadi-məhzundur.**

**(6) Kəməndi-çini-zülfün vəhmi getməz zar könlümdən,**
**Mənə ol rişteyi əjdər qılan bilməm nə əfsundur?**

**(7) Füzuli, vermədi tən oxları göz yaşina təskin,**
**Önü bənd etmək olmaz, xarü xaşak ilə Ceyhundur.**

Beyt 1: **Müjəm sərçeşmələr mənzil tutan aşüftə məcnundur,**
**Onunçun bəsteyi-zənciri-seyli-əşki-gülgundur**

Sözlük: Müjə = kirpik; sərçeşmə = çeşmə = bulaq başı; aşüftə = pərişan; bəstə = bağlı; seyl = sel; əşki-gülgun = qan-yaş.

Anlam: Çöllərə pənah aparıb bulaq başını məskən edən dəlilər kimi şıdırğı qan-yaş yağdıran gözümün üstündə kirpiklərim mənzil etmişdir, bunun üçün də zəncirə bağlı divanələr kimi qan-yaş halqalarına bağlanmış.

Beyt 2: **Səvadi-nöqteyi-girdabə bənzər mərdümi çeşmim,**
**Ki, daim ğərqeyi-girdabi- əşki-çeşmi -pürxundur**.

Sözlük: Səvad = savad = qara = cəmaət = şəhər ətrafı = yaxın kəndlər; mərdümi-çeşm = bəbək; ğərqe = ğərq =boğulmuş; əşk = göz yaşı, çeşm = göz; pürxun = qanlı.

Nişanə 1: "Ğərqe" – dünyəvi əngəl həyatdan xilas olmaq nişanəsidir.

Nişanə 2: "Qan-yaş" – məcazi mahiyyəti batil edən nişanədir.

Anlam: Girdaba batmış bir şəhər kimi göz bəbəyim qan-yaşda boğulmuşdur.

Beyt 3: **Xəmidə qamətim kim, daği-dildən qanə qərq olmuş,**
**İçində nöqtəsi guya ki, qan fərqindəki nundur.**

Sözlük: Xəmidə = əyilmiş = bükülmüş; fərq = baş ayrımı = baş = axır; fərqində = axırında

Nişanə 1: "Xəmidə":

A – vəhdət nöqtəsindən hərəkət etmiş saliki dübarə həman nöqtəyə qaldıran seyr dairəsindən nişanədir.

B – eşq hacılarının ziyarətindən, yaxud eşq ərəfəsini dövr etməkdən nişanədir.

T – dünyəvi ömür möhlətində tora düşmüş insanın azadlıq müqəddiməsidir.

Nişanə 2: "Dağ" – qəlbi ilahi nişanəli edən narı-məhəbbət təsirindən ibarətdir.

Anlam: Əyilmiş qamətimin içindəki qəlbim, qan kəlməsinin axırında yazılmış "nun" hərfi içindəki nöqtəyə bənzəyir.

Beyt 4: **Eşit dərdi-dilim, əfsaneyi-Məcnunə meyl etmə,**
**Kim, ol əfsanədən həm anlanan mütləq bu məzmundur.**

Nişanə: "Dərdi-dil" – insanı maddi əngəl vücuddan xəbərsiz edən tələb atəşindən ibarətdir.

Anlam: Məcnun hekayəsini aləmşumul edən zahiri eşq mənim batini hekayəmdən kişik bir hissədir.

**Qeyd**: *İkinci misra məcazi pak eşqin mənəvi eşq kimi müqəddəs olduğuna eyham etmək istəyir.*[1]

Beyt 5: **Fərəhbəxşi-dili-məşuq olur şərhi-qəmi-aşiq,**
**Sürudi-bəzmi-Şirin, naleyi-Fərhadi-məhzundur**.

Sözlük: Fərəhbəxş = fərəhləndirici; sürud = nəğmə = mahnı; bəzm = məclis.

Nişanə 1: "Fərəh" – bu beytdə mütəal məhbub razılığından ibarətdir.

Nişanə 2: "Nalə" – tələb atəşində alovlanmış ürəyin özəl münacatından ibarətdir.

Nişanə 3: "Məhzun":

A – Məhzunluq, kəsrət sərgərdanlığında aşiqi vəhdət tələbinə vadar etmiş batini əhvaldan ibarətdir.

B – tükənməz bir həsrət giriftarlığından ibarətdir.

**Qeyd** 1: *Həsrət mərifət nişanəsi olduğuna görə məhzun aşiq ilahi əslini yaddan çıxarmayan, nəhayət öz əslinə müraciət etməyə biqərarlıq və çalışqanlıq edən aşiqdən ibarətdir.*

**Qeyd** 2: *Ötən dörd beyt aşiqin yetkinliyini, nəhayət onun ilahi məqsəd nailyyətini müxtəlif bəlalərə bağlı olduğuna eyham etmək istəyir.*

Beyt 6: **Kəməndi-çini-zülfün vəhmi getməz zar könlümdən,**
**Mənə ol rişteyi əjdər qılan bilməm nə əfsundur?**

Sözlük: Vəhm = mövhumi-xiyal

Nişanə 1: "Kəməndi zülf" – bu beytdə maddi vücud etibarlarından, həm də kəsrət cazibələrindən ibarətdir.

Nişanə 2: "Vəhm" – fikir qanadını bağlayan müxtəlif maneələrdən ibarətdir.

Anlam: Xətərnak bir ilana bənzər kəsrətdə ölməz həyat bağışlayan vəhdət cəlalarını hərdənbir əks etdirməklə, məni giriftar edən ovsunçunu tanımaq imkanım yoxdur.

**Qeyd** 1: *Gizli ovsunçuluq əqlə- elmə sğmaz hikmət nişanəsidir.*

**Qeyd** 2: *Dünyəvilik, yaxud kəsrət, ya da dünyəvi ömür sürmək xətərnak bir ilanla həmdəm olmaq kimi mümkünsüzdür, ancaq ölümü*

[1] Qəzəl 12, beyt 2.

*həyata bağlayan həkimi-məbud*[1] *gah-gah vəhdət nurunu kəsrətdə əks etdirməklə mümkünsüz həyatı imkanlı etmək istəyir.*

Beyt 7: **Füzuli, vermədi tən oxları göz yaşina təskin,**
**Önü bənd etmək olmaz, xarü xaşak ilə Ceyhundur.**

Sözlük: Tən = tənə = sərki = sancmaq; bənd etmək = qabağını almaq = sədd şəkmək = bağlamaq; xarü xaşak = kol-kos , Ceyhun = çay.

Nişanə 1: "Tən oxları" – dünya əhlinə təvəccüh etməkdən, yaxud dünyanı unutmağa bais olmuş sərkilərdən ibarətdir.

Nişanə 2: "Göz yaşı" – yuyucu bir maddə kimi dünyəvilik ləkələrini yuyub-təmizləyən nişanədən ibarətdir.

Nişanə 3: "Xarü xaşak" – tən oxlarını, nəhayət dünyaşünas əqldən dəm vuran nəsihətçiləri təhqir edən nişanədən ibarətdir.

Anlam: Ey Füzuli, dəniz istiqamətli bir çayın önünə kol – kos ilə sədd çəkmək əbəs bir iş olan kimi, məni də sərki və danlaq ilə eşq müsibətindən ayırmaq yersizdir.

---

[1] "Baş – ayaq " ünvanlı ürfani mərtəbəyə bağlıdır

## Q Ə Z Ə L 80

**(1) Ğübari-səcdeyi-rahin xəti-lövhi-cəbinimdir,**
**Sücudi-dərgəhin sərmayeyi-dünyavü dinimdir.**

**(2) Əgər əzmi-rəh etsəm şövqi-vəslin hadiyi-rahim**
**Və gər aram həm dutsam, xəyalın həmnişinimdir.**

**(3) Həvayi-rövzeyi-kuyin bahari-gülşəni-canım,**
**Nihali-qamətin sərvim, üzarın yasəminimdir.**

**(4) Yəqinimdir ki, məqsudum olur hasil sənə yetsəm,**
**Bihəmdullah, mənə, səndən yana rəhbər yəqinimdir.**

**(5) Tələbkari-visaləm müjdeyi-vəslin dəriğ etmə**
**Kim, ol müjdə fərəhbəxşi-dili-ənduhginimdir.**

**(6) Çıxardı zövq vəslin xatirimdən rövzə pərvasin,**
**Sözün kövsər, münəvvər məclisin xüldi-bərinimdir.**

**(7) Mənə üz göstərər hər ləhzə yüz min şahidi-dövlət**
**Çü mirati-rüxün, mənzuri-çeşmi-pakbinimdir.**

**(8) Səriri-səltənət zövqündən əfzundur mənə ol söz**
**Ki, lütf ilə demişsən bir qulami-kəmtərinimdir.**

**(9) Bəri oldum, Füzuli, ğeyrdən, ol dilrüba ancaq**
**Ənisim, munisim, yarım, nigarım, nazəninimdir.**

Beyt 1: **Ğübari-səcdeyi-rahin xəti-lövhi-cəbinimdir,**
**Sücudi-dərgəhin sərmayeyi-dünyavü dinimdir**.

Sözlük: Rah = yol; xətt = yazı = nişanə = həkim

Nişanə 1: "Ğubari-səcdeyi-rah" – bəndəlik əlamətindən ibarətdir.

Nişanə 2: "Lövhi-cəbin" – ilahi sirrləri əks etdirməkdən nişanədir.

**Qeyd**: *Ğubar umumən aynanın torlanmağına bais olar, ancaq eşq ərəfəsindən qopmuş ğubar isə, durulducu bir maddə kimi alın aynasını, yaxud lövhi-cəbini işıqlandıran ğubardır.*[1]

Nişanə 3: "Sücud" – bir ayna kimi ilahi cilalar əks etdirməklə bəşəri sifətləri ardı-ardınca məhv edən nişanədən ibarətdir.

Nişanə 4: "Din" – iç aləmdən, həm də axirət aləmindən ibarətdir.

Anlam: Ey mütəal məhbub, sənə qulağı sırğalı bir bəndə olmaq dünyəvi və mənəvi səadətə çatmaq nişanəsidir.

**Qeyd**: *İlahi cəlalər əks etdirməyə nail olmuş bir vücud, həm dünya, həm də axirət səadətinə nail olmuşdur.*

Beyt 2: **Əgər əzmi-rəh etsəm şövqi-vəslin hadiyi-rahim**
**Və gər aram həm dutsam, xəyalın həmnişinimdir.**

Sözlük: Rəh = yol; hadi = lider = rəhbər = hidayətçi; rah = yol,
həmnişin = həmsöhbət.

Nişanə 1: "Şövq":

A – mütəal məhbub tələbində mənliyi unutmağa bais olmuş haldan ibarətdir.[2]

B – məhəbbət hərarətilə hərəkət etmiş qəlbi ilahi məqsədə çatdıran batini rəhbərdən ibarətdir.

P – məhəbbət meyvəsindən ibarətdir.

T – Şövqsüz məhəbbət imkansızdır.

S – mütəal məbud cəmalını göz aynasında istəmək nişanəsidir.

Nişanə 2: "Vəsl" – aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəyə çatmasından ibarətdir.

Nişanə 3: "Aram":

A – Aramlıq – ilahi zikr ilə daim fərəhlənmiş, həm də ümidvar olmuş ürəkdən ibarətdir.

B – İlahi kəşflər ilə daim fərhlənmiş ruhdan ibarətdir.

P – İlahi lütflər ilə davam etdirilmiş şühud səmərəsindən ibarətdir.

Nişanə 4: "Xəyal":

---

[1] "Baş - ayaq" ünvanlı ürfani özəl mərtəbədə izah olunmuşdur.

[2] Qəzəl 24, beyt 6

A – Bəsit mərtəbələr ilə əlaqələndirən qüvvədən ibarətdir.

B – yarı yer-yarı göy sakini insanı, yerlə göy arasında seyr etdirən qüvvədən ibarətdir.[1]

**Qeyd**: *Ürəyin fuad ünvanlı dördüncü mənzilində məhz həqiqəti aşkar göstərən səbəblərdən biri də xəyaldır.*[2]

Anlam: Mütəal məbudun adını zikr etməklə törənmiş ümiddən asılı fərəh qüvvəsi qəlbimi hicran həbsində də vüsal behişti kimi məst etmişdir.

Beyt 3: **Həvayi-rövzeyi-kuyin bahari-gülşəni-canım,**
**Nihali-qamətin sərvim, üzarın yasəminimdir.**

Sözlük: Rövzə = bağ = gülüstan = behişt; nəhal = körpə ağac = qələm; üzar = üz = camal = surət = üzün nar tük bitən yeri; yasəmin = yasəmən.

Nişanə 1: "Həva" – ötən beytdə qeyd olunmuş şövq mərtəbəsini təkrar edən nişanədən ibarətdir, ancaq tənəffüs etmək eyhamıyla mənəvi həyatlanmağı da təlqin etmək istəyir.

Nişanə 2: "Kuy" – mütəal məbudu özünün bütün varlığına, hətta elminə və iradəsinə malik bilmiş aşiqin bəndəlik məqamından ibarətdir.

Nişanə 3: "Bəhar":

A – İlahi seyrə məşğul olmuş aşiqin mənəvi elmlənməyindən, həm də batini fərhlənməyindən nişanədir.

B – özünü təəllüqlərdən fərd etmiş aşiqin bəst nailiyyətindən ibarətdir.

P – maddi aləmdə qeyri maddi rayihələr dərk etmiş aşiqin, yaxud yaranmışların həqiqətini müşahidə etmiş salikin vəcdə gəlməyindən ibarətdir.

T – bütün kainatın dəmbədəm yeniləşməyindən nişanədir.

**Qeyd**: *Təzə elm əsrində: fəlsəfə, ürfan, din, tarix və ictimai yeniləşmək bəhsilə ciddi surətdə məşğul olmuşlar. Demək, hər ləhzə hər bir şeyin fikri, anlamı və dini də daim təzələnməlidir. Beləliklə, ölməz dini həyat, yaxud daimi din cərəyanı açıq-aşkar sübut olunur.*

Yeniləşmək olmasaydı zaman dinə qalib olmaqla onu köhnələndirib təzə əsrdən – nəsildən kənar qalmağını dəlilləşdirdi.

S – təzə həyatı eyham edən yaşıllıqdan nişanədir.

---

[1] Qəzəl 64, beyt 6
[2] Qəzəl 71, beyt 3

C – İslam mədəniyyətində ilahi xilafətə eyham edən yaşıllıqdan nişanədir. Demək bu məna münasibəti ilə imamlar yaşıl əmmamə qoymuşlar.

Nişanə 4: "Gülşən" və "Yasəmin" – ilahi mərifətlə bəst tapmış ürəklərdən ibarətdir.

Nişanə 5: "Qamət" – mütəal məbuda həsr olunmuş pərəstiş yararlığından ibarətdir.

Nişanə 6: "Nihal" – qamət mərtəbəsində təzə həyatlanmaq nişanəsidir.

Nişanə 7: "Üzar" – mənəvi rəğbəti və tələbi əlavə edən ilahi kamal zühurundan ibarətdir.

Anlam: Ey mütəal məbud, sənə pərəstiş və bəndəlik etməklə:

A – Ürək açan bəst məqamına nail oluram.

B – Yeni həyat və yüksək insanlığa nail oluram.

P – İlahi rəğbəti-tələbi dolduran əhvala nail oluram.

Beyt 4: **Yəqinimdir ki, məqsudum olur hasil sənə yetsəm,**
**Bihəmdullah mənə, səndən yana rəhbər yəqinimdir**.

Nişanə 1: "Yəqin" – gözəgörünməz həqiqətləri qəlbə göstərən nişanədən ibarətdir.

**Qeyd** 1: *Gözlərə görünmüş vaqeələr elmdir.*

**Qeyd** 2: *Ürəklərə görünmüş həqiqətlər yəqindir.*

Anlam: Ey mütəal məhbub, ətəş atəşində alovlanmış qəlbləri, yaxud məzaci mahiyyəti nari-məhəbbətlə yandırıb unutmuş aşiqləri vəhdət mülkünə hidayət edən yalnız sənsən. Beləliklə, ilahi ərəfəyə hidayət olmağıma görə şükr edirəm.

**Qeyd**: *Mütəal məbudun əzəmətli adlarından biri isə hadi (hidayət edən) olduğuna görə aşiq, hidayətlənməyini yəqin etmişdir.*

Beyt: 5 **Tələbkari-visaləm müjdeyi-vəslin dəriğ etmə**
**Kim, ol müjdə fərəhbəxşi-dili-ənduhginimdir.**

Sözlük: Dəriğ = əsirgəmək, fərəhbəxş = fərəhləndirici, ənduhgin = qəmgin

Nişanə 1: " Tələbkar ":

A – Öz ilahi elmlərinə həqiqi mərifət tapmış aşiqdən ibarətdir.

B – şərif ayədə "من جآءَ بالحسنة فلَّهُ عَشرُ امثالِها" [1] buyurulduğu kimi bəndənin bir xeyir əməlinə on bərabər muzd bağışlayan kərim məbuddan yararlı mərifət tapmış aşiqdən ibarətdir.

Lisanəl-ğeyb Hafiz belə bir barədə ilə buyurmuşdur:

فردا اگر نه روضه رضوان به ما دهند
غلمان ز غرفه حور ز جنت بدر کشیم

Hafiz hurilərə, yaxud behişt xadimlərinə qalib gəlməkdən söz açaraq müddəilik, ya da məğrurluq etmək istəməyir. Bəlkə də o, şərif ayəyə əsaslanaraq:

1 – Mütəal məbud verdiyi vədələrin qəti olmağını elan etmək istəyir.

2 – Dünyəvi əngəllər əhatəsində mənəvi elmləri həm tanıyıb, həm də intixab etməyini elan etmək istəyir.[2]

3 – Ələsti – ilahi xarakterinin sağ – salamat qalmağını elan etmək istəyir.

P – Tələbkar, yarı yer – yarı göy sakini həqiqi insanın göy hissəsinə qovuşmaq tələbini təbii təlqin edən nişanədən ibarətdir.

T – Əflatun zənn etmişdir ki: mütəal məbud insanları yer üzərində üsyan etməkdən qorumaq məqsədilə onların yarı vücudunu göylərdə saxladı.[3] Demək, fəlsəfə də ürfan kimi yarı göydə qalmış vücud tələbini təbii bir tələb bilmişdir.

C – Ədəbiyyat isə insanı yarı bəşər, yarı mələk vəsf etməklə onun ülvi tələbkarlığını təbii təsdiq etmişdir:

آدمیزاده طُرفه معجونیست     کزفرشته سرشته وزحیوان
گرکند میل این شود به از این     ور کند میا آن شود کم از آن

Ç – Quran, "اِنّا لِلهِ وَ اِنّا اِلیهِ راجِعون" [4] buyurmaqla ilahi əslini tələb etmiş insanı təyid etmiş.

Nişanə 2: "Vüsal" – Bəşəri hissənin ilahi hissəyə qovuşmağından ibarətdir.

Nişanə 3: "Fərəhbəxş" – ürəyə bəst bağışlayan ilahi rayihədən ibarətdir.

Nişanə 4: "Dili-ənduhgin" – tələb çalışqanlığının məchul nəticəsindən hasil olmuş sərgərdanlıqdan ibarətdir.

---

[1] Quran, "Ənam" surəsi, 160-cı ayədən bir qismət (“Hər kim bir xeyir gətirsə, demək ona on bərabər[muzd] var”.

[2] Qəzəl 29, beyt 4

[3] Yarı, aciz olduğuna görə, üsyan etməyə qadir deyildir.

[4] Quran, "Bəqərə" surəsi, 156-cı ayədən bir qismət: (“Həqiqətən bizim varlığımız Allah üçündür və bir Allaha sarı qayıtmalıyıq).

Anlam: Ey məhriban məbud, ilahi əslimə qaytaran lütfünü şühud cilvələri, yaxud bəst ehsanı ilə xahiş edirəm.

Beyt 6: **Çıxardı zövq vəslin xatirimdən rövzə pərvasin,**
**Sözün kövsər, münəvvər məclisin xüldi-bərinimdir**.

Sözlük: Vəsl = vəslət = vüsal; rövzə= behişt = bağ, xuld = daimi = beheşt, pərva = meyl = rəğbət = fikir = həvəs, münəvvər = nurlu = ziyalı , bərin = əla = yüksək

Nişanə 1: "Zövq" – şühud mərtəbəsinin daim nur yağdıran ilk dərəcəsindən ibarətdir.[1]

**Qeyd** 1: *Kamil zövq ürfani ünvanlı "şürb" mərtəbəsindən ibarətdir.*

**Qeyd** 2: *Şorb yalnız nailiyyət mərtəbəsi ilə mərbut olur, ancaq zövq həm məhrumluq, həm də nailiyyətlə əlaqədardır.*

Nişanə 2: "Vəsl" – nəhayətə çatmış qürbdən ibarətdir.[2]

Nişanə 3: "Rövzə" və "Kövsər" və "Xüld" – behişt gözəlliklərini təlqin edən nişanələrdirlər.

Anlam: Ey gözəl məbud, sənin camalından parlayan cilalar ilə vücud qətrəsini vəhdət dənizinə qarışdırmaq məşğulluğu behişt gözəlliklərini gözümdən salmışdır.

**Qeyd** 1: *Bunu nəzərə alsaq ki, aşiq öz vücudunu unutmaqla ikilikdən, yaxud kəsrətdən xilas olmağa çalışir, yaxud qürb ünvanlı yox dərəcəyə yetişmiş fasilədə ikiliyi aradan qaldırmaq istəyir, behişt mərtəbələrinə rəğbətsizlik hikməti məlum olur. Demək, behişt tələb edən bir aşiq ikidən şox olan üçlük kəsrətinə giriftar olmuşdur, beləliklə:*

*1 – Vücudsuz behiştə daxil olmaq mümkünsüzdür.*

*2 – Vücud, behişt və məşuq üç varlıq, yaxud üç hədəfdir (üçlük).*

*3 – Vücud aşiqin ən xətərnak birinci əngəli və ağır günahıdır, bunun üçün də islamın ulu peyğəmbəri "وجودک ذنب لایقس به ذنب" buyurmuşdur.[3]*

4 – Əql əhli "Rizvan"[4] behiştini tələb etdiyi kimi eşq əhli isə "Rəhman" behiştini tələb edir.[5]

**Qeyd** 2: *Dünyəvi ömür möhlətində təfəkkür xəlvəti ilə cəmaət, yaxud kəsrət içində vəhdətlə məşğul olmuş[6], yaxud hazırlıqla qalibliyi*

---

[1] Qəzəl 8, beyt 5
[2] Qəzəl 7, beyt 1
[3] Doktor Cavad Nurbəxş, Sufi kist
[4] Umumxalq istəyən bağlı – bağçalı behişt
[5] Özəl aşiqlər tələb edən ilahi camal cilalarına həmişəlik nail olmaq.
[6] Qəzəl 69, beyt 4

*vahidləşdirmiş*[1] *imamlar və peyğəmbərlər rizvan beheşti içrə də rəhman beheşti ilə məşğuldurlar. Ancaq aşiqlər bu iki əks mərtəbəsini vahidləşdirməkdən acizdirlər.*

Beyt 7: **Mənə üz göstərər hər ləhzə yüz min şahidi-dövlət**
**Çü mirati-rüxün, mənzuri-çeşmi-pakbinimdir.**

Sözlük: Şahid = gözəl= görünməzləri görən Xaliq; mirat = ayna, rüx = üz =camal; çeşm = göz; pakbin = pak nəzər.

Nişanə 1: "Şahid" – bir yerə cəmləşmiş hüsnlərdən xəbər verən ilahi vasitələrdən, yaxud davam etdirilmiş təcəllilərdən nişanədir.

Nişanə 2: "Mirati-rox" – ilahi sifətləri zühur etdirən mərtəbədən ibarətdir.[2]

Nişanə 3: "Çeşmi-pakbin" – bütün yaranmışlar nisbətini yaradıcı məhbub ilə duşunmüş aşiqin kainatı təmamilə gözəl görməyindən ibarətdir.[3]

Anlam: Ey mehriban məbud, büsbütün kainatda təzahur etmiş sənin camal cəlaların qəlbimi ardı-arası kəsilməz mənəvi hüsnlər zühuru ilə feyzyab etmişdir.

Beyt 8: **Səriri – səltənət zövqündən əfzundur mənə ol söz**
**Ki, lütf ilə demişsən bir qulami – kəmtərinimdir**

Sözlük: Sərir – səltənət = səltənət təxti; əfzun = artıq = əlavə; qulami-kəmtərin = ən həqir qulam = əskik qulam.

Nişanə1: "Səriri-səltənət" – dünyəvi iqtidar – etibardan nişanədir.

Nişanə 2: "Lütf" – A – Zahiri batin ilə məvaziləşdirən ilahi tərbiyə nişanəsidir.

B – Aşiqin hədəfini təsdiqləmək məqsədilə onu müşahidə mərtəbəsinə istiqamətləndirən ilahi fərəhdən ibarətdir.[4]

Nişanə 3: "Qulami-kəmtərin" – mütəal malik ərəfəsində öz məmlüklüyünü etiraf etmiş aşiqdən ibarətdir.

Anlam: Mütəal məbud ərəfəsində qulluqçu olmağı yer kürəsinin şahlığından üstün bilirəm.

Beyt 9: **Bəri oldum, Füzuli, ğeyrdən, ol dilrüba ancaq**

---

[1] هرگز وجود حاضر و غایب شنیده ای      من در میان جمع و دلم جای دیگرست .
"سعدی"

[2] Fərhəngi istilahat ürfani, doktor Mənuçehr Daneşpejuh

[3] Qəzəl 40, beyt 5

[4] Doktor Qasim Qəni,Tarixi-təsəvvüf dər islam, cild 2, Tehran, 1375, səh.653

**Ənisim, munisim, yarım, nigarım, nazəninimdir.**

Sözlük: Bəri = kənar = uzaq; nigar = nigar, yar

Nişanə 1: "Bəri" – ilahi istiğnadan bəhrələnmiş aşiqin " او جيت بالظهور ظهور المكونات"[1] mərtəbəsində mütəal məbuddan başqalarını həqir[2] görməklə cəmaət adlı ən xətərnak kəsrətdən xilas olmaq nişanəsidir.

Nişanə 2: "Dilrüba" – aşiqi sınaq sıxıntısı ilə tərbiyə edən mütəal məhbubdan nişanədir.

Nişanə 3: "İkinci misra" – çöl və iç aləmi qəbz və bəstlə məşğul etmiş məşuqdan istiarədir.

Anlam: Ey Füzuli, ilahi məşğuliyyətlərlə dünyəvi nemətlərdən hacətsiz olmuşam.

---

[1] Qəzəl 40, beyt 5

[2] Müstəqillik iddia etmək nadanlıq və həqirlikdir.

**Q Ə Z Ə L 81**

**(1) Demiş hər qönçəyə aşiqligim razin səba derlər,**
**El ağzın tutmaq olmaz, qorxuram, ey gül, səna derlər.**

**(2) Əsiri – dərdü – eşqü məsti – cami – hüsn çox, əmma**
**Bizik məşhur olan: Leyli səna, Məcnun məna derlər.**

**(3) Sənin mehrü vəfa göstərdiyin əğyara çox gördüm,**
**Qələtdir kim, səni bimehr oxurlar, bivəfa derlər.**

**(4) Sənə derlər büti – Çin, zülfünə zünnar söylərlər,**
**Zəhi – imanı yoxlar, küfr söylərlər, xəta derlər.**

**(5) Mənə derlərdi əvvəl bir mələkdir sevdiyin, hala**
**Görənlər sən fəqirə - göydən enmiş bir bəla derlər.**

**(6) Mərizi – eşq üqdi – zülfün eylər arizu, zira**
**Müaliclər bu mühlik dərdə müşkildir dəva, derlər.**

**(7) Füzuli, aşiqə onlar ki, derlər tərki – eşq eylə,**
**Deməzlərmi xəta, təğyir qıl hökmi – qəza derlər.**

Beyt 1: **Demiş hər qönçəyə aşiqligim razin səba derlər,**
**El ağzın tutmaq olmaz, qorxuram, ey gül, səna derlər**

Sözlük: Raz = sirr = rəmz.

Nişanə 1: "Qönçə" – bu beytdə iç sifətlərini nazik örpəkdə pünhan etmiş dünyəvi və mənəvi eşq tələblərindən ibarətdir.

Nişanə 2: "Səba" – həzrət Cəbrayildən, yaxud başqa ilahi vasitələrdən ibarətdir.

Anlam: Aşiqlik istedadı qazanmaq məqsədilə ilahi vasitələrdən feyzyab olmuş tələbələr vəsiləsilə gizli sirrimin aşkara çıxmağından qorxuram.

**Qeyd** 1: *Tələbələr mənlə səba arasındakı gizli əlaqələrdən xəbərdar olmuşlar.*

**Qeyd** 2: *"Qorxuram ey gül səna derlər" – "təqid" ünvanlı ədəbi müşküllü bir ibarədir: "Ey gül, sənin sirrini aşkar etməkdən danışırlar."*

Beyt 2: **Əsiri – dərdü – eşqü məsti – cami – hüsn çox, əmma**
**Bizik məşhur olan: Leyli səna, Məcnun məna derlər**.

Anlam: Mütəal məhbub hər yaranmışı, xüsusilə hər insanı özəl cilvə ilə tovhid günəşindən bəhrələndirmişdir. Ancaq mənə nəsib etdigi cilvənin əqlə - idraka sığmaz olduğuna (Leyli), şöhrətimi isə cahana sığmaz etmişdir.(Məcnun)

**Qeyd** 1: *Leyli "Tənəzzül" ünvanlı ürfani mərtəbədə əqli heyran edən ilahi cilvədən ibarətdir.*

**Qeyd** 2: *"Camali-vilayət" ünvanlı ürfani mərtəbədə ilahi camaldan ibarətdir.*

**Qeyd** 3: *Mürşüd həzrətinin hüzur hüsnündən ibarətdir.*

**Qeyd** 4: *Leyli və Məcnun adları mənəvi açmaz mərtəbəni dünyəviləşdirib başa salan nişanələrdirlər.*

Beyt 3: **Sənin mehrü vəfa göstərdiyin əğyara çox gördüm,**
**Qələtdir kim, səni bimehr oxurlar, bivəfa derlər**.

Sözlük: Mehr = məhəbbət = mehribanlıq = günəş.

Nişanə 1: "Mehr" – aşiqin tərbiyəsinə gərəkli ilahi rəhmətdən ibarətdir.

Nişanə 2: "Vəfa" – bəndənin xeyr əməllərinə bağlı olmayan İlahi lütflərdən ibarətdir.

Anlam: Biganələrdən lütfünü qət etməyən mehriban məbudun aşinalara rəhmət göstərməyinə yəqinim var.

**Qeyd** 1: *Beyt ürək sıxan qəbzi də fərəhləndirən bəst kimi uğurlu və gərəkli təlqin etmək istəyir.*

**Qeyd** 2: *Beyt əğyardan söz açmağı bəhanə edərkən aşinaları yada salmaq istəyir.*

**Qeyd** 3: *Əğyara təvəccüh etmək onların müqavimətsizliyini göstərməkdir (istedadsız aşiq qəbz və qəhr atəşinə dözə bilməz).*

Beyt 4: **Sənə derlər büti – Çin, zülfünə zünnar söylərlər,**
**Zəhi – imanı yoxlar, küfr söylərlər, xəta derlər**.

Sözlük: Büt = büt; zünnar = qurşaq = Zərdüştilərin özəl qurşağı = xaç asılmış bağ; zəhi-heyif = ah = əcəba.

Nişanə 1: "Büti-Çin" – bütün kainatda camal cəlalərini təzahür etdirən gözəl məbuddan ibarətdir.

**Qeyd** 1: *Yeganəpərəstlik ləzzəti ilə bütün dünyanı unutmuş aşiqə bütpərəst demişlər.*

**Qeyd** 2: *Yüksək ürfan və insanlığa nail olmayan aşiq bütpərəst ola bilməz.*

Nişanə 2: "Zülf" – bu beytdə maddi küdurətdə əks etdirilmiş mənəvi cəlalərdən ibarətdir.[1]

Nişanə 3: "Zünnar":

A – Həqiqi məbud ibadətinə bel bağlamaq "məhmud" [2] zünnardan ibarətdir.

B – Dünyəvi ilgilərə, yaxud dünyaşünas əqlə bel bağlamaq "məzmun "[3] zünnardan ibarətdir.

Nişanə 4: "İman" – mütəal məbud tanışlığına gərəkli elmdən ibarətdir.

Nişanə 5: "Küfr" – kəsrət zülməti ilə vəhdət günəşindən xəbərsiz qalmaqdan, yaxud mənfi təfriqədən ibarətdir.[4]

Anlam: Ey mütəal məbud, özün "فيهِ ليسَ كَمِثلِهِ شَيئ" buyurduğun kimi [5] səni dünyəvi gözəllərlə müqayisə etmək, yaxud sənin hüsnünü əqlə - idraka sığışdırmaq xəbərsizlik və kafirlik əlamətidir.

---

[1] Qəzəl 12, beyt 2

[2] Məhmud = bəyənilmiş.

[3] Məzmun = məzəmmətlənmiş = təhqir olmuş.

[4] "Mənfi təfriqə ", vəhdət rayihəli kəsrəti ürək seyrinə qənaətbəxş bilməklə məhz mənəvi cilvədən qafil qalmağa bais olur. Ancaq "müsbət təfriqə" ilahi cilvəli kəsrətdən vəhdət səmasına köçməklə insanı məhz cəlalar dərkinə nail edir.

[5] Quran, "Şura" surəsi, 11-ci ayədən bir qismət: Onda ona bənzər bir şey yoxdu.

**Qeyd**: *Mütəal məbudu həqiqi tanımaqdan dəm vurmaq kafirlikdir, elə bunun üçün də islamın ulu peyğəmbəri "ایلاهی ما عرفناک حق معرفتک" buyurmuşdur:*[1]

Beyt 5**: Mənə derlərdi əvvəl bir mələkdir sevdiyin, hala
Görənlər sən fəqirə - göydən enmiş bir bəla derlər.**

Sözlük: Hala = indi; fəqir = fağır = yoxsul = dilənçi.

Nişanə 1: "Mələk" – səmavi uğurlarla bəhrələndirən nişanədir.

Nişanə 2: "Fəqir"– bu beytdə malına, canına, elminə, iradəsinə, yaxud büsbütün varlığına mütəal məbudu malik bilməklə özəl məmlüklüyünü etiraf etmiş aşiqdən ibarətdir.[2]

Nişanə 3: "Bəla"– insanı dünyəvi ilgi - əlaqədən, xüsusilə, fiziki mahiyyətdən qoparıb, kəsrət həbsindən vəhdət gülşəninə intiqal edən sınaq – sıxıntıdan ibarətdir.

**Qeyd** 1: *Ariflər iki çeşid bəlanı təyid etmişlər:*

*A – Cəzalandırmaq bəlası: bu bəla dünyəvi müşküllər önündə aşiqin tədbirini, həm də dözümünü qüvvələndirən bəladan ibarətdir.*

*B – Rəhmət və razılıq bəlası: bu bəla aşiqin yoxsulluğunu özünə sübut edərək onu dünəvi və şəxsi iradə - ixtiyardan ayırmaqla özünü tərk edib məbudu dərk etməyə nail edən bəladan ibarətdir.*

**Qeyd** 2: *Həkimi-məbud bəlanı əvvəl peyğəmbərlərinə, sonra isə özəl dostlarına nəsib etmişdir.*

Anlam: Bir çox aşiqi səmavi yardımlarılə məst edən məbud məni isə səmavi müsibətlərlə fərəhləndirmək istəyir.

**Qeyd** 1: *Yetkinliyin dayandırıcı maneəsi məstlikdən ibarətdir.*

**Qeyd** 2: *Yetkinliyi sürətləndirən səbəb müsibətdən ibarətdir.*

Beyt 6: **Mərizi – eşq üqdi – zülfün eylər arizu, zira
Müaliclər bu mühlik dərdə müşkildir dəva, derlər**.

Sözlük: Məriz = xəstə = bimar; üqd = boyunbağı = düyün = bənd; müalic = müalicə edən = təbib = həkim; mühlik = təhlükəyə salan = həlak edici.

Nişanə 1: "Məriz" – Xəstə bir üzv təbii fəaliyyət qabiliyyəti göstərməkdən aciz olduğuna görə, məriz, fiziki mahiyyətdən ayrılmış müqəddiməsini, yaxud qurbanlıq istedadını təlqin edən nişanədən ibarətdir.

---

[1] Gülüstani-Sədi, Dibaçə

[2] Gülüstani-Sədi, Dibaçə, qəzəl 44, beyt 4.

Nişanə 2: "Üqdi-zülf" – maddi imkanlarda təzahür etdirilmiş mənəvi həqiqətlər qurbanlıq məqamını hazırlayan xəstəliyi mühafizə etmiş nişanədən ibarətdir.

Nişanə 3: "Müalic ":

A – eşq müşkülünə əql ilə tədbir göstərən nəsihətçilərdən ibarətdir.

B – ruhu müalicə edən mürşiddən ibarətdir.

Nişanə 4: "Mühlik dərd ":

A – Mühlik dərd fiziki mahiyyətə iradi ölüm ünvanlı unudulmaq şəraiti yaradan xəstəlikdən ibarətdir.

B – əql tədbirini qulaq ardına vurmaqdan ibarətdir.

Anlam: A – Eşq bimarı məhbub zülfünə bağlanmaqla dünyəvilikdən nicat verən xəstəliyini, yaxud mürşid sifarişini mühafizə etmək istəyir.

B – Eşq bimarı kəsrət güzgüsündə vəhdət nurunu (zülf) görməklə əql tədbirini, yaxud təbiblər hökmünü batil etmək istəyir.

Beyt 7: **Füzuli, aşiqə onlar ki, derlər tərki – eşq eylə,**
**Deməzlərmi xəta, təğyir qıl hökmi – qəza derlər.**

Anlam: Ey Füzuli, aşiqə tədbir göstərən nəsihətçilər ilahi hökmü təğyir etməyi xahiş edirlər.

**Qeyd**: *"Ələst" öhdəliyinə qol çəkməyini unutmayan, yaxud yuxarı aləmdən gətirdiyi xarakterini sağ – salamat saxlamış bir insanın aşiq olmağı onun alın yazısı, yaxud ilahi vəzifəsidir.*[1] *Beləliklə, eşq xəstəsinə tədbir göstərən nəsihətçi ilahi hökmü təğyir etmək istəyir. Elə buna görə də Hafiz buyurmuşdur:*

درکوی نیک نامی مارا گذرندادند گرتونمی پسندی تغییر ده قضارا

[1] Qəzəl 19, beyt 4

## Q Ə Z Ə L 82

(1) Səbadan gül üzündə sünbüli-pürpiçü tab oynar,
Sanarsan pər açıb gülşəndə bir mişgin ğurab oynar.

(2) Xəyali-arizin cövlan edər bu çeşmi-pürnəmdə,
Necə kim mövclənmiş suda əksi-afitab oynar.

(3) Rüxün görkəc olur suzi-dərunü dudi-dil hasil
Bəhar əyyami sıçrar bərqi-rəxşəndə səhab oynar.

(4) İraq olsun yaman gözdən nə xoş saətdir ol saət
Ki, üşşaq ilə məşuq eyləyib nazü itab oynar.

(5) Riyayi-zahidi xüşkün səmaindan nolur hasil
Xoş ol kim, rindü meyxarə içib cami-şərab oynar.

(6) Bu qəmlər ki mənim vardır bəirin başinə qoysan,
Çıxar kafər cəhənnəmdən, gülər əhli-əzab oynar.

(7) Qılar göz pərdəsin xunabi-həsrət çak hər dəm kim,
Rüxündə ləzzəti-didar zövqündən niqab oynar.

(8) Füzuli, rəşkdən titrər dili-pürxuni üşşaqın,
Bəna guşində yarın hər zəman kim, ləli-nab oynar.

Beyt 1: **Səbadan gül üzündə sünbüli-pürpiçü tab oynar,**
**Sanarsan pər açıb gülşəndə bir mişgin ğurab oynar.**

Sözlük: Pürpiçü tab = qıvrılmış = qıvrım – qıvrım; mişgin = qara, gurab = qarğa = məğrur.

Nişanə 1: "Səba" – ilahi vasitələrə eyham edən mənəvi nəsimdən ibarətdir.

Nişanə 2: "Gül üz" – ürək açan hüsnlər nişanəsidir (bəst ) .

Nişanə 3: "Sünbüli porpiço tab ":

A – Müxtəlif maddi yaranmışların mənəvi cəlalərə güzgü olmağından nişanədir. (hadilik )

B – Mənəvi cəlalər qarşısında dikəlmiş maddi maneələrdən nişanədir (haillik ) .

P – Maddi vücudların mənəvi mübhəmliyindən ibarətdir.

Anlam: A – Ey mütəal məhbub, qara maddədə mənəvi parlaq hüsnlər əks etməklə bütün dünyanı gözəlləndirən yalnız sənsən.

**Qeyd**: *İkinci misra maddi yaranmışların mənəvi nur dənizindən bəhrələndiyini təlqin etmək istəyir.*

*B – Ey ilahi hüsnləri bəşəri camalda əks etdirmiş dilbər, yaxud ey mürşid, qara zülfüna, aşiqlərin ətəşini – həsrətini əlavə etməklə onları bitişdirmək istəyirsən.*

**Qeyd** 1: *Beyt qara zülfün nurani camal ilə məhrəmliyinə, yaxud hər bir şeyin öz ziddinə (əksinə) bağlılığına*[1] *eyham etməklə vüsal nailiyyətinin hicran müsibəti ilə əlaqədarlığına eyham etmək istəyir.*

**Qeyd** 2: *Ğurab məğrurluq mənasını daşıyarkən mənaya söykənmiş maddənin istiğna ünvanlı müsbət məğrurluğuna da eyham etmək istəyir.*[2]

Beyt 2: **Xəyali-arizin cövlan edər bu çeşmi-pürnəmdə,**
**Necə kim mövclənmiş suda əksi-afitab oynar.**

Sözlük: Ariz = camal = üz; çeşmi pürnəm = ağlar göz; aftab = günəş .

Nişanə 1: "Xəyali-ariz" – gözlərdən ğayib ilahi camalı ürəklərdə əks etdirən ürfani qüvvədən ibarətdir.[3]

Nişanə 2: "Çeşmi-pürnəm" – mənəm-mənəmliyi yuyub paka çıxarmaqla "xəyali- ariz" məqamına hazırlayan əhvaldan ibarətdir.

---

[1] Qəzəl 3, beyt 2

[2] Müsbət məğrurluq-məmlüküklə fəxr etməkdən, həm də müsbət xudpəsəndlikdən ibarətdir (Qəzəl 10, beyt 2 )

[3] Qəzəl 68, beyt 1

Nişanə 3: İkinci misra mənəvi bir məfhumu dünyəviləşdirmək ilə başa salmaq istəyir.

Anlam: İlahi camal suda əks etdirilmiş günəş kimi göz yaşımda təzahür edir.

Beyt 3: **Rüxün görkəc olur suzi-dərunü o dudi-dil hasil**
**Bəhar əyyami sıçrar bərqi-rəxşəndə səhab oynar.**

Sözlük: Rüx = camal = üz; suzi-dərun = batini atəş = batin yanğısı; Dudi- dil = ürək tüstüsü; bərqi rəxşəndə = parlaq işıq, səhab = bulud.

Nişanə 1: "Rüx" –məhz ilahi təcəllilərdən nişanədir.

Nişanə 2: "Suz " – A – Aşiqin batini aləmini paklayaraq onu bəndəlik məqamına nail edən nişanədən ibarətdir.

B – ürəyi maddi atmosferdən üstün seyr etdirən özəl hərarətdən ibarətdir.

Nişanə 3: "Bəhar" ölməz həyat mənbəyinə söykənməyə, yəni canlanmağa eham edən nişanədən ibarətdir.

Nişanə 4: İkinci misra mənəvi bir məfhumu dünyəviləşdirməklə başa salmaq istəyir.

Anlam: Ey mütəal məhbub, ürəyi maddilik dərisindən çıxarıb mənəvi səmalarda seyr etdirən sənin məhz təcəllilərindən ibarətdir.

Beyt 4: **İraq olsun yaman gözdən nə xoş saətdir ol saət**
**Ki, üşşaq ilə məşuq eyləyib nazü itab oynar.**

Sözlük: Üşşaq = aşiqlər, nazü itab = nazlana-nazlana qəzəblənmək = qəzəbli naz göstərmək.

Nişanə 1: "Naz" – aşiqin qəlbini qüvvətləndirən ilahi özəl rəhmətdən ibarətdir.

Nişanə 2: "İtab" – aşiqi istiqamətləndirmək məqsədilə məlamət etməkdən nişanədir.

Anlam: Mütəal məbudun qəhri – qəzəbi də lütf və rəhməti kimi şirin və sevməlidir.

**Qeyd** 1: *Gözəl mənbədən zühur etmiş sifətlər gözəl olmalıdır (gözəldən çirkin sifət görsənmək mümkünsüzdür).*

**Qeyd** 2: *Qəhr və qəzəb aşiqi istiqamətləndirən, yaxud yetkinləşdirən səbəblər olduqlarına görə şirin və əzizdirlər.*

Beyt 5: **Riyayi-zahidi xüşkün səmaindan nolur hasil**
**Xoş ol kim, rindü meyxarə içib cami-şərab oynar.**

Sözlük: Xüşk = quru = meyvəsiz = bihal = zövqsüz; simai = eşitmək = nəğmə = sufilərin özəl adab-təşrifatla birgə,yaxud tək – tək vəcdə gəlib rəqs etmələri, rind = hiyləbaz = zikr = batini zahirindən gözəl = ictimai adabi tərk etmiş; meyxarə = çox şərab içən.

Nişanə 1: "Zahidi-xüşk" – bu beytdə üzdə bir cür, arxada başqa cür xarakterli "mütəzəhhüd"dən ibarətdir.[1]

Nişanə 2: "Səmai" – A – Maddi əngəl dünyanı ayaq altına salıb təhqir edən ürfani özəl rəqsdən ibarətdir:

**"Əlaiqdən sərasər əl götür bir türfətül eynə**
**Təpik vur həsti-dünyayə, qovzan qabi-qovseynə.**"[2]

B – Səmai saliklərin ilahi özəl seyrindən ibarətdir.

**Qeyd**: *Səmai zahid sözünü qulaq ardına vurmağa da eyham edir*.

Nişanə 3: "Rind" – toplansal təşrifat və mədəni adabdan sovuşub həqiqət dənizində məhv olmuş arifdən ibarətdir.

Nişanə 4: "Meyxarə" – çöl və iç vücudunu tamamilə ilahi eşqə məğlub etmiş rinddən ibarətdir.

Nişanə 5: "Cami-şərab" – məhz təcəllilər nurunu əks etdirmiş ürəkdən ibarətdir.

Anlam: İlahi elmdə seyr etmiş, yaxud dünyəvi ilgiləri ayaq altına salmış rinddən rəhbərligini qəbul etməkdənsə, dünyəvi mənfəətlər məhdudluğunda mənəvi əhval – ruhiyyədən məhrum qalmış riyakar zahidin nəsihətini qulaq ardına vurmağın yaxşıdır.

Beyt 6: **Bu qəmlər ki mənim vardır bəirin başinə qoysan,**
**Çıxar kafər cəhənnəmdən, gülər əhli-əzab oynar.**

Sözlük: Bəir = dəvə.

Anlam: Çağdaş adlısanlı şair ustad Nəzmi Təbrizi ""Gülşəni-məani" ünvanlı, sanballı kitabında bu beytin özünü, həm də farca deyilmiş fikrini belə çərh etmişdir: "Şair (Füzuli-red.) bu beytdə "Əraf "surəsinin 40-cı kərimə ayəsindən [3] istifadə edərək özəl bir məzmun düzəltmişdir. Bu kərimə ayəni görməyən, yaxud onun mənasına diqqət etməyən bir şəxs həmin beytin məfhumunu idrak etməkdən aciz olar. Mütəal Allah bu ayədə buyurmuşdur: Həqiqətən nə qədər ki, dəvə iynənin gözündən keçməyib bir o qədər də ilahi ayələri təkəbbürlə təkzib edən şəxslərin

[1] Qəzəl 9, beyt 2,
[2] Ustad Münəm Ərdəbili

[3] انّالِ َذينَ كَذَّبو باياتِنا وَ ستَكبَر وُعَنها لا تُفَتَّحُ لهُم ابوابُ السَّماء وَلا يَدخُلوُنَ الجَنَّة حَتّى يَلِجَ الجَكَلُ فى سَمِّ الخِياطِ وَ كَذالِكَ نَجزى المُجرِمين

üzünə səmavi qapılar açılmayacaq və onlar behiştə daxil olmayacaqlar, belə bir günahkarları bərk cəzalandırmalıyıq”.

Bu misaldan qəmgin şairin şərif ayənin mənasına işarə etməyi məlum olur, yəni şair öz qəmlərini belə şərh edir: Mənim çiynimə qoyulmuş ağır qəm yükü dəvənin belinə qoyulsaydı, dəvə o ağır yük zəhmətindən elə zəifləşərdi ki, iynənin gözündən keçə bilərdi, nəhayət, belə bir iş baş tutsaydı, yəni əgər dəvə iynənin gözündən keçəydi, kafirlər behiştə yol tapardılar" [1]:

آنچه بر من می رود گربرشتررفتی زغم
می زدندی کافران در جنّت المأ وی قدم

Beyt 7: **Qılar göz pərdəsin xunabi-həsrət çak hər dəm kim,**
**Rüxündə ləzzəti-didar zövqündən niqab oynar.**

Sözlük: Xunab = qan-yaş; çak = yarıq; rüx = camal = üz; didar = görüş.

Nişanə 1: "Xunab "–fiziki mahiyyəti, həm də mənəm-ənəmliyi yuyub batil edən nişanədən ibarətdir.

Nişanə 2: "Həsrət" – öz istedadsızlığını başa düşən aşiqin əfsunlaşmağından ibarətdir.

Nişanə 3: "Rüx" – ilahi parlaq camaldan ibarətdir.

Nişanə 4: "Niqab" – vəhdətə söykənmiş kəsrətdən, yaxud "qürb" mərtəbəsindən ibarətdir.

Anlam: Vəhdət günəşindən bəhrələnmiş kəsrəti gördükcə əfsusum artır (kaş ki, mən də qürb mərtəbəsinə nail olaydım).

Beyt 8: **Füzuli, rəşkdən titrər dili-pürxuni üşşaqın,**
**Bəna guşində yarın hər zəman kim, ləli-nab oynar**.

Sözlük: Rəşk = qısqanclıq = qibtə; pürxun = qan dolmuş; üşşaq = aşiqlər; bənaguş = sırğalıq; dürrinab = xalis dürr.

Nişanə 1: "Rişk" – ötən beytdə qeyd olunmuş həsrətin təkrarından ibarətdir.

Nişanə 2: "Bənaguş" – dəqiqə ünvanlı əqlə - idraka sığmaz ilahi hüsnlərdən ibarətdir.

Nişanə 3: "Dürri nab":

A – aşiqin keçmiş elmlərini məhv edən mərtəbəyə işarə edən nişanədir.

B – xalis ibadət etməkdən nişanədir.

[1] Gülşəni-məani, Ustad Nəzmi Təbrizi s.138

Anlam: Mütəal məhbubun əqlə-idraka sığmaz nazik hüsnləri cilvə etdikcə aşiqlər qəlbini həsrət ətəşində qana döndərir: (Aşiqlər ibadət ətəşi ilə çalışqanlıq edirlər).

## Q Ə Z Ə L 83

**(1) Ah eylədiyim sərvi-xuramanın üçündür,**
**Qan ağladığım qönçeyi-xəndanın üçündür.**

**(2) Sərgəştəliyim kakili-mişginin ucundan,**
**Aşüfətliyim zülfi-pərişanın üçündür.**

**(3) Bimar tənim nərgisi-məstin ələmindən,**
**Xunin çigərim ləli-dürəfşanın üçündür.**

**(4) Yaxdım tənimi vəsl günü şəmtək, əmma**
**Bil kim, bu tədarük şəbi-hicranın üçündür.**

**(5) Qurtarmağa yəğmayi-ğəmindən dilü cani,**
**Səyim nəzəri-nərgisi-fəttanın üçündür.**

**(6) Can ver, könül, ol qəmzəyə kim, bunca zamanlar**
**Can içrə səni bəslədiyim anın üçündür.**

**(7) Vaiz bizə dün duzəxi vəsf etdi, Füzuli,**
**Ol vəsf sənin külbeyi-əhzanın üçündür.**

Beyt 1: **Ah eylədiyim sərvi – xuramanın üçündür,**
**Qan ağladığım qönçeyi – xəndanın üçündür.**

Sözlük: Xuraman = qəmzə satan = naz və təkəbbürlə addım atan.

Nişanə 1: "Ah" – A – Ürəyin müşahidə mərtəbəsinə mane olmuş maddi hissəsini "nari-məhəbbət" vəsiləsilə yandırarkən onu "nuri-məhəbbət", yaxud şühud nailiyyətinə hazırlamaqdan nişanədir.

B – ürəyə ilahi məqsədə çatmaq eşqi ilə mənəvi mərtəbələr seyr etdirən hərarətdən nişanədir.[1]

Nişanə 2: "Sərvi xuraman" – ülvi hüsnlər təzahürünü davam etdirmiş məhbubdan ibarətdir.

Nişanə 3: "Qan ağlamaq"– fiziki mahiyyəti, yaxud mənəm-mənəmliyi yuyub batil etmək nişanəsidir.

**Qeyd**: *Ah və qan, od və su kimi paka çıxaran özəl yuyucu nişanələrdirlər.*

Nişanə 4: "Qönçeyi-xəndan" – ürək açan ilahi intibahdan nişanədir.[2]

Anlam: Ey mütəal məhbub, gah ah odunda, gah da göz yaşında yuyunub paka çıxmaqla, ilahi ilham və işarələrdən, yaxud ülvi hüsnlərdən xəbərdar olmağa hazırlaşmışam. (Ülvi hüsnlərdən xəbərdar olmaq məqsədilə özümü oda – suya vurmuşam ).

Beyt 2: **Sərgəştliyim kakili – mişginin ucundan,**
**Aşüfətliyim zülfi – pərişanın üçündür.**

Sözlük: Sərgəştə = sərgərdan = avara = heyran; Kakil = kəkil; mişgin = qara = ətirli, aşüftə = pərişan.

Nişanə 1: "Sərgəştə" – ilahi əzəmətlər önündə əqlini, idrakını quru ağac kimi karsız hiss etməklə heyran olmuş aşiqdən ibarətdir.

Nişanə 2: "Kakili mişgin" – küdurətli maddədə əks etdirilmiş ilahi camal cələlərindən ibarətdir.

Nişanə 3: "Aşüftəlik" – şiddətli sərgəştəlikdən ibarətdir.

Nişanə 4: "Zülfi-pərişan" – xaliq rayihəli xəlq məşğulluğundan, yaxud "təfriqə" mərhələsindən ibarətdir.

Anlam: A – İlahi cələlər ilə heyran olmuşam.

B – Yaranmışlarda cilvə edən yaradıcı məhbuba heyran olmuşam.

Beyt 3: **Bimar tənim nərgisi – məstin ələmindən,**
**Xunin çigərim ləli – dürəfşanın üçündür.**

[1] Qəzəl 17, beyt 2.
[2] Qəzəl 53, beyt 1

Sözlük: Nərgis = nərgiz = məşuqun gözü; ələm = qəm= qüssə; xunin = qanlı; ləli – dürəfşan = dürr yağdıran ləl.

Nişanə 1: "Bimar tən" – bimarlıq əngəl cismi, yaxud fiziki mahiyyəti fəliyyətsiz edən bəsitlik, ya da mücərrədlik müqəddiməsindən ibarətdir.

Nişanə 2: "Nərgisi-məst" – iç aləmi fərəhləndirən ilahi şühud qələbələrindən ibarətdir.

Nişanə 3: "Xunin cigər" – yetkinlik müqəddiməsi hazırlamaq məqsədilə müxtəlif sınaq – sıxıntıya dözməkdən ibarətdir.

Nişanə 4: "Ləli-dürəfşan" – ölməz həyat rayihəli ilahi ilham feyzlərindən ibarətdir.

Anlam: İlahi ilham – intibah məqsədilə, yaxud iç aləmi fərəhləndirən şühud eşqilə fiziki əngəl mahiyyətini yuyb batil etməklə məşğul olmuşam.

Beyt 4: **Yaxdım tənimi vəsl günü şəmtək, əmma**
**Bil kim, bu tədarük şəbi – hicranın üçündür.**

Sözlük: Vəsl = vüsal = vəslət; şəbi-hicran = hicran gecəsi.

Nişanə 1: "Yaxdım tənimi" – Atəş paka çıxaran bir maddə olduğuna görə təni yaxıb – yandırmaq birinci beytdə bəyan olmuş "Ah" ilə iç vücudu çöl vücud ləkəsindən paklamaq nişanəsidir.

Nişanə 2: "Vəsl günü" – insanın maddi dünyaya düşməsindən əvvəl mənəvi, yaxud "ələst" [1] aləmində mütəal məbud hüzurunda yaşayış mərtəbəsindən ibarətdir.

Nişanə 3: "Şəm"– ilahi nur və hərarət ilə müqavimət qazanmaq nişanəsidir.

Nişanə 4: "Şəbi-hicran" – dünyəvilik həbsindən, həm də qəbzlər çətinliyindən nişanədir.

Anlam: Mənəvi nurani aləmdə vəsl atəşinə yanmaqla maddi küdurət dünyasında hicran oduna yanmaq müqavimətini tədarük görmüşəm.

Beyt 5: **Qurtarmağa yəğmayi – ğəmindən dilü cani,**
**Səyim nəzəri – nərgisi – fəttanın üçündür.**

Sözlük: Yəğma = qarət = tarac eləmək; səy = cəhd etmək = çalışqanlıq; nərgisi fəttan = fitnəli nərgis.

Nişanə 1: Birinci misra dünyəvi ömür məhləti yaranmış hicrandan həmişəlik xilas olmaq nişanəsidir.

---

[1] Qəzəl 19, beyt 4

Nişanə 2: "Nərgisi-fəttan" – aşiqi yer ilə göy arasında qaynaşdıran ilahi sifətlər zühuruindan nişanədir.

Anlam: Dünyəvilikdən, yaxud hicran həbsindən həmişəlik xilas olmaq məqsədilə yer ilə göy arasında çalışqanlıqla məşğul olmuşam.

Beyt 6: **Can ver, könül, ol qəmzəyə kim, bunca zamanlar**
**Can içrə səni bəslədiyim anın üçündür.**

Nişanə: "Qəmzə ":

A – qəlbi kamal səmasında seyr etdirən ilahi cazibələr – feyzlər nişanəsidir.

B – fiziki mahiyyəti qurban etdirməklə mənəvi mahiyyəti canlandıran ilahi feyzdən ibarətdir.

Anlam: Dünyəvi həyatımı mənəvi ərəfədə qurban etmək məqsədilə mühafizə edirəm.

Beyt 7: **Vaiz bizə dün duzəxi vəsf etdi, Füzuli,**
**Ol vəsf sənin külbeyi - əhzanın üçündür.**

Sözlük: Duzəx = cəhənnəm, külbeyi-əzan = pərişan daxma = qəmlər daxması.

Nişanə 1: "Vaiz" – dünyaşünas əqlə söykənməklə mənaşünas eşq hidayətini inkar etmiş nəsihətçidən ibarətdir.

Nişanə 2: "Külbeyi-əhzan" – A – Hicran qüssəsi ilə daşqın qəlbdən ibarətdir.

B – öz istedadsızlığını etiraf etmiş başıaşağı aşiqin qüssələnməyindən ibarətdir.

Anlam: Hicran atəşinə tab gətirmək cəhənnəm oduna dözməkdən daha çətindir.

## Q Ə Z Ə L 84

(1) Hansı gülşən gülbünü sərvi –xuramanınca var?
Hansı gülbün üzrə ğönçə, ləli-xəndanınca var?

(2) Hansı gülzar içrə bir gül açılır hüsnün kimi,
Hansı gül bərgi, ləbi-ləli-dürəfşanınca var?

(3) Hansı bağın var bir nəxli qədin tək barvər,
Hansı nəxlin hasili sibi-zənəxdanınca var?

(4) Hansı xuni sən kimi cəlladə olmuşdur əsir,
Hansı cəlladın qılıncı tiği-müüjganınca var?

(5) Hansı bəzm olmuş münəvvər bir qədin tək şəmdən,
Hansı şəmin şöləsi rüxsari-tabanınca var?

(6) Hansı yerdə sənə bənzər bulunur bir gənci-hüsn,
Hansı gəncin əjdəri zülfi-pərişanınca var?

(7) Hansı gülşən bülbülü söylər, Füzuli, sən kimi,
Hansı bülbül naləsi fəryadü əfğanınca var?

Beyt 1: **Hansı gülşən gülbünü sərvi –xuramanınca var?**
**Hansı gülbün üzrə ğönçə, ləli-xəndanınca var?**

Sözlük: Gülbün = buta.

Nişanə 1: "Gülşən gülbunu" – ürək açan dünyəvi mərifətlərdən ibarətdir.

Nişanə 2: "Sərvi-xuraman" – ardı – arası kəsilməz ülvi hüsnlər zühurundan ibarətdir.

Nişanə 3: "Qönçə" – bu beytdə dünyəvi mübhəm feyzlər mərkəzindən ibarətdir.

Nişanə 4: "Ləli-xəndan" – bu beytdə ürək açan ilahi ilhamlardan ibarətdir.

Anlam: Ey mütəal məhbub, heç bir maddi mərifət, yaxud dünyəvi feyz sənin erək açan ilhamlarınla bərabərlik edə bilməz.

Beyt 2: **Hansı gülzar içrə bir gül açılır hüsnün kimi,**
**Hansı gül bərgi, ləbi-ləli-dürəfşanınca var?**

Sözlük: Gül bərgi = gül yarpağı; dürəfşan = dürr yağdıran.

Nişanə 1: "Gülzar, gül, gül bərgi" – Ürək açan dünyəvi mərtəbələrdən nişanədir.

Nişanə 2: "Hüsn" – bütün kamalların bir vücudda cəmləşdirilməyindən ibarətdir.

**Qeyd**: *Kamallar cəmləşmiş vücud yalnız mütəal məbud vücudundan ibarətdir*.

Nişanə 3: "Qönçə"– bu beytdə ürək açan ilahi ilham – işarədən ibarətdir.

Nişanə 4: "Ləbi-ləli-dürəfşan" – ölməz həyat rayihəli ilahi feyzlər mərkəzindən nişanədir.

Anlam: Beyt ötən beyti təkrarlamaqda təkid edir.

Beyt 3: **Hansı bağın var bir nəxli qədin tək barvər,**
**Hansı nəxlin hasili sibi-zənəxdanınca var?**

Sözlük: Nəxl = ağac = xurma ağacı; barvər = barlı = meyvəli; sib = alma; zənəxdan = çənə.

Nişanə 1: "Bağ, nəxl" – səmərələşdirici dünyəvi mərtəbələrdən nişanədir.

Nişanə 2: "Qəd" – A – maddə ilə məna arasındakı ilahilik özəntisindən ibarətdir.

B – Qəd, yaxud ilahilik özəntisi "قد قامت الصلاوة" [1] etibarı ilə eşq namazının, yaxud bəndəlik iftixarının başlanışını təlqin edən nişanədir.

Nişanə 3: "Sibi-zənəxdan" – mütəal məbudun mərhəməti ilə bağlı qəzəbini təlqin edən nişanədən ibarətdir.

**Qeyd**: *Həkimi-məbud aşiqi dini nuraniliyə yetirmək məqsədilə zənəxdan ünvanlı mövqeiyyəti zülmətə giriftar edər.*[2]

Anlam: Ey mütəal məhbub, heç bir dünyəvi nemət bəndəlik mərtəbəsinə qaldıran sınaqlar – sıxıntılar kimi uğurlu deyil.

Beyt 4**: Hansı xuni sən kimi cəlladə olmuşdur əsir,**
**Hansı cəlladın qılıncı tiği-müjganınca var?**

Sözlük: Xuni = qanlı = adam öldürən = qan tutmuş; nuki-müjgan = kipriklərin ucu.

Nişanə 1: "Cəllad" – birinci misrada deyildiyi kimi dünyəviliyi öldürüb mənəviligi diriIdən, yaxud aşiqin fiziki əngəl mahiyyətinə rəhm etməyən ilahi qəzəb sifətindən ibarətdir.

Nişanə 2: "Nuki-müjgan"– aşiqi gizli, yaxud aşkar naqis əməllərinə görə ilahi şühud məhrumluğunda tənbih – tərbiyə etməkdən nişanədir.

Anlam: Ey həkim-məhbub, layiqsiz aşiq üçün mənəvilik və ölməzlik istedadıbağışlayan qəbz işgəncələri kimi uğurlu bir nemət yoxdur.

Beyt 5**: Hansı bəzm olmuş münəvvər bir qədin tək şəmdən,**
**Hansı şəmin şöləsi rüxsari-tabanınca var?**

Sözlük: Bəzm = məclis = ziyafət məclisi = əncümən = şadlıq məclisi; münəvvər = nurani = ziyalı; ruxsari-taban = parlaq üz.

Nişanə 1: "Münəvvər bəzm" – dünyəvi ziyalar nişanəsidir.

Nişanə 2: "Şəm" – bu beytdə maddi təcəllilər nişanəsidir.

Nişanə 3: "Qəd" – bütün kainata varlıq bağışlayan ilahilik yolundan ibarətdir.

Nişanə 4: "Şölə" – dünyəvi bağları yandırmaqla vücudu paka çıxaran nişanədən ibarətdir.

Nişanə 5: "Ruxsari-taban": Ruxsari taban, insanlara elm və mərifət bağışlayan həm də bütün kainatın varlığına səbəb törədən ilahi camal cilvələrindən ibarətdir.

Anlam: Ey mütəal məbud, kainatın varlığı, həm də insanların elmi – mərifəti sənin dünyəvi ölçülərə sığmaz ziyalarına bağlıdır.

---

[1] Həqiqətən namaz başlandı

[2] Qəzəl 38, beyt 6

Beyt 6**:** **Hansı yerdə sənə bənzər bulunur bir gənci-hüsn,**
**Hansı gəncin əjdəri zülfi-pərişanınca var?**

Sözlük: Gənci-hüsn = hüsn xəzinəsi; əjdər = əjdəha.

Nişanə 1: "Gənci-hüsn" – A – Əqlə - idraka sığmaz ilahi kamaldan ibarətdir.

B – Gənci-hüsn, əqldən və elmdən gizli kamalların mütəal məbud vücudunda təmamilə cəmləşməyindən ibarətdir.

Nişanə 2: "Mar" – malikiyyət, yaxud mühafizə etmək nişanəsidir.

**Qeyd** 1: *Xəzinəni gəliş – gedişi olmaz ilanlıqdan pünhan etmək onu amanda saxlamaq nişanəsidir.*

**Qeyd** 2: *İlanın xəzinə kənarında yuva salmağı onun qızıl – gümüş sevməyindən nişanədir.*

**Qeyd** 3: *Dünyəvi xəzinə ətrafı təhlükəsiz olmadığı kimi mənəvi xəzinə yaxınlığı da dünyəvi və mənəvi təhlükədən xali deyil.*

**Qeyd** 4: *Eşq yolunu seçmək əjdəha ilə mübarizə aparmaqdır.*

**Qeyd** 5: *"Əzdad" baxımı ilanı can alıcı olduğuna görə canlanmaq, yaxud yeni həyat nişanəsi bilmişdir.*[1]

Nişanə 3: "Zülfi-pərişan" – insanı vəhdət mərtəbəsindən məhrum etmiş kəsrət maneələrindən ibarətdir.

Anlam: İlahi cilvələri əks etdirmiş kainat insanları kəsrət güzgüsünə məşğul edərək vəhdət sirrini onların naməhrəm idraklarından mühafizə etmək istəyir.

**Qeyd** 1: *Bütün yaranmışlar ilahi cilvələri əks etdirməklə yaradıcı məhbubun hüsn gəncini mühafizə edirlər.*

**Qeyd** 2: *Mühafizə etmək naməhrəm fikirləri məhdud eləməkdən ibarətdir, elə buna görə də lisanül qeyb Hafiz demişdir:*

تابه گیسوی تو دست ناسازیان کم رسد        هر دلی ازحلقه ای مشغول یارب یار بست[2]

Beyt 7**:** **Hansı gülşən bülbülü söylər, Füzuli, sən kimi,**
**Hansı bülbül naləsi fəryadü əfğanınca var?**

Nişanə 1: "Gülşən": Gülşən ilahi ürək açan mərifətlərə eyham edən nişanədir.

Nişanə 2: "Fəryadü fəğan" – biqərar qəlbin özəl münacatından ibarətdir.

Anlam: Beyt dünyəvi hüsnlərin mənəvi hüsnlər önündə həqirligini təlqin etmək istəyir.

---

[1] Qəzəl 3, beyt 2
[2] Qəzəl 61, beyt 5

## Q Ə Z Ə L 85

**(1) Vəh nə qamət, nə qiyamət, bu nə şaxi-güli-tərdir,**
**Nə bəladir nəzər əhlinə, nə xoş məddi-nəzərdir.**

**(2) Göz yoludur ki, könül mülkünə xublar girər ondan,**
**Tutma, ey əşk, onu, billah ki əcəb rahgüzərdir.**

**(3) Nə gühər olsa bəgənməz, buraxır yazıya dərya,**
**Ğaliba kim ona məqsud dişin kimi gühərdir.**

**(4) Eşq eybini bilibsən hünər, ey zahidi-qafil,**
**Hünərin eybdir, amma dediyin eyb hünərdir.**

**(5) Sitəmin gərçi yamandır, onu tərk eyləmə, billah**
**Ki, təğafül, sitəmindən daha, əlbəttə, betərdir.**

**(6) Axər olmaz necə kim göz yaşı axarsa, həmana**
**Ki, dəmadəm ona imdad qılan xuni-cigərdir.**

**(7) Sərsəri basma qədəm eşq təriqinə, Füzuli,**
**Ehtiyat eylə ki, ğayətdə xətərnak səfərdir.**

Beyt 1: **Vəh nə qamət, nə qiyamət, bu nə şaxi-güli-tərdir,**
**Nə bəladir nəzər əhlinə, nə xoş məddi-nəzərdir.**

Sözlük: Məddi = nəzər diqqəti cəlb etmək.

Nişanə 1: "Qamət" – "Qəd qamə əssəlat" etibarilə ürək münacatı uzantısından, həm də davam etdirilmiş ilahi maraq – müşahidədən həm də iç aləmin mütəal məbuda məşğul olmağından nişanədir.[1]

Nişanə 2: "Qiyamət" – fiziki əngəl mahiyyətindən xilas edən "suğra qiyaməti" ünvanlı "iradi ölümdən", yaxud "موتو قبل ان تموتوا" [2] nailiyyətindən ibarətdir.

Nişanə 3: "Gül" – bəst ünvanlı ilahi ürək açan müşahidədən ibarətdir.

Nişanə 4: "Tər, şax": Tər həm də şax, mənəvi canlanmaqdan, yaxud iç həyatın dəmadəm yeniləşməyindən nişanədir.[3]

Nişanə 5: "Bəla" – dünyəvilikdən ayılan, yaxud bəsitlik şəraiti hazırlayan sınaq – sıxıntıdan ibarətdir.[4]

Nişanə 6: "Nəzər əhli" – A – Hər bir yaranmışda yaradıcı məbudun cilvəsini müşahidə etmiş şəxslərdən ibarətdir.

B – bəşəri gözəl camalda ilahi hüsnlər təzahürünü müşahidə etmiş şəxslərdən ibarətdir.

P – Nəzər əhli, bir çox ürək sevən məqamları, yaxud mənəvi görüntüləri müşahidə etmiş şəxslərdən ibarətdir.

Anlam: Ürək münacatını əlavə edən ilahi maraq – müşahidə uzanışı aşiqin nəzər diqqətini cəlb etməklə onu "iradi ölüm", yaxud " موتو قبل ان تموتوا" mərhələsində dünyəvilikdən çıxarıb mənəvilik ilə canlandırır.

Beyt 2: **Göz yoludur ki, könül mülkünə xublar girər ondan,**
**Tutma, ey əşk, onu, billah ki, əcəb rahgüzərdir**

Sözlük: Xublar = gözəllər; əşk = göz yaşı, billah = Allah xatirinə; rəhgüzər = yol.

Nişanə 1: "Könül mülkü" – aşiqin iç aləmindən ibarətdir.

Nişanə 2: "Xublar" – bəşəri camalda ilahi hüsnlər əks etdirmiş gözəllərdən ibarətdir.

**Qeyd**: *Dönə-dönə dediyimiz kimi, dünyəvi gözəllər-gözəlliklər iç aləmini sağ-salamat saxlamış bir insanı yaxud "Ələst"[1] səciyyəli bir bəşəri, mənəvi gözəlliklərə hidayət edən müqəddimədən ibarətdir.*

---

[1] Qəzəl 84, beyt 3
[2] Qəzəl 6 beyt 6 nişanə 2 (Zülm), qəzəl 37, beyt 1
[3] Qəzəl 71, beyt 3
[4] Qəzəl 81, beyt 5

Beyt 3: **Nə gühər olsa bəgənməz, buraxır yazıya dərya,**
**Ğaliba kim ona məqsud dişin kimi gühərdir.**

Sözlük: Gühər = gövhər.

Nişanə 1: "Gühər" – A – birinci misrada dünyəvi dəyərlərdən nişanədir. İkinci misrada İlahi mənalardan yaxud mütəal məbud sifətlərindən, yaxud kamil bir insanın həqiqətindən nişanədir.[2]

Nişanə 2: "Diş" – idrak sifətindən nişanədir.

**Qeyd** 1: *Şairlər sultanı Xaqani dişi göz yaşına bənzətməklə iç aləm xülasəsinin çöl aləmdə zühur etməyini təlqin etmək istəyib:*

به سرشک ترو خون جیگرم          بسته بیرون و درون دهنت

**Qeyd** 2: *Xorasan şairləri o cümlədən İbni-Yəmin dişi şehə bənzətməklə onu hüsnlər xülasəsi, yaxud gözəlliklər nümunəsi bilmişlər:*

دندانت به قطره های شبنم ماند          کاندر دهن غنچه خندان افتد

**Qeyd** 3: *Amiri-Məcnun, dişi ulduzlara bənzətməklə yer mülkündə göy cilvəsini, yaxud bəşəri camalda ilahi cəlaləri təlqin etmək istəmişdir:*

دورسته درّ دندان چون از رخت بتابد          گویی مگر ثریا در ماه کرده منزل

"کمال الدین اسماعیل"

**Qeyd** 4: *Dişi dürrə bənzətməklə onun rədifli, mənzumlu, qiymətli olmağına eyham etmişlər.*

**Qeyd** 5: *Ərəblər yeddi təşbihlə dişi vəsf etmişlər:*

*Nur, Hobb, Bərd (Dolu), Cuma ulduzu, Dürr, Mirvari, Sin.*[3]

**Qeyd** 6: *Farslar səkkiz bənzətmə ilə dişi vəsf etmişlər:*

*Dolu, Şeh, Gövhər, Mirvari, Cuma ulduzu, Ulduz, Onurğa, Göz yaşı*

Anlam: Diş rəmzindən xəbərdar olmuş dəniz öz gövhərlərini həqir görərkən onları eşiyə buraxır.

Beyt 4: **Eşq eybini bilibsən hünər, ey zahidi-qafil,**
**Hünərin eybdir, amma dediyin eyb hünərdir.**

Anlam: Ey mənəvi hüsnlərdən xəbərsiz zahid, yaxud ey aşiqə irad etməyi özünə imtiyaz bilmiş nəsihətçi, həqiqətən bu imtiyazın özü eyb ilə eynidir.

**Qeyd**: *Beyt zahidin baş –ayaq nəsihətini təlqin etmək istəyir.*

Beyt 5: **Sitəmin gərçi yamandır, onu tərk eyləmə, billah**
**Ki, təğafül, sitəmindən daha, əlbəttə, betərdir.**

---

[1] Qəzəl 19 beyt 4

[2] Fərhəngi-istilahati ürfani, doktor Mənuçehr Daneş Pejuh

[3] Sin, "simya" ünvanlı elm ilə adətdən kənar işlər göstərməkdən, yaxud adətkərdə işlərə mane olmaqdan, həm də "Seyyid", yaxud "Rəsul" rəmzindən nişanədir.

Sözlük: Təğafül = qəflət etmək = özünü qafil göstərmək.

Nişanə 1: "Sitəm" – bu beytdə mütəal məhbubun mərhəmətilə bağlı qəzəbindən, yaxud istedadsız aşiqin qəbz sınaqlarında tənbihlə istedadlanmağından ibarətdir.

Nişanə 2: "Təğaful" – bu beytdə yetkinlik məhrumluğundan, yaxud mənəvi mərtəbələr xəbərsizligindən ibarətdir. Təğaful cəfa tərkini də iham edir.

Anlam: Təğaful dərdi qəbz və qəhr cəfasından daha çətindir.

**Qeyd** 1: *Beyt zahidin qafilliyinə eyham etməklə onu təhqir etmək istəyi.*

**Qeyd** 2: *Beyt eşq cəfalarını əql vəfalarından çox üstün və fərəhləndirici təlqin etmək istəyir.*

Beyt 6: **Axər olmaz necə kim göz yaşı axarsa, həmana**
**Ki, dəmadəm ona imdad qılan xuni-cigərdir.**

Sözlük: Həmana = həqiqətən = doğurdan doğruya; dəmadəm = dəmbədəm, xuni-cigər = cigər qani.

Nişanə 1: "Göz yaşı" – fiziki mahiyyət ləkəsini paklayan yuyucu nişanədən ibarətdir.

Nişanə 2: "Xuni-cigər" – dünyəviliyi, yaxud vücudu batil edən nişanədən ibarətdir.

Anlam: İç aləm, yaxud batin, yaxud həqiqi vücud zavalsız olduğuna görə onunla bağlı təzahür etməklər də, o cümlədən göz yaşı zavalsız, yaxud qurtarmazdır.

**Qeyd**: *Beyt eşqin mənəviliyinə, yaxud zavalsız olmağına eyham etmək istəyir.*

Beyt 7: **Sərsəri basma qədəm eşq təriqinə, Füzuli,**
**Ehtiyat eylə ki, ğayətdə xətərnak səfərdir.**

Sözlük: Təriq = yol; qayət = qayə = nəhayət.

Nişanə 1: "Təriq" – ilahi məqsədə nail edən təhlükəli mənzillərdən ibarətdir.[1]

Nişanə 2: "Səfər" – dünyəvi ilgiləri - əlaqələri məhv etmiş qəlbin mütəal məbuda diqqətindən ibarətdir.

Ürfani səfər dörd çeşiddir:

1 – Ürək səfəri: Bu səfər dünyəvilikdən çıxmaqla başlanarkən mənəvilik səmasından özəl təcəllilər nailiyyəti ilə sona çatır.

---

[1] Qəzəl 78, beyt 4.

2 – Ruh səfəri: Bu səfər aşiqi ilahi sifətlərə nail etməklə sona çatır.

3 – Cəm səfəri: Bu səfər qoşalığı aradan qaldıran "Əv Ədna" ünvanlı özəl səfərdən ibarətdir.

4 – Müraciət səfəri: Bu səfər aşiqi göydən yerə qaytarmaqla onu rəsulluq vəzifəsini daşımağa məşğul edir.

Anlam: Ey Füzuli, seyr yolunda müxtəlif təhlükələrlə üzbəüz olmağa ciddi hazırlaşmalısan.

**Qeyd**: *Beyt kəsrət vadisindən vəhdət nöqtəsinə dübarə qaytaran dairəvi seyr çətinliklərini təlqin etmək istəyir.*[1]

---

[1] Qəzəl 1, beyt 1 (Nişanə: Salik).

## Q Ə Z Ə L 86

(1) Nəvavü saz ilə mey nuş edənlər dilrubalardır,
Çəkən dərdü bəla bəzmi-qəm içrə binəvalardır.

(2) Pərişan etmə kakili başinçün, ey pəri peykər
Ki, hər bir kakülun tarında yüz min mübtəlalardır.

(3) Gəl, ey zahid, əgər əhli-yəqini görmək istərsən,
Özündən bigüman biganə olmuş aşinalardır.

(4) Keçib dildarə yar olmaq dilərsən müddəalərdən,
Səni yarindən əğyar eyləyən bu müddəalardır.

(5) Cəfaü və cövri çox, dilbərlərin mehrü vəfası az,
Füzuli, çək əlini netmək olur, bivəfalardır.

Beyt 1: **Nəvavü saz ilə mey nuş edənlər dilrubalardır,**
**Çəkən dərdü bəla bəzmi-qəm içrə binəvalardır.**

Sözlük: Nəva = var – dövlət[1]; saz = nemət = ziyafət = mənfəət = hiylə[2]; bəzm = əmcümən = məclis; binəva = natəvan = yoxsul = adamsız.

Nişanə 1: "Nəvaün saz" – ürək şadlığından, həm də bəşəri istiğna nailiyyətindən, yaxud mütəal məhbuba möhtac aşiqin bütün dünyadan ehtiyacsız olmağından nişanədir.

Nişanə 2: "Mey nuş edənlər" – ilahi cilvələri yadırğamaqla ürəkləri-ni zövqlə doldurmuş gözəllərdən, yaxud mürşüdlərdən ibarətdir.

Nişanə 3: "Dərdü bəla" – aşiqi fiziki mahiyyətdən ayırmaqdan ötrü təlimləndirən qəbzlərdən ibarətdir.

Anlam: Şühud məqamına nail olmuşların, yaxud İlahi hüsnlərdən bəhrələnmişlərin məstliyi sözə -bəyana sığmayan kimi, məhrumların da qəm-qüssəsi deməyə gəlmir.

Beyt 2: **Pərişan etmə kakili başinçün, ey pəri peykər**
**Ki, hər bir kakülun tarında yüz min mübtəlalardır**.

Sözlük: Kakil = kəkil; pəri peykər = pəri əndamlı.

Nişanə 1: "Pərişan" – Pərişanlıq bu beytdə mənəviliyə dünyəvilik qatmaqdan nişanədir.

Nişanə 2: "Kakil" – ilahi cilaları əks etdirən kəsrət güzgüsündən xüsusilə ilahi rayihəli bəşəri hüsnlərdən ibarətdir.

Nişanə 3: "Pəripeykər" – birinci beytdə bəyan olmuş dilrübadan ibarətdir (ilahi hüsnlər əks etdirilmiş bəşər).

Anlam: Ey ilahi cəlalər əks etdirmiş dilbər, mənəvi hüsnləri dünyə-vilik örpəyində pünhan etməklə səbirsiz aşiqin həlak olmağına razılıq vermə.

Beyt 3: **Gəl, ey zahid, əgər əhli-yəqini görmək istərsən,**
**Özündən bigüman biganə olmuş aşinalardır.**

Nişanə 1: "Zahid" – dünyaşünas əqli kamal nailiyyətinə kafi bilmiş nəsihətçidən ibarətdir.

Nişanə 2: "Yəqin" – A – Bu beytdə gözlərdən gizli mərtəbələrin ürəklərdə aşkar olmasından ibarətdir.

B – müşahidə mərtəbəsindən ibarətdir.

P – həqiqət nurunu müşahidə etməkdən ibarətdir.

---

[1] Nəva ─özəl muğama da eyham edir.

[2] Saz, aşıqlar sazına da eyham edir.

T – yəqin əhli cəfalar önündə heçdə etiraz etməz.

S – yəqin əhli mütəal məhbubdan vəfa tələb etməz.[1]

**Qeyd**: *Vəfa tələb etmək, yaxud cəfadan şikayətlənmək mənliyi mühafizə etməkdən ibarətdir, halbuki aşiqin ilk vəzifəsi mənliyi unutmaqdır, çünki mənlik vəhdət müxalifi ikilikdən nişanədir. Bir mən bir, məhbub.*

Nişanə 3: "Biganə olmuş aşnalar" hər bir şey öz ziddi ilə tanındığı[2] kimi aşinalıq da biganəlik səbəbilə tanınmalıdır, demək öz mənliyinə biganə olmayan bir aşiqə ilahilik aşinalığı mümkünsüzdür, elə buna görə də şair buyurmuşdur: Qət eylə aşinalığım ondan ki qeyrdir.[3]

Anlam: Ey zahid, ülvi elmlə aşina olmuşlar, yaxud yəqin əhli özlərini unutmuşlardan ibarətdirlər.

Beyt 4: **Keçib dildarə yar olmaq diləsən müddəalərdən,**
**Səni yarindən əğyar eyləyən bu müddəalardır.**

Nişanə 1: "Dildar" – iç aləmi fərəhləndirən, yaxud ürəyə bəst bağışlayan ilahi sifətlərdən ibarətdir.

Nişanə 2: "Müddəa" – ilahi istedadlar iddia etməkdən ibarətdir.

**Qeyd**: *İddiaçılıq müddəilik olduğuna görə ən böyük bir günahdır, bunun üçün də "العاصی خیر من المدعی" demişlər.[4]*

**Qeyd**: *Bunu nəzərə alsaq ki, aşiq məşuq qarşısında ixtiyarsız-iradəsiz bir qul kimi büsbütün malikiyyətlərdən, hətta öz vücuduna malik olmaqdan kənardır, məlum olar ki, müddəa əhli aşiqlik imkanı tapa bilməz.[5]*

Anlam: Elm və dəlil (fərzlə) ilahi aşinalığından dəm vuran zahid bunu dərk etməyib ki, əksinə onun biganəliyini sübut edən haman elm və dəlildir.

**Qeyd**: *Elm və dəlil fiziki mahiyyət sifətləri olduğuna görə lisanül-qeyb Hafiz onları məzəmmət edərkən buyurmuşdur:*

تا علم و فضل بینی بی معرفت نشینی یک نکته ات بگویم خودرا مبین که رستی[6]

Beyt 5: **Cəfaü cövri çox, dilbərlərin mehrü vəfası az,**
**Füzuli, çək əlini netmək olur bivəfalardır.**

---

[1] Fərhəngi-istilahat və təbirati-ürfani.
[2] Verniger, Paydaya, , səh.994
[3] Qəzəl 3, beyt 2
[4] Fərhəngi –istilahate və tərtibati ürfani
[5] Qəzəl 6, beyt 2
[6] Müəllif "Ta Qafi-əndişe" kitabının 4-cü cilddə bu beyti izah etmişdir.

Sözlük: Mehr = məhəbbət = mehribanlıq.

Nişanə 1: "Cəfaü cövr" – saliki yetişdirmək məqsədilə mənəvi maraq və müşahidədən həm də ilahi seyrdən saxlayan qəbzlərdən ibarətdir.

Nişanə 2: "Dilbər" – iç aləmi qüssələndirən, yaxud ürəyi qəbz giriftarı edən ilahi özəl sifətlərdən ibarətdir.

Nişanə 3: "Mehrü vəfa" – yararlı əməli olmayan aşiqin ilahi təvəccühlərdən bəhrələnmək nişanəsidir.

Nişanə 4: "Bivəfa" – A – Bivəfalıq məşuqun istiqna və hikmət sifətinə bağlı olduğundan müsbət mərhələdir.[1]

B – Vəfasızlıq aşiqin yetkinliginə gərəkli olduğuna görə müsbət mərhələdir.

Anlam: Ey Füzuli, istedadsız bəhrələnmək imkanı az olduğuna görə, qəbzlər razılığı ilə istedad qazanmağın gərəkli bir fəaliyyətidir.

[1] Qəzəl 30, beyt 3

## Q Ə Z Ə L 87

(1) Hüsnün olduqca füzun eşq əhli artıq zar olur,
Hüsn hər miqdar olsa, eşq ol miqdar olur.

(2) Cənnət üçün mən edən aşiqləri didardən,
Bilməmiş kim, cənnəti aşiqlərin didar olur.

(3) Eşq dərdindən olur aşiq məzaci müstəqim,
Aşiqin dərdinə dərman etsələr bimar olur.

(4) Zahidi-bixud nə bilsin zövqini eşq əhlinin,
Bir əcəb meydir məhəbbət kim içən huşyar olur.

(5) Eşq sevdasinə sərf eylər Füzuli ömrünü,
Bilməzəm bu xabi-qəflətdən qaçan bidar olur.

Beyt 1: **Hüsnün olduqca füzun eşq əhli artıq zar olur,**
**Hüsn hər miqdar olsa, eşq ol miqdar olur.**

Sözlük: Füzun = artıq.

Nişanə 1: "Hüsn" – bu beytdə ilahi cazibələr nişanəsidir.

Nişanə 2: "Zar" – Zar olmaq, yaxud zəifləşmək və xəstəlik fiziki mahiyyəti karsız etməkdən, yaxud "iradi ölüm" müqəddiməsindən ibarətdir.

Anlam: Ey mütəal məhbub, ilahi parlamalar əlavə olduqca mənəvi ətəşlər- tələblər də onlara əlavə olur.

**Qeyd**: *Qürb və vüsal da qəbz və hicran kimi aşiqin iç atəşini əlavə etməklə dünyəvi ömür möhlətində aramlıq və sakinliyin mümkünsüz olduğunu sübut edir. Bunun üçün də islamın ulu peyğəmbərinin "*الدنيا سجن مومن*"[1] buyurduğu kimi maddi dünya bir həbsxanatək aşiqa darısqal gəlir.*

Beyt 2: **Cənnət üçün mən edən aşiqləri didardən,**
**Bilməmiş kim, cənnəti aşiqlərin didar olur.**

Sözlük: Mən = maneçilik = qabağını almaq; didar = görüş

Nişanə: "Didar" – ilahi parlamaları, yaxud həqiqət simasını "fuad" ünvanlı ürək gözilə görməkdən ibarətdir.[2]

Anlam: Zahid bilsəydi ki, ilahi camal parlamaları, yaxud bəşəri camalda əks etdirilmiş ilahi hüsnlər, aşiqlərin "rəhmani behişt" ünvanlı cənnətidir, "Rizvan behiştini" vədə verməklə onlara eşqdə mane olmazdı.[3]

Beyt 3: **Eşq dərdindən olur aşiq məzaci müstəqim,**
**Aşiqin dərdinə dərman etsələr bimar olur.**

Sözlük: Müstəqim = düz = qüvvətli = sağ salamat.

Nişanə 1: "Dərd" – A – Qəlbi günahlardan təmizləyən qəbz sıxıntılarından ibarətdir.

B – şirinlikdən asılı acılıqdan ibarətdir.

Nişanə 2: "Məzac" – bu beytdə aşiqin həqiqi səciyyəsindən ibarətdir.

Nişanə 3: "Bimar" – bu beytdə mənfi xəstəlikdən, yaxud cismi əzabdan ibarətdir.

---

[1] Dünya möminə həbsxanadır.

[2] Qəzəl 13, beyt 1

[3] Qəzəl 80, beyt 6

Anlam: "Baş-ayaq" ünvanlı ürfani mərtəbələrdə, yaxud "əzdad" bəhsində dönə-dönə dediyimiz kimi həqiqi salamatlıq məcazi bimarlığa bağlıdır.

**Qeyd**: *Çöl vücud, yaxud fiziki mahiyyət vəhdət qarşında kəsrət ünvanlı əngəl olduğuna görə bimar və karsız olmalıdır.*

Beyt 4: **Zahidi-bixud nə bilsin zövqini eşq əhlinin,**
**Bir əcəb meydir məhəbbət kim içən huşyar olur.**

Sözlük: Huşyar = huşlu = ayıq; xud = öz, özü.

Nişanə 1: "Bixud" – Hər bir insan başqa yaranmışlar kimi iki "xud" ilə mürəkkəbləşmiş bir vücuddur:

A – Həqiqi xud, yaxud iç aləm.

B – Məcazi xud, yaxud çöl vücud.[1]

**Qeyd** 1: *Vəhdət nailiyyətindən məhrum edən müddəilik və məğrurluq məcazi xudpəsəndlik, yaxud mənfi xudpəsəndlikdən ibarətdir.*

**Qeyd** 2: *İlahi istiğna rayihəli xudpəsəndlik həqiqi xudpəsəndlik, yaxud müsbət xudpəsəndlikdən ibarətdir.*[2]

**Qeyd** 3: *Aşiq öz məcazi xudunu unutmuş bixuddur.*

**Qeyd** 4: *Zahid həqiqi xudunu unutmuş bixoddur.*

**Qeyd** 5: *Vəhdət ərəfəsinə, yaxud ilahi məqsədə nail edən cazibə öz məcazi xudunu unutmuş bixuda bağlıdır.*

Nişanə 2: "Zövq" – şühud nailiyyətinin ilk dərəcəsindən ibarətdir

Nişanə 3: "Məhəbbət" – A – Mənəvi qayğılarla qəlbi çırpındıran ilahi camal şövqündən ibarətdir.

B – iç vücudun camal aləminə meyl etməyindən ibarətdir.

P – bəşəri sifətləri, həm də cismi ixtiyar-iradəni məşuq xəyalıyla unutmaqdan ibarətdir.

T – insanı ilahi xilafət məqamına qaldıran nişanədən ibarətdir.

Nişanə 4: "Huşyar" – bu beytdə iç aləmini, yaxud həqiqi vücudunu tanımış aşiqdən ibarətdir.

Anlam: Zahid öz həqiqi xudundan xəbərsiz olduğuna görə eşq əhlini tanımaqdan acizdir.

Beyt 5**: Eşq sevdasinə sərf eylər Füzuli ömrünü,**
**Bilməzəm bu xabi-qəflətdən qaçan bidar olur.**

---

[1] Qəzəl 3, beyt 2
[2] Qəzəl 10, beyt 2

Sözlük: Sevda = alqı-satqı = xəyal = meyl; xabi-qəflət = qəflət yuxusu; bidar = ayıq = oyaq.

Nişanə 1: "Sevda" – həyat sərmayəsini eşq bazarına çıxarmaq nişanəsidir.

Nişanə 2: "Xabi-qəflət" – A – Dünyəvi həyat sərmayəsinin həqirliyini təlqin edən nişanədir.

B – Xabi-qəflət, dünyəvi ömür möhlətində ilahi məqsəd, yaxud dayimi vüsal tələb edənləri mümkünsüz bir məqsud axtarmağa görə təhqir etmək istəyir.

Anlam: Füzuli, həqir ömür sərmayəsini eşq bazarına çıxarmaqla öz qafilliyini sübut edir.

## Q Ə Z Ə L 88

(1) Ey gül, nə əcəb silsileyi- müşki-tərin var,
Vey sərv, nə xoş can alıcı işvələrin var.

(2) Acıtdı məni acı sözün, tünd nigahin,
Ey nəxlli-məlahət, nə bəla təlx bərin var.

(3) Peykanları ilə doludur çeşmi-pürabim,
Ey bəhr, sanırsan sənin ancaq gühərin var.

(4) Ol səngdilə naleyi-zarin əsər etmiş,
Ey dil, sənə bu zövq yetər ta əsərin var.

(5) Eşq içrə, könül, demə ki, mən bixudəm ancaq,
Ey qafil, özündən sənin ancaq xəbərin var.

(6) Çox baxdığına qəmzə ilən bağrın əzərsən,
Hər kimə ki, baxmazsan onunla nəzərin var.

(7) Eşq əhlinə ol mah, Füzuli, nəzər etmiş,
Sən həm özünü göstər əgər bir hünərin var.

Beyt 1**: Ey gül, nə əcəb silsileyi-müşki-tərin var,**
**Vey sərv, nə xoş can alıcı işvələrin var.**

Sözlük: Müşki-tər = təzə müşk.

Nişanə 1: "Gül" – ürək açan, yaxud bəst bağışlayan ilahi hüsndən ibarətdir.

Nişanə 2: "Müşk" – vəhdət rayihəli kəsrətdən ibarətdir.

**Qeyd** 1: *Müşk qarasayaq olduğuna görə mənəvi görünməz aləmin pünhanlığını yaxud idrakın bir qaranlıq gecə kimi eşq və ürfan günəşindən bəhrəsiz olmağına nəhayət görünməz – ölməz aləmin əqlə - idraka sığmaz olduğuna eyham etmək istəyir.*

**Qeyd** 2: *Müşk, Xütayi ahu göbəgindən ayrılmış olduğuna görə yer sakinlərinin göy mərkəzindən ayrılmaqlarına eyham etmək istəyir.*

Nişanə 3: "Silsilə":

A – Bütün kainatın ilahi ərəfəyə bağlılığından nişanədir.

B – "Təsəvvüf" firqəsiniə eyham etməklə eşq və ürfan uzantısına eyham edir.

Nişanə 4: "Tər" – ilahi rayihələrin dəmbədəm yeniləşməyini təlqin edən nişanədən ibarətdir.

Nişanə 5: "Sərv", gül mərtəbəsinin ülviliyini təlqin edən nişanədir

Nişanə 6: "Can alıcı":

A – Qurbanlıq məqamına hazırlayan müqəddimədən ibarətdir.

B – mənəm-mənəmliyi aradan qaldıran mərtəbədən nişanədir.

Nişanə 7: "İşvə" – maddi mərtəbələrdə təzahür etdirilmiş mənəvi cələlərdən ibarətdir.

Anlam: Ey mütəal məhbub, yenicə təzahür etmiş camal cilvələrini:

A – Məni qurbanlıq məqamına hazırlayır.

B – Fiziki mahiyyətimi öldürərkən mənəvi mahiyyətimi dirildir.

Beyt 2: **Acıtdı məni acı sözün, tünd nigahin,**
**Ey nəxlli-məlahət, nə bəla təlx bərin var.**

Sözlük: Tünd nigah = qəzəbli baxış; nəxli-məlahət = məlahət ağacı; Təlx bər = acı bar = acı meyvə.

Nişanə 1: "Acıtdı":

A – Acıtma tərbiyə, yaxud yetişdirmək nişanəsidir.

B – Acıtma dünyəvi həyat namütənasibliyini, yaxud fiziki əngəl mahiyyət təlxliyini təlqin edən nişanədir.

Nişanə 2: "Acı söz" – aşiqi mənəvi isinişməkdən müvəqqəti surətdəməhrum etmiş qəhr və qəzəbdən nişanədir.

Nişanə 3: "Tünd nigah" – mütəal məhbubun qəbz sifətindən ibarətdir.

Nişanə 4: "Məlahət" – Məlahət nəhayətinə əl çatmaz ilahi sonsuzluqdan ibarətdir

Nişanə 5: "Təlx bər" – şirinlikdən asılı özəl acılığı, yaxud ziddlər bağlılığını təlqin edən nişanədir.

**Qeyd**: *Hər bir şeyin öz içindəki ziddi ilə dayim mübarizə aparmağı məlum edər ki, insanın da batini ilə zahiri belə bir cahanşümul müharibədən müstəsna deyil, beləliklə çöl vücudu qalib gəlmiş bir insanın heyvandan aşağı düşməyi kimi, "اولئک کالانعام بل هم اضلّ"* [1] *iç vücudu qalib gəlmiş insanın isə mələkdən yuxarı ucalmağı məlumdur. Elə buna görə də demişlər:*

*Sənin əqlin Hüseyndir Şümr, nəfsindir geyib cövşən*
*Vırır meydani-təndə bir-birini zülmətü rövşən*
*Amandır, qoyma öldürsun Hüseyni Şimri-zilcövşən*[2]

Anlam: Ey həkimi-məhbub, həsrət və hicran acılığı mənəvi sonsuz şirinlikdən asılı olduğuna görə şirindir.

Beyt 3: **Peykanları ilə doludur çeşmi-pürabim,**
**Ey bəhr, sanırsan sənin ancaq gühərin var.**

Sözlük: Peykan = ox ucu = nizə ucu = ox; çeşmi pür ab = ağlar göz; bəhr = dəniz, gühər = gövhər.

Nişanə 1: "Peykan" – ürəyi həm parçalayan həm də özəl münacata vadar edən ilahi qəmzə satmaqlardan nişanədir.

Nişanə 2: "Çeşmi pür ab" – iç vücudu çöl vücud ləkəsindən təmizləyən ürfani yuyucudan ibarətdir.

Nişanə 3: "Bəhr" – dünyəvi dövlət nişanəsidir.

Nişanə 4: "Gühər" – mənəvi tükənməz etibarlara eyham edən dünyəvi imtiyazdan nişanədir.

Anlam: Vüsətli dərin dənizlər etibarını təhqir edən mənim də yerli göz yaşımdır.

**Qeyd**: *Dənizə bənzər deyilmiş göz yaşı kamil bir insanı təlqin edən nişanədir.*

Beyt 4: **Ol səngdilə naleyi-zarin əsər etmiş,**

---

[1] Quran, surə Əraf, 179-cu ayədən bir qismət (Onlar heyvanlar kimidirlər, bəlkə heyvandan da aşağıdırlar).

[2] Ustadım Monəm Ərdəbilinin misralarıdır.

**Ey dil, sənə bu zövq yetər ta əsərin var.**

Sözlük: Səngdil = rəhmsiz = ürəyi bərk.

Nişanə 1: "Səngdil" – öz bəndəsini təsdiq etmək məqsədilə onun bəşəri muradlarını məhv etdirən mütəal məbud qəhrindən ibarətdir.

Nişanə 2: "Naleyi - zar" – sevinə-sevinə nalə etməkdən, yaxud məhəbbətdən asılı nalədən ibarətdir.

**Qeyd**: *Nalə mütəal məhbub qapısını döyməkdən ibarətdir, bunun üçündə islamın ulu peyğəmbəri qapı döyməyi məqsədə çatmaq səbəbi kimi təkid etmişdir:*

گفت پیغمبر که چون کوبی دری عاقبت زان در برون آید سری[1]

Nişanə 3: "Əsərin var" – ilahi məhəbbətlə dolu ürəyin nalə etmək qüvvəsini təlqin etmək istəyir.

Anlam: Nalə ünvanlı özəl münacatını tərk etməyən ürək şühud qapılarının açılmağına nail olmalıdır.

Beyt 5: **Eşq içrə, könül, demə ki, mən bixudəm ancaq,**
**Ey qafil, özündən sənin ancaq xəbərin var**

Anlam:

A – Bixudluğ[2], yaxud məcazi mahiyyəti unutmaqla iftixar etmək haman xudu, yaxud haman mahiyyəti unutmamaqdan nişanədir.

B – Bixudluqla iftixar etmək müddəilik nişanəsidir.

Beyt 6: **Çox baxdığına qəmzə ilən bağrın əzərsən,**
**Hər kimə ki, baxmazsan onunla nəzərin var.**

Anlam: İstedadsızların cəfalanması qəbz cəfasına giriftar olmuşların istedadlı olduğunu məlum edir (mütəal məhbub bəyəndiyi bəndəsini cəfalandırar).

**Qeyd**: *Müxtəlif müsibətlər çəkmiş arif insanlar, imamlar, peyğəmbərlər xüsusilə Kərbəla qəhrəmanları bu beytin parlamaq nümunələridirlər.*

Beyt 7: **Eşq əhlinə ol mah, Füzuli, nəzər etmiş,**
**Sən həm özünü göstər əgər bir hünərin var**.

Sözlük: Mah = ay = mahtab.

Nişanə 1: "Mah" – qara sayaq maddəni mənəvi cəlalərila işıqlandıran ilahi camaldan ibarətdir.

---

[1] Məsnəviyə, Mövləvi, dəftər 3, beyt 4833

[2] Qəzəl 87, beyt 4

Nişanə 2: "Nəzər" – bu beytdə "rəhmani nəzər" ünvanlı ilahi təvəccühdən ibarətdir.[1]

**Qeyd**: *Rəhmani nəzər nailiyyəti mənəm-mənəmliyin məhv olmasına bağlıdır.*

Nişanə 3: "Özünü göstərmək" – "Öz" bu beytdə aşiqin həqiqi "xud"undan, yaxud onun iç vücudundan ibarətdir.[2]

Nişanə 4: "Hünər" – bu beytdə mənəvi istedad nişanəsidir.

Anlam: Ey Füzuli, mütəal məhbub istedadlı aşiqləri şühud nemətindən bəhrələndirmişdir, sən isə bir mənəvilik göstərməklə istedadını göstər.

---

[1] Qəzəl 2, beyt 5

[2] Qəzəl 87 beyt 4

## Q Ə Z Ə L 89

(1) Ləhzə - ləhzə ləbin anıb edəçək əfğanlar,
Qətrə - qətrə saçılır didələrimdən qanlar.

(2) Qətrə - qətrə deme qandır ki çıxar çeşmimdən,
Dəmbədəm könlüm odiyla əriyən peykanlar.

(3) Qaşların yayına meyl eyləyəli canü könül,
Dünü gun mən bilirəm kim nə çəkərlər anlar.

(4) Açma kakil girehin, başin üçün görmə rəva
Ki, pərişan olalar bir neçə sərgərdanlar.

(5) Yel dəyər zülfünə, ya qoymayıb öz hali ilə,
Gəzdirirlər onu əldən-ələ hər dəm canlar.

(6) Eylə üşşaqə cəfalar ki vəfalar görəsən,
Sanma kim zaye olur eylədiyin ehsanlar.

(7) Sorma zöhhadə, Füzuli, rəhi-rəsmin eşqin,
Nə bilirlər rəvişi-əhli-xirəd nadanlar.

Beyt: 1 **Ləhzə-ləhzə ləbin anıb edəçək əfğanlar,**
**Qətrə-qətrə saçılır didələrimdən qanlar.**

Sözlük: Əfğan = fəğan = fəryad; didə = göz.

Nişanə 1: "Ləb" – mahiyyətlərə vücud bağışlayan rəhmani feyzdən, yaxud yoxu var edən ilahi ilhamlardan nişanədir.

Nişanə 2: "Əfğan" – ürək münacatından asılı tələbdən ibarətdir.

Nişanə 3: "Qan" – çöl vücudu, yaxud dünyəviliyi batil edən nişanədən ibarətdir.

Anlam: Mənəvi həyat bağışlayan ilahi feyzlər həvəsilə dəmbədəm mənliyimi yuyub batil etməklə məşğul olmuşam.

Beyt 2: **Qətrə-qətrə demə qandır ki çıxar çeşmimdən,**
**Dəmbədəm könlüm odiyla əriyən peykanlar.**

Sözlük: Çeşm = göz; peykan = ox ucu = ox.

Nişanə 1: "Könül odu" – ürəyi paka çıxarıb mənəvi seyr etdirən ilahi eşq şöləsindən ibarətdir.

Nişanə 2: "Peykan" – xeyirli işlər görmüş aşiqin ilahi gizli, yaxud aşkar lütflərdən bəhrələnmək nişanəsidir.[1]

Anlam: Məni bəsitlik məqamına hazırlayan, yaxud mənəvi seyrlərə nail edən yalnız ilahi lütflərdən ibarətdir.

Beyt 3: **Qaşların yayına meyl eyləyəli canü könül,**
**Dünü mən bilirəm kim nə çəkərlər anlar.**

Nişanə 1: "Qaşlar yayi":

A – Dayirəvi seyr[2] təhlükələrindən qorxmuş aşiqi yerə endirməklə dübarə tənbih – tərbiyə edən ilahi lütfdən nişanədir.

B – Çöl vücuddan təsirlənmiş aşiqi dübarə bəsitləşdirən ilahi lütfdən nişanədir.

Anlam: Ey həkimi-məhbub, süqut mərhələsinin davam etdirilmiş tənbihləri ilə canımı və qəlbimi məşğul etmişəm.

Beyt 4: **Açma kakil girehin başin üçün görmə rəva,**
**Ki, pərişan olalar bir neçə sərgərdanlar.**

Sözlük: Kakil = kəkil; gireh = düyün.

Nişanə 1: "Kakil" – seyrə məşğul olmuş aşiqi iztiraba salmaqdan nişanədir.

---

[1] Doktor Mənuçehr Daneş Pejuh, Fərhəngi istilahate ürfani.
[2] Qəzəl 1, beyt 1, Nişan: Salik

Nişanə 2: "Başın üçün" – ülvi əl çatmaz yüksəkligi yad etmək nişanəsidir.

Nişanə 3: "Pərişan" – Pərişanlıq yaradıcı məhbubun yaranmışlarda əks etdirilmiş cilvələri ilə məşğul olması qənaətbəxş bilinmək ilə həqiqətdən kənar qalmaq, yaxud "Təfriqə" giriftarı olmaq nişanəsidir.

**Qeyd**: *Məhz məşğulluq, hətta ibadət – itaət məşğulluğu təfriqəyə giriftar edən məşğulluqdur. Əksinə hər bir xeyr iş məşğulluğunu ilahi lütflərə bağlı bilib şükr etmək "Cəm" məşğulluğudur. Nəhayət, həm özünü, həm də məşğulluğunu ilahi eşq önündə unutmaq "Cəm-əl-Cəm" nailyyətindən nişanədir.*[1]

Anlam: Ey həkimi-məhbub, iztiraba salan cilvələr ilə[2] aşiin ürək seyrinin naqisliyinə, yaxud təfriqə müşkülünə giriftar olmağına razılıq vermə.

Beyt 5: **Yel dəyər zülfünə ya qoymayıb öz hali ilə,**
**Gəzdirirlər onu əldən-ələ hər dəm canlar.**

Nişanə 1: "Yel": – ilahi yardımçılardan yaxud mənəvi vasitələrdən nişanədir.

Nişanə 2: "Zülf" – bu beytdə mütəal məhbub camalının özəl örpəyindən nişanədir.

Nişanə 3: "Can" – məhz həqiqətdən yaxud ilahi təcəllidən nişanədir.

Anlam: İlahi parlaq camalın ətrafını almış mənəvi vasitələrə, yaxud mülklərə, yaxud məhz həqiqətlərə heyran olmuşam.

Beyt 6: **Eylə üşşaqə cəfalar ki, vəfalar görəsən,**
**Sanma kim zaye olur eylədiyin ehsanlar.**

Sözlük: Üşşaq = aşiqlər.

Nişanə 1: "Cəfa" – aşiqin yetkinliyinə gərəkli tənbih – tərbiyədən ibarətdir.

Nişanə 2: "Vəfa" – "ələst" aləmində qol çəkilmiş təahhüdnaməyə (öhdəçilik sənədinə – Red.) dəqiqliklə əməl etməkdən nişanədir.[3]

Nişanə 3: "Ehsan " – cəfa nişanəsini yenidən təkid edən mərtəbədən ibarətdir.

**Qeyd** 1: *İbadət vəziyyətində mütəal məbudu müşahidə etməkdən, yaxud xalis pərəstişdən ibarətdir.*

---

[1] Fərhəngi-istilahatvə təbirati ürfan.

[2] Kəsrətdə təzahür etmiş cilvələrin məhz məşğulluğu aşiqi iztiraba salan məşğulluqdur.

[3] Qəzəl 19, beyt 4

**Qeyd** 2: *Həzrət Əli (ə) buyurduğu kimi, behişt tamahından, həm də cəhənnəm qorxusundan kənar mütəal məbuda aşiqanə ibadət etmək xalis ibadətdir.*

Anlam: Ey mütəal məhbub, vəhdət rayihəsindən bəhrələnmiş aşiq nəzərincə sənin qəhr və qəzəbin də lütf və mərhəmətin kimi şirindir.

Beyt 7: **Sorma zöhhadə, Füzuli, rəhi rəsmin eşqin,**
**Nə bilirlər rəvişi-əhli-xirəd nadanlar.**

Sözlük: Zöhhad = zahidlər; rəh = yol; rəveş = yol; əhli xirəd = əql əhli.

Nişanə 1: "Zöhhad":

A – İman cilaları ilə axirət aləmini müşahidə etmiş qəbilədən ibarətdir.

B – maddi dünyanın çirkin surətini aşkar müşahidə etməklə dünyəvi zavala məruz almış matahlara diqqət yetirməyənlər yəqin əhlidirlər.

P – behişt ləzzətini alqışlamaqla camal ləzzətindən məhrum olmuş qəbilədirlər. (qoşa ləzzət nailiyyəti vəhdət ilə müxtəlifdir).

T – behişt xəyalı ilə dünyanı unutmuş qəbilədən ibarətdir, halbuki üşşaq (aşiqlər) ilahi camal arzusuyla dünyanı, həm də axirəti yaddan çıxarmış guruhdan ibarətdir.

S – Behişt məşğulluğu məşuq məşğulluğundan məhrum edən hicab olduğuna görə, məşuqu tələb edə aşiqlər, behişti tələb edən zöhhadı məzəmmət etmişlər.[1]

Nişanə 2: "Xirəd" – yaxud əql, bu beytdə eşq adıyla məşhurlaşmış mənaşünas əqldən yaxud kamil əqldən ibarətdir. Lisanül-qeyb Hafiz kamallanmış əqli, eşq ünvanıyla tanıtdırmaq məqsədilə buyurmuş:

حاشا کی من به موسم گل ترک می کنم        من لاف(عقل) می زنم این کار کی کنم[2]

Anlam: A – Ey Füzuli, məhdud əql tərəfdarlarına sonsuz eşqdən söz açmaq yersiz və faydasızdır.

B – Ey Füzuli, nəfsi öldürmək açiqin ilk vəzifəsi olduğuna görə, öz nəfsini behişt sevdasına məşğul edən bir şəxs aşiq olmaqdan məhrum olmalıdır.

[1] Qəzəl 9, beyt 2
[2] Müəllif, "Ta Qafe-əndişe" kitabının 4-cü cildində bu beyti izah etmişdir.

## Q Ə Z Ə L 90

**(1) Tökdükcə qanımı oxun, ol asitan içrə,**
**Bir yerdəyəm əsir ki, torpağı qan içər.**

**(2) Əhli-zəmanə qanına çox təşnədir zəmin,**
**Qanın kimin tökərsə fələk, ol zaman içər.**

**(3) Mey içmədən açılmaz imiş babi-məğfirət,**
**Sövgəndlər bu babdə piri-muğan içər.**

**(4) Üqbadə kövsər istəməsin piri- meykədə,**
**Dünyadə bəs degilmi meyi - ərğəvan içər.**

**(5) Qəmzən görünməyib gözə qanlar içər müdam,**
**Zahid kimi ki, badəni eldən nihan içər.**

**(6) Meydən əgərçi tövbə verir el Füzuliyə,**
**Ey sərv, sən qədəh sunar olsan, rəvan içər.**

Beyt 1: **Tökdükcə qanımı oxun, ol asitan içrə,**
**Bir yerdəyəm əsir ki, torpağı qan içər.**

Sözlük: Astan = astana = ərəfə.

Nişanə 1: "Qan"– A – Qan tökmək, fiziki mahiyyəti batil edən nişanədən ibarətdir.

B – Qan tökmək qurbanlıq məqamına hazırlayan nişanədən ibarətdir.

Nişanə 2: "Ox"– ürəyi özəl münacata vadar edən ilahi qəmzə satmaqlardan nişanədir.

Nişanə 3: "Astan"– pərhizkarlıq, həm də bəndəlik məqamından ibarətdir.

Nişanə 4: "Əsir"– bütün muradlarını ilahi eşq ərəfəsində fəda etmiş bəndədən ibarətdir.

**Qeyd** 1: *Elm əsiri axirət savabını axtarmaqdan əl götürməz.*

**Qeyd** 2: *Həqiqət əsiri maddi həyat ləzzətlərindən qaçar.*

**Qeyd** 3: *Həqq (məhbub) əsiri həm dünya, həm də axirət ləzzətlərindən pərhiz edər.*

Nişanə 5: "Torpağı qan içər"– fiziki əngəl mahiyyətini yaxud çöl vücudu batil edən ibadət mərtəbəsindən, yaxud bəndəlik məqamından ibarətdir.

Anlam: Mütəal məhbub astanası fiziki mahiyyətini, yaxud mənəm – mənəmliyini tamamilə unudub mücərrəd və bəsit olmuş aşiqi qəbul edər.

Beyt 2: **Əhli-zəmanə qanına çox təşnədir zəmin,**
**Qanın kimin tökərsə fələk, ol zaman içər**

Nişanə 1: "Əhlizəmanə"– A – Fiziki mahiyyət məhdudluğunda yüksək insanlıq və ürfan səviyyəsindən xəbərsiz qalmış şəxslərdən ibarətdir.

B – vücudun yalnız bəşəri cəhətinə bağlı olmuşlardan ibarətdir.

P – dünyəvi ömür möhlətində həyat sürməyə məcbur olmuşlardan ibarətdir.

Nişanə 2: "Zəmin"– maddi dünyanı, yaxud yer sakinliyini təlqin edən nişanədən ibarətdir.

Nişanə 3: "Fələk"– ülvi aləmdən nişanədir.

**Qeyd**: *Keçmişlərdə ay-ulduzun seyrini insanların alın yazısına təsir edici bilmişlər, beləliklə fələk insanların dünyəvi ömür şərayitinə hakimlik edən təqdirdən ibarətdir.*[1]

---

[1] Qəzəl 71, beyt 4

Anlam: A – Ruzgar insanın məcazi iqtidar və etibarını tezliklə əlindən alan güclü bir hakim kimidir. Elə buna görə də ustad Şəhriyar buyurmuşdur:

Heydər baba dünya yalan dünyadı,
Süleymandan Nuhdan qalan dünyadı,
Oğul doğub dərdə salan dünyadı
Hər kimsəyə hər nə verib alıbdı,
Əflatundan bir quru ad qalıbdı

**Qeyd**: *Bu baxım dünyəvi mərtəbələr məğrurluğunda mənəvi məqamlar məhrumluğunu təlqin etməklə insanları ibrətləndirmək istəyir*.

B – Ülvi aləm insanı maddi əngəl vücud həbsxanasından xilas etmək məqsədilə ona iqtidarlı bir hakim kimi rəğbət göstərir.

P – Ülvi aləm insanı qurbanlıq məqamına nail etməyə çox əcələ edir.

Beyt 3: **Mey içmədən açılmaz imiş babi-məğfirət,**
**Sövgəndlər bu babdə piri-muğan içər**

Sözlük: Babi – məğfirət = bağışlanmaq qapısı = rəhmət qapısı; sövgənd = qəsəm = and; piri-muğan = zərdüşti rəhbər.

Nişanə 1: "Mey" – A – Həm çöl həm də iç vücuda qələbə çalan ilahi əhval – ruhiyyədən ibarətdir.

B – bəşəri sifətləri məhv etmək ilə ilahi sifətlərə təzahür şəraiti törədən özəl zövqdən ibarətdir.

P – aşiqi bixudluq məqamına nail edən ülvi qələbələrdən ibarətdir.[1]

Nişanə 2: "Babi-məğfirət" xalis ibadət şəraitində mütəal məhbubu müşahidə etməkdən ibarətdir.

Nişanə 3: "Piri-muğan"– A – Aşiqi mütəal məbud ərəfəsinə hidayət edən feyz vasitəsindən ibarətdir.

B – aşiqi ilahi cazibələrdən bəhrələndirən məcazi aləmə sığmaz mürşüd həzrətindən ibarətdir.

P – ilahi cazibələr qarşında yanıb kül olmaqdan mühafizə edən, yaxud aşiqi istedadi qədər ilahi parlamalardan bəhrələndirən rəhbərdən ibarətdir.[2]

Anlam: Piri-muğanın təkid etdiyi kimi mərifət qapısının açılmazlığına, yaxud ilahi müşahidə məhrumluğuna naqis mey içmək ( naqis məğlubluq) bais imiş.

---

[1] Qəzəl 87, beyt 4
[2] Qəzəl 23, beyt 8

**Qeyd**: *Naqis mey içmək bəşəri sifətləri tamamilə unutmamaq nişanəsidir.*

Beyt 4: **Üqbadə kövsər istəməsin piri- meykədə,**
**Dünyadə bəs degilmi meyi - ərğəvan içər**

Sözlük: Üqba = axirət dünyası = qiyamət; kövsər = behişt çeşməsi, rind = zirək = hiyləgər = ictimai-umumi adab-muaşirətə təvəccüh etməyən; meyi-ərğəvan = qırmızı şərab = atəşnak şərab.

Nişanə 1: "Kövsər"– pak nəfsi ləzzətləndirən behişt nemətindən ibarətdir.

Nişanə 2: "Rindi-meykədə"– A – Maddi imkanları - əlaqələri qət etmiş dünyaya sığmaz mürşüddən ibarətdir.

B – varlığını tamamilə ilahi eşqə məğlub etmiş mürşüddən ibarətdir.

P – iç vücudunu sağ- salamat saxlayıb, çöl vücudunu sərkilərlə ləkələndirmiş arifdən ibarətdir.

T – dünyəviliyi öldürüb mənəviliyi dirildən təlimatçıdan ibarətdir.

S – Rind bütün bəşəri sifətlərdən yan olmaqla ilahi sifətlərə nail olmuş mürşüddən ibarətdir.[1]

Nişanə 3: "Ərğəvan"– A – Qırmızı olduğuna görə kamil qələbədən nişanədir.

B – qırmızı olduğuna görə mənəmliyi – dünyəviliyi batil edən nişanədən ibarətdir.

P – atəşnak olduğuna görə iç aləmi paka çıxaran nişanədən ibarətdir.

T – atəşnak olduğuna görə qəlbi hərəkətləndirib seyr etdirən nişanədən ibarətdir.

Anlam: Dünyada şühud behiştində bəhrələnmiş mürşüd axirət behiştini tələb etməz.

**Qeyd**: *"Rəhman behiştinə" nail olmuş bir arif "Rizvan behişti"nə rəğbət etməz.*[2]

Beyt 5: **Qəmzən görünməyib gözə qanlar içər müdam,**
**Zahid kimi ki, badəni eldən nihan içər.**

Sözlük: Müdam = daim; nihan = gizli = pünhan.

Nişanə 1: "Qəmzə"– A – Gizli surətdə ürəyə daxil olmuş ilahi cazibələrdən ibarətdir.

---

[1] Fərhəngi-Moin

[2] Qəzəl 80, beyt 6

B – dünyəviligi – mənəmliyi məhv edən ilahi feyzlərdən nişanədir.

P – ürəyi yarıb onu özəl münacata vadar edən cazibələrdən nişanədir.

Nişanə 2: "Qan içmək"– qurbanlıq məqamına nail edən sifətdən ibarətdir.

Nişanə 3: "Zahid"– A – Əqldən dəm vuran riyakardan ibarətdir.

B – cəmaət içində əqli və elmi təsdiq edib, xəlvətdə eşq və ürfanfdan tərəfdarlıq edən rəhbərdən ibarətdir.[1]

Nişanə 4: "Badə"– A – Mənəvi mərifət tələb edən şagirdlərin eşqindən ibarətdir.

B – ötən beytdə bəyan olunmuş ərğəvandan ibarətdir.

Anlam: Zahid öz ürfani əhval-ruhiyyəsini gizlətdiyi kimi mən də ilahi qəmzələr təsirini qəlbimdə gizlətmişəm.

**Qeyd** 1: *Zahid kimi riyakarlıq etməyirəm.*

**Qeyd** 2: *Zahid eşqini gizli saxladığı kimi mən də ürək münacatımı, həm də qurbanlıq məqamına hazırlaşmağımı gizlədirəm.*

**Qeyd** 3: *Beyt zahidin cəmaət sərkilərindən qorxduğuna, əksinə aşiqinsə qorxusuzluğuna eyham etmək istəyir.*

Beyt 6: **Meydən əgərçi tövbə verir el Füzuliyə,**
**Ey sərv, sən qədəh sunar olsan, rəvan içər**

Nişanə 1: "Sərv"– camal cilalarını ülvi mərtəbələrdə əks etdirmiş məhbubdan ibarətdir.

Nişanə 2: "Qədəh"– A – Təcəlla ehsanından ibarətdir.

B – ilahi feyzlərə naillik istedadı bağışlayan mərhəmətdən ibarətdir.

Anlam: Təcəlla ehsanı, yaxud rəhmani feyzlər agər mənə yardım etsə camaatın sərkilərinə baxmayaraq eşq qələbələri ilə bəşəri sifətlərimi asanlıqla qət edərəm.

[1] Qəzəl 9, beyt 2

## Q Ə Z Ə L 91

(1) Girib meyxanəyə müğ müşribilə kim ki xu eylər,
Olub mömin, behişti kafərəm gər arizu eylər.

(2) Məgər divanədir sevdayi-əbrusilə zahid kim,
Baxıb mehrabə daim öz – özilə göftu-gu eylər.

(3) Dəmadəm qətrə - qətrə qan-yaşımdır ki çıxar gözdən
Və ya peykanların kim, atəşi-dil onu su eylər.

(4) Rəhi-eşqində olmam təngdil sevda hücumundan
Təriqi-səltənət hər kim tutar, qovğayə xu eylər.

(5) Dedim: "kimdir pərişan eyləyən aşiqlər əhvalın?"
Səba göstərdi tari-sünbül-zülfün ki: "bu eylər".

(6) Füzuli zülfünə bağlandı əmma, öylə incəldi
Ki, guya zəf onu həm zülfünə bir tari-mu eylər.

Beyt 1: **Girib meyxanəyə müğ müşribilə kim ki xu eylər,**
**Olub mömin, behişti kafərəm gər arizu eylər.**

Sözlük: Müğ = Zərdüşti rəhbər = müğ əsasda ruhanilik məqamını özlərinə həsr etmiş "mad" irqindən bir qəbilədir. Zərdüşt ayini Azərbaycan (red.) və İranın "mad" və "pars" ünvanlı qərb və cənub məntəqələrində qalib gəldiyi zaman müğlər təzə dinin rəhbərliyinə nail oldular.[1]

Müşrib = dini yol = fəlsəfi yol = özəl məzhəb = subaşı; xu = adət

Nişanə 1: "Meyxanə ":

A – İlahi ülvi aləm, yaxud qeyri-maddi aləmdən ibarətdir.

B – ilahi tanışlıqlar ilə dolu və kamil arif ürəyindən ibarətdir.

P – mütəal məhbub eşqində məğlub olmuş bir üzlü dostlar əncümənindən ibarətdir.[2]

T – Rəziəddin Ərtimani demişkən aşiqin özünə, özündən nicat verən mərtəbədən ibarətdir:

[3] به میخانه آی و صفا را ببین مبین خویشتن را خدارا ببین

Nişanə 2: "Müğ müşribi" – ilahi eşq məktəbindən ibarətdir.

**Qeyd** 1: *Məcazi şərabın haram olduğu kimi, məcazi yaşayış şəraitində muğ olmaq da atəşpərəstlik, yaxud mütləq kafirlikdir.*

**Qeyd** 2: *Şərab, mey, qumar, meyxanə, müğ, rind və habelə bir çox zahiri çirkin kəlmələrin təmizlənib ürfana daxil olmağı "baş-ayaq"ünvanlı mərtəbədən bəhrələnməklə şərtlənir.*

**Qeyd** 3: *Aşiqlər əql əhlinin mənəm-mənəmliyi canlandıran sitayişindən amanda qalmaq üçün mey və şərab kimi mənfi istiarələrə pənah aparmışlar.*

**Qeyd** 4: *Aşiqlər eşq sirrini naməhrəmlərdən gizli saxlamaqdan ötrü mənfi kəlmələrə pənah aparmışlar.*

Nişanə 3: "Mömin" – vəhdət aləminə daxil olmuş arifdən ibarətdir.

Anlam: Kamil mürşid təlimatı ilə fiziki "xud"[4], yaxud maddi mahiyyətdən xilas .

olub vəhdət ləzzətini dadmış şəxs behişt ləzzətinə rəğbət etməz.

Beyt 2: **Məgər divanədir sevdayi-əbrusilə zahid kim,**
**Baxıb mehrabə daim öz – özilə göftu-gu eylər.**

---

[1] Fərhəngi-Moni, Əlam.
[2] Fərhəngi-istilahat və təbirati-ürfani.
[3] Fərhəngi -istilahat və təbirati-ürfani.

[4] Qəzəl 87, beyt 4

Sözlük: Seda = sövdə = alqı-satqı = xəyal = həvəs; əbru = qaş; mehrab = pişnamazın namaz qıldığı yer = evin yuxarı başı = məclisin yuxarı başı; göftu-gu = danışıq = söhbət.

Nişanə 1: "Divanə" – bütün sifətləri ilə eşqə məğlub olmuş aşiqdən ibarətdir.

Nişanə 2: "Əbru" – bütün vücudlara camal bağışlayaraq mütəal məbud həqiqətini pünhan etmiş sifətdən ibarətdir.

**Qeyd**: *Nuru addımlayıb günəş həqiqətinə çatmaq imkansızlığı kimi yaxud nur günəşə hicab olan kimi əbru də İlahi həqiqətin hicabıdır.*

Nişanə 3: *"Mehrab": mehrab ürək tələb etdiyi məhbub və məqsuddan ibarətdir.*

**Qeyd**: *Mehrab – "Mehrab" adlı məşhur mübarizə aparan dilavər bir şəxsə eyham edərək [1] namaz şəraitində dünyəvi əlaqələrlə, yaxud şeytan ilə, yaxud mənəm – mənəmliklə mehraba aparılmağa eyham edir.*

Nişanə 4: "Öz – özilə göftu-gu etmək ":

A – Məcazi “xud” xilaslığında həqiqi “xud” ilə məşğul olmaqdan nişanədir[2] (müsbət məna).

B – Məğlubluq, yaxud divanəlik məqamına nail olmaqdan nişanədir (müsbət məna).

P – Adab məhdudluğunda həqiqətdən xəbərsiz qalmaq, yaxud məhbub qaibliyində özü ilə söhbət etməkdən nişanədir (mənfi məna ).

Anlam: A – Əbru sifəti zahidi həqiqətdən məhrum edərək özü ilə məşğul etmişdir.

B – Əbru sifəti zahidi məhbub cilvələrinə məğlub edərkən onu batin əhli etmişdir.

**Qeyd**: *Öz – özü ilə danışmaq batin ilə danışmaqdan ibarətdir.*

P – Danışmaq namazı batil edən hal olduğuna görə beyt, əqlini – elmini, yaxud fiziki mahiyyətini mühafizə etmiş zahidin namazının batil olduğuna işarə edir.

Beyt 3: **Dəmadəm qətrə-qətrə qan-yaşımdır ki çıxar gözdən**
**Və ya peykanların kim, atəşi-del onu su eylər.**

Sözlük: Dəmadəm = dəmbədəm; peykan = ox ucu = uc.

Nişanə 1: "Qan-yaş" – dünyəviliyi yuyub batil edən nişanədən ibarətdir.

---

[1] Fərhəngi Dehxoda
[2] Qəzəl 87, beyt 4

Nişanə 2: "Peykan ": Peykan, məcazi həyatdan xilas olmaq məqsədilə yaralanmış ürəyi özəl münacata vadar edən ilahi qəmzə satmaqdan ibarətdir.

Nişanə 3: "Atəşi-del" – ürək paklayan yetkinlik və seyr hərarətindən ibarətdir.

Nişanə 4: "Su" – həqiqi həyat bağışlayan ilahi mərifətdən nişanədir.

Anlam: Ey mütəal məhbub, yaralı qəlbimə mərifət, həyat və seyr bağışlayan qüvvəsinin qəmzə satmaqlarından ibarətdir.

Beyt 4: **Rəhi-eşqində olmam təngdil sevda hücumundan**
**Təriqi-səltənət hər kim tutar, qovğayə xu eylər.**

Sözlük: Rəh = yol; təngdil = darıxmış = səbirsiz; xu – adət; Təriq = yol = iş = adət = hal; qovğa = hay – küy = iğtişaş..

Anlam: Ey mütəal məhbub, müxtəlif iğtişaşlara adətkərdə olmuş sultanlar kimi mən sərki vuranların hay – küyünə adət etmişəm.

**Qeyd** 1: *Beyt aşiqin öz nəfsinə sultan olmağına da eyham edir.*

**Qeyd** 2: *Beyt aşiqin dünyəviliyə qalib gəlməyinə də eyham edir.*

**Qeyd** 3: *Beyt aşiqi dünya əhlindən ehtiyacsız edən bəşəri istiğnaya da eyham edir.*

Beyt 5: **Dedim: "kimdir pərişan eyləyən aşiqlər əhvalın?"**
**Səba göstərdi tari-sünbül-zülfün ki: "bu eylər".**

Sözlük: Tar = tel.

Nişanə 1: "Pərişanlıq" – vəhdət rayihəli kəsrət məşğulluğuna giriftar olmaqdan, yaxud cilvələr məşğulluğunda həqiqətdən xəbərsiz qalmaqdan ibarətdir.[1]

Nişanə 2: "Səba" – ilahi vasitədən, yaxud kamil mürşiddən ibarətdir.

Nişanə 3: "Tari-zülf" – kəsrət güzgüsündə təzahür etmiş vəhdətdən ibarətdir.

Anlam: Səba demişkən, güzgü mərtəbəli kəsrət, yaxud ilahi cilalar əks etdirilmiş kainat gah "təfriqə "giriftarlığına, gah da "cəm "nailiyyətinə bais olur.

Beyt 6: **Füzuli zülfünə bağlandı əmma, öylə incəldi**
**Ki, guya zəf onu həm zülfünə bir tari-mu eylər.**

Sözlük: Zəəf = zəiflik.

---

[1] Qəzəl 89, beyt 4

Nişanə 1: "Zülfünə bağlanmaq" – vəhdətə söykənmək nailiyyətindən istiarədir.

Nişanə 2: "İncəlmək" bəsitlik və mücərrədlik şəraitindən nişanədir.

Nişanə 3: "Zəəf" – "iradi ölüm", yaxud "موتوا قبل انتموتو" [1] müqəddiməsindən, yaxud qurbanlıq istedadından ibarətdir.[2]

Nişanə 4: "Tari-mu ":

A – Tari-mu, incəlməyi təkrar etmiş nişanədir.

B – aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəyə çatmağına eyham edən nişanədir.

P – başda bitməyə başladığına görə mənəvi həyat başlanışına eyham edən nişanədir.

Anlam: Füzuli dünyəvi ilgilərini, yaxud öz təbii – fiziki mahiyyətini qat – qat soyub – unutmaqla bəsitlik məqamına nail olaraq həqiqi həyat mənbəyinə, həm də vəhdət məhrəmlərinə qoşulmağa müvəffəq oldu.

---

[1] Qəzəl 37, beyt 1
[2] Qəzəl 81, beyt 6

## Q Ə Z Ə L 92

**(1) Saçın əndişəsi təhriki-zənciri-cünunumdur,**
**Cünunum dəfinə zikri-ləbi-ləlin füsunumdur.**

**(2) Diyarı-dərd səgərdaniyəm, hər kim məni istər,**
**Dəlili-rah qətrə-qətrə əşki-laləgunumdur.**

**(3) Fələkdə bərqi-ahimdən sərasər yandi kövkəblər,**
**Qalan odlarə yanmış kövkəbi-bəxti-zəbunumdur.**

**(4) Gələn navəklərin bir-bir yaxıb, qoymaz bulam zövqün,**
**Məni hirman oduna yandıran suzi-dərunumdur.**

**(5) Səri-kuyində könlüm bərqi ahin sanma bihudə,**
**Qaranqu gecə əzmi-kuyin etsəm rəhnəmunumdur.**

**(6) Ləbi-Şirinlərin şövqilə Fərhadı mənəm əsrin,**
**Yanımda cəm olan səngi-məlamət Bisütunumdur.**

**(7) Füzuli, xali olmaq cami-eyşim saf səhbadən,**
**Nişani-bəxti-nafərcamü iqbali, nigunumdur.**

Beyt 1: **Saçın əndişəsi təhriki-zənciri-cünunumdur,**
**Cünunum dəfinə zikri-ləbi-ləlin füsunumdur.**

Sözlük: Cünun = məcnunluq = divanəlik; füsun = əfsun = ovsun.

Nişanə 1: "Saç" – A – Tələb yolundan nişanədir.

**Qeyd**: *Tələb yolu, uzun və mübhəm olduğuna görə saça təşbih olunur.*

B – Saç "Həblül-mətin" ünvanlı ilahi əlaqə saxlamaqdan ibarətdir.

**Qeyd**: *Əflatun ilahi görünməz tənab (ip) ünvanıyla Həblül-mətindən söz açaraq demiş: "İnsanlar mütəal məbudun yalnız şairlərin müşahidə etdiyi tənabıyla bir gəlincik kimi hərəkət edirlər, onlar nə qədər tənab hərəkəti ilə müvəffəq olsalar bir o qədər ilahi hidayətdən bəhrələnməlidirlər.*[1]*"*

Nişanə 2: "Cünun" – A – İctimai adab tərkindən nişanədir.

B – ürfani son qələbələrdən nişanədir.

P – dərvişlik, yaxud fanilik başlanışından ibarətdir.

T – bu beytdə xəbərdarlıqla vahidləşmiş xəbərsizlikdən nişanədir

Nişanə 3: "Zikri-ləb" – yoxu var edən ilahi ilhamlar xatirati ilə müşahidə nailiyyətinə müqəddimə törətməkdən ibarətdir.

Anlam: İlahi ilhamlar xatirəsi ilə tələb yolunu seyr edib-saxlayan maneələrinə qalib gəlirəm.

**Qeyd**: *Beyt ilahi təcrübələrin rəhbərliyinə eyham etmək istəyir.*

Beyt 2: **Diyarı-dərd səgərdaniyəm, hər kim məni istər,**
**Dəlili-rah qətrə-qətrə əşki-laləgunumdur.**

Sözlük: Dəlil = rəhbər = dəlalət edən = yol göstərən = bələd; rah = yol/

Nişanə 1: "Dərd" – A – Şirinlikdən asılı acılıqdan ibarətdir.

B – ülvi əslindən-əsasından ayrılmağını dərk etmiş aşiqin səbirsizliyindən ibarətdir.

P – aşiqi taqətsiz edən ilahi sifətlərdən ibarətdir.[2]

Nişanə 2: "Sərgərdanlıq" – əql və idrak acizliyindən nişanədir.

Nişanə 3: "Əşki-laləgun" – mənliyi batil edən nişanədən ibarətdir.

Anlam: Əqlimi – idrakımı yuyub batil edən ağlar halım sərgərdanlıq mülkünün hidayətçisidir.

Beyt 3: **Fələkdə bərqi-ahimdən sərasər yandi kövkəblər,**

---

[1] Paydya Verniger, cild 3, səh.1234

[2] Bu sifətlər həm qəhr, həm də lütf ilə bağlıdır.

**Qalan odlarə yanmış kövkəbi-bəxti-zəbunumdur**.

Sözlük: Yandı = işıqlandı; yanmış = məhv olmuş = qaralmış; zəbun = aciz = həqir.

Nişanə 1: "Ah" – A – Ah, sözə - söhbətə sığmaz kamal nişanəsidir.

B – xüsusilə bu beytdə ürək paklığına, həm də mənəvi seyrə nail edən ilahi eşq şöləsindən ibarətdir.

P – Ah, dərindən nəfəs almağa eyham edərək mənəvi nəfəs nailliyindən, yaxud həkim Nizami buyurduğu həqiqi həyat müqəddiməsindən ibarətdir:

زنده به جان خود همه حیران بود      زنده به دل باش که جان آن بود[1]

Nişanə 2: "Bəxt" – İstedadsız aşiqi ilahi ehsandan bəhrələndirən mərtəbədən nişanədir.

Anlam: Alovlu qəlbimdən çixan ilahi eşq şölələri bütün ulduzlara ziya bağışla öz bəxt ulduzunu isə özündən məhrum etmişdir.

Beyt 4: **Gələn navəklərin bir-bir yaxıb, qoymaz bulam zövqün,**
**Məni hirman oduna yandıran suzi-dərunumdur.**

Sözlük: Navək = ox, hirman = nakamlıq; suzi-dərun = iç alovu = ürək atəşi.

Nişanə 1: "Navək" – A – Ürəyi özəl münacata vadar edən ilahi qəmzə satmaqdan nişanədir.

B – aşiq qəlbini qurbanlıq məqamına hazırlamaq qəsdilə, gözə çevirən nişanədən ibarətdir.

Nişanə 2: "Hirman" – məcazilik asarına, yaxud fiziki mahiyyətə eyham edən nişanədən ibarətdir.

Anlam: İç aləmi əhatə etmiş atəş bəlalər tamsınmağını mümkünsüz etmişdir.

Beyt 5: **Səri-kuyində könlüm bərqi ahin sanma bihudə,**
**Qaranqu gecə əzmi-kuyin etsəm rəhnəmunumdur.**

Sözlük: Bihudə = yersiz = faydasız = vecsiz; rəhnəmun = rəhbər

Nişanə 1: "Səri-kuy" – bəndəlik məqamını təlqin edən nişanədir. -

Nişanə 2: "Bərqi-ah" – üçüncü beytə bax.

Nişanə 3: "Qaranqu gecə" – bu beytdə yer-göy arasında seyr etmək çətinliyindən, yaxud kəsrət içindən vəhdət mülkünə yol açmaq müşkülündən nişanədir.

---

[1] Nizami, Sirrlər xəzinəsi

Anlam: Maddi əngəlləri, xüsusilə fiziki mahiyyəti ah atəşində yandırmaqla:

A – Mənəvilik yolunu işıqlandırmaq istəyirəm.

B – Məcazi maneələri aradan qaldırmaq istəyirəm.

Beyt 6: **Ləbi-Şirinlərin şövqilə Fərhadı mənəm əsrin,**
**Yanımda cəm olan səngi-məlamət Bisütunumdur.**

Sözlük: Səngi-məlamət = məlamət daşı; bisütun = Daryuş (Dara-red.) padşahın kətibələri – daş yazmaları ilə məşhur olan İran Kirmanşahında "Pamçal" kəndinə yaxın bir dağ.[1]

Nişanə 1: "Ləbi-şirinlər" – mürşüdlərdən, yaxud mənəvi vasitələrdən, ya da bəşəri camalda ilahi hüsnlər əks etdirmiş gözəllərdən ibarətdir.

Nişanə 2: "Şövq" – şühud həvəsindən, yaxud tələb bitablığından ibarətdir.

Nişanə 3: "Fərhad" – mənəvi eşqi başa salmaq məqsədilə onu dünyəviləşdirən nişanədən ibarətdir.

Anlam: Sərkilər maneəsilə mübarizə aparmaq Bisütun dağını yarmaqdan çətindir.

**Qeyd**: *Bisütun dağını yarmaq Fərhadın müəyyən vüsal şərti imiş.*

Beyt 7: **Füzuli, xali olmaq cami-eyşim saf səhbadən,**
**Nişani-bəxti-nafərcamü iqbali-nigunumdur.**

Sözlük: Səhba = şərab; nafərcam = şum = aqibətsiz; nigun = başı aşağı = baş-ayaq

Nişanə 1: "Eyş" – mütəal məhbubla isinişmək ləzzətindən ibarətdir.

**Qeyd**:

*A – İtaət etmək mələklər eyşindən ibarətdir.*

*B – Elm tələbi, həm də vəhy intizarı peyğəmbərlər eyşından ibarətdir.*

*P – İlahi hökmlər intizarı sadiqlər eyşindən ibarətdir.*

*T – Yemək – içmək umum insanlar eyşindən ibarətdir.*[2]

Nişanə 2: "Safi-səhba" – A – Davam etdirilmiş təcəllidən ibarətdir.

B – "Ələst" xatiratının canlanmağından ibarətdir.

Nişanə 3: İkinci misra istedadsız aşiqin ilahi ehsan məhrumluğunu təlqin etmək istəyir.

---

[1] Fərhəngi Moin, Ələm

[2] Fərhəngi-istilahat və təbirati –ürfani.

Anlam: Ey Füzuli, ilahi təcəllilərdən, yaxud Ələst mərtəbələrindən məhrum olmağım öz istedadsızlığımdandır.

## Q Ə Z Ə L 93

**(1) Məndə Məcnundan füzun aşiqlik istedadı var,**
**Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var.**

**(2) Nola qan tökməkdə mahir olsa çeşmim mərdümi,**
**Nütfeyi-qabildürür, qəmzən kimi ustadı var.**

**(3) Qıl təfaxür kim, sənin həm var mən tək aşiqin,**
**Leylinin Məcnunu, Şirinin əgər Fərhadı var.**

**(4) Əhli-təmkinəm, məni bənzətmə, ey gül, bülbülə,**
**Dərdə yox səbri onun, hər ləhzə min fəryadı var.**

**(5) Öylə bədhaləm ki, əhvalım görəndə şad olur**
**Hər kimin kim, dövr cövründən dili-naşadı var.**

**(6) Gəzmə, ey könlüm quşu qafil fəzayi – eşqdə**
**Kim, bu səhranın güzərgahində çox səyyadı var.**

**(7) Ey Füzuli, eşq mənin qılma nasehdən qəbul**
**Əql tədbiridir ol, sanma ki, bir bünyadı var.**

Beyt 1: **Məndə Məcnundan füzun aşiqlik istedadı var**
**Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var.**

Sözlük: Füzun = artıq = əlavə

Nişanə 1: "Məcnunluq" – dünyəviliyi mənəviliyə söykəndirən bəşəri müqəddəs eşqdən ibarətdir.

Nişanə 2: "Sadiq" – A – İç vücudunu çöl vücudu ilə vahidləşdirmiş aşiqdən ibarətdir.

B – hər bir əməlini ürfani ruhiyyə ilə məvaziləşdirmiş aşiqdən ibarətdir.

P – bəşəri adətlərini, həm də sifətlərini, mərifətlərini tərk etmiş aşiqdən ibarətdir.

Anlam: Məcnun yer aləmində məşhur olduğu kimi mən də göylərdə şöhrətlənmişəm.

Beyt 2: **Nola qan tökməkdə mahir olsa çeşmim mərdümi**
**Nütfeyi-qabildürür, qəmzən kimi ustadı var.**

Sözlük: Çeşmim mərdümi = göz-bəbəyim

Nişanə 1: "Qan tökmək" – A –Fiziki mahiyyəti yuyub batil etmək nişanəsindən ibarətdir.

B – "İradi ölüm" ərəfəsinə yaxud qurbanlıq nailyyətinə hazırlayan nişanədən ibarətdir.

Nişanə 2: "Qəmzə" – A – gah iztirab, gah ümid törətmiş ilahi cazibələrdən ibarətdir.

B – ilahi "İstiğna"[1] mərtəbəsində mənəvi feyzlərin kəsilməsindən nişanədir.

Anlam: Ey istiğnalı məhbub, sənin qan tökməyin, yaxud öldürüb-diriltməyin göz bəbəyimə ürəkdən batan rəhmsiz qəmzələrindir.

**Qeyd**: *Rəhmsizlik aşiqi yetişdirən ilahi lütfdən ibarətdir.*

Beyt 3: **Qıl təfaxür kim, sənin həm var mən tək aşiqin,**
**Leylinin Məcnunu, Şirinin əgər Fərhadı var.**

Sözlük: Təfaxür = iftixar etmək = naz etmək.

Nişanə 1: "Təfaxür" – A – Mütəal məbudun aşiqə alicənablıq göstərməyindən ibarətdir.

B – mütəal məbudun öz ilahilik bağışladığı bəndəsinə yaxud bəşəri vücudda əks etdirdiyi ilahi əzəmətə "فتبارکالله احسنُ الخالقين"[1] deməyindən ibarətdir (“O – ənyaxşı yaradan sitayişə layiqdir”).

[1] Qəzəl 30, beyt 3

P – mürşüd həzrətinin öz təlim etdiyi şagirdlə fəxr etməyindən, yaxud razılığından ibarətdir.

Anlam: Ey mütəal məhbub, yaxud ey mürşüd, dünyəviliyi təmamilə fəda etmiş aşiqin arzusu sənin razılıq göstərməyindən asılıdır.

**Qeyd**: *İkinci misra mənəvi bir məfhumu başa salmaq qəsdilə aşiqi dünyəviləşdirmişdir.*

Beyt 4: **Əhli-təmkinəm, məni bənzətmə, ey gül, bülbülə**
**Dərdə yox səbri onun, hər ləhzə min fəryadı var**.

Nişanə 1: "Təmkin" – mənəvi dəyişilməyən haldan ibarətdir.

**Qeyd** 1: *Təğyir, yaxud Təlvin*[2] *ünvanlı ürfani məşhur mərtəbə bir haldan başqa hala nail olmaq tərəqqisindən, ibarətdir, lakin "təmkin" sona çatmış tərəqqi mərtəbəsində, yaxud ilahi mərkəzdə vəhdət nailiyyətində sakinlikdən ibarətdir. İslamın ulu peyğəmbəri təmkin məqamına nail olduğuna görə "Merac"* [3] *gecəsi müxtəlif görünməz aləmlər müşahidə edə-edə, habelə əcayib sirrlər görə - görə heç də iztiraba düşmədi, demək o həzrət haman halda ki göylərə səfər etmişdi haman halda da yerə qayıtdı.*[4]

**Qeyd** 2: *Vəhdət dənizində fanilik məqamına nail olmayan bir aşiq təmkin əhli ola bilməz.*

Nişanə 2: "Gül" – bəst feyzi bağışlayan, yaxud ürək açan mərtəbəyə nail edən mütəal məbuddan, yaxud ilahi vasitədən, yaxud mürşüd həzrətindən ibarətdir.

Nişanə 3: "Bülbül, fəryad" – A – Fiziki mahiyyətindən xəbərdar aşiqin nalə etməyindən, yaxud mənfi nalədən ibarətdir.

B – fiziki mahiyyətini unutmuş aşiq naləsindən, yaxud müsbət nalədən ibarətdir.

Anlam: Ötən beytləri təsdiq etmək məqsədilə təmkin əhli olmağın qurbanlıq məqamına hazırlaşmaqla bağlı olduğunu demək istəyir.

Beyt 5: **Öylə bədhaləm ki, əhvalım görəndə şad olur**
**Hər kimin kim, dövr cövründən dili – naşadı var.**

Sözlük: Naşad = qəmgin = bədhal.

---

[1] Quran, Mominun surəsi, 14-cü ayədən bir hissə
[2] Rəngarəng olmaq, müxtəliflik
[3] İslam peyğəmbərinin İsra gecəsi göylərə səfər etməyi(qəzəl 6 beyt 1)
[4] Fərhəngi-istelahat və təbirati-ürfani.

Nişanə 1: "Bəd hal" – A – Bimar mənasını təlqin edən bəd hal ötən beytlərdə qeyd olunmuş qurbanlıq müqəddiməsini təkrarlamağa təkid etmək istəyir.

B – Bədhallıq fiziki mahiyyət pərişanlığına eyham edən nişanədən ibarətdir.

Anlam: Mənim pərişan zahirimi görmüş giriftar adam öz pərişanlığına şükr edər.

**Qeyd**: *Batin tərəqqisi zahir pərişanlığıyla əlaqədardır.*

Beyt 6: **Gəzmə, ey könlüm quşu, qafil fəzayi – eşqdə**
**Kim, bu səhranın güzərgahində çox səyyadı var.**

Sözlük: Güzərgah = yol, keçid; səyyad = ovçu.

Nişanə 1: "Qafil" – xəbərdarlıq iddia edən xəbərsizdən ibarətdir.

Nişanə 2: "Güzərgah" – müxtəlif mübhəmliklər geyən seyr dayirəsindən ibarətdir.[1]

Nişanə 3: "Səyyad" – İç aləm istedadından, yaxud ürək müqavimətindən, yaxud səbir qüvvəsindən üstün ilahi cazibələrdən ibarətdir.

Anlam: Ey aşiq, mərifət naqisliyi:

A – İlahi cazibələrdən müsbət bəhrələnməyə maneədir, elə buna görə də lisanül- qeyb Hafiz mərifət qazanmaqdan əvvəl aşiq yolunda addımlamağı yolu çaşmaqla bərabər bilib demişdir:

تا به گیسوی تو دست ناسزایان کم رسد      هر دلی از حلقه ای در ذکر یارب یاربست[2]

B – Mürşüd təlimatından məhrum olmağa baisdir.

Beyt 7: **Ey Füzuli, eşq mənin qılma nasehdən qəbul**
**Əql tədbiridir ol, sanma ki, bir bünyadı var.**

Sözlük: Mən = mane olmaq = qabağını almaq; naseh = nəsihətçi

Nişanə: "Əql": Dönə - dönə dedigimiz kimi əql, yaxud məcazi həyat möhlətində məişət keçirmək qüvvəsi mütləq həqiqətlər idrakından, yaxud mənəvi mərtəbələr tanışlığından aciz olduğuna görə:

A – Ariflər yarı yer – yarı göy sakini insanın ülvi hissəsini tanıtdıran mənaşünas əqli eşq adıyla təbliğ etmişlər.

B – Filosoflar dünyaşünas əql acizligini araşdırıb – aydınlatmaq məqsədilə bir çox izahlar aparmışlar[3], o cümlədən "Akunyas" ilahi

---

[1] Qəzəl 1, beyt 1, nişanə Salik
[2] Qəzəl 61, beyt 4
[3] Qəzəl 64, beyt 3

həqiqətlərin əql çərçivəsindən xaric olduğunu "Vəhy"[1] vacibliginə aydın dəlil göstərmişdir.[2]

Anlam: Ey Füzuli, əql məhdudluğunda, sonsuz eşq iqtidarından xəbərsiz qalmışların nəsihətini qulaq ardına vurmaq heç də qeyri təbii deyil.

[1] "Ləb" ünvanlı ilahi ilham, intibahlar isə bir çeşid vəhydir.

[2] "Elm və din" Ayan Barpur, Xürrəmşahi, səh 23

## Q Ə Z Ə L 94

**(1) Müqəvvəs qaşların kim, vəsmə ilə rəng tutmuşlar,**
**Qılınclardır ki, qanlar tökmək ilə cəng tutmuşlar.**

**(2) Qılıb təğyiri-surət vəsmədən yəğma qılarlar dil,**
**Hərami qaşların rəsmü rəhi-neyrəng tutmuşlar.**

**(3) Könül miratını eylər mükəddər, əql təklifi**
**Xoş ol bibaklər kim, tərki-namü nəng tutmuşlar.**

**(4) Fəzayi-ömrdən guya degillər qönçə tək vaqif**
**Olar kim, özlərin dünya üçün diltəng tutmuşlar.**

**(5) Məni kim, səngsari-möhnətəm bazari-eşq içrə,**
**Bəla dağın çəkən Fərhad ilə həmsəng tutmuşlar.**

**(6) Ləbin dövründə zahidlər tutub meyxanələr küncin,**
**Qılıb təsbih tərkin tar zülfi-çəng tutmuşlar.**

**(7) Səhər bülbüllər əfğanı degil bihudə gülşəndə,**
**Füzuli naleyi-dilsuzinə ahəng tutmuşlar.**

Beyt 1**: Müqəvvəs qaşların kim, vəsmə ilə rəng tutmuşlar,**
**Qılınclardır ki, qanlar tökmək ilə jəng tutmuşlar.**

Sözlük: Müqəvvəs = qövsi = əyri, jəng = əyilmə = çin-çin, qırış-qırış olmaq.

Nişanə 1: "Qaş" – A – Müqəvvəs qaş şərif ayənin buyurduğu "qabi-qövseyn" [1] məqamına əsaslanaraq nəhayətə çatmış "Qürb"dən, yaxud ilahi dayirəvi seyri nəhayətə çatdırmaqla vəhdət nöqtəsinə, yaxud "İnnəllah" əslinə qaytaran hidayətdən ibarətdir.

B – naqislik göstərmiş, yaxud tənbəlcəsinə seyr etmiş saliki həqiqətdən xəbərdar etmək məqsədilə süqut etdirən ilahi tənbihlərdən ibarətdir.

P – saliki ayıq salan ilahi tənbihlərdən ibarətdir.

Nişanə 2: "Vəsmə"– qəhr və qəzəbi, yaxud mənəvi tənbihləri şiddətləndirən nişanədən ibarətdir.

Nişanə 3: İkinci misra, xüsusilə "qan tökmək" saliki dünyəvilik hicabından, yaxud mənəmlik maneəsindən xilas edən müqəddimədən ibarətdir.

Anlam: Ey həkimi məhbub, sənin qeyzlənməyin, yaxud şiddətli tənbihlərin salikə naqislikdən nicat verən lütfdən nişanədir.

Beyt 2: **Qılıb təğyiri-surət vəsmədən yəğma qılarlar dil,**
**Hərami qaşların rəsmü-rəhi neyrəng tutmuşlar.**

Sözlük: Yəğma = qarət etmək = tarac eləmək; rəh = yol; neyrəng = hiylə = cadu = zəminə = zərdüşti özəl mərasim.

Nişanə 1: "Təğyiri-surət qılmaq" – qəzəb örpəyindən pünhan olmuş mehribanlıqdan, yaxud mərhəmət qəsdilə qeyzlənmiş məhbubdan nişanədir.

Nişanə 2: "Yəğma" – bu beytdə dünyəvi ilgiləri, yaxud bəşəri sifətləri qat – qat qoparmaqla aşiqi bəsitlik məqamına hazırlayan müqəddimədən ibarətdir.

Nişanə 3: "Hərami" – aşiqi öz məmlüklüyündən xəbərdar etdirən qəbz sifətlərindən ibarətdir.

Nişanə 4: "Neyrəng" – bu beytdə mənəvi xasiyyət göstərən maddi şivələrdən ibarətdir.

Anlam: A – Aşiqin iç aləmini silkələtməklə onu qəflət yuxusundan ayılmağa nail edən ilahi qəzəb sifətlərindən ibarətdir.

[1] Doktor Mənuçehr Daneş Pejuh Fərhəngi istilahati ürfani

B – Aşiqi öz məmlüklüyündən xəbərdar etməklə peyğəmbərin nail olduğu bəndəlik məqamına (əbdlik) tərbiyə edən ilahi qəzəblərindən ibarətdir.[1]

P – Maddədən üstün ülvi məqamlar nailiyyəti, yaxud vəhdət nöqtəsinə qaytaran bəsitlik mərtəbəsi ilahi qəzəb sifətlərilə bağlıdır.

Beyt 3: **Könül miratını eylər mükəddər əql təklifi,**
**Xoş ol bibaklər kim, tərki namü nəng tutmuşlar**.

Sözlük: Mirat = güzgü = ayna; mükəddər = kədərli = qara = toz basmış; namü nəng =ad- san = abır-həya

Nişanə 1: "Könül mirati"– ilahi cəlaləri əks etdirmiş ürəkdən ibarətdir.

Nişanə 2: "Mükəddər" – qat-qat unudulmuş dünyəvilikdən qalmış xıltın mənəvi cilvələr maneəsi olmasından ibarətdir.

Nişanə 3: "Əql təklifi" – dünyaşünas nəsihətçinin əql tədbiri görməsindən ibarətdir.[2]

Nişanə 4: "Bibaklar": Bibaklar qeyri-maddi həyat şərayitində mənəvi iqtidara nail olmuş "şahbaz" ünvanlı mücərrəd aşiqlərdən ibarətdir.

Nişanə 5: "Tərki-namü nəng" – dünyəvi etibarlar həqirliyini yəqin etməkdən nişanədir.

Anlam: Dünyaşünas əql məhdudluğunda mənəvi mərifətlər nailiyyəti mümkünsüzdür.

**Qeyd** 1: *Namü nəng ünvanlı məcazi abır – etibarı qorumaq mənliyi mühafizə etməklə bərabərdir.*

**Qeyd** 2: *Namü nəngi mühafizə etmiş bir aşiqə sərkilər önündə müqavimət etmək mümkünsüzdür.*

Beyt 4: **Fəzayi-ömrdən guya degillər qönçə tək vaqif**
**Olar kim özlərin dünya üçün diltəng tutmuşlar**.

Sözlük: Diltəng = darıxan = təngimiş

Nişanə 1: "Fəzayi-ömr" – bu beytdə mənəvi həyatın sonsuzluğundan ibarətdir.

Nişanə 2: "Qönçə" – bu beytdə ürək sifətlərini məğlub edən ürəklərdən ibarətdir.

---

[1] اشهدُ انّ محمدً عبدهُ و رسوله

[2] Qəzəl 93, beyt 7

Anlam: Dünyəvi zavala məruz qalmış etibarları mühafizə etmək məqsədilə çalışqanlıq edən şəxslər mənəvi ölməz etibardan xəbərsizdirlər.

**Qeyd** 1: *Dünyəvi atmosfer qönçə bətni kimi darısqaldır*.

**Qeyd** 2: *Dünya məhdudluğunda həyat sürən şəxslər başı bağlı qönçələr kimi gözü bağlı yaşayırlar*.

Beyt 5: **Məni kim səngsari-möhnətəm bazari-eşq içrə**
**Bəla dağın çəkən Fərhad ilə həmsəng tutmuşlar**.

Sözlük: Səngsar = daşlamaq = daşa basmaq = bəzi günahkarı belinə qədər torpağa quylayıb daşa basmaq; həmsəng = bərabər.

Nişanə 1: "Möhnət"– məhəbbət qədimi qoşa yoldaşdırlar. Məhəbbətdən dəm vuran bir şəxsin qəlbini – canını sınaqlara çəkməklə onun naqisliyini, yaxud kamilliyini üzə çıxarıb aydınlaşdıran yalnız möhnətdir.[1]

Nişanə 2: "Bazari-eşq" – aşiqin diqqət dərəcəsini müəyyən edən ilk ürfani əhval – ruhiyyədən yaxud "Hal"[2] başlanışından ibarətdir.

Anlam: Məni Fərhad ilə bərabər bilmiş şəxslər ilahi eşq bəlalarından xəbərsizdirlər.

Beyt 6: **Ləbin dövründə zahidlər tutub meyxanələr küncün**
**Qılıb təsbih tərkin tar tərk zülfi-çəng tutmuşlar.**

Sözlük: Dövr = dövr, dövran; künc = künc-bucaq

Nişanə 1: "Ləb" – yoxu var edən, yaxud aşiqin bəşəri sifətlərini incəldib ilahi sifətlərini canlandıran ilahi ilham – işarədən ibarətdir.

Nişanə 2: "Zahid" – eşq həqiqətini inkar edən nəsihətçidən ibarətdir.

Nişanə 3: "Meyxanə" – A – İç aləmi maddi küdurətlərdən saflaşdırmış həqiqətşünas dostlar əncümənindən ibarətdir.

B – qeyri-maddi ülvi aləmə qovuşmaq şəraitindən ibarətdir.

P –kamil arifin ilahi mərifətlərlə dolu ürəyindən ibarətdir.

T – müsbət bixudluq məqamında mənəvi müşahidələr nailiyyətindən ibarətdir.[3]

به میخانه آی و صفا را ببین     مبین خوشتن را خدا را ببین[4]

---

[1] Fərhəngi-istilahat və təbirati-ürfani.
[2] Hal daim çaxan şimşəklərin ürəkdə çaxmağından ibarətdir.
[3] Qəzəl 87, beyt 4
[4] Rəziəddin Ərtimani

Nişanə 4: "Təsbih" – bu beytdə dil ucuna həsr olunmuş zikrdən, yaxud dünyəvilik çərçivəsində məhdud olmuş mərifətdən ibarətdir.

Nişanə 5: "Tari-zülf çəng" – iç aləmin səssiz – səmirsiz zikr ilə məstliyindən ibarətdir.

Anlam: Bir çox eşq həqiqətini inkar etmiş zahiddə ilahi ilhamlar bərəkətindən aşiqlərin sırasına qoşulmuşdur.

Beyt 7: **Səhər bülbüllər əfğanı degil bihudə gülşəndə,**
**Füzuli naleyi-dilsuzinə ahəng tutmuşlar.**

Sözlük: Əfğan = fəğan = fəryad; bihudə = vecsiz = yersiz = faydasız; dilsuz = ürək yandıran.

Nişanə 1: "Səhər"– A – Bəndənin münacat məqamına eyham edən nişanədən ibarətdir.

B – ilahi parlamalar mərtəbəsinə eyham edən nişanədən ibarətdir.

Nişanə 2: "Bülbül"– eşq siirini aşkara çıxaran səbirsiz aşiqdən nişanədir.

Nişanə 3: "Naleyi-delsuz" – "Nari-məhəbbət" hərarətilə ilahi seyrə məşğul ürəyin özəl münacatından ibarətdir.

Anlam: Quşlar isə zahidlər kimi Füzuli ilə ahəngdarlıq etmişlər.

**Qeyd**: *Füzuli zahidləri, həm də quşları ilahi işarələrdən xəbərdar etmiş bir vasitədir.*

## Q Ə Z Ə L 95

**(1) Aşiyani-müğri-dil zülfi-pərişanındadır,**
**Qanda olsam, ey pəri, könlüm sənin yanında.**

**(2) Eşq dərdilə xoşam, əl çək əlacımdan, təbib,**
**Qılma dərman kim, həlakim zəhri-dərmanındadır.**

**(3) Çəkmə damən naz edib üftadərlərdən, vəhm qıl**
**Göylərə açılmasın əllər ki, damanındadır.**

**(4) Gözlərim yaşın görüb şur, etmə nifrət kim, bu həm**
**Ol nəməkdəndir ki, ləli-şəkkərəfşanındadır.**

**(5) Məsti-xabi-naz olub, cəm et dili-sədparəmi**
**Kim, onun hər parəsi bir nuki-müjganındadır.**

**(6) Bəs ki, hicranındadır xasiyyəti-qəti-həyat,**
**Ol həyat əhlinə heyranəm ki, hicranındadır.**

**(7) Ey Füzuli, şəm tək mütləq açılmaz yanmadan**
**Tablar kim, sünbülündən rişteyi-canındadır.**

Beyt 1: **Aşiyani-müğri-dil zülfi-pərişanındadır,**
**Qanda olsam, ey pəri, könlüm sənin yanındadır.**

Sözlük: Aşiyan = yuva = ev = mərtəbə; mürği-dil = ürək quşu

Nişanə 1: "Mürği-dil" – ürfan səmalarında seyrlə məşğul olmuş ruhdan ibarətdir.

Nişanə 2: "Zülfi-pərişan" – yaradıcı məbud cilvələrini əks etdirən yaranmışlardan ibarətdir.

Nişanə 3: "Könül" – iç aləmdən, yaxud mürği-dildən ibarətdir.

Anlam:

A – Ey mütəal məhbub, məcazi mahiyyətim yer sakini olsa da həqiqi vücudum, yaxud ruhum göy sakinidir.

B – Yaradıcı məbud cilvələrini bütün yaranmışlarda müşahidə etməklə dünyəviliyi mənəviliyimə söykəndirmişəm.

**Qeyd**: *Dünyəvi şərayitdə mənəvi həyat surmək, yaxud hicranda vüsala nail olmaq "təfəkküri-xəlvəti" ünvanlı özəl mərtəbəyə bağlıdır.*[1]

Beyt 2: **Eşq dərdilə xoşam, əl çək əlacımdan, təbib,**
**Qılma dərman kim, həlakim zəhri-dərmanındadır.**

Nişanə 1: "Eşq dərdi" – maddi həqiqi dünyaya düşmüş aşiqin mənəvi ölməz aləm həsrətindən, yaxud ilahi eşq ünvanlı tükənməz atəşindən ibarətdir.

Nişanə 2: "Təbib" – bu beytdə eşq mərtəbələrindən xəbərsiz nəsihətçidən ibarətdir.

Nişanə 3: "Həlak" – bu beytdə yarı göy sakinliyinin yarı yer sakinliyinə fəda olmasından ibarətdir.

Anlam: Eşq dərdinə dərman tələb etmək daimi qafilliyi istiqbal etməkdir.

**Qeyd**: *Dərd, yaxud xəstəlik:*

*A – Fiziki əngəl mahiyyəti fəaliyyətsiz edən vasilədən ibarətdir.*

*B – Mücərrədlik, yoxsa qurbanlıq məqamına hazırayan müqəddimədən ibarətdir.*

Beyt 3: **Çəkmə damən naz edib üftadərlərdən, vəhm qıl**
**Göylərə açılmasın əllər ki, damanındadır.**

Sözlük: Damən = ətək; üftadə = ayaqdan düşmüş = natəvan = aciz; vəhm qılmaq = xəyal etmək = mümkünsüz bir xəyali əməl.

---

[1] Qəzəl 69, beyt 4

Nişanə 1: "Damən çəkmək" – istiğna mərtəbəli məşuqun aşiqi sınağa çəkmək qəsdilə nəzərə alınmaz dərəcədə saxlamağından ibarətdir.

Nişanə 2: "Naz etmək" – taqətsiz aşiqi qüvvətləndirməkdən nişanədir.

Nişanə 3: "Vəhm qılmaq" – imkan daxilində sığmaz bir işin mümkün olmasını tələb etməkdən ibarətdir.

Nişanə 4: "Əl göyə aşmaq ":

A – Şikayət etməkdən nişanədir.

B – yalvarıb-yaxarmaqdan nişanədir.

Anlam: Ey mütəal məhbub, natəvan aşiqləri bir belə nəzərə alınmaz dərəcədə saxlasan:

Şikayətlənmək məcburiyyətində onlar kafirliyə məhkum olarlar, çünki:

1 – şikayət mənliyi sübut edən nişanədir.

2 – şikayət mümkünlüyü inkar etməkdən nişanədir.

3 – şikayət həqiqi malikə etiraz etməkdən nişanədir.

4 – şikayət yetkinlik istedadından məhrum olmaq nişanəsidir.

Beyt 4: **Gözlərim yaşın görüb şur, etmə nifrət kim, bu həm**
**Ol nəməkdəndir ki, ləli-şəkkərəfşanındadır.**

Sözlük: Nəmək = duz; ləli-şəkkər əfşan = şəkər yağdıran dodaq = şirin dil = şirin söz.

Nişanə 1: "Göz yaşı" – fiziki mahiyyət ləkəsini yuyucu bir maddə kimi təmizləyən mərtəbədən nişanədir.

Nişanə 2: "Nəmək" – mütəal məbudun namütənahi kamalından nişanədir.

Nişanə 3: "Ləli-şəkkərəfşan" – iç aləmi şövqləndirən vasitəsiz ilhamlar nişanəsindən ibarətdir.

Anlam: Ey mütəal məhbub, göz yaşım həqir sərmayə olsa da, sənin ülvi astana bağlıdır.

Beyt 5: **Məsti-xabi-naz olub, cəm et dili-sədparəmi**
**Kim, onun hər parəsi bir nuki-müjganındadır**

Sözlük: Xab = yuxu; sədparə = yüz parça = yüz parə; nuki-müjgan = kirpiklərin ucu.

Nişanə 1: "Məsti – xabi – naz olmaq" – istedadsız aşiqi qüvvətləndirməkdən nişanədir.

Nişanə 2: "Müjgan" – ürək yarasını özəl münacata vadar edən ilahi qəmzə satmaqdan nişanədir.

Anlam: Ey mütəal məhbub, qəbzlərin təngləşdirdiyi qəlbimi "təfriqə"[1] məcburiyyətindən azad edən yalnız sənin əvəzsiz ehsanındır.

Beyt 6: **Bəs ki, hicranındadır xasiyyəti-qəti-həyat,**
**Ol həyat əhlinə heyranəm ki, hicranındadır**.

Anlam: Hicran şəraitində həyat sürmək həqiqətən heyrətləndiricidir.

**Qeyd** 1: *Beyt eşq və ürfandan xəbərsiz yaşayan şəxslərin həqiqi həyatdan məhrumluğuna eyham etmək istəyir*.

**Qeyd** 2: *Beyt, hicrandan asılı vüsala, yaxud məcazi dünyada mənəvi yaşamağa eyham etmək istəyir*.

Beyt 7: **Ey Füzuli, şəm tək mütləq açılmaz yanmadan,**
**Tablar kim, sünbülündən rişteyi-canındadır**.

Sözlük: Tab = qıvrılma = alışdırma = hərarət

Nişanə 1: "Tab" – ilahi sirrlərdən nişanədir.

Nişanə 2: "Sünbül" – bu beytdə kəsrət güzgüsündə əks etdirilmiş vəhdət nurundan, yaxud maddi kainatın mənəvi rayihəsindən nişanədir.

Anlam: Büsbütün vücudunu yandırıb qurtaran şam kimi mən də dünyəvi ömür möhlətinin sonuncu ləhzəsinə qədər yanmalıyam.

---

[1] Qəzəl 89, beyt 4

## Q Ə Z Ə L 96

**(1) Saqiya, cam tut ol aşiqə kim, qayğuludur,**
**Qayğu çəkmək nə üçün, cam ilə aləm doludur.**

**(2) Təlx göftarsız olmaz ləbi-yar, ey aşiq,**
**Çox həvəs eyləmə ol şərbətə kim, ağuludur.**

**(3) Qoyalım başı xümi-badə əyağinə müdam,**
**Tutmaq olmaz onun hörmətini, bir uludur.**

**(4) Bunca kim kuhsifət başimə daşlar urulur**
**Dideyi-bəxtim oyanmaz, nə ağır uyğuludur.**

**(5) Dili-pürxunuma yağdırma bəla peykanın,**
**Həzər et şişəyə, nagəh xətər eylər, doludur.**

**(6) Könlümün zəxminə peykanını etdim mərhəm,**
**Gənci-ğəmdir nola gər böylə dəmir qapuludur.**

**(7) Nərgisin fikri, Füzuli, gözü könlümdə gəzər,**
**Tutar ahu vətən ol yerdə ki, otlu, suludur.**

Beyt 1: **Saqiya, cam tut ol aşiqə kim, qayğuludur,**
**Qayğı çəkmək nə üçün, cam ilə aləm doludur.**

Nişanə 1: "Saqi" – həzrəti-Cəbraildən, yaxud mürşid həzrətindən, ya da digər feyz vasitəsindən ibarətdir.

Nişanə 2: "Cam" – aşiq vücudunu saflaşdıran ilahi təcəllilərdən nişanədir.

Nişanə 3: "Qayğı" – nailiyyət məchulluğunda iztiraba düşmüş ürəkdən nişanədir.

Nişanə 4: "Cam ilə aləm doludur" – bütün kainatda əks etdirilmiş ilahi cilvələrdən, yaxud vəhdət rayihəli kəsrətdən, yaxud hər bir yaranmışda yaradıcı məbud nisbətini görməkdən[1] nişanədir.

Anlam: Ey saqi, iztiraba düşmüş aşiqin vücudunu ilahi cəlalər ilə saflaşdırarkən onu qayğı çəkməkdən xilas et.

Beyt 2: **Təlx göftarsız olmaz ləbi yar, ey aşiq,**
**Çox həvəs eyləmə ol şərbətə kim, ağuludur.**

Sözlük: Təlx göftar = acı söz

Anlam: Beyt qəbz ilə bəst bağlılığını, yaxud hicrandan asılı vüsalı, yaxud "Əzdad"[2] iddialarını təsdiq etməklə dünyəvi ömür möhlətində hər bir vəziyyətin dayimiliyini mümkünsüz təlqin etmək istəyir.

Beyt 3**:** **Qoyalım başı xümi-badə əyağinə müdam,**
**Tutmaq olmaz onun hörmətini, bir uludur.**

Sözlük: Xüm = küp = küpçə; müdam = daim = həmişə

Nişanə 1: "Qoyalım başı" – Baş qoymaq:

A – Məşğulluqdan nişanədir.

B – Hörmət göstərmək nişanəsidir.

Nişanə 2: "Xümi-badə" – bu beytdə qəlbi küp kimi coşğunlandırmış ilahi feyzlərdən yaxud mürşüd təlimatından nişanədir.

Anlam: Ömür boyu ehtiram məqsədilə canan ərəfəsinə, yaxud mürşüd ayağına döşənsəm yenə də hörmətlərini əda edə bilmərəm.

**Qeyd** 1: *Ayağ, cam nişanəsinə də eyham edir.*

**Qeyd** 2: *Müdam, şərab mənasına da eyham edir.*

**Qeyd** 3: *Beyt mürşüd həzrətinin ilahi istiğnadan bəhrələnməyinə də eyham edir.*

---

[1] Qəzəl 40, beyt 5

[2] Qəzəl 3, beyt 2

**Qeyd** 4: *Beyt aşiqin öz məmlüklüyünə etiraf etməyinin gərəkli olduğuna demək istəyir.*

Beyt 4: **Bunca kim kuhsifət başimə daşlar urulur**
**Dideyi-bəxtim oyanmaz, nə ağır uyğuludur.**

Sözlük: Kuhsifət = dağ kimi; dideyi-bəxt = bəxtin gözü

Nişanə 1: "Kuh sifət" – iç aləmini məcazi "xüd" əngəlindən[1], yaxud fiziki mahiyyət xıltından duruya çıxartmayan aşiqdən ibarətdir.

**Qeyd**: *Layiqli aşiqin müqavimətinə də eyham edir.*

Nişanə 2: "Daşlar":

A – Mənəvi sınaq – sıxıntıdan ibarətdir.

B – eşq mərtəbələrini inkar etmiş camaatın sərki – danlağından nişanədir.

Nişanə 3: "Bəxt" – istedadsız, yaxud sərmayəsiz aşiqin mənəvi cazibələrə nail olmağından nişanədir.

Nişanə 4: "Ağır uyğu" – Ağır yuxu:

A – Sınaqdan çıxmamaq nişanəsidir.

B – Tükənməz məhrumiyyət nişanəsidir.

P – Əl çatmaz yüksəkliyə hazırlaşmaq nişanəsidir.

Anlam: Bir çox sınaq – sıxıntıya dözə - dözə mən yetkinlik həddinə, yaxud şühud ehsanına nail ola bilməyirəm.

**Qeyd**: *Əl çatmaz ülvilik, qurtarmaz sıxıntı ilə bağlıdır.*

Beyt 5: **Dili-pürxunuma yağdırma bəla peykanın,**
**Həzər et şişəyə, nagəh xətər eylər, doludur.**

Sözlük: Dili-pürxun = qanlı ürək; nagəh = nagah, peykan = ox ucu

Nişanə 1: "Dili-pürxun":

A – Aşiqin səbirsizliyini, yaxud tükənmiş taqətini təlqin edən nişanədən ibarətdir.

B – yetkinlik müqəddiməsindən nişanədir.

Nişanə 2: "Bəla peykanı" – bu beytdə davam etdirilmiş sıxma-boğmadan, yaxud tükənməz məhrumluqdan nişanədir.

Nişanə 3: "Şişə" – dili-pürxundan ibarətdir.

Nişanə 4: "Xətər etmək" – bu beytdə eşq sirrinin aşkara çıxarılmasından nişanədir.

Anlam: Ey mütəal məhbub, yaxud ey həzrəti-mürşüd, səbrimi tükəndirib sirrimi aşkara çıxaran feyzlərdən qorxuram.

---

[1] Qəzəl 87, beyt 4

Beyt 6: **Könlümün zəxminə peykanını etdim mərhəm**
**Gənci-ğəmdir nola gər böylə dəmir qapuludur.**

Sözlük: Zəxm = yara; gənc = xəzinə

Nişanə 1: "Zəxm":

A – Fiziki əngəl mahiyyəti karsız edən müqəddimədən ibarətdir.

B – qurbanlıq məqamına hazırlaşan müqəddimədən ibarətdir.

Nişanə 2: "Peykanı mərhəm etmək" – məcazi yaşayışı məğlub edən sıxıntıları qarşılamaq nişanəsidir.

Nişanə 3: "Gənci-ğəm" – bəndəlik əhval-ruhiyyəsindən ibarətdir.

Anlam: Ey həkimi-məbud, müxtəlif bəlaları qarşılamaqla dünyəviliyi fəda etməyə, yaxud qurbanlıq nailiyyətinə çalışıram.

Beyt 7: **Nərgisin fikri, Füzuli, gözü könlümdə gəzər,**
**Tutar ahu vətən ol yerdə ki, otlu, suludur.**

Sözlük: Nərgis = nərgiz

Nişanə 1: "Nərgis":

A – şühud məqamından nişanədir.

B – aşiqi fərəhləndirən mərifət meyvəsindən ibarətdir.

Nişanə 2: "Ahu" – mənəvi bir fikiri başa salmaq məqsədilə maddiləşdirmiş nişanədən ibarətdir.

Nişanə 3: "Ot" – yaşıllıqdan nişanədir.

**Qeyd** 1: *Yaşıllıq həqiqi həyat kökünə, yaxud "İnna lillah" nöqtəsinə bağlılıqdan nişanədir.*

**Qeyd** 2: *Yaşıllıq ilahi xilafət nişanəsidir.*[1]

**Qeyd** 3: *İlahi xilafət dünyəvi ömür müsibətliyini dəlilləşdirən*[2]*, yaxud dünyəviliyi mənəviliyə qovuşduran xilafətdən ibarətdir.*[3]

**Qeyd** 4: *Yaşıllıq, yenilənmək nişanəsidir.*[4]

Nişanə 4: "Su":

A – Mənəvi mərifətdən nişanədir.

B – Su, mənəm-mənəmlik ləkəsini yuyub təmizləyən nişanədir.

P – həqiqi həyatı davam etdirən nişanədir.

---

[1] Qəzəl 80, beyt 3

[2] Bəşəri müstəqil həyat sürmək mənfi həyatdan ibarətdir.

[3] Peyğəmbərlər, yaxud imamlar dünyəviliyi mənəviliyə qovuşdurduqlarına görə xilafət mənsəbini qəbul etmişlər.

[4] Qəzəl 71, beyt 3

Anlam: Şühud xəyalı, yaxud həqiqi həyat xəbərdarlığı Füzulinin iç aləmini fərəhləndirməklə onu ilahi məstliyə nail etmişdir.

## Q Ə Z Ə L 97

**(1) Məni zikr etməz el, əfsaneyi-Məcnunə maildir,**
**Nə bənzər ol mənə, dərdi onun təqrirə qabildir.**

**(2) Biyabangərd Məcnundan qəmü dərdim sual etmin,**
**Nə bilsin bəhr halın ol ki, mənzilgahi sahildir.**

**(3) Mənim tək ola bilməz şöhreyi-şəhri-bəla Məcnun,**
**Qəbul eylərmi bu rüsvalığı hər kim ki, aqildir.**

**(4) Nə müşkil halı olsa aşiqin məşuq edər çarə,**
**Gər ol bidərd bilməzsə bu hali, hal müşkildir.**

**(5) Fəraq əyyami seylabi-sirişkimdən xəbər tutmaz,**
**Qiyamət macərasından gör ol zalim nə ğafildir.**

**(6) Fəqihi-mədrəsə məzurdur inkari-eşq etsə,**
**Yox özgə elminə inkarımız, bu elmə cahildir.**

**(7) Füzuli, el səni Məcnundan əfzun der məlamətdə,**
**Buna münkir degil, Məcnun dəxi məqulə qaildir.**

Beyt 1: **Məni zikr etməz el, əfsaneyi-Məcnunə maildir,**
**Nə bənzər ol mənə, dərdi onun təqrirə qabildir.**

Sözlük: Təqrir = bəyan = söhbət = danışmaq = aydınlatmaq/

Anlam: Mən çəkdigim qəm – qüssə, yaxud idrakdan üstün eşq macəralarım sözə - söhbətə sığışsaydı, xəlq Məcnun hekayəsini yaddan çıxarardı.

Beyt 2: **Biyabangərd Məcnundan qəmü dərdim sual etmin**
**Nə bilsin bəhr halın ol ki, mənzilgahi sahildir.**

Sözlük: Bəyangərd = çöllərə düşmüş = səhraya düşmüş; bəhr = dəniz/

Nişanə 1: "Biyabangərd" – Biyabangərdlik qafillik mərhələsindən nişanədir.

Nişanə 2: "Bəhr" – Həqiqəti həm də sifəti sonsuz mütəal məbud eşqindən nişanədir.

Nişanə 3: "Sahil" – bu beytdə "Bəhr" ünvanlı mənəvi mərifət xəbərsizliyindən nişanədir.

Anlam: Ötən beyti davam etdirmək qəsdilə buyurur:

Məcnun mən tanış olduğum bəhr mərtəbəsindən xəbərdar olsaydı, çöllərə düşməzdi.

**Qeyd**: *Məcnun mənəvi eşqdən xəbərdar olsaydı məcazi həqir eşqə giriftar olmazdı.*

Beyt 3: **Mənim tək ola bilməz şöhreyi-şəhri-bəla Məcnun**
**Qəbul eylərmi bu rüsvalığı hər kim ki, aqildir.**

Sözlük: Şöhrə = məşhur

Nişanə 1: "Şəhri bəla" – müxtəlif fərəhləndirici müsibətlərdən, yaxud acılıqdan asılı şirinliklər barədə nişanədir.

**Qeyd**: *Mütəal məbudun dostları bir ləhzə dərd və bəla hücumundan kənarda qalsalar, mal-dövləti əlindən çıxmış fəryad edici dünyapərəstlər kimi fəryadları ərşə ucalar.*[1]

Nişanə 2: "Rüsvalıq" – fiziki mahiyyəti təhqir edən sərkilərdən ibarətdir.

Nişanə 3: "Aqil":

A – Eşq mərtəbələrini inkar etmiş dünyaşünas əql tərəfdarından ibarətdir.

---

[1] Qəzəl 81, beyt 5

B – dünyaşünas əqli təhqir etmiş mənaşünas eşq tərəfdarından ibarətdir.

Anlam: Dünyaşünas əql xıltı Məcnunu mən gördyüm sərkilərdən mühafizə etdi.

**Qeyd**: *İkinci misra:*

*A – Dünyaşünas əql əhli bu rüsvalığı edərmi?*

*B – Bu rüsvalığı yalnız mənaşünas əql əhli qəbul edər.*

Beyt 4: **Nə müşkil halı olsa aşiqin məşuq edər çarə**
**Gər ol bidərd bilməzsə bu hali, hal müşkildir.**

Nişanə 1: "Müşkil hal" – ötən beytlərdə qeyd olunmuş dərd və bəladan, yaxud rüsvalıqlardan nişanədir.

Nişanə 2: "Bidərd" – yarı göy sakinliyini, yaxud ülvi keçmişini yaddan çıxarmış məcazi mahiyyət məhdudluğunda, yaxud məişətşünas əql dayirəsində həyat sürməgi kafi bilmiş insandan ibarətdir.

Nişanə 3: "Hal müşküldir" – eşq bəlalarından uzaq olmuş şəxslərin yüksək ürfan və insanlıq səviyyəsindən məhrumluqlarını təlqin edən nişanədən ibarətdir.

Anlam: Mütəal məhbubun qəzəbi də lütfü kimi ürək saflaşdıran olduğuna görə uğurlu müsbət bir mərtəbədir, bunun üçün də onun cəfalarından qaçan aşiq yetkinlik mərtəbəsindən məhrum olmalıdır.

Beyt 5: **Fəraq əyyami seylabi-sirişkimdən xəbər tutmaz,**
**Qiyamət macərasından gör ol zalim nə ğafildir**.

Sözlük: Seylabi-sirişk = selləmə göz yaşı

Nişanə 1: "Silabi-sirişk" – fiziki əngəl mahiyyətini təmamilə yuyub məhv etmək çətinliyini təlqin edən nişanədən ibarətdir.

Nişanə 2: "Qiyamət" – "İradi ölüm" yaxud "موتو قبل ان تموتوا" mərtəbəsindən iarətdir.[1]

Nişanə 3: "Zalim":

A – Öz iç aləminə zülm edən bidərddən ibarətdir.

B – mənəvi həqiqətləri istedadsız aşiqdən gizli saxlayan vasitədən ibarətdir (müsbət zülm).

Nişanə 4: "Ğafil":

A – Xəbərsiz bidərddən ibarətdir.

B – xəbər tutmayan vasitədən ibarətdir.

Anlam:

[1] Qəzəl 70, beyt 2

A – Bidərdlər "Suğra qiyaməti" ünvanlı "İradi ölüm" şəraitindən xəbərsizdirlər.

B – Öz istedadsızlığıma görə ilahi vasitələr feyzindən məhrum olmuşam.

**Qeyd**: *Zalim kəlməsinin bir mənası isə örtülü olduğuna görə*[1] *beyt mürşüd həzrətinə, yaxud mütəal məhbuba xitab etsə eyb etməz.*

Beyt 6: **Fəqihi-mədrəsə məzurdur inkari-eşq etsə**
**Yox özgə elminə inkarımız, bu elmə cahildir**.

Sözlük: Fəqih = alim = şəri hökmlər alimi; məzur = üzrlü = azad

Nişanə: "Fəqihi-mədrəsə" – bu beytdə məişətşünas əql çərçivəsində məhdud olmuş zahiddən ibarətdir.

Anlam: Zahid bir çox elmdən xəbərdar olsa da, camal elmindən xəbərsiz olduğuna görə əgər dünyaşünas əql gözündən gizli mərtəbələri inkar edərsə üzrlüdür.

Beyt 7: **Füzuli, el səni Məcnundan əfzun der məlamətdə,**
**Buna münkir degil, Məcnun dəxi məqulə qaildir.**

Sözlük: Əfzun = artıq = əlavə; münkər = inkar edici; məqul = ağlabatan = ağlasığan, qail = qəbuledən = iqrar etmiş.

Nişanə 1: "Məcnun" – məcazi müqəddəs eşqdən nümunədir.

Nişanə 2: "Məlamət" – mənfi kəsrət ünvanlı camaat etibarını aşiq nəzərincə həqir edərək, onu "Təfrid" yoxsa "Fərdlik" [2] məqamına hazırlayan mərhələdən ibarətdir.

Nişanə 3: "Məqul" – bu beytdə dəlilləşdirməkdən, yaxud inkar edilməzlikdən nişanədir.

Anlam: Ey Füzuli, sənin sərkilər önündə Məcnundan artıq müqavimət göstərməyini Məcnun özü də başqa camaat kimi inkar olunmaz bilmişdir.

**Qeyd**: *Bu qəzəl dönə - dönə Məcnun adını çəkmək ilə:*

*A – Məcazi pak eşqə mənəvi müqəddəs eşq müqəddiməsi təlqin etmək istəyir*[3]

*B – İlahi eşqi bəşəriləşdirməklə başa salmaq istəyir*.

[1] Zülm: Fərhəngi -istilahat və təbirati ürfani.
[2] Qəzəl 64, beyt 6,
[3] Qəzəl 12, beyt 2, nişanə: Şəmrüx

## Q Ə Z Ə L 98

**(1) Ol pərivəş kim, məlahət mülkünün sultanıdır,**
**Hökm onun hökmü məna, fərman onun fərmanıdır.**

**(2) Sürdü Məcnun növbətin, imdi mənəm rüsvayi-eşq**
**Doğru derlər hər zaman bir aşiqin dövranıdır.**

**(3) Ləhzə-ləhzə könlüm odundan şərərlərdir çıxan,**
**Qətrə-qətrə göz tökən sanman sirişkim qanıdır.**

**(4) Çakilər köksümdə tiği-eşqdən, eyb etməniz**
**Kim, cünun gülzarının bunlar güli-xəndanıdır.**

**(5) Ey Füzuli, ola kim rəhm edə yar əfğanına,**
**Ağlagil zar, onca kim, zar ağlamaq imkanıdır.**

Beyt 1**:** **Ol pərivəş kim məlahət mülkünün sultanıdır**
**Hökm onun hökmü məna, fərman onun fərmanıdır**.

Sözlük: Pərivəş = pəriçöhrə = pərisima

Nişanə 1: "Pərivəş" – əqli-idrakı heyrətləndirən ilahi hüsnə bağlı bəşəri camal cilvəsindən, yaxud mürşüd cazibəsindən, ya da mütəal məbud cəlalərindən nişanədir.

Nişanə 2: "Məlahət" – elmə-anlama sığmaz ilahi sonsuz kamaldan ibarətdir.

Nişanə 3: "Sultan" – bəşəri iradəni ilahi iradəyə çevirən mütəal məbuddan, yaxud mürşüd həzrətindən ibarətdir.

**Qeyd**: Bəşəri müstəqil iradəyə bağlı fəaliyyət vecsiz mənfi fəaliyyətdən ibarətdir, bunun üçün də:

A – Həmişəlik behişt sakinliyini iradə etmiş həzrəti-Adəm ilahi iradəyə məğlub olaraq yer xilafətini qəbul etməgə məcbur oldu.

B – Şeytan, möminlər rəhbəri olmaqlığa müstəqil iradə etdiginə görə ilahi iradəyə məğlub olaraq kafirlərə rəhbər oldu.

P – Həzrəti-Musanın tələb etdigi məbud görüşü ilahi iradəyə uyğun gəlmədiyinə görə qəbula keçmədi... Habelə:

T – Hər gün səhər çağı bir mələk, göydə: " عبدی ترید و انا ارید و لایکون الا ما ارید" deyərək elan edər ki: "Ey mənim bəndəm sən iradə edirsən, mən də iradə edirəm, ancaq qalib olan yalnız mənim iradəmdir, haçan mən etdiyim iradəyə, yaxud mənim istəkimə razılıq verməsən, səni əzaba giriftar edərəm."[1] Elə bunun üçün də Hafiz buyurmuşdur:

سرارادت ما و استان حضرت دوست　　　که هر چه بر سر ما می رود ارادت اوست[2]

Nişanə 4: İkinci misra: ilahi iradə qələbəsini təsdiq edən nişanədən ibarətdir.

Anlam: Bəşəri iradələr bütünlüklə əqlə - idraka sığmaz sonsuz kamal sahibi mütəal məbud iradəsinə tabedir. Bunun üçün də rəvayətdə "الاسلام هو تسليم" buyurulmuşdur.[3]

**Qeyd**: *Dönə-dönə dediyimiz kimi ilahi iradəyə məğlub olmaq məmlüklük vəziyyətini etiraf etməkdən ibarətdir.*

Beyt 2: **Sürdü Məcnun növbətin, imdi mənəm rüsvayi-eşq**
**Doğru derlər hər zaman bir aşiqin dövranıdır.**

---

[1] Fərhəngi-istilahat və təbirati-ürfani

[2] Müəllif, "Ta Qafe-əndişe" kitabının birinci cildində bu beyti şərh etmişdir.

[3] İslam, təslim olmaqdan ibarətdir (Sufu kist, Doktor Cavad Nurbəxş)

Anlam: Doktor Hüseynəli Herəvi demişkən, bu beyt "silsiləvi aşiqlərin bir-birinə bağlılığını[1], yaxud dünya boyu davam edən eşq həyatını "növbət" nişanəsi ilə təlqin etmək istəyir".

**Qeyd** 1: *Hafiz də aşiqləri silsiləvi təsdiq etmək qəsdilə buyurmuş:*

دور مجنون گذشت و نوبت ماست        هر کسی پنج روزنوبت اوست[2]

**Qeyd** 2: *Aşiqlər silsiləsini təsdiq etmiş "növbət" nişanəsi iki önəmli mərtəbəni təlqin etmək istəyir:*

*A – İqamə – Nəzərə alsaq ki ölüm yıxıcı bir hadisədir, ayaq üstündə durmaq mənasını daşayan iqamə kəlməsinin həyat, yaxud varlıq nişanəsi olmağı məlum olar[3].*

*B – İdamə, davam etdirmək mənasını daşayan "idamə" kəlməsi iqamə mərhələsinə zamin duran mərtəbədən ibarətdir.*

**Qeyd**: *İdaməsiz iqamə mümkün olmadığına görə "növbət" nişanəsi iqamə ilə idamənin vahidləşməyini təlqin etmək istəyir.*

Beyt 3: **Ləhzə - ləhzə könlüm odundan şərərlərdir çıxan**
**Qətrə - qətrə göz tökən sanman sirişkim qanıdır.**

Sözlük: Şərər = qığılcım, sirişk = göz yaşı.

Nişanə 1: "Od, şərər":

A – Od, yaxud şərər ürəyi paklayıb – saflaşdıran səbəbdən ibarətdir.

B – ürək seyrinə lazım hərəkət verici səbəbdən ibarətdir.

P – maddi ilgiləri yandırmağıyla mənəvi ilgilərə yer açan səbəbdən ibarətdir.

Nişanə 2: "Sirişk" – məcazi mahiyyət ləkəsini həqiqi vücuddan yuyub – təmizləyən səbəbdən ibarətdir.

Nişanə 3: "Qan" – məcazi mahiyyəti batil edən nişanədən ibarətdir.

Anlam: Göz yaşıyla saflaşmış iç vücudum eşq atəşilə ilahi seyr və hərəkətlə məşğul olmuşdur.

Beyt 4: **Çakilər köksümdə tiği-eşqdən, eyb etməniz**
**Kim, cünun gülzarının bunlar güli-xəndanıdır.**

Nişanə 1: "Çak":

A – Çak, yaxud ürək çatı qurbanlıq müqəddiməsindən ibarətdir.

B – ülvi aləmə açılmış ürək pəncərəsindən ibarətdir[4].

---

[1] Şərhi-qəzəlhayi-Hafiz, doktor Hüseynəli Herəvi

[2] Müəllif, "Ta Qafe əndişe" kitabının birinci cildində bu beyti şərh etmişdir.

[3] Cansız yaranmışların öz yerində qərar tutması, yaxud öz xasiyyətini nişan verməyi onların iqaməsindən ibarətdir.

[4] Qəzəl 60, beyt 6

Nişanə 2: "Tiği-eşq" – xeyr əməllər naqisliyindən xəbərdar edən özəl lütfdən asılı qəhrdən ibarətdir.

Nişanə 3: "Cünun gülzarı" – eşq qələbələrindən asılı məstlikdən ibarətdir.

Nişanə 4: "Güli-xəndan" – ürək açan əhval – ruhiyyədən, yaxud bəst nailyyətindən ibarətdir.

Anlam: Qəlbimin çatı bəst ünvanı olduğuna görə fərəhləndirici bir nemətdir.

Beyt 5: **Ey Füzuli, ola kim rəhm edə yar əfğanına**
**Ağlagil zar, onca kim, zar ağlamaq imkanıdır.**

Sözlük: Əfğan = fəğan = fəryad = nalə.

Nişanə 1: "Rəhm" – ilahi feyz nailiyyətindən nişanədir.

Nişanə 2: "Əfğan" – qəlbin özəl münacatından ibarətdir.

Nişanə 3: "Zar ağlamaq" – mənəm-mənəmliyi silmək, yaxud məmlüklüyü etiraf etmək nişanəsindən ibarətdir.

Anlam: Ey Füzuli, ilahi feyz almaq mənəm-mənəmliyi silən əhval-ruhiyyəyə, yaxud özəl münacat ünvanlı mənəvi yalvar-yaxara bağlıdır.

## Q Ə Z Ə L 99

(1) Mənim kim, bir ləbi-xəndan üçün giryanlığım vardır
Pərişan türrələr dövründə sərgərdanlığım vardır.

(2) Yaşım təxti-rəvandır, taci-zərrin şöleyi-ahim,
Görün kim dövləti-eşq ilə nə sultanlığım vardır.

(3) Yumulmaz əşk tüğyanından onsuz çeşmi-xunbarım
Xəyali-surəti-cananə xoş heyranlığım vardır.

(4) Sirişkim gör, məni, ey əbr, özündən kəm xəyal etmə
Həvayi-eşq ilə min səncə əşkəfşanlığım vardır.

(5) Füzuli, camimey tərkin qılıb zöhd ilə təqvadən
Hamı danayə rövşəndir bu kim, nadanlığım vardır.

Beyt 1: **Mənim kim, bir ləbi-xəndan üçün giryanlığım vardır**
**Pərişan türrələr dövründə sərgərdanlığım vardır.**

Sözlük: Türrə = alın üstünü örtən zülf = zülf

Nişanə 1: "Ləbi xəndan" – ürək açan ilahi işarələrdən ibarətdir.

Nişanə 2: "Giryanlıq" – mənliyi yaddan çıxaran biqərarlıqdan ibarətdir.

Nişanə 3: "Pərişan türrə":

A – İlahi camal cəlalərinin doğu – batısından ibarətdir.

B – Aşiqi iztiraba salan seyr dolaylarından ibarətdir.

Nişanə 4: "Sərgərdanlıq" – əqlin-idrakın ilahi qələbələr önündə bərbad olmağından ibarətdir.

Anlam: Seyr yolunun dolaylarında bir ilahi işarəyə həsrət qalmışam.

Beyt 2: **Yaşım təxti-rəvandır, taci-zərrin şöleyi-ahim,**
**Görün kim dövləti-eşq ilə nə sultanlığım vardır.**

Sözlük: Təxti rəvan = yol gedən təxt = qulamlar çiynində aparılan padşah oturmuş təxt = Həzrəti-Süleyman peyğəmbərin təxti; taci-zərrin = zərli tac.

Nişanə 1: "Yaş, ah" – Su, həm də atəş şəriətə görə paka çıxaran maddə olduğuna görə göz yaşı, həm də ah atəşi iç vücudu fiziki əngəl mahiyyət ləkəsindən təmizləyən nişanələrdən ibarətdir.

Nişanə 2: "Sultanlıq" – bəşəri iradəni bərbad etməklə ilahi iradəyə nail olmaqdan nişanədir.[1]

Nişanə 3: "Təxt", "Tac", "Dövlət" və "Sultanlıq" dünyəvi etibar – iqtidar həqirliyini tanımış aşiqin ilahi istiğnadan bəhrələnmək nişanələrindən ibarətdirlər.

Anlam: Fiziki mahiyyət həbsindən, yaxud dünyəvi bağlantılar əsirliyindən xilas olmaqla həqiqi vücudumun mənəvi iqtidar və etibarından xəbərdar olmuşam.

Beyt 3: **Yumulmaz əşk tüğyanından onsuz çeşmi-xunbarım,**
**Xəyali-surəti-canano xoş heyranlığım vardır.**

Sözlük: Əşk = göz yaşı; çeşmi xunbar = qan yağdıran göz.

Nişanə 1: "Əşk" – Mənəm-mənəmliyi yuyan nişanədən ibarətdir.

Nişanə 2: "Çeşmi-xunbar" – mənəm-mənəmliyi batil edən nişanədən ibarətdir.

---

[1] Qəzəl 98, beyt 1

Nişanə 3: "Xəyal" – gözlərdən gizli cananı ürəklərdə hazır edən, yaxud məhz onun həqiqətini nişan verən ürfani özəl qüvvədən ibarətdir.[1]

Nişanə 4: "Surəti-canan" – Mütəal məbudun da "vəch" ünvanlı surəti vardır, amma onun surətini bəşəri surətlə müqayisə etmək olmaz, çünki bəşəri surət zaman keçdikcə solğunlaşıb fani olmalıdır, lakin ilahi surət şərif ayə də

"كُلُّ مَن عَليها فانٍ،وَيَبقى وَجهُ رَبکَ ذُوالجَلال وَالاِكرام"[2] buyurulduğu kimi zaman qələbəsindən, yaxud solğunluqdan və fanilikdən üstündür.[3]

**Qeyd**: *İlahi surət cəlaləri vasitəsiz parlasaydı yer – göy təmamilə yanıb sovrulardı.*

Nişanə 5: "Heyranlıq":

A – Heyranlıq, ilahi seyrə nail olmuş aşiqin yerlə göy arasındakı sərgərdanlığından, yaxud qəribliyindən nişanədir.

B – əqli-idrakı aciz edən kəşflərdən ibarətdir.[4]

Anlam: Gözdən qayib cananı ürəkdə hazır etmək məqsədilə, məcazi vücud maneəsini yuyub – batil etmək istəyirəm.

Beyt 4: **Sirişkim gör məni, ey əbr, özündən kəm xəyal etmə,**
**Həvayi eşq ilə min səncə əşkəfşanlığım vardır.**

Sözlük: Sirişk = göz yaşı; əbr = bulud; əşk əfşanlıq = göz yaşını yağdırmaq

Nişanə : "Əbr ": Əbr, bu beytdə:

A – mənəm-mənəmlik xıltını yuyub təmamilə təmizləyən mənəvi əhval-ruhiyyəni dünyəviləşdirən nişanədən ibarətdir.

B – Yaşıllığa, yaxud mənəvi həyat müqəddiməsinə eyham edən nişanədən ibarətdir.

Anlam: Dünyəvi yaşıl həyat törətmiş buludu, mənəvi həyat yaradan göz yaşımla müqayisə etmək mümkünsüzdür.

Beyt 5: **Füzuli, cami-mey tərkin qılıb zöhd ilə təqvadən,**
**Hamı danayə rövşəndir bu kim, nadanlığım vardır.**

Sözlük: Zöhd = pəhrizkarlıq = təqva; rövşən = aydın = bəlli = işıqlı

Nişanə 1: "Cami-mey" – mürşid həzrətinin mərifət badəsilə daşqın ürəyindən, yaxud təlimatından ibarətdir.

---

[1] Qəzəl 68, beyt 1

[2] Quran, "Ərrəhman" surəsi, ayə 26, 27 ( Hər bir yaranmış zavala məruz qalmışdır və daimidir səni yaradan cəlallı və kəramətli Allahın vəchi)

[3] Fərhəngi-istilahat və təbirati-ürfani,

[4] Qəzəl 100, beyt 4

Nişanə 2: "Zöhd və təqva":

A – Zöhd və təqva, şəri hökmlər zahirini diqqətlə gözətləməkdən ibarətdir.

B – şəri hökmlərə, üzdə bir cür, arxada başqa cür əməl etməkdən, yaxud riyakarlıqdan ibarətdir.

P – şəri hökmlər vasitəsilə sərkilərdən qorunmaq nişanəsidir.

**Qeyd** 1: *Şəri hökmlərin qabığına şəriət, məğzinə təriqət və hədəfinə həqiqət demişlər.*

**Qeyd** 2: *Bəzi ariflər şəriəti cəmdək və təriqəti ürək bilmişlər.*

**Qeyd** 3: *Bəzi ariflər, peyğəmbər buyurduğu sözü şəriət, etdiyi əməli təriqət və gördüyü camalı həqiqət bilmişlər.*

**Qeyd** 4: *Eşq və ürfan bəhanəsilə şəriətdən qafil olmaq, beləliklə, dini hökmlərə naqis əməl etmək, yaxud heç əməl etməmək təriqəti qabilsiz meyvə kimi fasid etməkdən ibarətdir. Əksinə, şəriət bəhanəsilə təriqətdən qafil qalmaq ürəksiz cəmdəkdən həyat ummaq kimi vecsizdir.*

**Qeyd** 5: *Təriqətdən xəbərsiz zahid, həm də şəriətdən qafil arif – hər ikisi məlamət olunmalıdır.*

**Qeyd** 6: *İmamlar şəriət ilə təriqəti kamil surətdə vahidləşdirmişlər.*

Anlam: Sərkilər qorxusundan zöhd ixtiyar etmək nadanlıqla eynidir.

**Qeyd**: *Beyt Füzuli adını bəhanə edərkən zöhd və təqva bəhanəçilərini, yaxud dünyaşünas əql tərəfdarlarını, ya da riyakar zahidləri kinayə ilə məlamət etmişdir.*

## Q Ə Z Ə L 100

(1) Zövq şövqilə cəhan qeydin çəkən zəhmət çəkər,
Əhli-zövq oldur kim ondan daməni-himmət çəkər.

(2) Gün çəkər yerdən göyə hər dəm ğubari-rahini
Tutiya içün, bəli, göydən yerə minnət çəkər.

(3) Ey çəkən qeyr ilə pünhan bəzm edib mey gah-gah,
Yad qıl ondan ki, bəzmin yad edib həsrət çəkər.

(4) Xali etmiş qeyrdən zülfün xəyali könlümü,
Nola sahibkəşf ola bir ömrdür xəlvət çəkər.

(5) Çək səbuhi, sübh nəqqaşinə ərzi-ariz et,
Böylə çəksin gər fələk lövhin də bir surət çəkər.

(6) Sərvqamətlər səmənrüxsarlər toprağıdır,
Hər səmən kim, açılır hər sərv kim, qamət çəkər.

(7) Qətreyiəşkim qətari, sinə çakindən girib,
Tən evinə dişradan bari-qəmü möhnət çəkər.

(8) Ey Füzuli, baxmayam hər qeyrə, hər xunin müjə
Atəşin bir mildir kim, çeşmimə qeyrət çəkər.

Beyt 1: **Zövq şövqilə cəhan qeydin çəkən zəhmət çəkər,**
**Əhli zövq oldur kim, ondan daməni-himmət çəkər.**

Sözlük: Damən = ətək.

Nişanə 1: "Cahan qeydini çəkmək" – yarı yer sakinliyindən məhdud məstliyə çalışqanlıq etməkdən ibarətdir.

Nişanə 2: "Əhli-zövq" – bir çox elm və məntiq axtaran həqiqətləri şühud nailyyətində kəşf etmiş ariflərdən ibarətdir.

Nişanə 3: "Daməni-himmət çəkmək" – ictinab etməkdən, yaxud tərk etməkdən istiarədəir.

Anlam: Dünyəvi etibarlar şövqilə çalışqanlıq edənlər həqiqətən vecsiz zəhmətlər çəkirlər, çünki dünyəvi etibarlar umumən zavala uğraşmış etibardırlar, deməк zavalsız etibar maddi dünyanı tərk edənlərə nəsib olmalıdır.

**Qeyd** 1: *Dünyanı məlamət etmək yer sakinliyinə məhdud olmuşları məlamət etməkdən ibarətdir, demək mənəvilikdən bəhrələnmiş dünyəvilik təriflənməli müsbət dünyəvilikdir.*

**Qeyd** 2: *Dünya axirət körpüsü olduğuna görə çox hörmətlidir, ancaq körpü sakinliyi, yaxud axirəti körpü fədası etmək məlamətlənməli qəribə bir ğafillikdir.*

Beyt 2: **Gün çəkər yerdən göyə hər dəm, ğubari-rahini**
**Tutiya içün bəli, göydən – yerə minnət çəkər.**

Sözlük: Rah = yol

Nişanə 1: "Gün" – bu beytdə dünyəvi yüksəklikdən, yaxud məcazi inkşaf və etibardan nişanədir.

Nişanə 2: "Ğubari-rah, tutya":

A – Ğubari-rah aşiqin istedadını qüvvətləndirərkən onu şühud məqamına hazırlayan bəndəlik ərəfəsindən, yaxud mürşüd astanasından ibarətdir.

B – tutya ürək gözünü açmaq qəsdilə cisim gözünü kor edən eşq ərəfəsinin tozundan ibarətdir.

Nişanə 3: "Göydən-yerə" – əqləsığmaz fasiləni təlqin edən nişanədən ibarətdir (göydən yerə qədər).

**Qeyd**: *Göydən-yerə eşq ərəfəsinin əql səmasından daha ucaraq olmasına eyham edərək lisanil-qeyb Hafizin buyurduğu beyti təsdiq etmək istəyir:*

عجب علميست علم هيات عشق        كه چرخ هفتمش هفتم زمينست

Anlam: Günəş eşq astanasının tozundan yüksəklik, həm də parlaqlıq borc etmək istəyir.

**Qeyd**: *Dünyəvi mərtəbələr mənəvi mərtəbələrə söykənməklə etibar qazanmışlar.*

Beyt 3: **Ey çəkən qeyr ilə pünhan bəzm edib mey gah-gah,**
**Yad qıl ondan ki, bəzmin yad edib həsrət çəkər**.

Sözlük: Bəzm = məclis = əncümən = ziyafət məclisi

Nişanə 1: "Mey" – bu beytdə ilahi cazibələr nailiyyətindən yaxud mürşüd həzrətinin ürək açan təlimatından ibarətdir.

Nişanə 2: "Bəzm":

A – Gözdən qayib mütəal məhbubun ürəkdə hazır olma ləhzələrindən ibarətdir.

B – mürşüd həzrəti ilə söhbətləşmək nailyyətindən ibarətdir.

Anlam:

A – Ey bir çox aşiqi özəl cazibələrə nail etmiş həkimi-məbud, mənim də əfsuslanmış məhrum qəlbimi bir cilvə ilə şad qıl.

B – Ey bir çox salik ilə söhbətləşmiş mürşüd, mənim də möhtac qəlbimi yaddan çıxarma.

Beyt 4: **Xali etmiş qeyrdən zülfün xəyali könlümü,**
**Nola sahibkəşf ola bir ömrdür xəlvət çəkər.**

Nişanə 1: "Xali olmaq" – dünyəvi ilgilərini, həm də bəşəri sifətləri-ni eşiyə tullamış vücudun ilahi sifətlərlə dolmağından, yaxud "ney" mərtəbəsinə nail olmağından nişanədir[1]

Nişanə 2: "Zülf" – bu beytdə yaradıcı məbud cilvələrini əks etdirən yaranmışlardan ibarətdir.

Nişanə 3: "Kəşf":

A – gözlərdən qaib mərtəbənin ürəkdə hazır olmağından ibarətdir.

B – maddi aləmdən üstün həqiqətlərlə tanış olmaqdan nişanədir.

P – dünyəvi şəraitdə mənəvi həqiqətləri müşahidə edib tanımaqdan ibarətdir.

T – dünyəvi şəraitdə mənəvi həqiqətləri eşidib tanımaqdan ibarətdir.

S – əqlə-idraka sığmaz həqiqətlərin ürəkyə sığışmasından ibarətdir.

Nişanə 4: "Xəlvət" – dünyəviliyini, hətta mənəm-mənəmliyini unut-muş aşiqin mənəvi məşğulluğundan ibarətdir.[2]

[1] Qəzəl 65, beyt 1
[2] Qəzəl 69, beyt 4

Anlam: Hər bir yaranmışda[1] mən yaradıcı məbud cilvələrini müşahidə etməklə yaxud ömür boyu dünyəviliyi mənəviliyə söykənməklə ilahi kəşflər nailiyyətinə hazırlaşmışam.

Beyt 5: **Çək səbuhi, sübh nəqqaşinə ərzi-ariz et**
**Böylə çəksin gər fələk lovhinə bir surət çəkər.**

Sözlük: Səbuh = sübh şərabı = şərab = sübh içilən süd; nəqqaş = nəqqaş; ariz = camal = sima = üz; lovh = lövhə.

Nişanə 1: "Səbuh":

A – İç vücudun mütəal məbud ilə danışmağından ibarətdir.

B – maddi dünyaya düşməzdən əvvəl mənəvi aləmdə mütəal məbud hüzurunda vüsal şərabı ilə məst olmuş insanların məcazi dünyada xumarlıqlarını sındıran ilahi camal cilvələrindən ibarətdir.

Nişanə 2: "Sübh":

A – Sübh vəhdət günəşindən parlayan nurdan nişanədir.

**Qeyd**: *Bunu nəzərə alsaq ki, səbuh mərtəbəsinə, yaxud danışmağa hüzur lazımdır, hüzurun görüş ilə və görüşün nur ilə bağlılığı sübhlə səbuhun əlaqəsini məlum edir.*

B – Sübh, ilahi əlaqələr başlanğıcından nişanədir.[2]

Nişanə 3: "Ariz": – ilahi hüsnlər əks etdirmiş bəşəri camaldan, yaxud mürşid simasından nişanədir.

**Qeyd** 1: *Ariz mərtəbəsinə nail olmuş arifi "Məzhər" ünvanlı ürfani mərtəbədə vəsf etmişlər.*

**Qeyd** 2: *Hər bir yaranmış yaradıcı məbuddan bir əsər göstərməklə bir ilahi məzhərdir, ancaq insanın bütün ilahi sifətlər əks etdirmək istedadı onu mütəal məbudun tam məzhəri olmağa layiq etmişdir.*
*Anlam: Ey ilahi hüsnlər əks etdirmiş gözəl insan, yaxud ey mürşid həzrəti, ya da ey həkimi-məbudun tam məzhəri:*

*A – Mütəal məbuddan tam məzhərlər zühurunu xahiş et.*

*B – Səfalı məzhərlər simasını nişan verməklə, sübh səfasına fəxr etmiş günəşi (nəqqaş sübhi) öz acizliyindən xəbərdar et.*

Beyt 6: **Sərv qamətlər səmənrüxsarlər torpağıdır,**
**Hər səmən kim açılır hər sərv kim qamət çəkər.**

Sözlük: Səmən = yasəmən; rüxsar = camal; səmənrüxsar = gül üzlü.

Nişanə 1: "Sərv qamətlər" – ülvi mərtəbəli məzhərlərdən ibarətdir.

[1] Xəyal, fikir, elm və başqa zehni işlər yaranmışlar.
[2] Qəzəl 25, beyt 1

Nişanə 2: "Səmən rüxsarlar" – bəst məqamına nail edən məzhərlərdən ibarətdir.

Anlam: Bütün güllərə, gülşənlərə gözəllik bağışlayan məzhərlər rayihəsidir.

**Qeyd**: *Dünyəvi gözəlliklər məzhərlər rayihəsindən yaranıblar.*

Beyt 7: **Qətreyi-əşkim qətari, sinə çakindən girib**
**Tən evinə dişradan bari qəmü möhnət çəkər**.

Sözlük: Əşk = göz yaşı; çak = çat, bar = yük

Anlam: Ürək güzgüsünü duruldan göz yaşım mənim fiziki mahiyyətimlə mübarizə aparmaqla məşğuldur.

Beyt 8: **Ey Füzuli, baxmayam hər qeyrə, hər xunin müjə**
**Atəşin bir mildir kim, çeşmimə qeyrət çəkər.**

Sözlük: Xunin müjə = qanlı kiprik; çeşm = göz .

Nişanə 1: "Xuni moje" – ilahi lütfdən asılı qəzəbdən ibarətdir

Nişanə 2: "Qeyrət"

A – Qeyrət mütəal məbuddan başqa mailliyə razılıq verməyən əhval-ruhiyədən ibarətdir.

B – məhəbbətdən ayrılmaz müsbət təəsübdən ibarətdir.

Anlam: Ey Füzuli, qeyrət canan camalından başqasına nəzər salmış gözü mil çəkməklə tənbih edir.

**Qeyd**: *Beyt qeyrətin mühafizə edici olmağını təlqin etmək istəyir.*